# İSLAMDA QADIN HÜQUQ SİSTEMİ

:Müəllif

Şəhid Mürtəza Mütəhhəri

:Çap nəşriyyat

əl–Mustafa (s) Beynəlxalq Tərcümə və Nəşr mərkəzi

:Digital nəşriyyat

İsfəhan Qaimiyyə adına komputer araşdırmalar mərkəzi

# Mündəricat

## İSLAMDA QADIN HÜQUQ SİSTEMİ

### KİTAB HAQQINDA

Kitabın adı: İslamda qadın hüquq sistemi

Müəllif: Şəhid Mürtəza Mütəhhəri

Tərcümə edən: Mərdan Zalov

Redaktor: Seyid Azər Əhmədoğlu

Naşir: Beynəlxalq əl-Mustafa (s) Tərcümə və Nəşr Mərkəzi

Çap tarixi: ۲۰۱۳

Çap növbəsi: Birinci

Tiraj: ۱۰۰۰

:ISBN



:Satış mərkəzləri

Telfaks: +۹۸ ۲۵۱ ۷۷۳۰۵۱۷

İran, Qum, Məhəmməd Əmin (s) prospekti, "Camiətul-ulum"un yanı, Beynəlxalq əl-Mustafa (s) Tərcümə və Nəşr Mərkəzinin satış şöbəsi

Tel/Faks: +۹۸۲۵۱ ۲۱۳۳۱۰۶ / +۹۸۲۵۱ ۲۱۳۳۱۴۶

www.miup.ir www.eshop.miup.ir

(E-mail: admin@miup.ir root@miup.ir (۱

səh:۱

### İŞARƏ

## NAŞİRDƏN

Hər hansı inkişaf mərhələsini keçən elmi-tədqiqi bir iş ilkin olaraq yazıçının ilham zəmisinə səpdiyi sorğu-suallarla başlayaraq müəyyən zamanda verdiyi səmərə ilə yekunlaşır. Əlbəttə, bu, işin sonu yox, yeni-yeni fəaliyyətlər üçün ümid və təşəbbüs deməkdir. Belə ki, əldə olunan hər bir səmərəli qazancın məhsuldarlığı həmişə onun artımı üçün şərait yaradır. Deməli, zaman keçdikcə elm, bilik və incəsənət əhli onun .toxumlarını becərib yetişdirir, daim elm və mədəniyyət cərəyanını təmin edir

Fasilə və hüdudları həddən artıq azaldan son müasir zamanımız coşqun tufan kimi, maraqlanan hər şəxsin qarşısına qalaq-qalaq məlumatı sovurub gətirir, mədəniyyətin yeni bir mərhələsinə qapı açır. Hər halda, onun normal inkişafında, şübhəsiz, düzgün .təsəvvür və istiqamət həlledici rola malikdir

Beynəlxalq əl-Mustafa (s) Universitetinin ümumdünyəvi rolu, dini hövzələr arasında xüsusi yeri və yetərli kadr imkanına malik olduğunu nəzərə alaraq, artıq elmi təhqiqat və tədqiqatlar üçün geniş şərait yaratmağı qarşısına qəti məqsəd qoymuşdur. Bununla əlaqədar Beynəlxalq əl-Mustafa (s) Universitetinin tədqiqat şöbəsi fundamental proqramın təşkili, mövcud avadanlığın düzgün təmini və dini sahələrdə araşdırma aparmaq istəyənlərin cəlb olunmasını özünün ən mühüm vəzifələrindən

hesab edir. Ümid edirik ki, elmi-təhqiqi işlərə qarşı maraq və dirçəlişlərə zəmin yaratmaq və potensial imkanları inkişaf etdirməklə dünyanın hər bir guşəsində dini mədəniyyətin çiçəklənməsinin şahidi olarıq!

(Beynəlxalq əl-Mustafa(s

Tərcümə və Nəşr Mərkəzi

## MÜNDƏRİCAT

səh:۷

## MÜQƏDDİMƏ

Əsrimizin tələbləri bir çox məsələlərin yenidən nəzərdən keçirilməsini və əvvəlki düşüncələrlə kifayətlənməməyi gərəkdirir. "Hüquq sistemi və ailə vəzifələri" də bu cür məsələlərdəndir. Bu əsrdə (sonradan həmin məsələlərin səbəblərinə toxunacağıq) düşünülən əsaslı məsələlərdən biri "qadın azadlığı" və onun kişlərlə "hüquqi bərabərliyi"dir. Digər bütün mövzular bu iki məsələdən yaranan ikinci dərəcəli .hissələrdir

Düşünürük ki, ən əsas və ya ən azı, əsaslı məsələlər sırasında duran "ailə hüquq sistemi" görəsən, ictimai sistemlərdən seçilən və ictimai təşkilatların istifadə etdikləri meyar və məntiqlərdən fərqli olan məntiq və xüsusiyyətlərə malikdir, yoxsa, onun digər sistemlərlə heç bir fərqi yoxdur və ona da eynilə həmin məntiq, fəlsəfə və digər ?meyarlar hakimdirmi

Bu şübhənin əsli və kökü bir tərəfdən, həmin sistemin iki əsas prinsipinin ikitərəfliliyində (iki cinsliliyində) və digər tərəfdən, nəsil artımı, valideyn və övladların olması məsələsindədir. Yaradılış nizamında bu sistemin üzvləri bənzərsiz, qeyri-bərarbər və müxtəlif keyfiyyət və fərqliliklə müəyyən edilmişdir. Ailə icması təbii və razılaşma əsasında olan bir icmadır. Yəni, instinktlərə tabe olan bal arıları və qarışqaların cəmiyyətinə bənzər və bütün hədd, hüquq və müqəddəratların təbiət tərəfindən müəyyən edilməsi və itaətsizliyin qeyri-mümkünlüyü şəklində olan bir cəmiyyətlə razılaşma əsasında və daha az təbii və

instinktiv oxşarlıqları olan insanların mədəni cəmiyyəti (icması) arasında orta bir .həddir

Məlum olduğu kimi, qədim filosoflar "ailə yaşayışını" "əməli hikmət"in müstəqil bir hissəsi hesab edərək insan həyatındakı bu qismin fərqli məntiq və meyarlara malik olmasına inanırdılar. Əflatun (Platon) "Azadlıq" traktatında, Aristotel "Siyasət" və İbn Sina "Əş-Şəfa" kitabında həmin mövzuya bu cəhət və prizmadan yanaşmışlar. Təbii olaraq, cəmiyyətdə qadın hüququ ilə əlaqədar bu sual və şübhə meydana çıxır ki, görəsən, qadının təbii və insani hüquqları kişininki ilə eyni şəkildə və bərabərdir, yoxsa, müxtəlif və fərqlidir? Yəni, insana bir sıra silsiləvi hüquqlar bəxş edən təbiət və xilqət, görəsən, həmin hüquqları ikicinsli yaratmışdır, yaxud bircinsli? Görəsən, "kişilik" və "qadınlıq" hüquq və ictimai vəzifələrdə özünə yer tutmuşdur, yoxsa, təbii cəhət, təkvini ?məntiq və yaradılışda bircinsli hüquq olmuşdur

Qərb dünyasında XVII əsrdən sonra ardıcıl olaraq elmi, fəlsəfi və ictimai məsələlər zəminəsində "bəşər hüququ" adı altında hərəkatlar baş verdi. XVII və XVIII əsrlərin yazıçı və mütəfəkkirləri təbii, fitri və insandan alınması qeyri-mümkün olan "bəşər hüququ" ilə bağlı öz fikir və düşüncələrini camaat arasında qəbul olunacaq şəkildə yaya bildilər. Jan Jak Russo, Volter, Montesko kimilər bu qrupdan olan yazıçı və mütəfəkkirlərdəndir. Bu qrupun bəşər cəmiyyəti üzərində danılmaz haqqı vardır. Bəlkə də, onların bu haqqının heç də məşhur kəşf və ixtiraçıların haqqından geri qalmadığını .iddia etsək, yanılmarıq

Bu qrupdan olanların diqqət mərkəzində saxladıqları ən əsas məsələ insanın fitri, təbii və xilqət baxımından bir sıra silsiləvi hüquq və azadlıqlara malik olması idi. Həmin hüquq və azadlıqları hansısa bir fərd və ya qrup heç bir halda və heç bir şəkildə onlardan ala, hətta bu hüquqların sahibi belə, onu özündən kənarlaşdıra və başqasına verə bilməz, eyni zamanda, bütün camaat - istər hakim və məhkum, ağ və qara dərili, .istərsə də varlı və fəqir bu hüquq və azadlıqlarda bərabərdirlər

Bu ideoloji və ictimai hərəkat cəmiyyətə öz səmərəsini vermişdir. Əvvəlcə İngiltərədə, sonra Amerikada və daha

sonra isə Fransada inqilab və hərəkatların baş verməsi və rejimlərin dəyişilməsi, həmçinin, memorandumların imzalanması şəklində özünü büruzə verərərək digər ölkə .və məntəqələrə də öz təsirini qoymuşdur

XIX əsrdə insan hüquqlarının iqtisadi, ictimai və siyasi məsələlər zəminəsində yeni ideyalar meydana gələrək dəyişikliklər baş verir ki, sosializmin yaranması, mənfəətlərin zəhmətkeş (fəhlə) təbəqəyə məxsus edilməsi və hakimiyyətin sərmayədar (kapitalist) təbəqədən zəhmətkeş və fəhlə təbəqəni dəstəkləyənlərə .ötürülməsi ilə nəticələnir

XIX əsrin sonlarından XX əsrin əvvəllərinə qədər insan hüququ barəsində aparılan dialoq və əməldə göstərilən fəaliyyətlər millət hüquqlarının dövlətlər qarşısında və yaxud fəhlə və zəhmətkeş təbəqənin sahibkar və hakim təbəqənin müqabilindəki .hüquqları ilə bağlı olmuşdur

XX əsrdə "kişi hüquqları" bərabərində "qadın hüquqları" məsələsi hallandırılmağa başladı və birinci dəfə dünya ictimaiyyətində – ikinci dünya müharibəsindən sonra ۱۹۴۸-ci ildə "Beynəlxalq Millətlər Təşkilatı" (BMT) tərəfindən nəşr edilərək – kişi və .qadın hüquqlarının bərabərliyi açıq-aşkar elan olundu

XVII əsrdən indiki dövrə qədər Qərbin bütün ictimai hərəkatlarının mərkəzində "azadlıq" və "bərabərlik" adlanan iki əsas məsələ dayanmışdır. Qərbdə "qadın hüquqları" ilə əlaqədar baş verən hərəkatların digər hərəkatların ardınca baş verməsinə və "qadın hüquqları" Avropa tarixində "azadlıq" və "bərabərlik" adı ilə hallanmasına baxmayaraq, burada da sadəcə "azadlıq" və "bərabərlik"dən başqa, .digər məsələdən söhbət açılmamışdır

Bu hərəkatın öncül və liderləri qadın azadlığı və onun kişilərlə bərabərhüquqlu olmasını bəşər hüququ ilə əlaqədar hərəkatın tamamı və kamil olması kimi – bu məsələ XVII əsrdən yaranmağa başlamışdı – dəyərləndirərək qadın azadlığı və onun kişilərlə bərabərhüquqlu olmasını təmin etmədən insan azadlığı və bəşər hüququndan söhbət açmağın mənasız olduğunu iddia edir və bundan əlavə, ailədə yaranan problemlərin qadının azad və kişi ilə eynisəviyyəli hüquqa malik olmamasında görür və bu

hüquqların təmin ediləcəyi təqdirdə, bütün problem və çətinliklərin birdəfəlik həll .olunacağını vurğulayırdılar

Bu hərəkatda bizim “ailə hüquq sisteminin əsas məsələsi” adlandırdığımız mövzu, yəni onun təbii olaraq digər ictimai sistemlərdən ayrı və müstəqil və ictimai təşkilatların məntiq və meyarından fərqli olub-olmaması məsələsi diqqətdən yayınaraq .unudulmuşdur

Zehinləri özünə cəlb edən əsas məsələ kişilərə nisbətdə qadınların azadlıq və hüquq bərabərliyi mövzusu olmuşdur. Başqa bir ifadə ilə desək, qadın hüququ ilə bağlı bəhsin mövzusu “bəşərin təbii, fitri və ondan alınması qeyri-mümkün olan” hüququ və sairə idi. Bütün söhbətlər “qadının insanlıqda kişi ilə müştərək və insani keyfiyyətlərə malik olması və kişilər kimi fitri və ondan alınması qeyri-mümkün olan bəşər hüququndan istifadə etməli olması” mətləbi ətrafında dolanırdı. Bu kitabın bəzi fəsillərində “təbii hüquqların mənbəyi” barədə kifayət qədər bəhs edilmişdir. Həmin fəsildə insanın təbii və fitri hüquqları mənbəyinin fitrət olmasını sübuta yetirmişik. Əgər insan at, qoyun, toyuq, balıq və s. kimi heyvanlarda olmayan xüsusi bir hüquqdan yararlanırsa, bunun mənbəyi təbiət, xilqət və yaradılışdır. İnsanlar bütün təbii hüquqlardan bərabər şəkildə istifadə etmək və azad yaşamaqda müsavidirlərsə, bu, xilqətdə müəyyən edilmişdir və .bundan başqa, digər bir smüraciət və dönüşdən başqa, bir mənbə yoxdur

İndi bizim “ailə hüquq sisteminin əsas məsələlsi” adlandırdığımız mövzunun nə üçün diqqət mərkəzində olmadığına nəzər salaq. Görəsən, günümüzdəki elmlər sayəsində kişi və qadın arasındakı fərq və müxtəlifliyin sadəcə hansısa bir üzvlə əlaqədar olması və cismi, psixoloji struktur, öhdələrinə aldıqları məsuliyyət və onlara aid hüquqlarla bağlı təsirin olmadığı məlum olmuş və həmin cəhətdən bugünkü ictimai fəlsəfədə bunun üçün ayrıca bir hesab-kitab nəzərdə tutulmamışdırmı? Həqiqətdə, məsələ bunun əksinədir. Psixoloji və təbii sahədə əldə edilən elmi kəşf və ixtiralar nəticəsində, bu iki müxalif cins arasındakı fərqlər daha da aydınlaşmış və

sübuta yetmişdir. Biz kitabın bəzi fəsillərində təbii, fizioloji və psixoloji tədqiqatlara istinad edərək bu barədə söhbət açmışıq. Bütün bunlara baxmayaraq, əsas məsələ .unudulmuşdur və bu da öz növbəsində təəccüb doğurur

Həmin hərəkatların sürətli şəkildə baş verməsini bu diqqətsizliyin mənşəyi hesab etmək olar. Bu hərəkatlar qadınların həyatındakı bir sıra silsiləvi bədbəxtlikləri müəyyən miqdarda aradan qaldırmaqla yanaşı, digər bəla və çarəsizlikləri də ona (qadına) və bəşər cəmiyyətinə ərməğan etmişdir. Kitabın gələcək bəhslərində qərbli qadınların XX əsrin əvvəllərinə qədər ən sadə və ən aşağı hüquqlardan məhrum olması və yalnız XX əsrdə qərblilərin bu zərəri aradan qaldırmaq fikrinə düşməsi barədə tanış olacaqsınız. “Azadlıq” və “bərabərlik” məsələsi sonrakı hərəkatların davamı olduğundan, qərblilər bu iki sözün mənasının möcüzələr yaradacağını gözləyirdi. Amma onlar “azadlıq” və “bərabərliyin” tələbələrin dediyi kimi, “insanın insan olmasını gərəkdirən haqq olması” məsələsini və insanların insan olaraq bir-biri arasındakı münasibət və rabitədən qaynaqlandığını nəzərdən qaçırmışlar. Eyni zamanda, qadın da insan olduğu və digərləri kimi azad yaradıldığı üçün azadlıq və hüquq bərabərliyindən istifadə etməlidir. Amma kişi və qadın özünəməxsus fərq və keyfiyyətlərə malik olan insanlardır. Kişi və qadın insanlıqda bərabərdirlər, amma ikili xarakter, psixologiya və xüsusiyyətlərə malikdirlər və bu fərqlilik və təzad coğrafi, ictimai və tarixi amillər səbəbilə deyil, əksinə yaradılış və xilqət baxımındandır. Əlbəttə, təbiət (fitrət) cəhətindən bu ikili xüsusiyyətdə hansısa bir hədəf nəzərdə tutulmuşdur və onlardakı fitrət və təbiətin ziddinə əməl etmək xoşagəlməz hadisələrlə nəticələnə bilər. Biz insanların - həmçinin, kişi və qadının - azadlıq və bərabərliyini anlamaq üçün təbiətdən ilham aldıq və onların hüquqlarının “bir xüsusiyyətli”, yoxsa, “ikili xüsusiyyətli” və ailə icmasının ən azı, yarıtəbii olub-olmamasını da təbiətdən istifadə edərək anlaya bilərik. Bəyan və izaha ehtiyaclı məsələlərdən biri də heyvanların - eyni zamanda, insanların - ikicinsli olmasının

təsadüfi və gözlənilməz, yoxsa, xilqət cəhətindən bu cür olmasıdır. Görəsən, iki cinsin fərqi təkcə üzvlərin səthi və sadə olan fərqliliyindədir və ya Aleksis Karlın dediyi kimi, hər bir insandakı molekul onun cinsiyyətinin nişanəsidir? Görəsən, məntiq və fitrət baxımından, kişi və qadının hər birinin özünəməxsus missiya və funksiyası var, ya yox? Onların hüquqları bircinslidir, ya ikicinsli? Əxlaq və tərbiyə bir, yoxsa, ikicinslidirmi? ?Cəzalar, eynilə, məsuliyyət və vəzifələr necə

Bu hərəkatlarda "azadlıq" və "bərabərlik" məsələsindən başqa, digər mətləblərin də olması diqqətdən qaçırılıb. "Azadlıq" və "bərabərlik" lazımlı şərtdirlər, nəinki, kifayət olunası. "Hüquq bərabərliyi" və "hüquq bənzərliyi" fərqli mətləblərdir. Kişi və qadının maddi və mənəvi dəyərlər baxımından hüquq bərabərliyi bir məsələ, eynilik, bənzərlik və bərabərlik isə başqa bir məsələdir. Həmin hərəkatlarda qəsdən və ya səhvən "müsavilik" "bənzərlik" yerinə işlədilmiş, "bərabərlik" "eynilik" kimi hesab olunmuş və "keyfiyət" "kəmiyyət" kölgəsində nəzərdə tutulmuş, eyni zamanda, qadının "insan" .olması onun "qadın" olmasının unudulması ilə nəticələnmişdir

Həqiqətdə, bu diqqətsizliyi təkcə "tələskənlikdən doğan fəlsəfi qəflət" kimi qiymətləndirmək olmaz. İşin içində "azadlıq" və "bərabərlik" adı altında "qadından istifadə etmə" amilinin olmasını da qeyd etməliyik. Həmin amillərdən birinə sərmayədar və kapitalistlərin bu cərəyanlardan istifadə etmək istəməsi daxildir. Fabrik və karxana sahibləri qadınları evdən karxanalara çəkib gətirərək onların işçi qüvvəsindən istifadə etmək üçün "qadın hüququ", "qadının iqtisadi azadlığı", "qadın azadlığı" və "qadın hüquqlarının kişilərlə bərabər olması" kimi şüarları əldə bayraq .tutmuş və onu rəsmi olaraq qanun şəklinə salmağa müvəffəq olmuşlar

Vil Dorant "Fəlsəfənin ləzzətləri" adlı kitabının doqquzuncu fəslində Aristotel, Nitşe, Şopenhaur və yəhudilərin müqəddəs kitablarının qadınlara nisbətdə bəzi təhqiramiz nəzəriyyələrini nəql etməsi və Fransa hərəkatında qadın azadlığından sohbət açmasına baxmayaraq, əməldə heç bir dəyişikliyin edilməməsinə

işarə etdikdən sonra deyir: “١٩٠٠-cü illərə qədər qadın çox az-az hallarda kişinin ona ehtiram etmək məcburiyyətində olmasını təmin edən hüquqlara malik idi.” Sonra XX əsrdə qadının vəziyyətindəki dəyişikliklərin səbəbinə toxunaraq deyir: “Qadının :azadlığı sənaye inqilabı ilə bağlı olmuşdur.” Beləliklə, sözlərinə bu şəkildə davam edir

Qadınlar kişilərə nisbətdə ucuz işçi qüvvələri idi və fabrik sahibləri onları kişilərdən ...“ üstün tuturdular. Bir əsr əvvəl isə İngiltərədə kişilərin iş tapması çox çətin bir məsələyə çevrilmişdi. Amma elanlarda onlardan qadın və uşaqlarını karxanalara göndərməsi tələb olunurdu... Birinci dəfə bizim nənələrimizin azad olması üçün qəbul edilən qanun ١٨٨٢ saylı qanun idi. Bu qanuna əsasən, Böyük Britaniya qadınları təsəvvüredilməz hüquqa - qazandıqları pulları özləri üçün yığmaq hüququna - malik oldular.(١) Bu ali məsihi əxlaq qanununu “Fabrik Sahiblərinin Avam Məclisi” İngiltərə qadınlarını fabrik və karxanalara işçi kimi gətirə bilməsi üçün qəbul etmişdi. Həmin illərdən indiyə qədər onların inkarolunmaz şəkildə mənfəət güdməsi qadınları ev-eşiklərindən didərgin salmış və canlarını mağaza və dükanlarda tələf etmələrinə (səbəb olmuşdur.”(٢

Texnika və maşınların sürətli inkişafı, günbəgün insanların həqiqi tələbat və ehtiyaclarının əksinə olaraq istehsalın artması və min cür hiylə və kələkbazlıqla istehlakın istifadəçilərə məcbur edilməsi zərurəti və görmə, eşitmə, ideoloji, hissi istedad və şəhvətəyönəli bütün xidmətlərdən insanı qeyri-iradi olaraq



---

Doktor Əli Şayeqan “İran ictimai qanununun şərhi” kitabının ٣۶٢-ci səhifəsində . [١] -١ yazır: “Qadının öz mülkiyyəti ilə əlaqədar sahib olduğu və şiə fiqhinin də təsdiqlədiyi müstəqillik yunanlar, roma və jermenlərdə və bir müddət əvvələ qədər ölkələrin hüquq sistemində mövcud deyildi, yəni uşaq və divanələr kimi öz malında təsərrüf etmək onun üçün qadağan idi. Qadın şəxsiyyəti ərinin şəxsiyyətində fəna və məhv olan İngiltərədə ١٨٧٠ və ١٨٨٢-ci illərdə “ərli qadınların mülkiyyət hüququ” adı ilə qəbul .edilən iki qanun qadınların üzərindən bu qadağanı qaldırdı

.Fəlsəfənin ləzzətləri”, səh. ١۵۵-١۵٩“ . [٢] -٢

istehlakçı amilinə çevirmək bir daha sərmayədar və kapitalistləri qadının vücudundan kişilərlə istehsalda şərik bir işçi qüvvəsi kimi deyil, onların gözəllik və cazibəsindən qadınların şərafət və heysiyyətlərini girov qoyaraq iradələrin, düşüncələrin dəyişdirilməsi və istehlakçılara istifadəni məcbur etmək sahəsində faydalanmağa vadar etdi. Aydındır ki, bütün bunlar "qadının azadlığı və onların kişilərlə bərabərliyi" .adı ilə əldə olunmuşdur

Siyasət də bu amillərə xidmət etməkdə heç də geri qalmamışdır. Onunla əlaqədar məlumatları qəzet və jurnallardan əldə etmək mümkündür. Bütün bunların həyata keçirilməsində qadının vücudundan faydalanılmış və ona "azadlıq" və "bərabərlik" .donu geyindirilərək kişinin məqsəd və hədəfləri üçün istifadə edilmişdir

Aydın məsələdir ki, XX əsrin cavanları da bu baha qiymətli fürsətdən istifadə etməkdə qafil olmamış, onu daha tez və asanlıqla tovlayıb ələ gətirmək üçün qadının çarəsiz və biçarəliyinə hiyləgərcəsinə göz yaşı tökmüş və bu müqəddəs cihadda iştirak edə bilməsi və qadından faydalanması səbəbilə evlənməyini qırx illərlə təxirə salmışdır ki, .həmişə subay qala bilsin

Yaşadığımız əsrdə qadınların üzərindən bir sıra problem və çətinliklərin götürüldüyünə şübhə yoxdur, amma sözümüzün canı bununla yanaşı digər bəla və bədbəxtliklərin də ona bəxş olunmasındadır. Nə üçün? Görəsən, qadın bu iki çətinlikdən birinə məhkum və onlardan birini seçməyə məcburdurmu? Yoxsa, özünün keçmişdəki çətinlik və !?gələcəkdəki bəlalarından xilas olmasında heç bir maneə yoxdur

Həqiqət heç bir məcburiyyət və cəbrin olmamasındadır. Qadının keçmişdəki problem və bədbəxtliyinin səbəbi onun insan olmasının, hazırkı çətinliklərinin səbəbi isə, bilərəkdən və ya səhvən onun fitri və təbii mövqeyi, missiyası, maddi və mənəvi tələbləri, xüsusi istedadlara malik və qadın olmasının unudulmasında idi. Təəccüb olunası məsələ kişi və qadının fitri və təbii fərqlərindən söhbət açılarkən bir dəstənin onu kişinin kamilliyi və qadının isə naqisliyi, bir sözlə, naqis və kamilliyin məsələyə dəxli olmadığını unudaraq kişinin bir sıra

xüsusiyyətlərdən yararlanması və qadının həmin xüsusiyyətlərdən məhrum olmasına səbəb olan amillər kimi qiymətləndirməsidir. Xaliq onlardan birini kamil, digərini naqis, eyni zamanda, birinin bütün imkanlardan istifadə etmək qabiliyyətinə malik, digərinin isə məhrum olaraq yaratmaq istəməmişdir. Məntiqli və hikmətli izahdan sonra, həmin qrup: "Qadına təbiəti baxımından zülm edilərək zəif və naqis yaradıldığı üçün biz də ona zülm edərək zülm üstünə zülmü artırmalıyıqmı?"-deyir. Əgər qadının təbii zəiflik və naqisliyini görməzdən gəlsək, insanlıq baxımından daha düzgün əməl etmiş ?olmarıqmı

Həqiqətdə, məsələ bunun əksinədir. Qadının təbii və fitri xüsusiyyətlərinə diqqət edilməməsi onun hüquqlarının daha da tapdalanması və zay olmasına səbəb olacaqdır. Əgər kişi qadın müqabilində cəbhə tutsa və desə ki, sən də mənimlə eyni səviyyədə işləri, məsuliyyət və vəzifələri, mükafat və cəzaları paylaşmalı, çətin işlərdə mənimlə şərik olmalı, sərf etdiyin əmək müqabilində muzd almalı, məndən özünə ehtiram və himayə gözləməməli, bütün məişət ehtiyaclarını özün öz öhdənə götürməli və mənim sənə xərclədiyim pul miqdarında sən də mənə pul xərcləməli, övladların xərclərində mənimlə müştərək olmalı və xətərlər qarşısında özün-özünü müdafiə etməlisən və s. bu zaman qadının vəziyyəti daha da çətinləşər, çünki qadının təbiət baxımından qüvvəsi kişiyə nisbətdə az, amma sərvət və nemətləri məsrəf və istehlakda isə çoxdur. Ayrıca, qadının aylıq xəstələnməsi (menstruasya dövrü), hamiləlik dövrünün narahatlıqları, uşağın dünyaya gətirilməsinin çətinlikləri və südəmər körpənin xərcləri qadının ərinin himayəsi və daha çox gəlirə ehtiyaclı olmasına zəminə yaradır. Bunlar təkcə insana aid olan xüsusiyyətlər deyil, cütlük şəklində yaşayan bütün canlılar da bu cürdür. Bu tipli canlılarda erkək olan cins dişi .cinsi instinktiv olaraq himayə edir

Kişi və qadının hər birinə onların insanlıq və müştərək hüquqlarda azad və bərabər olmasını, həmçinin, təbii və fitri xüsusiyyətlərini nəzərə alaraq diqqət etdikdə, qadının özü və şəxsiyyətinin sarsılmadığı və zərər dəymədiyi münasib bir mövqedə olduğunu .anlayırıq

Azacıq da olsa, kişi və qadının təbii və fitri xüsusiyyətlərini unudaraq təkcə onların azadlıq və bərabərliyinə əsaslananların hansı nəticəyə çatdıqları barədə məlumat əldə etmək üçün, yaxşı olar ki, bizdən əvvəl bu yolda qədəm götürmüş və yolun sonuna çatmış şəxslərin fikir və düşüncələrinə müraciət edərək onların bu barədə nə dedikləri .və nə yazdıqlarına diqqət edək

cü ildə (şəmsi-qəməri) çap edilən jurnalın ۷۹-cu sayında "Şəhrbani" jurnalı-۱۳۳۴ tərəfindən "Amerika cəmiyyətindəki işçi qadınların sərgüzəştləri" adı ilə əlli üç məqalə nəşr edilmişdir. Bu məqalələr "Krunt" jurnalından edilən tərcümələrdir. Onlar oxunulası və müfəssəl məqalələrdir. Məqalədə işçi qadınlardan birinin ürək ağrısı ilə "əvvəllər kişilərlə qadınlar arasında azadlıq və bərabərliyin gözlənilməsi və kişilərdən fərqli olaraq qadınlara iyirmi beş punddan (ağırlıq ölçü vahidi) artıq çəkidə yüklərin qaldırılmasına icazə verilmədiyi, indi isə bunların aradan qaldırılmış olduğunu" deməsi qeyd edilmişdir. O, belə deyir: "Ohayo ştatının "General motors" adlı şirkətində, başqa sözlə desək, iki min beş yüz qadının əziyyət və zəhmətə qatlaşdığı həmin yerdə "...vəziyyət və şərtlər dəyişmişdir

Barəsində danışdığımız qadın bir qədər əvvəl öz qarşısında bir kişinin iyirmi beş pundluq iri və ağır buxar maşınını yerə qoyduğu və onu təmizləməli olduğunu qeyd edərək (kişinin) öz-özünə belə dediyini eşidir: "Əldən-ayaqdan düşərək yoruldum. Hər gün bir dəqiqə ərzində iyirmi beş və əlli inç (ağırlıq ölçü vahidi), yəni otuz beş punda bərabər çəki arasında olan qəlibləri buxarılardan qarmaqlara asmalıyam. Əllərim də ".həmişə şişkindir və ağrı verir

Məqalə daha sonra əri dəniz qoşunlarında dənizçi olan digər bir qadını dilə gətirir və onun narahat və həyəcanla təşvişə düşərək həyat yoldaşının son zamanlarda kişilərə məxsus gəmiyə bir neçə qadın işçi götürmək fikrində olduğunu deməsinə səbəb olur. O yazır: "Dəniz qüvvələri komandanlığı içərisində qırx qadın və dörd yüz səksən dənizçi olan gəmi heyətini təlimata göndərir. Bu kişi və qadından ibarət qarışıq heyət birinci səfərdən sahilə qayıtdıqda, yerli olaraq dənizçilərin

xanımlarının narahatlığına səbəb olur və tezliklə məlum olur ki, gəmidə təkcə eyş-işrət və eşqbazlıqla bağlı macəralar baş verməyib, eyni zamanda, həmin qadınların ".əksəriyyəti bir nəfər dənizçi ilə deyil, onların bir neçəsi ilə cinsi əlaqədə olmuşlar

Ardınca yazılır: "Florida ştatında dul qadınların bataqlıqdakı azadlığı sonrakı narahatçılığa səbəb olur. Həmin ştatın Tomas Testa adlı bir hakimi son zamanlarda dul qadınlar üçün təyin edilmiş beş yüz dollar həcmindəki dəyər vergisinin qeyri-qanuni olmasını elan etməklə bu qanunun kişilərin əleyhinə ayrı-seçkilik yaratdığını ".vurğulayır

Sözlərinə davam edərək Maq Daniyel adlı bir qadının əllərində yanğı hiss etməsi və xanım Ostonun (həyat yoldaşı gəmidə dənizçi olmuşdur) iztirab və təşvişə düşməsinə səbəb olmasını və Floridadakı dul qadınların nağd pulla cərimə olunduğunu və digər qadınların da öz azadlıqlarını müəyyən miqdarda dada biləcəklərini qeyd edir. Hamının zehnində bu sual canlanır ki, görəsən, qadınlar bundan əvvəl əldə etdikləri bütün şeyləri itirmədilərmi? Artıq bəhs faydasız və kifayətdir, çünki oyun başlamış və .tamaşaçılar öz yerlərini tutmuşlar

Bu il Amerikanın konstitusiyasında ٢٧-ci islahat qanununun qəbul edilməsi və bununla əlaqədar cinsi məsələlərdən əldə edilən bütün üstünlüklərin qeyri-qanuni olmasının elan edilməsi nəzərdə tutulmuş və beləliklə, Harvard universitetinin hüquq müəllimi olan Resko Bavendin öz bəyanatlarında qadın azadlığının Amerikada qadının hüquqları ilə bağlı qanunların təəssüfləndirici nəticələrinin mənşəyinə çevrildiyini deməsi .həqiqətə uyğundur

Şimali Karolina ştatının senatorlarından biri olan Cey Ervin Amerikadakı cəmiyyətlə bağlı mütaliələrindən sonra kişi və qadını bərabər və eynihüquqlu elan etmək təklifini irəli sürərək bütövlükdə, ailə qanunlarının dəyişdirilməsini və kişilərin ailənin məişət ehtiyaclarının təmin etməklə bağlı qanunda nəzərdə tutulan məsuliyyətliliyinin aradan .qaldırılmasını bildirir

Məqalədə xanım Maq Daniyelin "Qadınlardan biri işdə ağır çəkini qaldırma səbəbilə daxili qanaxmaya mübtəla olmuşdur. Biz istəyirik ki, əvvəlki günlərə qayıdaq və kişilər bizimlə işçi

qüvvəsi kimi deyil, bir qadın kimi rəftar etsinlər. Qadın azadlığının tərəfdarı olan kəslərin bər-bəzəkli və cah-cəlallı otaqlarda oturaraq "kişi və qadınlar bir-birilə bərabərdirlər" -deməsi çox asandır. Onların - həmin tərəfdar və sahibkarların yolunun indiyə qədər iş yerlərinə tərəf düşdüyü görülməmiş və günəmuzd qadınların hansı zəhmətə qatlaşdığı və canlarından olduğunu da bilmirlər. Mən belə bərabərliyi istəmirəm, çünki kişilərə məxsus olan bu cür işlərin öhdəsindən gələ bilmirəm. Əgər əmək məşğuliyyəti ilə bağlı bizimlə kişilər arasında rəqabət apararaq işlərimiz müqayisə olunsa, mən öz üzərimə düşən işi öhdəmə götürərək onlarla rəqabətdən kənara çəkilərəm. Ohayo ştatındakı işçi qadınların əldən verdikləri imtiyazlar işçiləri himayə edən qanuna əsasən əldə edilən imtiyazlardır. Biz bir qadın olaraq öz şəxsiyyətimizi əldən vermişik. Mən azad olduqdan sonra nəyə sahib olduğumuzu anlaya bilmirəm. Əlbəttə, müəyyən sayda qadınların vəziyyətinin yaxşılaşdığı deyilə bilər, amma bizim onlardan (azad şəxslərdən) olmadığımız aydın məsələdir." - dediyi .də qeyd edilmişdir

Bu, nəzərinizə çatdırılan məqalənin xülasələşdirilmiş formasıdır. Məqalənin mətnindən bütün bu qadınların "azadlıq" və "bərabərlik" adı ilə məcbur edilən məsələlərdən yorularaq bu iki sözə - həmin iki sözün bu sahədə təqsirli olmadığını unudaraq - düşmən olduqları anlaşılır. Kişi və qadın müxtəlif qütbdə olan iki ulduz kimidir. Onların .hər biri öz oxu və istiqaməti ətrafında hərəkət etməlidir

Nə günəş aya çata (yetişə), nə də gecə gündüzü ötə bilər. Günəş, ay və ulduzların hər" (biri özünəməxsus bir göydə (öz oxu ətrafında və dairəsində) üzər."(١)

Həqiqətən də, bəşər cəmiyyətində kişi ilə qadının səadət və xoşbəxtliyinin əsl şərti bu iki cinsin hər birinin öz oxu ətarafında hərəkətini davam etdirməsindədir. "Azadlıq" və "bərabərlik" onların heç birinin öz fitri və təbii olan ox və mərkəzlərindən xaric olmadığı .zaman faydalı ola bilər



---

.Yasin" surəsi, ayə ۴٠" . [١] -١

Cəmiyyətdə narahatlıq və problem yaradan məsələlər təbiət və fitrətin əleyhinə atılan .addımlardır, nəinki, digər məsələlər

Bizim “qadının ailə və cəmiyyətdəki hüquq sistemi” məsələsinin yenidən nəzərdən keçirilməli olduğunu və keçmiş nəzəriyyələrlə kifayətlənməməyi iddia edməyimiz birincisi, təbiəti özümüzə bələdçi və yol göstərən seçməyimiz, ikincisi, keçmiş və hazırda əldə edilən acı və şirin təcrübələrdən faydalı nəticələr çıxarmağımız mənasındadır. Yalnız və yalnız bu zaman qadın hüququ barədəki hərəkatlar özünün .həqiqi mənasında gerçəkləşəcəkdir

Dost və düşmənlər Qurani-Kərimin qadın hüquqlarının müdafiəçisi olmasında müttəfiq və fikir birliyinə malikdirlər. İslama müxalif olanlar ən azı, nazil olduğu dövrü nəzərə aldıqda, Quranın qadın və onun insanlıq hüququ ilə bağlı bir sıra faydalı məsələləri nəzərdə tutaraq bu barədə əhəmiyyətli addımlar atdığı fikrindədirlər. Bununla yanaşı, Quran qadını bir insan və kişilərə şərik olaraq qiymətləndirərkən onun “qadın” və kişinin də “kişi” olmasını heç vaxt nəzərdən qaçırmamışdır. Başqa bir ifadə ilə desək, Quran qadını təbiətinin tələbinə uyğun olaraq nəzərdə tutmuşdur. Bu baxımdan, Quranın əmr və göstərişləri qadının təbiəti ilə uyğunluq təşkil edir. Quranda barəsində söhbət edilən qadın eynilə, xaric aləmi və təbiətdə mövcud olan qadındır. Biri təkvini (təbiət) və digəri yazılmış olaraq yaradılan (Quran) bu iki ilahi kitab bir-biri ilə oxşarlıq və eynilik təşkil edir. Əgər bu silsilə təşkil edən məqalələrdən hansısa yeni və xeyirli .düşüncələr əldə olunarsa, bu, həmahənglik və uyğunluqla izah olunmalıdır

Möhtərəm oxuculara təqdim etdiyimiz və ailə məsələləri ilə əlaqədar barəsində bəhs edilən mövzular bizim tərəfimizdən xüsusi olaraq toplanılan və ۱۳۴۵-۱۳۴۶-cı (hicri-şəmsi) illərdə “Günün qadını” jurnalında “Qadın islami hüquqlarda” adı ilə nəşr edilərək .diqqəti cəlb edən məqalələr silsiləsindəndir

Mövzunun (bəhsimizin) əvvəli və baş verən cərəyanlardan xəbərsiz və işimizlə yenicə tanış olan kəslər üçün ola bilsin ki, bu məqalələrin onlarda dəyişiklik edilmədən toplanması və ilk dəfə

olaraq həmin jurnalda çap edilməsi və zərurət təşkil edən mətləblərin xüsusi olaraq seçilməsi təəccüb doğursun. Bu baxımdan, məqalələrin yaranması səbəblərini :diqqətinizə çatdırmaq istəyirəm

Min üç yüz qırx beşinci (hicri-şəmsi) ildə “ailə hüququ” ilə bağlı edilən qanun dəyişikliyi irəli sürülən təklif və nəzərlərin Quranın açıq-aşkar nəss(۱) və dəlillərinə zidd olması cəhətindən İrandakı müsəlmanlar arasında narahatlıq və xüsusən, qadınlarla əlaqədar nəşr olunan qəzet və jurnallarda səs-küy yaranmasına səbəb oldu. Hamıdan daha çox və daha kəskin şəkildə hakim İbrahim Məhdəvi Zəncani (Allah ona rəhmət eləsin) etiraz etməyə başladı. Adı çəkilən şəxs həmin səbəblə qırx madədən ibarət bir layihə hazırlayaraq onu qeyd etdiyimiz jurnalda nəşr etdirməyə nail oldu. Məqalələr ogünkü dövrün tələblərinə uyğun olaraq oxucuların bu maddələrlə bağlı rəy və fikirlərini qeyd edə biləcəkləri şəkildə çap olunmuşdu. Hakim İ.M. Zəncani jurnalda irəli .sürdüyü həmin maddələrlə bağlı təklifləri müdafiə edəcəyinə vədə vermişdi

O günlərdə Tehranın məqam sahibi və möhtərəm ruhanilərindən biri İ.M. Zəncaniyə zəng edərək “iştirak etdiyi məclislərin birində “Keyhan müəssisəsi və informasiya agentliyinin müdirləri ilə həmin mətləblərlə əlaqədar onların da nəşr etdirdikləri qadın jurnallarında olan iradlarla bağlı söhbət apardığını” - deyir. Hakim İ.M.Zəncani ona “əgər hansısa bir irad və ya bu barədə demək istədiyi mətləb varsa, onu eynilə olduğu kimi jurnalda çap etdirəcəyini” - bildirir. Tanınmış ruhani bu məsələni mənə danışdıqdan sonra, fürsət və imkan daxilində həmin məqalələri nəzərdən keçirməyi və ona gərəkli düzəlişlər edə və haşıyələr yazaraq jurnalın sonrakı sayına təqdim etməyimi təklif etdi. Mən dedim: “Jurnalın bütün saylarında çap ediləcək məqalələrə haşiyə yazmağa razı deyiləm, lakin hakim İ.M.Zəncaninin qırx maddədən ibarət irəli sürdüyü və öz təkliflərini müdafiə etmək məqsədilə “Günün qadını” jurnalında nəşr etdirmək istədiyi məqalələrə öz nəzərlərimi yaza bilərəm və



---

Nəss - Quranda hansısa bir hökmün yerinə yetirilməsi və ya yetirilməməsi ilə . [۱] -۱ .bağlı göstəriş

bu yolla hər ikimizin fikirləri ümumi camaatın ixtiyarında qoyula bilər.” Həmin ruhani məndən bu barədə bir qədər düşünmək və əlaqəli şəxslərlə məsləhətləşmək üçün ona vaxt verməyimi xahiş etdi. Bir müddətdən sonra yenidən mənimlə təmas saxlayaraq bu məsələyə razı olduqlarını vurğuladı. O, redaksiyaya məktub yazaraq islami fiqhlə uyğunluq təşkil etdiyi miqdarda həmin qanunları müdafiə etməyə hazır olduğunu bildirdi və tələb etdi ki, hakim İ.M.Zəncani və mənim nəzərlərimiz jurnalda bir-biri müqabilində nəşr edilsin. Eyni zamanda, redaksiyanın qəbul edəcəyi təqdirdə, məktubunun da məqalələrlə yanaşı çap edilməsini istədi. Redaksiya bu təklifi qəbul edərək məktubu ۰۷/۰۸/۱۳۴۵-ci (hicri-şəmsi) il tarixdə nəşr etdirdiyi jurnalın ۸۷-ci sayında .dərc etdi və birinci məqalə jurnalın ۸۸-ci sayında işıq üzü gördü

Mən əvvəllər “qadın hüququ” barəsində İ.M.Zəncaninin kitablarından birini mütaliə etmiş və onun bu mövzularla bağlı məntiq və fikirləri ilə tanış idim. Bundan əlavə, uzun illər idi ki, “İslamda qadın hüququ” mövzusu mənim diqqətimi özünə cəlb etmişdi və mən bu barədə çoxlu məlumat və materiallar toplayaraq diskussiya və fikir mübadiləsi aparmağa hazır idim. Hər ikimizin yazdığı məqalələr jurnalda üzbəüz səhifələrdə .yerləşdirilmiş şəkildə nəşr edildi

Təbii ki, mən mətləbə Zəncaninin barəsində bəhs etdiyi mövzuya uyğun olaraq başlamışdım. Bu silsiləvi məqalələrin nəşr edilməsi adı çəkilən şəxsə həddən artıq çətinlik və baş ağrısı yaratdı və o, altı həftədən sonra ürək dayanmasından dünyasını dəyişərək onun ünvanına tuşlanan suallara cavab verməkdən birdəfəlik yaxa qurtardı. Həmin altı həftə ərzində bu məqalələr oxucular arasında öz yerini tuta bildi və maraqlananlar redaksiya və məndən məqalələrin yazılmasının davam etdirilməsini xahiş etdilər. Oxucuların bu istəyi qəbul olundu və beləliklə, məqalələrin sayı otuz üçə .çatdı. Nəzərinizə çatdırırıq ki, məqalələr bu qayda ilə yaranıb ərsəyə çatmışdır

Nəşr edilən otuz üç məqalədə yalnız nəzərdə tutulan mətləblərin yazılması və bir sıra mövzuların kənarda qalmasına baxmayaraq, mən yorğunluq və başqa məsələlərlə məşğul

olmağım səbəbilə onları tənzimləyə bilmədim. Çoxlu sayda oxucu və maraqlananların tələbini nəzərə alaraq, mən həmin məqalələri jurnalda yenidən çap etdirmədim, çünki onları daha da təkmilləşdirmək və “İslamda qadın hüquq sistemi” adı altında və bir kitab şəklində nəşr etdirmək fikrində idim. Bu məqalələrdə toxunulan mövzular :aşağıdakılardan ibarətdir

Elçilik”, “müvəqqəti evlilik (mütə)”, “qadın və ictimai müstəqillik”, “İslam və həyatın“ yenilənməsi”, “Quranda qadının məqamı”, “heysiyyət və insanlıq hüququ”, “ailə hüququnun təbii mənbə və əsasları”, “kişi və qadının fərqləri”, “mehriyyə və nəfəqə”, .”“irs”, “boşanma (talaq)”, “qadınların (zövcələrin) sayı

:Barəsində məlumat topladığımız və yerdə qalan mövzular bunlardır

Kişinin ailədə idarəçilik hüququ”, “uşağın xərcləri ilə bağlı hüquqlar”, “iddə(١) və onun“ fəlsəfəsi”, “qadın və ictihad və fətva”, “qadın və siyasət”, “qadının qəzavət məsələlərində rolu”, “qadının cəza məsələlərində rolu”, “qadının əxlaq və tərbiyəsi”, “qadının geyimi”, “qadının cinsi əxlaqı (qeyrət, həya, iffət və s.)”, “analıq məqamı”, ”.“qadın və evdən xaricdəki işlər, həmçinin, bir sıra digər məsələlər

Əgər Allah tofiq əta eləsə, bu mövzuları kitabın ikinci cildi olaraq nəşr və çap etmək .fikrindəyik. Allahdan müvəffəqiyyət və uğur diləyirik

.(Qəlhək, Şəhrivər, ١٣٥٣-cü il (hicri-şəmsi

.Mürtəza Mütəhhəri

## ÖN SÖZ

### İşarə

Günün qadını” jurnalının ailə məsələlərilə əlaqədar aparılan qanun dəyişikliyi ilə bağlı“ qırx maddədən ibarət irəli sürülən təklifə mənim nəzər yazmağımı və əvvəlki səhifələrdə qeyd etdiyimiz tanınmış ruhaninin məktubu ilə birgə jurnalda nəşr .etdirilməsinə razı olaraq qəbul etməsi məndə çox xoş təəssürat yaratdı

Mənə verilən həmin fürsəti qənimət bilirdim, çünki bu yolla

---

İddə“ – qadının ərindən boşandığı və ya əri öldüyü zaman, gözlədiyi vaxt“ . [۱] -۱
.müddətinə “iddə“ deyilir

İslamın ictimai fəlsəfəsinin cavanlar arasında yaya bilmək imkanına malik olacaqdım. Ümidvaram ki, cavanların islami baxımdan ailə münasibətləri ilə əlaqədar olan .məsələləri anlaması üçün onlara yardımçı ola bilərəm

Öz məktubumda da qeyd etdiyim kimi, mən qəbul edilən ictimai qanunu müdafiə etmək və onun kamil və yüz faiz islami qanunlara uyğun və ictimai meyarlar baxımından, düzgün olduğunu iddia etmək məqsədini güdmürəm. Mənim də həmin qanuna iradlarımın olması mümkündür. Eyni zamanda, camaat arasında yayılmış və qəbul edilən üslubun doğru və ədalətə uyğun olduğunu da qəbul etmirəm. Əksinə, mən özüm də aydın şəkildə ailə münasibətlərindəki xaos və nizamsızlıqları müşahidə edərək görür və bu əqidədəyəm ki, ailə zəminində əsaslı və köklü islahatlar həyata .keçirilməlidir

Amma "İran konstitusiyası və ictimai qanunlarına irad", "Müqəddəs əhd-peyman, yoxsa, evlilik andı" kitablarını qələmə alan yazıçıların əksinə, mən İran kişilərini yüz faiz olaraq günahsız kimi tanıtdırmır və bütün təqsirləri qəbul edilən ictimai qanunlarda görmür və həmin qanunların İslam fiqhindən qaynaqlandığını söyləmir və məsləhət və yeganə həll yolunun həmin qanunun maddələrində dəyişiklik etməkdə olduğunu demirəm. Mən ər və arvadın bir-birinə, övladları və ya digər fərdlərə nisbətdə İslamda nəzərdə tutulan hüquqlarını aradan qaldıran və onların dəyişdirilməsinə təkid edən qanunları bu məqalədə bircə-bircə tədqiq edə və dəqiq psixoloji, təbii və ictimai araşdırmalara əsaslanaraq sübut edəcəyəm ki, kişi və qadın insanlıq baxımından bir-biri ilə bərabərdir və ailə münasibətlərinin icra və əməl məqamında təşkili üçün ən .yaxşı zamindirlər

Əziz oxucularımızdan nəzərdə tutulan bəhsə daxil olmadan öncə, aşağıdakı bəzi :mətləblərə toxunmaq üçün icazə istəyirik

### Ailə münasibətlərinin dünyəvi problemləri

Bizim zamanımızda ailə münasibətləri ilə əlaqədar problemlər nə bir o qədər asan və .١ sadə deyil ki, gənclər - onların düşüncə və təfəkkür səviyyəsinin nə dərəcədə olduğunu

görmüş və eşitmişik – seminar və konfranslar təşkil edərək onu həll edə bilsin, nə bu məsələ təkcə bizim ölkə və məmləkətə məxsusdur və nə də digərləri onu həll etmiş və .ya həqiqi həll yolunu bildiklərini iddia etmişlər

Məşhur “Tarix və sivilizasiya” əsərinin müəllifi filosof və yazıçı Vil Dorant deyir: “Əgər iki mininci ildə məsihi olduğumuzu və XX əsrin rəbiül-əvvəl ayında dünyada hansı böyük hadisənin baş verəcəyini bilmək istədiyimizi fərz etsək, anlayacağıq ki, bu, nə müharibə, nə də Rusiya hərəkatıdır, əksinə qadınların vəziyyətinin dəyişməsidir. Tarix qısa müddət ərzində belə bir sarsıdıcı dəyişikliyi görməmişdir və ictimai asayişin dayaqları hesab edilən kilsələr, insanın şəhvət və əxlaqi fəsadlarına mane olan evlilik və qadına sahib olmaq və bizi vəhşilikdən xilas edərək mədəniyyət və sivilizasiyaya yiyələnməyimizə səbəb olan əxlaq qanunları – bunların hamısı açıq-aşkar bu nəql olunma və inteqrasiyada bizim düşüncə və təfəkkürümüzə təsir edə və adət-ənənə, həyat və yaşayış tərzi kimi formalaşaraq qeyd etdiyimiz sahələrin giriftarçılığa düçar ”.olmasına səbəb olmuşdur

İyirminci əsrin üçüncü rübündə yaşamağımıza baxmayaq, Qərb mütəfəkkirlərinin ailə münasibətlərinin dağılması və evlilik təməllərinin yıxılmasından, cavanların evlilik məsuliyyətinin yükü altına girməkdən boyun qaçırması, analarından nifrət etmələri, ata-ananın bir-birlərinə, xüsusən də, övladlarına qayğı və isti münasibət bəsləməsinin azalması, bugünkü dünyada qadının pozğunluq və fahişəliyi, həqiqi hislər və məhəbbətin öz yerini səthi və keçici hislərə verməsi, talaq və boşanma hallarının daimi olaraq artımı, heyrətamiz şəkildə qeyri-qanuni və qeyri-şəri (bic və ata-anası bilinməyən)) uşaqların dünyaya gəlməsi, evlilər arasında səmimiyyət və vəhdətin nadir .hallarda olması məsələlərindən söhbət açmaları heç də gözlənilməz deyil

**?Müstəqil olaq, yoxsa, Qərbi təqlid edək**

Bəzi bixəbər və məlumatsız şəxslərin ailə münasibətlərini sürücülük, taksi və avtobusların idarə edilməsi, elektrik və santexnika işlərinin görülməsi kimi təsəvvür etməsi və Avropa

və Qərbin, guya, uzun illərdir ki, bu məsələləri daha yaxşı həll etdiyini və bizim isə onlardan geridə qaldığımızı və bacardıqca tez bir zamanda onlara təqlid etməli olduğumuzu düşünməsi təəssüf doğurur. Bu, bir təxəyyül və xülyadır. Onlar həmin məsələlərdə bizdən daha biçarə və giriftar, eyni zamanda, lider və öndərlərinin bu baxımdan fəryad və ah-naləsi daha da ucadır. Qadının elm və təhsil alması məsələsini demirəm, digər məsələlərə nəzər saldıqda, onların daha pis vəziyyətdə olduğu və ailə .səadəti və xoşbəxtliyindən binəsib və bəhrələnmədikləri göz qabağındadır

### Tarixin cəbr və məcburiyyəti

Bəziləri də fərqli və başqa cür düşüncə və təsəvvürə malikdirlər. Onlar ailədəki nizamın sarsılması və fəsadın ona yol tapmasını qadın azadlığının nəticəsi və bu azadlığın da sənaye həyatının tənəzzülü, elm və mədəniyyətin inkişaf etməsinə səbəb hesab edirlər. Başqa sözlə, bu, tarixin məcburiyyətidir və ona boyun əymək, ailədəki fəsad və nizam-intizamsızlığa göz yummaqdan və keçmişdə mövcud olan ailə .səadətindən vaz keçməkdən başqa, çarə yoxdur

Əgər bu cür fikirləşiriksə, çox səthi və yüngül düşüncəyə malik olduğumuz anlaşılır. Biz sənaye inkişafının ailə münasibətlərində istər-istəməz təsirli olmasını qəbul edirik, amma Avropada ailə münasibətlərindəki nizam-intizamın aradan qalxmasına digər iki :ümdə amil səbəb olmuşdur

Birincisi, bu əsrdən əvvəl onlar arasında zalım və cahilanə qanun və adətlərin icra və cari olması hakim idi, yəni ilk dəfə olaraq on doqquzuncu əsrin sonu və XX əsrin .əvvəllərində Avropada qadının mülkiyyət hüququna malik olması idi

İkincisi, qadınların vəziyyət və əhvalını dəyişmək fikrinə düşən kəslər bizim zamanımızda bəzi üzdən iraq mütəfəkkirlərin seçdikləri yoldan getdilər və qırx maddədən ibarət təklif də onun açıq-aşkar göstəricisidir. Onlar qadının qaşını .düzəltdikləri yerdə, vurub gözünü çıxartdılar

Sənaye həyatının bu cür zərər və xaosun yaranmasına hakim olmasından əvvəl, Avropanın keçmiş və qədimki qanun və

islahatları ona hakim oldu. Nəticədə, Şərqdə yaşayan biz müsəlmanların da onların düşdükləri hər bir bataqlığa düşməyimiz və getdikləri yolları getməyimizi zəruri edən heç bir qaçınılmazlıq yoxdur. Biz Qərb həyatına ayıq və düşüncəli olaraq diqqət etməliyik, çünki onlara təqlid edərək əldə etdiyimiz elm və texniki inkişaf, adət və ənənələr və onlara baha başa gələn və bəlaya çevrilən minlərlə qanunlardan – İranda ailə intizamı ilə əlaqədar edilən qanun dəyişikliyi və onun Avropa qanunları ilə .ayaqlaşdırılması da onlardan biridir – ehtiyat etməliyik

**Biz və konstitusiya**

İrəli sürülən təkliflərin qadınlara zidd, ictimai, psixoloji və təbii tələblərə müxalif .٢ olmasını nəzərə almadan, (sonradan bu məsələləri izah edəcəyik) konstitusiya ilə uyğunluğu barədə hansı düşüncələr mövcuddur? Konstitusiyada açıq-aşkar İslam qanunlarına zidd və müxalif olan qanunuların qüvvədən düşdüyü və Milli Məclisdə səsə qoyulma qabiliyyətinə malik olmadığı bildirilmişdir. Digər tərəfdən, təklif edilən qanunun bir sıra maddələri İslam qanunları ilə aşkar şəkildə müxalifdir. Görəsən, qərblilər onlara kor-koranə və gözüyumulu meyilli olan kəslərə öz ölkələrinin ?konstitusiyasını bu cür oyun-oyuncağa çevirməyə razı olarlarmı

Din və məzhəbi nəzərə almadan, hər bir ölkənin vətəndaşları üçün onun konstitusiyası müqəddəsdir. İran konstitusiyası da İran millətinin nəzərində möhtərəm və ehtirama layiqdir. Görəsən, millət vəkillərinin konfrans və toplantılar kecirməsi, canfəşanlıq ?etmə və fəaliyyət göstərməsi ilə konstitusiyanı ayaq altında qoymaq olarmı

**İran cəmiyyətinin dini həssaslığı**

İrəli sürülən təkliflərin eyibli və konstitusiya ilə açıq-aşkar müxalif olmasına göz .٣ yumuruq. Hər bir məsələni inkar etsək də, İran xalqının ruhiyyəsinə İslami məzhəbə olan həssaslığın hakim olduğunu inkar edə bilmərik. Hər bir məsələyə ziddiyyətli yanaşan məhdud saydakı çox az bir qismi

və hərc-mərclik və müxalifətçiliyə tərəfdarlıq edən kəsləri çıxmaq şərtilə, camaatın .əksəriyyəti din və məzhəbə bağlıdır

Bəzilərinin verdiyi proqnozların əleyhinə olaraq, təhsil və elmlənmək bu millət arasında ayrılıq və fasilə yarada bilmədi, əksinə düzgün və səhih təbliğatın az, amma zəhərli və əks-təbliğatın çox olmasına baxmayaraq, elm və təhsil sahibləri günbəgün İslama .tərəf yönəlməyə başladılar

İndi sizdən soruşuruq ki, bu qanunlar istər-istəməz psixoloji zəminələrin olması ilə necə uyğunluq təşkil edir? Yəni, qanun ürfi cəhətdən İslam şəriəti ilə uyğunluq təşkil ?etməsə, ondan hansı nəticələr gözlənilə bilər

Hansısa bir qadının həyatındakı münaqişələr və çətinliklər ucbatından məhkəməyə müraciət etdiyini və ərinin razılığı ilə məhkəmənin də boşanma hökmü verdiyini və daha sonra onun başqa bir kişi ilə evləndiyini düşünün. Bu yenicə evlənmiş olan kişi və qadın ürfi qanunlar baxımdan bir-birini ər-arvad bilmələrinə baxmayaraq, öz məzhəbi vicdanlarının dərinliyində özlərini yad və əcnəbi, cinsi əlaqə və münasibətlərini qeyri-.şəri, övladlarını da zinazadə və cəzalarının edam edilmək olduğunu hesab edirlər

Belə bir halda, onlar üçün hansı psixoloji və ruhi gərginlik və narahatçılığın yarandığını və dost, qonum-qonşu arasında onlara və övladlarına hansı gözlə baxılacağını təsəvvür edin. Biz qanunda dəyişiklik etməklə insanların məzhəbi vicdanlarında dəyişiklik etməyə qadir deyilik. Ya təəssüf, ya da xoşbəxtlikdən, insanların əksəriyyəti .din və məzhəbi həssaslıqdan ayrı və kənar deyil

Əgər siz xaricdən psixoloq və ya hüquqşünas gətirərək camaatın psixoloji vəziyyətinin bu şəkildə olması səbəbindən qanun qəbul edə bilmədiyinizi desəniz və onunla məsləhətləşsəniz, görəsən, o, sizə bu şəraitə uyğun bir nəzər deyə biləcəkmi? O, sizə bu işin minlərlə ruhi və psixoloji çətinlik törədərək narahatçılıqlar yaradacağını ?deməyəcəkmi

Bu cür qanunların cəzavermə qanunları ilə müqayisədə daha çox fəsad və zərərlər yartdığını düşünmək yanlışdır. Onlar arasındakı fərqlər yerlə göy qədərdir. Cəzavermə və cinayət məcəlləsinə aid qanunlarda dəyişiklik və onların tətil olunması

sadəcə cəmiyyətə bir zərbədir və təkcə azğın və cinayətkarların fəaliyyətinə səbəb olur, lakin ər-arvad və övladlarla bağlı qanunların tətili insanların fərdi və şəxsi həyatları ilə əlaqədardır və hər bir fərdin şəxsi olaraq məzhəbi həssasiyyəti və hissləri ilə birbaşa müharibə etmək deməkdir. Belə qanunlar ya məzhəbiin nüfuzu və vicdanın qələbəsi ilə təsirsiz və fəaliyyətsiz qalaraq yaratdığı psixoloji və ruhi gərginlik və narahatçılıq səbəbilə ləğv edilir, ya da psixoloji çəkişmədən sonra məzhəbi ruhiyyəni .qüvvədən salaraq zəiflədir

**BİRİNCİ HİSSƏ**

**Elçilik və nişanlı olmaq**

Mən öz sözümə təklif edilən qırx maddənin toxunduğu həmin məsələ və mətləbdən başlayıram. O təkliflərdə birinci “ictimai qanundan” – elçilik və namizədlikdən bəhs edilir. “İctimai qanun” adı altında qeyd olunan elçilik və namizədlik məsələsi müstəqil şəkildə islami qanunlardan hesab edilmir, yəni bu barədə əlimizə İslamdan bizə aşkar şəkildə bir nəss və göstəriş çatmamışdır, həmçinin, ictimai qanunda bildirilənlər, guya, İslamın bütün hökmlərindən istinbat(١) edilərək ələ gətirilənlərə uyğundur və biz bu qanunu müdafiə etməkdə özümüzü mükəlləf bilmir və təklifi irəli sürən şəxsin böyük səhfə yol verməsi və onun bir neçə sadə maddəsini dərk etməkdə aciz olmasına baxmayaraq, onun nəzər və düşüncələrinin cüziyyatına daxil olmuruq. Bununla belə, .mən iki mövzuya toxunmaya bilmərəm

**?Görəsən, kişinin qadına elçi getməsi ona xəyanətdirmi**

Təklifi irəli sürən şəxs deyir: “Qanunu qəbul edən şəxs bu bir neçə (elçilik və . ١ namizədliklə əlaqədar) maddəni təklif etdikdə, irticaçı və qeyri-insani olan mətləbi – ,kişinin əsas



---

İstinbat –İslamın bir sıra qanunlarının fiqhi mənbələrin (ayə, hədis rəvayət və s.) . [١] -١ .araşdırılması ilə ələ gətirilməsidir

qadının isə əlavə (yardımçı) olmasını - də unutmamışdır. O, sadalanan həmin məsələni min otuz dördüncü maddəni - nikah (evlilik) və boşanma məcəlləsinin birinci :qanunudur - izləyərək bu şəkildə tənzimləmişdir

cü maddə - evlənməklə əlaqədar heç bir maneəsi olmayan qadınlara elçi gedilə-۱۰۳۴ .bilər

Başa düşüldüyü kimi, yuxarıdakı maddədə heç bir hökm və məcburiyyət qeyd olunmadığı halda, kişi üçün evlilik "qadını almaq" - mənasında nəzərdə tutulmuş və o (kişi), alıcı və müştəri ünvanında göstərilmiş, eyni zamanda, qadın da kişi müqabilində mal və əmtəəyə bənzədilmişdir. Bu cür ifadələr cəmiyyətin ruhiyyə və psixologiyasında həddən artıq xoşagəlməz və narahat vəziyyətlərin yaranmasına səbəbə olur, xüsusən də, kişi-qadın münasibətlərinə təsir edərək kişini ağa və müştəri, qadını isə mal və qul kimi nəzərə çarpdırır. "Bu dəqiq psixoloji müzakirələrin ardınca, məsələni "elçilik" adı altında xatırladan qarşı tərəf (qırx maddədən ibarət təklifi irəli sürən şəxs) məsələnin bir tərəfli və "qadını almaq" mənasında nəzərə çarpmaması üçün elçiliyi kişi və qadın üçün bir vəzifə hesab edir ki, evlilik nə "qadını almaq", nə də "kişini almaq" mənasına şamil olmasın. Əgər "qadını almaq" mənasında kişinin həmişə qadına elçi getməli olduğunu desək, qadının şəxsiyyət və heysiyyətini .alçaltmış və onu əmtəə və mal kimi qələmə vermişik

**Kişiyə ehtiyaclı olmaq qərizəsi tələbatdır, qadına ehtiyaclı olmaq isə naz-qəmzə**

Həqiqətdə, ən böyük səhv də elə buradadır. Həmin təklif mehriyyə və nəfəqənin ləğv olunmasına səbəb olmuşdur və biz öz yerində bu məsələ barəsində əsaslı şəkildə .söhbət açacağıq

Qədim zamanlardan etibarən, kişilərin qadınlara elçi getmə və evlənmək təklifi etməsi onların heysiyyət və şərafətinin qorunmasına ən yaxşı göstərici və dəlildir. Təbii cəhətdən kişi aşiq, məhəbbət arzusunda olan və tələb edən, qadın isə məşuq və tələb olunan kimi yaradılmışdır. Qadınla kişi gül və bülbül, şam və pərvanə timsalında xəlq edilmişdir. Kişinin vücudunda ehtiyac

və tələb, qadının vücudunda isə naz və qəmzənin yerləşdirilməsi xilqətin şahanə əsərlərindəndir, belə ki, yaradılışda qadının cismani zəifliyi kişinin güc və qüdrətli cismi .müqabilində bu vasitə (qadın tərəfindən cəlb olunma) ilə bərpa olunmuşdur

Kişinin ardınca düşmək qadının heysiyyət və şərafətinin xilafınadır. Kişi üçün hansısa bir qadına elçi gedərək ondan "rədd" cavabı almaq, sonra digər bir qadının qapısına getmək, nəhayət, bir nəfəri öz istəyi ilə zövcəsi olmağa razı salmaq qəbul olunasıdır, amma kişini öz təsir və cazibəsi altına salmaq və onun məşuquna çevrilməyə layiqli olan qadının gündə bir kişini dalınca düşməsi və rədd cavabı eşidərək digərinin .sorağında olması bəyənilən və qadına yaraşan bir iş deyil

Tanınmış Amerika filosofu Vilyam Ceymsin əqidəsinə görə qadınlardakı zərif şəkildə özünü büruzə verən çəkinmə və həya qərizə və instiktlə bağlı deyil, əksinə onların dəyər və qiymət, izzət və ehtiramı kişilərin arxasınca düşmədikdə, özlərini pozğun hala salmadıqda və kişilər üçün əl çatmaz olduqda daha çox nəzərə çarpır. Tarix boyunca qadınlar belə məsələləri öz qızlarına da öyrətmişlər. Həmin mətləb təkcə insan cinsinə məxsus deyil, heyvanlarda da məsələ bu cürdür və erkək heyvanların təbiətində özünü dişi heyvana ehtiyaclı kimi göstərmək xüsusiyyəti vardır. Dişi heyvanlar erkək heyvanın iradə zəifliyindən istifadə edərək ona ən həssas olan qəlbi vasitəsilə təsir .edir və şikarını ələ keçirmək və daha çox özünə tabe etmək və ələ almaq üçün çalışır

## Kişi qadının köləliyi deyil, onun vüsalı intizarındadır

Görəsən, nə üçün ictimai qanun kişini "qadın alıcısı" kimi qələmə verir? Əvvəla, bu məsələ ictimai qanuna aid deyil, yaradılış qanununa əsasəndir. İkincisi, hər hansı bir alıcılıq (alış-veriş), bəyəm, əşyaya malik və sahib olmaq və onun mülkiyyətçiliyi baxımındandırmı? Tələbə və şagird elmin, təlim almaq istəyən müəllimin və istedad sahibi isə sənətkarın xəridarıdır. Belə olduğu təqdirdə, onun adını malikiyyət qoymalı və elm və alim, sənət və sənətkar arasında heysiyyət

baxımından fərq yaratmalıyıqmı? Kişi qadının vüsalı intizarındadır, nəinki, onun köləliyi. Şirin sözlü şair Hafiz belə deyir: “Mən təəssüf edirəm ki, ən yaxşı olan kəslərin diqqətini cəlb etmək üçün onlara əta eləmək baxımından heç nəyə sahib deyiləm.” Bu, qadın və onun məqamına xəyanət edilməsidir, yoxsa, yaşayan və canlı (diri) qəlblərdə qadına ən yüksək hörmət və ehtiramın yer tutması və bütün kişilərin qadının gözəlliyi və onun camalı qarşısında zəif və acizliyini bildirərək ona ehtiyaclı olduğunu deməsi və onun ?(qadını) isə kişiyə ehtiyacsızlığını tanıtmasıdır

Qadının hünər və istedadı kişini hansı halda və vəziyyətdə olursa olsun, öz tərəfi və səmtinə çəkə bilməsindədir. Amma günümüzdə “qadın hüquqlarını müdafiə” adı ilə onun ən böyük imtiyaz, şərəf və ləyaqətinin necə ləkənərək tapdalandığının şahidiyik. Bizim “qadının qaşını düzəltmək istədikdə, onun gözünü çıxartdılar.” – deyə .toxunduğumuz məsələlər bunlar idi

**...Elçilik adət–ənənləri qadının heysiyyət və**

Elçilik adət-ənənləri qadının heysiyyət və ehtiramının qorunması üçün ən zərif və aqilanə tədbirlərdəndir

Yaradılış və xilqət baxımından kişinin tələb edən, ehtiyac və istək məzhəri (məkanı), qadının isə tələb olunan və istəklərə cavab verən kimi yaradılmasının həm qadının heysiyyət və ehtiramının qorunması və kişinin güclü cismi müqabilində qadının cismi zəifliyinin bərpa edilməsinə ən yaxşı zəmanət, həm də müştərək yaşayışlarında ətalət və müvazinətin saxlanınması üçün ən yaxşı amil olduğunu diqqətinizə çatdırmışdıq. Bu, bir növ, qadınlara verilən təbii imtiyaz və üstünlük, kişilər üçünsə məsuliyyət və .vəzifədir

Bəşərin təyin etdiyi, başqa sözlə, tədbir tökərək işlətdiyi qanunlar qadın üçün nəzərdə .tutulan həmin imtiyaz və üstünlüyü, kişi üçünsə vəzifə və məsuliyyəti qorumalıdır

Kişi və qadının elçilik baxımından bərabər və müsavi olmasına söykənən qanunlar zahirdə kişinin xeyrinə olsa da, əslində onların hər ikisinin zərərinədir və bu yolla .aralarındakı ətalət pozulur və qadının ehtiram, heysiyyət və şərafətinə ziddir

Bu cəhətdən “qırx maddədən ibarət” təklifi irəli sürən şəxsin nəzərdə tutduğu maddələr qadının kişilərlə vəzifə və elçilikdə şərik və ortaq müəyyən etdiyindən, heç .bir dəyərə malik deyil və bəşər cəmiyyətinin zərərinədir

**İctimai qanunda qırx maddə"ni təklif edən müəllifinin səhvləri"**

Bu fəsillə əlaqədar xatırladılması zəruri olan mətləblərdən ikincisi M.İ.Zəncaninin :“Günün qadını” jurnalının ۸۶-cı sayında yazdıqlarıdır

ci maddənin olmasına əsasən, hər iki şəxs – qadın və onun nişanlısı səbəbsiz-۱۰۳۷“ olaraq aralarındakı münasibəti pozsalar, hədiyyə olaraq onlara nişanlı, onun anası və ya üçüncü bir şəxs tərəfindən evlilik üçün verilənlər geri qaytarılmalı və onların özü və əsli olmadıqda, həmin hədiyyələrin pul və qarşılığı ödənməlidir, əgər hədiyyənin tələf .olmasında onların təqsirləri olmasa, bu hökmdən istisnadırlar

Qeyd edilən maddəyə uyğun olaraq namizədlik məsələsi (evliliyə vədə) qanunu irəli sürən şəxsin nəzərində, heç bir qanuni və icra edici əsasa malik olmamış və onun iki tərəf (kişi və qadın) arasında qarşılıqlı vədələşməyə zəmanət baxımından heç bir rola malik olmadığı bildirilmişdir. Eyni zamanda, təklif edən şəxsin düşüncəsində onun yeganə təsiri sadəcə aralarındakı münasibəti (nişanı) səbəbsiz olaraq pozan tərəfin qarşı tərəfdən evlilik səbəbilə hədiyyə olaraq aldıqlarını və ya onun məbləğini geri qaytarmaqla bağlıdır. Buna səbəb nişanlı olan vaxtlarda, adətən, qadına o qədər də “ .hədiyyələrin alınmamasına baxmayaraq, kişinin həddən artıq xərcə düşməsidir

Diqqət etdiyiniz kimi, M.İ.Zəncaninin bu qanunda nəzərdə tutduğu maddəyə bizim iradımız namizəd üçün qanuni baxımdan məsuliyyət və icra edilmə cəhətindən heç bir zəmanətin nəzərdə tutulmamasıdır. Təkcə münasibəti pozan şəxsin verdikləri hədiyyələrin qaytarılması və ya onun məbləği, nişan və məsrəf edilən digər xərclərinin .qarşı tərəfə ödənilməsi nəzərdə tutulmuşdur

səh:۳۹

Mən bu maddəyə başqa iradların da tutulduğunu deyirəm. Həmin irad belədir: "M.İ.Zəncani "münasibətləri heç bir səbəb olmadan pozan tərəfin ya aldığı hədiyyələri qaytarmasını, ya da onun pulunu ödəməsini və əgər qaydaya uyğun olaraq hansısa bir tutarlı səbəbdən münasibətləri pozduqda və müqabil tərəf də tələb etdikdə, ən azı, aldıqları hədiyyələri geri verməli olduğunu" - deyir. Amma həqiqət həmin iradlardan :heç birinin yerli olmadığıdır. "İctimai qanunun ۱۰۳۶-cı maddəsində belə deyilir

Əgər namizədlərdən (nişanlı şəxslərdən) hansısa biri səbəbsiz olaraq münasibətləri" pozsa və tərəf müqabili, ya hər iki tərəfin ataları və ya digər şəxslər evliliyin olacağına etimad edərək xərc çəkmiş olsalar, nişanı pozan şəxs digərlərinə dəyən xəsarəti ".ödəməlidir və nəzərdə tutulan xəsarət taariflərə uyğun olmalıdır

Qanunun bu maddəsi M.İ.Zəncaninin "qanun nəzərdən qaçırtmışdır" - deyə düşündüyü məsələni izah edir. Həmin məsələ qanunun bu maddəsində "səbəbsiz olaraq nişanı pozan" qeydi və sözünün işlədilməsidir. Qanunun bu maddəsinə əsasən, nişanı heç bir səbəb olmadan pozan tərəf təkcə qarşı tərəfə vurduğu şəxsi zərəri deyil, valideyn və .digərlərinin də çəkdikləri xərci ödəməyə zamindir

Bu maddədə qanun "evlənəcəklərinə etimad etmək" sözünə söykənir. Əlavə olaraq, səbəbiyyət qanununda zəmanətə səbəb olan amillərdən biri kimi "küsmək" də nəzərdə tutulmuşdur ki, qarşı tərəfin zaminliyinə sübut olaraq üç yüz otuz ikinci .maddədən istifadə etmək olar

Beləliklə, ictimai qanun namizədlik xəsarətləri - təklif sahibinin də dediyi kimi, buna .nişanlanma səbəbdir - barədə sükut etməyərək onu iki maddədə yerləşdirmişdir

:İctimai qanunun ۱۰۳۷-ci maddəsi belədir

Nişanlılardan hər biri nəzərdə tutulan nişan müqabilində bir-biri və ya valideyinlərinə" verdikləri hədiyyələri nişan pozulduğu zaman, tələb edə bilərlər. Əgər verilən hədiyyələrin özü mövcud olmazsa, adətən, onların məbləği ödənməlidir və bu şərt ".tərəflər hədiyyənin tələf olmasında təqsirli olmadıqları zaman istisnadır

Bu maddə tərəflərin bir-birinə vedikləri əşyalara aiddir və diqqət edirsinizsə, maddədə “tərəflərdən biri səbəbsiz olaraq nişanı pozsa” - deyə, heç bir qeyd nəzərdə .tutulmamışdır. M.İ.Zəncaninin “səbəbsiz olaraq” qeydini vurğulaması yersizdir

Görəsən, ictimai qanunun iki sadə maddəsinin mənasını anlamaqda aciz olanlar - ömür boyu həmin məsələləri araşdırmaları və uzun illər ərzində ölkənin büdcəsini “mütəxəssis tədqiqatı” adı ilə bu qanunları öyrənmək üçün xərcləmələrinə baxmayaraq - minlərlə məsələ və xırdalıqları nəzərə alan asimani qanunların dəyişdirilməsini və onlardan baş açdıqlarını necə iddia edirlər?! Onu da qeyd edək ki, M.İ.Zəncani “Müqəddəs əhd-peyman, yoxsa, evlilik andı” kitabını yazmazdan beş il əvvəl, yuxarıdakı cümlələri “heç bir səbəb olmadan” kimi oxuyurmuş. O, öz kitabının ön səhifələrində fəryad edərək “dünyada səbəb və nəticəsiz bir iş varmı?” - deyir. Amma .son illərdə onun bu cümlələri səhv və yanlış oxuduğu məlum olmuşdur

.Hələlik “Elçilik” fəslində təklif sahibinə tutduğumuz digər iradlardan daşınırıq

## İKİNCİ HİSSƏ

**(Müvəqqəti evlilik (mütə**

Mən bəzi şəxslərdən fərqli olaraq, İslam dini ilə bağlı məsələlərdə şəkkiyyat və şübhə yaradanlardan – bu dinə bəslədiyim etiqad və məhəbbətə rəğmən – heç vaxt narahat olmuram, əksinə qəlbimin dərinliyində sevinirəm, çünki bu asimani və ilahi din ona edilən bütün həmlə və hücumlar, həmçinin, dəyişdirilməsinə çalışılan cəbhələrdən .həmişə başı uca və şərəfli çıxmış və daha da tanınmışdır

Həqiqətin xasiyyəti şəkk və tərəddüdün onun zahir və aşkar olmasına kömək etməsidir. "Şəkk" yəqinin müqəddiməsi, tərəddüd isə həqiqətin kirpikləridir. Qəzzali "Əməlin mizanı" və "Ayıq olan canlı" risaləsində belə nəql edir: "Sözlərimizin faydalı olduğunun sübutu üçün sizi köhnə və irsi olaraq əldə etdiyiniz etiqadlarınızda şəkkə salması kifayətdir. Şəkk etmək tədqiqatın sütunudur və şəkk etməyən kəs düzgün düşüncəyə malik olmur. Doğru-düzgün şəkildə baxmayan kəs yaxşı görə bilməz və ".belə bir şəxs korluq və çaşqınlıqda həyat sürər

Qoyun, yazıb-pozsunlar, deyib-danışsınlar və konfrans təşkil edərək irad tutsunlar ki, .özləri də bilmədən İslam həqiqətlərinin aşkar olunmasına vəsilə və vasitə olsunlar

Cəfəri məzhəbinin – bizim ölkəmizin (İranın) rəsmi məzhəbidir

nəzərində İslamın parlaq qanunlarından biri evliliyin iki istiqamətdə baş tutmasıdır:-.Daimi və müvəqqəti

Daimi evliliklə müvəqqəti evlilik bir sıra məsələlərdə oxşar və bəzi məsələlərdə isə fərqli yönlərə malikdir. Onları bir-birindən fərqləndirən birinci dərəcəli məsələ kişi və qadının müvəqqəti evlənməyə qərar verdikləri zaman müddət başa çatdıqdan sonra istəsələr vaxtı artırmaları, istəməsələr də ayrılmalarıdır. Digər bir fərq isə şərait baxımından, onların istədikləri kimi əhd-peyman bağlamalarının mümükün olmasıdır. Məsələn, daimi evlilikdə kişi qadının gündəlik xərclərini, geyimini, xəstələndikdə dərman və həkimlə bağlı və digər tələbatlarını ödəməyə borcludur, amma müvəqqəti evlilikdə bu məsələ əqd bağlayan tərəflərin istəyindən asılıdır, belə ki, kişi həmin xərcləri təmin etmək qabiliyyətinə malik olmaya və qadın kişinin pulundan istifadə .etməyi istəməyə bilər

Daimi evlilikdə qadın istər-istəməz kişinin ailə başçısı olmasını qəbul etməli və onun əmr və göstərişlərinə məsləhətə əsasən, ailə daxilində itaət etməlidir, amma .müvəqqəti evlilikdə bu məsələ razılaşma və tərəflərin istəyinə bağlıdır

Daimi evlilikdə kişi və qadın qeyri-ixtiyari olaraq bir-birindən irs aparırlar, lakin .müvəqqəti evlilikdə bu cür deyil

Daimi və müvəqqəti evliliyin əsl və əsaslı fərqləri müvəqqəti evliliyin hədd-hüdud və qeydlərdən azad və istisna olması, yəni tərəflərin istək və razılaşmasına bağlı olmasındadır. Hətta, onun (evliliyin) müvəqqəti olması da həqiqətdə, hər iki tərəfə bir .növ, azadlıq bağışlayır və evliliyin zaman və müddətini onların ixtiyarında qoyur

Daimi evlilikdə tərəflərdən heç biri digərinin razılığı olmadan övlad sahibi olmaq və nəsil artırılmasının qarşısını ala bilməz, amma müvəqqəti evlilikdə tərəflərdən birinin razılığına zərurət və ehtiyac yoxdur. Həqiqətdə, bu da hər iki tərəfə bəxş edilən ikinci .bir azadlıqdır

Bu qəbildən olan evliliyin nəticəsi, yəni övladın dünyaya gəlməsi ilə daimi evlilikdən .dünyaya gələn övlad arasında heç bir fərqlər mövcud deyil

zəruridir. Əgər müvəqqəti evlilikdə mehriyyənin miqdarı müəyyən edilməmiş olsa, əqd batildir və daimi evlilikdə isə batil deyil və mehriyyə təyin olunmuş olur. Bu, müvəqqəti .evliliyin daimi evliliklə olan fərqlərindəndir

Daimi evlilik və əqddə qadının anası və qızı (ögey) evlənmək baxımından ərə və ərin atası və oğlu (ögey) qadına haram olduğu kimi, həmin şərtlər müvəqqəti evlilikdə də keçərlidir. Eyni zamanda, daimi əqddə olan qadına digərlərinin elçi getməsi haram olduğu kimi, müvəqqəti əqddə olan qadına da elçi getmək haramdır. Daimi əqddə olan digər bir qadınla zina etməyin əbədi haramlığa (yəni o qadınla əbədi evlənə bilməz) səbəb olması, müvəqqəti əqddə olan qadınla zina etməyə də aiddir və o qadın da eyni hökmü daşıyır. Daimi evlilikdə qadın ayrılıq və talaqdan sonra bir müddət iddə saxlayır və onun gözləmə müddəti üç dəfə aylıq xəstələnmə zamanı gördüyü qandan pak olmaq müddəti qədərdir, amma müvəqqəti evlilikdə müddətin bitməsi və ya onun qadına bağışlanılmasından sonra gözləmə müddəti daimi evlilikdən fərqli olaraq iki dəfə aylıq xəstələnmə qanından təmizlənməsi və ya qırx beş gün gözləmə müddəti .qədərdir

Daimi evlilikdə iki bacı ilə eyni zamanda evlənmək qeyri-mümkün olduğu kimi, müvəqqəti evlilikdə də bu qayda ilədir. Bu, “müvəqqəti evlilik” və ya “müddətli izdivac” .adı ilə şiə fiqhində qeyd edilən və ictimai qanunumuzda işarə olunan məsələlərdəndir

Aydın məsələdir ki, biz bu qanunu onun bütün xüsusiyyətləri ilə qəbul edirik. Amma “camaat həmin qanundan sui-istifadə etmiş və etməkdədir” məsələsinin bu qanuna heç bir aidiyyatı yoxdur. Həmin qanunun ləğv edilməsi bu məsələlərin qabağını ala bilməz, sadəcə onların forma və şəklini dəyişə bilər, hətta, qanunun ləğv edilməsinin .özü də əlavə olaraq, yüzlərlə fəsadın yaranmasına gətirib çıxarar

Biz insanları islah edib onları tərbiyələndirmək və məlumatlandırmaq əvəzinə, buna ləyaqət və qüdrətimiz çatmadığı üçün davamlı olaraq qanunların üstünə düşmüşük və .bu düzgün deyil. Biz insanları günahsız və qanunları müqəssir bilməməliyik

Başa düşməyə çalışmalıyıq ki, daimi evliliyin olmasına baxmayaraq, nə üçün qanun "müvəqqəti evlilik" qanunu adını daşıyır? Görəsən, "Günün qadını" jurnalında məqalələr yazan bəzi yazıçıların dedikləri kimi, müvəqqəti evliliyin qadının insanlıq heysiyyəti və bəşər hüququnun ruhiyyəsi ilə ziddiyyəti vardırmı? Qədim zamanlarda və keçmişdə olmasına baxmayaraq, indi bizim dövrümüzdəki həyat tərzi və iqtisadi ?şərait baxımdan uyğunluq təşkil etmirmi

:Həmin məsələni biz iki başlıq altında araşdırırıq

A) Bugünkü həyat və müvəqqəti evlilik

B) Müvəqqəti evliliyin fəsad və zərərləri

### Bugünkü həyat və müvəqqəti evlilik

Əvvəlki bəhslərdən başa düşdüyümüz kimi, daimi evlilik tərəflər arasında daha çox təklif və məsuliyyət yaranmasına səbəb olur. Bu baxımdan, həddi-büluğ və yetkinlik yaşına çatmış elə bir qız və oğlanı tapmaq olmaz ki, təbii olaraq cinsi qərizələrin təzyiqinə məruz qalmış olmasın və daimi izdivac və evliliyə hazır olsun. Yaşadığımız yeni əsrin xüsusiyyəti təbii olan həddi-büluğ və yetkinliklə ictimai yetkinlik və ailə .qurmaq qüdrəti arasındakı fasiləni həddən artıq çoxaltmasındadır

Sadə həyat tərzinə malik olan keçmiş zamanda əgər bir oğlan uşağının ixtiyarında ömrünün sonuna qədər hansısa iş və ya məşğuliyyət qoyulsaydı, onun öhdəsindən gələ bilərdi, amma bu, yeni əsrdə, ümumiyyətlə, mümkün deyil. Orta məktəb və universitetə heç vaxt gecikmə və qeybəti (qayıbı) olmadan gedib-gələn, universitet və ali məktəblərdə ilin axırında götürülən imtahan və konkurslardan müvəffəqiyyətlə keçən bir oğlan uşağı iyirmi beş yaşına çatdıqda, universiteti bitirdikdən sonra gəlir əldə edə biləcəkdir. Əlbəttə, özü üçün şərait qurması və daimi olaraq evlənə bilməsi üçün, haradasa, üç-dörd il vaxt keçəcək. Bu məsələ eyni qaydada qızlar üçün də .keçərlidir

### Bugünkü gənc və onun "həddi–büluğ və cinsi böhran" dövrü

Əgər siz təhsilli, on səkkiz yaşına çatmış və cinsi ehtiyacları

tüğyan edərək zirvə və pik nöqtəsinə çatan bir gəncə evlənməli olmasını təklif etsəniz, .sizə güləcək. On altı yaşlı və ali təhsilli bir qız da eynilə belədir

Əməli olaraq bu yaşdakı təbəqədən olan kəslərin evlilik yükü – bir-birləri və gələcək övladlarına nisbətdə həddən artıq məsuliyyət və vəzifələrin yaranmasına səbəb olur – .altına girməsi və onları qəbul etməsi mümkün deyil

**...,Müvəqqəti rahiblik, cinsi kommunizm, yoxsa**

Müvəqqəti rahiblik, cinsi kommunizm, yoxsa, müvəqqəti evlilik – bunlardan hansını ?qəbul etmək

Sizdən soruşuram: "Belə bir vəziyyətdə təbiət və qərizələrlə nə etmək fikrindəsiniz?" Təbiət sizin on altı və ya on səkkiz yaşınıza çatmamış, hələ təhsili başa vurmamış cinsi ?hiss və qərizələrinizin inkişaf etməməsinə və sizdən əl çəkməsinə icazə verirmi

Görəsən, daimi olaraq evlənmək imkanı əldə edən zamana qədər cavanlar bir müddət "müvəqqəti rahiblik" etmək və bəzi çətinlik və təzyiqlərə sinə gərməyə razıdırlarmı? Hansısa bir gəncin buna (müvəqqəti rahibliyə) razı olduğunu fərz etdikdə, görəsən, təbiət cinsi qərizə və hissin qarşısının alınması zamanı şiddətli ruhi sarsıntı və psixoloqların bu günlərdə kəşf etmiş olduqları və hissiyyatın qüvvədən düşməsinə .?səbəb olan xətərli nəticələr yaratmaqdan əl çəkəcəkmi

İkidən artıq yolumuz yoxdur. Ya oğlanları başlı-başına buraxaq və onların yüzlərlə qızdan kam almasına və qızların da onlarla oğlanla qeyri-qanuni və qeyri-şəri münasibət və əlaqəyə girməsinə və neçə-neçə uşağı siqt və abort etməsinə, yəni əməldə cinsi kommunizmi qəbul etməyə icazə verməliyik, çünki oğlan və qızlar hüquqlarda bərabərdirlər və bəşər hüququdur deyə, bir-birlərindən kam alaraq xoşallansınlar və dar düşüncəlilərin dediyi kimi, əgər cəhənnəmə də yuvarlansalar, bir-biri ilə əl-ələ verərək və eyni şəkildə yuvarlanacaqlar. Belə olduğu təqdirdə, təhsil müddətində saysız-hesabsız əlaqə və münasibətdə olan oğlan və qız öz evinin kişisi və ?qadını ola biləcəkmi

Ya da ikinci yol müvəqqəti və azad evlilikdir. Müvəqqəti evlilik ilkin olaraq qadını məhdudlaşırır ki, eyni zamanda iki

kişiyə məxsus olmasın. Bu zaman kişinin də məhdud vəziyyətə düşəcəyi aydın məsələdir. Belə olan halda, həm kişi, həm də qadın bir-birinə mehr və məhəbbət bəsləyəcək. Bu yolla onlar müvəqqəti rahibliyin çətinlikləri və cinsi kommunizmin .tələsinə düşmədən müvəqqəti evliliklə kifayətlənə və qane ola bilərlər

**İmtahan və sınaq üçün evlilik**

Bu zərurət sadəcə təhsil alma müddətinə aid deyil, digər vaxtlarda da qarşıya çıxa .bilər

Bir qayda olaraq, daimi şəkildə evlənmək düşüncəsində olan, amma bir-biri ilə münasibətləri alınmayan və aralarında etimad yaranmayan oğlan və qızlar üçün bu, bir növ, imtahan və sınaq xarakteri daşıya bilər. Əgər onlar bir-birinə etimad etsələr, münasibət və müvəqqəti evliliklərinə davam edir, əks təqdirdə ayrılırlar. Mən sizdən "avropalıların pozğun qadınları hər bir şəhər və müəyyən olunmuş yerlərdə saxlanılması və dövlətin də nəzarət etməsinin zərurət təşkil etdiyini hesab etməsi nəyə əsaslanır?" - deyə soruşuram. Buna səbəb subay kişiləri cəmiyyət və ailələr üçün ?böyük təhlükə olaraq görməsidirmi

**Rassel və "müvəqqəti evlilik" nəzəriyyəsi**

Məşhur İngiltərə filosofu Bertrand Rassel özünün "Qadına sahib olmaq və əxlaq" kitabında yazır: "...Doğru və düzgün olaraq fikirləşdiyimizdə, fahişəliyin bizim ailəmizin məsumiyyətini, həmçinin, qadın və qızlarımızın paklığını qoruduğunu anlayarıq. Bu əqidələri Lekki özünün "Viktoriya əsri" əsərində büruzə verdiyi zaman, bu məsələnin səbəbini bilmələrinə baxmayaraq, əxlaq alimləri şiddətli şəkildə narahat oldular, amma Lekki əqidəsinin səhv və xətasını heç vaxt sübut edə bilmədilər. Həmin əxlaq sahiblərinin şərhi-halı belədir: "Əgər camaatın əksəriyyəti bizim göztərişlərimiz və təlimatlarımıza tabe olsaydı, əxlaqsızlıq və pozğunluq mövcud olmazdı." Bununla ".yanaşı, onların sözlərinə kiminsə diqqət etmədiyini yaxşı bilirlər

Bu, avropalılar sayağı kişilərin və daimi olaraq evlənə bilməyən qadınların xətərininin dəf edilməsi üçün çarə axtarışı

.və düsturdur, müvəqqəti evlilik isə, İslamın təklif etdiyi qanun

Əgər bu avropasayağı proses həyata keçirilə və bədbəxt və biçarə qadınların bir dəstəsi həmin ictimai vəzifəni ifa etmək üçün təyin olunarsa, o zaman qadın öz həqiqi məqamına və insanlıq heysiyyətinə yetişəcək və bəşər hüququnun ruhiyyəsi şad ?olacaqmı

Bertrand Rassel rəsmi şəkildə öz kitabının bir fəslində "təcrübi və sınaq evliliyi"nə yer vermişdir. O deyir: "Mütəmadi olaraq Denver əyalətinin məhkəməsində hakimlik etmiş Lindezi həmin vəzifədə olduğu müddətdə bir sıra həqiqətləri müşahidə etmək fürsətinə malik olmuş və "dostluq evliliyi"nin həyata keçirilməsi təklifini irəli sürmüşdür. Təəssüflər olsun ki, o, Amerikadakı post və məqamını əldən verir və daha sonra onun cavanların düşüncəsində mənfi fikirlər yaratması deyil, əksinə onların səadətinə çalışıldığı məlum olur. Katoliklər və qara dərililərə zidd olan siyasi firqələrin də ona .etmədikləri əziyyət qalmadı

Dostluq evliliyi"ni Mühafizəkarlardan olan alimlərdən biri təklif etmişdi və məqsədi də" cavanların cinsi problemlərini həll etmək idi. Evlilikdə pulun olmamasının çətinlik yaradan əsas məsələlərdən biri olduğu Lindezinin diqqətindən yayınmır. Bu məsələnin (pulun olmaması) çətinliyi gələcəkdə uşaqların olması ehtimalı ilə bağlı deyil, əksinə qadınların məişət ehtiyaclarını ödəmələrini yaxşı fikir olmaması baxımından idi. Beləliklə, o, cavanların həmin evliliyi həyata keçirməsinin düzgünlüyü fikrində idi. Bu evlilik adi evliliklə üç cəhətdən fərqə malikdir: Birincisi, evlilikdə məqsəd uşaqların dünyaya gətirilməsi deyil. İkincisi, qadın hamilə olmadığı və övlad dünyaya gətirmədiyi müddətdə, onların bir-birindən ayrılması hər iki tərəfin razılığı ilə olmalıdır. Üçüncüsü, ayrılıq və talaqın baş verdiyi surətdə, qadın sadəcə yemək-içmək xərcərinin ödənilməsini tələb edə bilər.... Mən Lindezinin irəli sürdüyü təklifin təsirli olması ilə bağlı heç də şəkk-şübhə etmirəm və əgər bu məsələni qanun qəbul etsəydi, əxlaqın ".sağlamlaşdırılmasında bir çox təsirlərə malik olardı

Rassel və Lindezinin "dostluq evliliyi" adlandırdığı izdivacın

İslamın “müvəqqəti evlilik” adlandırdığı məsələ ilə azacıq fərqinin olmasına baxmayaraq, Rassel və Lindezi kimi mütəfəkkirlər təkcə daimi evliliyin cəmiyyətin .bütün ehtiyaclarını ödəməsində yeganə vasitə və çıxış yolu olmadığını anlamışlar

Xüsusən, hazırkı və yaşadığımız əsrdə müvəqqəti evliliyin xüsusiyyətləri və onun zəruriliyi, eyni zamanda, daimi evliliyin bəşərin bütün ehtiyaclarını ödəməkdə kifayət etməməsi tədqiqat və araşdırma mərkəzində saxlanılmışdır. İndi də, başqa bir deyimlə, sikkənin digər üzünü - həmin evliliyin hansı zərər və fəsadları törədə bildiyini :araşdıraq. Müqəddimə olaraq bir mətləbi xatırlatmaq istəyirəm

İnsanların düçüncə və nəzərlərini irəli sürə bildikləri bütün mövzu, məsələ və zəminələr arasından heç biri tarix elmləri, əqaid, adət və ənənələrlə bağlı mövzu və zəminələr qədər dolaşıq və çətin deyil və elə bu cəhətdən, heç bir mövzu həmin mövzular kimi tənqid atəşinə tutulmamış və əksinə, onlar qədər də şöhrət tapan və .barəsində nəzərlər irəli sürülən mövzular da olmamışdır

Misal olaraq, deyə bilərəm ki, fəlsəfə, irfan, islami kəlam (əqaid) barəsində məlumatı olan və günümüzdə qələmə alınan bir sıra əsərləri - əksər hallarda xaricilərin yazdıqlarından iqtibas və ya eynilə onların dedikləridir - mütaliə etmiş şəxslər mənim nə demək istədiyimi başa düşə və anlaya bilərlər. Bu, şərqşünaslar, onların tərəfdar və tabeçiliyində olanların həmin məsələlər barədə məsələni başa düşüb anladıqları .zaman, o mövzularla bağlı hər cür nəzər söyləməyi lazım və zəruri bilməsinə bənzəyir

Məsələn, islami irfanda məşhur olan “vəhdətül-vücud” məsələsi ətrafında hansı sözlər deyilməmiş və nələr danışılmamışdır?! Amma təkcə bir məsələnin -”vəhdətül-vücud”un nə olması və onun barəsində (Sədrül-mütəəllihin Şirazi və Muhyddin Ərəbi kimi) İslam irfanı qəhrəmanlarının nə dedikləri və hansı təssəvvürdə olduqlarının yeri !məlum

Mən “Günün qadını” jurnalının bir neçə sayında nəşr edilən düşüncə və nəzərləri oxuduğum zaman, qeyri-ixtiyari olaraq

vəhdətül-vücud” məsələsini xatırladım. Gördüm ki, bütün sözlər deyilib, lakin“ məsələnin ruhu və əsasını təşkil edən hissə - qanun barədə müəllifin nə demək istədiyi .və məqsədinin nə olduğu nəzərdən qaçırılıb

Əlbəttə, bu məsələnin “Şərqin mirası” olması səbəbi ilə ona lazımı miqdarda diqqət göstərilməmişdir, amma “Qərbin töhfəsi” olsaydı, belə olmazdı. Əgər bu qanun Qərbdən bizə keçsəydi, indi onun barəsində seminar və konfranslar təşkil olunar və daimi evlilik qanunlarının XX əsrin ikinci yarısı ilə bir araya sığaraq uzlaşmadığı və gənc nəslin daimi əqdin bu cür şərtləri altına girmədiyi və bugünkü nəslin azad olmaq, azad yaşamaq istədiyi və sadəcə özünü razılaşma əsasında seçə bildiyi şərtlərlə uzlaşan .evliliyə razı olduğunu deyərdilər

Bu səbəbdən, həmin nəğmə və zümzümə Qərbdən başladıldığı və Rassel kimi şəxslər tərəfindən “dostluq evliliyi” təklif olaraq irəli sürüldüyü üçün, onun İslamda istənildiyindən daha artıq rəğbətlə qarşılandığı diqqətdən yayınmamış və daimi evlilik və izdivacı geridə qoymuşdur. Belə olan təqdirdə, biz də daimi evliliyi təbliğ və müdafiə .etmək məcburiyyətindəyik

**Müvəqqəti evliliyin fəsad və zərərləri**

:Müvəqqəti evliliyin törətdiyi fəsad və zərərlər belədir

Evlilik və izdivacın əsasları möhkəm və davamlı olmalıdır. Evliliyin əvvəllərində bir-biri .١ ilə əhd-peyman bağlayan tərəflər həmişəlik olaraq bir-birinə sədaqətli və bağlı olmalıdır və onların fikir və düşüncələrində ayrılığa yer verilməməlidir. Beləliklə, .müvəqqəti evlilik tərəflər arasında möhkəm əhd-peymana söykənmir

Evlilik əsaslarının möhkəm və davamlı olması məsələsi tamamilə doğrudur, amma bu irad müvəqqəti evliliyin daimi evliliyə canişin olaraq təyin olunduğu və daimi evlilik .hökmünü aradan qaldırdığı zaman həqiqət tapır

Şübhəsiz, hər iki tərəf daimi evliliyə hazır, bir-birlərinə nisbətdə əmin və həmişəlik .bağlı olduqlarını düşündükləri zaman daimi evlilik əqdi bağlayır

Müvəqqəti evlilik bütün hall və şəraitdə daimi evliliyin təklikdə bəşərin ehtiyaclarını aradan qaldırmağa qadir olmadığı zamanlarda şəriliyə malik olmuş və sadəcə daimi evliliklə bağlı olan inhisar insanların müvəqqəti rahiblik və yaxud cinsi kommunizmdə qərq olması məcburiyyətini yaratmışdır. Ayındır ki, heç bir oğlan və qız daimi evlilik .zəminəsi olan yerdə özünü müvəqqəti evliliyə aludə etməz

Müvəqqəti evlilik iranlı oğlan və qızlar tərəfindən - onlar şiə məzhəblidirlər - yaxşı .۲ qarşılanmamış və bunu, bir növ, özlərininin təhqir olunması kimi qəbul etmişlər. .Nəticədə, şiə olan cəmiyyətin ümumi fikrində də, bu məsələ kənarlaşdırılır

Cavab olaraq birincisi, qadınlar arasında mütəyə nifrət və mənfi münasibətin yaranması səbəbinin onlardan sui-istifadə edən kişilər olduğunu deyə bilərik. Qanun bu cəhətdən onların qarşısını almalı və mane olmalıdır. Biz həmin sui-istifadələr barədə söhbət açacağıq. İkincisi, müvəqqəti evliliyin - bu evliliyin fəlsəfəsi daimi evliliyə ya hər iki tərəfin, ya da onlardan birinin hazırlığının olmamasına baxmayaraq - .daimi evlilik qədər yaxşı qarşılanacağını gözləmək yanlış və yersizdir

Müddətli evlilik qadının heysiyyət və ehtiramına ziddir və bir növ, insanı kirayəyə .۳ (icarəyə) vermək və şəri baxımdan bunu qanuniləşdirməkdir. Qadının kişidən aldığı müəyyən miqdar pul müqabilində öz bədən və vücudunu kişiyə təslim etməsi və onun .ixtiyarında qoyması qadın heysiyyətinə müxalifdir

Bu irad daha da təəccüb ediləsidir. Birincisi, əvvəlki məqalələrdə də qeyd etdiyimiz bütün xüsusiyyətlərilə yanaşı, müvəqqəti evliliyin kirayə və icarə ilə nə əlaqəsi var və görəsən, evliliyin zaman məhdudiyyəti onun evlilik forması və şəklindən xaric olması və icarə şəklinə düşməsinə səbəb olurmu? Eyni zamanda, mehriyyə və müəyyən bir müddətin təyin olunmasına malik olma onun icarə və kirayə hesab edilməsinə əsas verirmi? Əgər mehriyyəsiz olsa və kişi qadına heç bir şey verməsə və bağışlamasaydı, onda, qadın öz insanlıq heysiyyətinə qovuşacaq və onu əldə edəcəkdimi? Biz mehriyyə .məsələsini ayrıca olaraq izah edəcəyik

Fəqihlərin əksəriyyəti açıq-aşkar işarə etmiş və ictimai qanun da buna əsasən, öz maddələrində müvəqqəti evliliklə daimi evliliyin razılaşma mahiyyəti baxımından, heç bir fərqə malik olmadığını və elə bu cür də qəbul olunmalı olduğunu tənzimləmişdir. Onların hər ikisi izdivaca aiddir və hər birinin əqdi özünə məxsus sözlərə malikdir və .əgər müvəqqəti evlilik əqdini kirayə və icarəyə aid olan sözlərlə oxusalar, əqd batildir

İkincisi, hansı vaxt və hansı tarixdən etibarən, insanı icarə etmək hökmü mənsux (aradan qaldırılmış) olmuşdur? Bütün dərzilər, çörək bişirənlər, həkim və mütəxəssislər, Baş Nazirdən tutmuş sadə işçilərə qədər bütün dövlət məmurları və .karxana işçiləri kirayə edilmiş insanlardır

Üçüncüsü, azad və ixtiyari şəkildə bir qadın hansısa bir kişi ilə müvəqqəti izdivac əqdi bağlayarsa, kirayə olunmuş insan deyil və insanlıq heysiyyət və şərafətinə xilaf olan heç bir iş görməmişdir. Əgər kirəlik və icarə edilmiş qadını tanımaq və qadının köləliyini görmək istəyirsinizsə, Avropa və Amerikaya səfər edərək film və kino çəkən şirkətlərə baş çəkin və onların necə olmasını anlayın və görün ki, adları çəkilən kompaniyalar qadın hərəkətləri, jestləri və cinsi qabiliyyətlərini necə satışa çıxarmışlar. Həqiqətdə, sizin kino və teatrlar üçün aldığınız biletlərin pulları kiralıq qadınların pullarını ödəməyə sərf edilir. Siz bədbəxt və biçarə qadınların pul qazanmaqdan ötrü hansı yükün altına girdiyinə bir diqqət edin. Onlar uzun müddət təcrübəli və möhtərəm mütəxəssislərin nəzarəti altında qalaraq cinsi hissləri təhrik edən sirlərin öyrənilməsində istifadə edilir və özlərini gəlirli müəssisələrin ixtiyarında qoyur və onların müştərilərinin artmasına .xidmət edirlər

Bar, diskoteyka və otellərə də baş çəkin və qadınların necə də şərafətə sahib olduğunun, qəpik-quruş əldə etmək və ya kiminsə cibini doldurmaq üçün özünü qonaqların ixtiyarında qoyduğunun şahidi olun. Kiralıq və icarə edilmiş qadınlar böyük ticarətlərin həyata keçirilməsi üçün öz şərəf və heysiyyətlərini alətə çevirən .manikenlərdir və onlar digərlərinin hərisliklərinin daha da artmasına səbəb olurlar

İcarə edilmiş qadınlar hansısa bir firmanın iqtisadiyyatı xeyrinə süni və keyfiyyətsiz malları reklam etmək üçün min cür formada televiziya ekranlarına çıxır və malları .nəzərə çarpdırmağa çalışırlar

Zəmanəmizdə Avropadakı qadınların gözəlliyi, vücudu, cinsi baxımdan cazibəsi, səsi, bir sözlə, bütün şəxsiyyətinin həqir və ən pis formada sərmayədarlara xidmət etdiyini bilməyən bir kəs varmı? Təəssüflər olsun ki, siz bilərəkdən və ya bilməyərəkdən nəcib və şərafətli olan iranlı qadınları bu cür əsarətlər altına sürükləmək istəyirsiniz. Mən nə üçün azad şəkildə bir qadının hansısa bir kişi ilə müvəqqəti evlənməsi zamanı həmin qadının kirayəlik qadın hesab edildiyini, lakin gecə həyatı keçirən, bar və diskoteykalarda öz ehtiyaclarını ödəmək və ona həris və acgözlüklə baxan yüzlərlə göz qarşısında kişilərin cinsi istəklərini razı salmaqdan ötrü, min hoqqadan çıxan .qadının isə icarə və kirayəlik hesab olunmadığını başa düşə bilmirəm

Görəsən, kişilərin qadınlardan bu cür faydalnmasının qarşısını alan və qadınlara belə əsarətdən nicat verən və onların məlumatlanması və ayıq olmasına şərait yaradan İslam qadının məqamını tənəzzülə uğratmışdır, yoxsa, XX əsrin ikinci yarısındakı ?Avropa

Əgər bir gün, doğrudan da, qadın yuxudan ayılaraq XX əsr kişilərinin onların yolları üstündə qurmuş və gizlətmiş olduğu tələləri görsə, bütün bu fırıldaqların əleyhinə qiyam edəcək və onun yeganə hami və pənah yeri və doğru danışanın Quran olduğu .sübut olunacaq. Əlbəttə, belə bir gün heç də uzaq deyil

Günün qadını" jurnalı ۸۷-ci sayının ۸-ci səhifəsində Mərziyyə adlı qadın və Rza adlı bir" kişidən müsahibə alaraq "Kiralıq və icarə qadın" başlığı altında qadınının bədbəxt və .biçarəliyini şərh etmişdir

Bu məsələ Rzanın dediklərinə əsasən, elçilik məsələsindən başlamışdır, yəni ilk dəfə olaraq "qırx təklif" düsturundan istifadə olunmuş və qadın kişiyə elçiliyə getmişdir. Qadının kişiyə elçilik etməsi hadisəsinin bədbəxtlikdən başqa, bir şeylə nəticələnməsini .gözləmək olmaz

Amma qadının – Mərziyyənin dediklərinə əsasən, o daş qəlbli və fürsəttələb insan onu daimi izdivac məqsədilə öz əqdinə keçirtmək, gələcək övladlarını himayə etmək yerinə, qadından xəbərsiz, müvəqqəti əqdinə keçirərək ondan faydalanmış, daha .sonra isə ona etinasızlıq etmişdir

Əgər bu deyilənlər doğru olmuş olsa, əqd batildir. Şəri qanunlar və ürfi məsələlərdən xəbərsiz olan qadının haqlarına həmin kişi təcavüz etmişdir və o, qanun qarşısında hesab verməli və cəzalanmalıdır. Rza kimilər cəzalandırılmazdan qabaq .tərbiyələndirilməli və bundan əvvəl, Mərziyyə kimilər də məlumatlandırılmalıdırlar

Kişinin vicdansızlığı və qadının bixəbər olması səbəbindən baş vermiş cinayətin qanuna nə aidiyyatı var ki, "Günün qadını" jurnalı Rzaya haqq donu geydirir və daha sonra qanunun üzərinə qılınc çəkir? Əgər müvəqqəti evlilik qanunu olmasaydı, Rza ?kimisi xəbərsiz və qafil Mərziyyəni rahat buraxardımı

Nə üçün kişi və qadınların tərbiyə və məlumatlandırılması məsuliyyəti altına girmir və kişi və qadının şəri hüquqlarını gizlədirsiniz, həmçinin, yazıq qadınları qəflətə salaraq onun yeganə hamisi və pənahı olan qanunu ona düşmən kimi tanıtdırır və qadının öz ?əlləri ilə hamisini məhv etmək istəyirsiniz

### Müvəqqəti evlilik və qadınların sayı

Müvəqqəti evlilikdə qadınların sayı çox ola bilir və çox olduğuna görə məzəmmət .۴ .olunur deyə, nəticədə, müvəqqəti nikah məzəmmət olunasıdır

Müvəqqəti evliliyin hansı şəxslər üçün nəzərdə tutulması və qadınların sayı barədə elə .bu bəhsin davamında və müfəssəl şəkildə Allahın yardımı ilə izah verəcəyik

### Müvəqqəti evlilikdə övladların taleyi

Müvəqqəti evlilik davamlı olmaması baxımından, dünyaya gələn uşaqlar üçün . ۵ münasib rabitə deyi. Bu evliliyin nəticəsi dünyaya gələn övladların mehriban ata .qayğısı və ana məhəbbətindən məhrum olmasıdır

Həmin irad və tənqid “Günün qadını” jurnalının üzərində ən cox və təkidlə dayandığı iradlardandır və verdiyimiz izahlardan sonra bəhs və irada bir lüzumun qaldığını .gümün etmirəm

Əvvəlki məqalələrdə daimi evliliklə müvəqqətli evlilik arasındakı fərqlərdən birinin nəsil artımı ilə bağlı olduğunu demişdik. Hər iki tərəfin azad olduğu müvəqqəti evlilikdən fərqli olaraq, daimi evlilikdə tərəflərdən heç biri digərinin razılığı olmadan bu məsələdən (övlad sahib olmaqdan) yayına bilməz. Müvəqqəti evlilikdə qadın kişinin əlaqə və yaxınlıq etməsinə mane olmadan hamilə qalmasının qarşısını ala bilər və bu məsələ günümüzdəki bir sıra dərman preparatları sayəsində tamamillə həll edilir. Müvəqqəti evlilikdə əgər hər iki tərəf övlad sahibi olmaq istəsə və dünyaya gələcək uşağın məsuliyyətini qəbul etsələr, uşaq sahibi ola bilərlər. Atifə və hissiyyat baxımından daimi evlilikdən dünyaya gələn övladın müvəqqəti evlilikdən dünyaya gələn övladla heç bir fərqi yoxdur. Əgər ata və ananın öz vəzifələrini icra etməkdən imtina etdiklərini fərz etsək, ayrılıq və boşanma zamanı övladların haqqının tapdalanmaması üçün qanun müdaxilə etdiyi kimi, bu zaman da qanun onları vəzifələrinə əməl etməyə məcbur və mükəlləf edir. Əgər tərəflər övladın olmasını .istəməsələr, onun dünyaya gətirilməsinin qarşısını alırlar

Bildiyimiz kimi, kilsələr uşağın abort edilməsini qeyri-şəri hesab edir, lakin islami cəhətdən əgər valideynlər əvvəlcədən övladın dünyaya gəlməsinin qarşısını alsalar, şəri cəhətdən bunun heç bir maneəsi yoxdur, amma nütfə qadının bətninə düşərək .cənin halına çevrilsə, İslam heç bir halda onun abort edilməsinə icazə və razılıq vermir

Şiə fəqihlərinin “daimi evlilikdə məqsəd nəsil artımı və müvəqqəti evlilikdə cinsi .qərizələrin təmin edilməsidir” - deməsi, yuxarıda qeyd etdiyimiz həmin mənadadır

**İradlar**

Qırx təklif”in müəllifi “Günün qadını” jurnalının ٨٧-ci sayında müvəqqəti evliliyə irad“ :tutmuşdur. O, əvvəcə belə deyir

Müvəqqəti evlilik qanununun mövzusu o qədər narahat edici bir məsələdir ki, hətta,“ nikah qanununu yazanların özləri də onun barəsində şərh və izah verə bilməmişlər. Elə bil, öz işlərindən narazı olmuş və sadəcə məsələnin zahirini qorumaq üçün ۱۰۷۵, ۱۰۷۶ və ۱۰۷۷ maddələrin olması səbəbi ilə cümlə və ifadələri bir-birinə calaşdırmışlar. Həmin məmurlar məsələdən həddən artıq narazı olduqlarından, adı çəkilən izdivacın əqdini ”.....(sözlərini) qeyd etməmiş və onun şərait və xüsusiyyətlərini izah verməmişlər

Daha sonra müəllifin özü ictimai qanundakı bu naqisliyi aradan qaldırmaq məqsədi ilə müvəqqəti nikahı tərif edir və deyir: “Müvəqqəti nikah subay qadının özünü müəyyən məbləğ və ücrət müqabilində, eyni zamanda, təyin edilən zaman və müddətdə - həmin müddət bir neçə saat və hətta, bir neçə dəqiqə də olsa belə - kişinin cinsi ”.ehtiyaclarını ödəmək üçün onun ixtiyarında qoymasıdır

Sonra deyir: “Bu nikahın qəbul edilməsi və necə oxunması barədə şiə kitablarında ərəbcə olan məxsus sözlər qeyd edilməsinə baxmayaraq, ictimai qanun həmin sözlərə diqqət etməmişdir. Elə bil, qanunvericilikdə yuxarıdakı məqsədin həyata keçməsinin (yəni icarə və muzd alınması) hansı dildə olması - ərəbcə olmasa da - əhəmiyyət kəsb ”.etmir

:Müəllifin nəzərində

.A. İctimai qanun müvəqqəti nikahın tərifini deməmiş və onun şəraitini izah etməmişdir

B. Müvəqqəti nikahın mənası qadının müəyyən edilmiş məbləğ müqabilində özünü .kişiyə icarə verməsidir

C. İctimai qanunun nəzərində qadının icarə və kirayə edilməsinin baş tutmasına .dəlalət edən cümlələr (əqd) müvəqqəti evliliyin həyata keçirilməsi üçün kifayət edir

Mən müəllifi bir daha ictimai qanunu diqqətlə oxuyub nəzərdən keçirtməyə dəvət edirəm. Eyni zamanda, “Günün qadını” jurnalının oxucularından ictimai qanunun bir .nüsxəsini əldə edərək onun aşağıdakı hissələrinə diqqət etməsini xahiş edirəm

İctimai qanununun altıncı fəsli olan “Nikah məcəlləsi” müvəqqəti evliliyə məxsusdur və :üç sadə cümlədən artıq deyil

Birincisi, nikah müəyyən bir müddət üçün baş tutduğu zaman, müvvəqqəti nikahdır. İkincisi, müvəqqəti nikahın müddəti tamamilə müəyyən edilməlidir. Üçüncüsü, müvəqqəti evliliklə bağlı irs və mehriyyə hökmlərləri əvvəlki fəsillərdə irs və mehriyyə .ilə əlaqədar söylədiklərimiz kimidir

Qırx təklif”in möhtərəm müəllifi nikah məcəlləsinin əvvəlki beş fəslində yazılanların“ təkcə daimi evliliklə bağlı olduğunu güman etmiş və həmin fəsillərdəki maddələrdən sadəcə biri - ۱۰۶۹-cu və ya boşanma və talaqla bağlı maddə - istisna olmaqla, hamısının müvvəqqəti evliliklə müştərək olmasından qafil olmuşdur. Məsələn, ۱۰۶۲-ci maddədə deyilir: “Qəbul edilmək və müəyyən sözlərin oxunması ilə gerçəkləşən və izdivac edilməsinə dəlalət edən nikah təkcə daimi evliliyə aid deyil, hər iki evliliyə məxsusdur. Həmçinin, əqd və əqd edən tərəflərlə əlaqədar nəzərdə tutulan şəraitlər iki evliliyə (daimi və müvəqqəti) şamildir. Əgər ictimai qanun müvəqqəti evliliyin tərifini qeyd etməmişdirsə, buna lüzum duymamış və əgər daimi evliliyin də tərifini verməmişdirsə, onun tərif etməkdən ehtiyacsız bilmişdir. Qanun istər daimi evlilik olsun, istərsə də müvəqqəti, evliliyin gerçəkləşməsi və tərəflərin bir-birinə nisbətdə ər-arvad hesab edilməsinə səbəb olan kəlmə və sözləri qənaətbəxş hesab etmişdir. İcarə, qəzavət və s. məsələlərlə bağlı oxunan və istifadə edilən sözləri nə daimi, nə də müvəqqəti evlilik üçün düzgün hesab etməmişdir. Mən bu andan etibarən, vədə verirəm ki, əgər ölkəmizin fəzilətli hakim və qanunvericiliklə əlaqədar çalışan təcrübəli məmurları - həqiqətən, onların sayı çoxdur - ictimai qanuna tutalan iradların yerində və doğru olduğunu təsdiqləsələr, mən “Günün qadını” jurnalında yazılanları tənqid ”.etməkdən əl çəkərəm

#### Müvəqqəti evlilik və hərəmxanalar

Qərblilərin şərqlilər əleyhinə hazırladıqları, nümayişlər təşkil edərək ictimaiyyətə çatdırmaq istədikləri süjetlər təəssüflər olsun ki, Şərq tarixində özünü həddən artıq büruzə verən və nümunələrinin ələ gətirilməsi mümkün olan hərəmxanalar .məsələsidir

Şərq ölkələrinin xəlifə, sultan və hakimlərinin həyatında bu cür məsələlərin yer tutması təbiidir və hərəmxanalar şərqli bir kişinin eyş-işrət və həvayi-nəfsinə nə qədər düşkün .olduğunu göstərir

Bəziləri "müvəqqəti evliliyiə icazə verilməsi hərəmxanaların təşkil olunmasına icazə vermək kimi bir şeydir və bu məsələ şərqlilərin qərblilər qarşısında başıaşağı və təhqir edilməsinə şərait yaradır, həm də zəiflik nöqtəsi hesab olunur" - deyir və həmçinin, .onun əxlaq və inkişafa zidd və süqut və tənəzzülə səbəb olduğunu vurğulayırlar

Bu məsələnin oxşarı qadınların (zövcələrin) sayının çox olması barədə də deyilmişdir. Çoxarvadlılığa icazə verilməsini "hərəmxanaların təşkil edilməsinə verilən icazə" kimi .dəyərləndirmiş və təfsir etmişlər

Biz zövcələrin sayı barəsində ayrıca olaraq bəhs edəcəyik, amma indi bəhsimidə .üstünlüyü müvəqqəti evliliyə veririk

:Bu məsələni iki cəhətdən tədqiq edib araşdırmaq lazımdır

Birincisi, ictimai baxımdan hərəmxanaların təşkil edilməsinə hansı amillər səbəb olmuşdur? Görəsən, müvəqqəti evlilik qanunu şərqlilərin həyatında hərəmxanaların ?yaradılmasına təsir qoymuşdur, ya yox

İkincisi, müvəqqəti evlilik qanununun yaradılmasında məqsəd bir sıra şəxslər və ?kişilərin eyş-işrətlə məşğul olması və hərəmxanalar tikməsinə yardım etməkdirmi

Hərəmxana yaradılmasının ictimai səbəbləri

Birinci bəhs. Hərəmxanaların yaranması bir-biri ilə müttəfiqlik edən iki amilin :nəticəsidir

Hərəmxana yardılmasında birinci amil qadınların təqva və iffət məsələsidir, yəni ictimai və əxlaqi mühit elə bir şəraitə malik olmalıdır ki, bir kişi ilə cinsi irtibatda olan qadınların digər kişilərlə də rabitəsinə icazə verməsin. Belə bir şəraitdə imkanlı, eyş-işrətə və nəfsinə düşkün kişilər öz ətraflarına bir dəstə qadını toplayaraq .hərəmxanalar təşkil etməyə məcburdurlar

olmalarını lazım bilməsəydi, qadın müftə (havayı) və asan şəkildə özünü istədiyi hər hansı bir kişinin ixtiyarında qoysaydı, kişilər üçün qadınlardan istədikləri zaman və istədikləri şəraidə istifadə edərək eşqbazlıq etmələrinə imkan yaransaydı, çətin ki, həmin imkanlı kişilər bu qədər zəhmət və həddən artıq baha başa gələn xərclərlə .hərəmxanalar yaradardılar

Digər ikinci amil ictimai ədalətin olmamasıdır. Belə olan şəraitdə çoxları bol və firavan nemətlər içində qərq, bəziləri yoxsulluq və müflislikdə sərgərdan və çaşqın olaraq qalacaq və əksər kişilərin evlənmək imkanı olmama səbəbindən subay qızların sayı çoxalacaq və bu zaman hərəmxanaların yaranması üçün yaxşı fürsət və zəminə ələ .düşəcəkdir

Əgər ictimai ədalət bərpa edilərsə və hamı üçün ailə qurmaq və zövcə seçmək imkanı olarsa, hökmən, hər qadın müəyyən bir kişiyə aid olacaq və hərəmxana yaradaraq .eyş-işrət və eşqbazlıqla məşğul olmaq məsələsi aradan qalxacaqdır

Bəyəm, qadınların sayı hansı həddədir ki, yetkin, həddi-büluğ və qadına ehtiyaclı olan kişilər evləndikdən sonra, geridə imkanlı və pullu kişilərin hərəmxana təşkil etməsi ?üçün qadınlar qalmış olsun

Tarixin qaydası hərəmxana təşkil edərək eyş-işrətlə məşğul olan xəlifə və sultanların vəziyyətini diqqətə çatdırmaq, onların ictimai və əxlaqi şərait baxımından hansı məhrumiyyət və bir qadını belə özünə zövcə seçə bilməməyə düçar olduğunu və bunun müqabilində sükut edə və arzuları ürəklərində qalaraq nəticədə, qəbirsanlıqları .ziyarət etdiklərini gözlər önünə sərgiləməkdir

Hərəmxanalarda yaşayan onlarla, yüzlərlə qadın ömrünün sonuna qədər subay .qalmaq məcburiyyətində olan neçə-neçə məhrum və biçarə kişilərin haqqı idi

Əgər bu iki amil bir-birindən ayrılsa və aradan qalxsa, yəni iffətli olmaq və təqva qadın üçün vacib hesab olunsa, cinsi ehtiyacların evlilikdən (daimi və ya müvəqqəti) başqa, digər vasitələrlə təmin edilməsi qeyri-mümkün olsa, ailə qurmaq üçün cavanların iqtisadi və ictimai çətinlikləri ortadan götürülsə və bəşərin təbii olan bu hüququ ödənsə, hərəmxana təşkili

.mümkün olmayan və mahal bir məsələyə çevrilər

Tarixə müxtəsər şəkildə nəzər salsaq, hərəmxanaların yaranması və təşkilində .müvəqqəti evliliyin zərrə qədər də olsa, təsir etmədiyini görərik

Hərəmxanaları ilə tanınan Abbasi xəlifələri və Osmanlı sultanlarının heç biri şiə .məzhəbinin tərəfdarı olmamış və müvəqqəti evlilik qanunundan istifadə etməmişlər

Şiə məzhəbli hökmdar və sultanlar müvəqqəti evlilik qanunundan bəhanə olaraq istifadə edə bilmək imkanına malik olsalar da, heç vaxt Abbasi və Osmanlı padşahları kimi etməmişlər. Bu məsələnin özü həmin macəranın (hərəmxanaların yaranmasının) .digər bir xüsusi ictimai vəziyyətin olması nəticəsində yarandığını göstərir

**?Müvəqqəti evliliyin yaradılması (şəriliyi) eyş–işrət və nəfsin təmini üçündürmü**

İkinci bəhs. Hər hansı bir məsələdə tərəddüd edilməsinə baxmayaraq, asimani və səmavi dinlərlə bağlı onların təkcə insanın şəhvət və istəklərinin qarşısını almaq üçün nazil edilməsini və bu istiqamətdə əksər din tərəfdarlarının məcburən və riyazətlər (özünü məcbur etmələr) hesabına səbr və dözümlülük göstərdiyini düşünmək və onda .şəkk etmək olmaz

İslamın aydın və aşkar üslub və qaydalarından biri onun nəfsəpərəstişlə mübarizə aparmasıdır. Qurani-kərimdə nəfsə pərəstiş məsələsi bütpərəstliklə yanaşı hesab edilir. İslamda məqsəd və hədəfi fəqət müxtəlif qadınlardan istifadə etmək və onlardan kam almaq olan insan Allahın qəzəb etdiyi və onun rəhmətindən uzaq (məlun) kimi tanıtdırılmışdır. Biz talaq və boşanma ilə əlaqədar bəhsdə bu mətləbin .islami material və sənədlətinə toxunacağıq

İslamın digər dinlərdən üstünlüyü onun rahibliklə mübarizə aparmasıdır, nəinki, nəfsəpərəstişə icazə verməsi. İslamın nəzərində, bütün qərizələr (istər cinsi, istərsə də qeyri-cinsi) öz təbiət və tələbinə uyğun halda ödənməlidir. İslam insanların qərizələrini daha da alovlandıraraq onu bitmək bilməyən ruhi

istəklərə çevirməsinə icazə vermir. Əgər hansısa bir məsələdə zülm, ədalətsizlik və nəfsə pərəstiş olarsa, onun İslamın nəzərdə tutduğu məqsədlə uyğun olmadığını .anlamaq üçün kifayətdir

Şübhəsiz, müvəqqəti evlilik qanununun yaradılmasında hədəf nəfsinə pərəstiş edən bir dəstə camaatın hərəmxanalar yaradaraq əyyaşlıq etməsinə, qadınların qapı-qapı .düşməsi və saysıs-hesabsız övladların dünyaya gəlməsinə vəsilə olmaq deyil

Dini rəhbər və imamlar tərəfindən müvəqqəti evliliyə təşviq edilməsinin xüsusi bir .fəlsəfəsi olmuşdur və biz tezliklə onu izah edəcəyik

**Bugünkü dünyada hərəmxanalar**

İndi bugünkü dünyanın hərəmxanalar təşkil etməklə bağlı nə etdiyinə (hansı işlər gördüyünə) diqət edək. Hazırkı dünya hərəmxana yaratmaq adət-ənənəsini ləğv etmişdir. Bügünkü dünya hərəmxanaları qəbul etməyərək onun yaranma amilini aradan qaldırmışdır. Amma hansı amilini? Görəsən, qeyri-bərabərlik yaradan ictimai amilini aradan qaldırmış və nəticədə, bu yolla bütün cavanlar evliliyə üz tutmuş və ?hərəmxana yaradılması ortadan götürülmüşdürmü

Xeyr, başqa bir iş görmüşdür. Birinci amillə - qadınların iffət və təqvası ilə - mübarizə apararaq bu yolda kişi cinsinə ən böyük xidməti göstərmişdir. Qandının dəyərli və .qiymətə layiq olmasını təmin edən iffət və təqva kişi üçün maneə hesab edilmişdir

Bügünkü dünya elə bir iş görmüşdür ki, artıq XX əsr əyyaş kişilərinin baha başa gələn .hərəmxanalar təşkil etməsi və yaratmasına ehtiyac qalmasın

Qərb mədəniyyətinin bərəkəti hesabına, hər tərəf indiki əsrdə yaşayan kişilər üçün hərəmxanadır. Bu əsrin kişilərinə Harun Ər-Rəşid və Fəzl ibn Yəhya Bərməki kimi qüdrət və pul əldə edərək müxtəlif rəng və dərili qadınları almaq, istifadə etmək və onlara sahib olmağa elə də lüzum yoxdur. Qadınlardan istədiyi kimi və hətta, Harun Ər-Rəşidin yuxusuna belə girməyən şəkildə bəhrələnmək və istifadə ütmək üçün, -indiki əsrdə yaşayan kişilərə bir avtomobil və aylıq olaraq iki

üç min tümən (İran pulu) kifayət edər. Otel, restoran və kafelər kişilər üçün .hərəmxana funksiyası və rolunu daşımağı açıq-aşkar elan etmişdir

Özünün ədalətli olduğunu düşünən cavanlardan biri eyni zamanda müxtəlif sima və yaraşıqda olan iyirmi iki məşuqəyə sahib olduğunu çəkinmədən və aşkar şəkildə iddia edir. Daha indiki əsrin kişi cinsi üçün bundan yaxşı nə olsun! İyirminci əsrin kişiləri baha başa gələn, hədsiz xərc və baş ağrısı tələb edən hərəmxana təşkilinin olmamasına .görə heç bir şey itirmir

Əgər "Min bir gecə" əsərinin qəhrəmanı qəbirdən baş qaldırsa və bugünkü əsrin qadınları, eyş-işrət və kef məclislərinin havayı və asan başa gəldiyini görsəydi, heç vaxt ağır zəhmət və xərclərlə yaradılan hərəmxana təşkilinə razı olmadığını, kişi və qadın üçün məsuliyyət yaranmasına səbəb olan müvəqqəti evliliyin ləğv edilməsini və .Qərbə belə bir fürsət yaratdığı üçün də öz təşəkkürünü elan edər və bildirərdi

Əgər "dünənin və bu günün qalibi məlum oldusa, bəs, məğlubu kimdir?" - deyə soruşsanız, təəssüflə dünən və bu günün məğlubu və oyunu uduzanının sadəlövh .varlıq və sadə qəlbli kimi tanınan "qadın cinsi" olduğunu deməliyik

### Xəlifənin müvəqqəti evliliyi qadağan etməsi

Müvəqqəti evlilik" Cəfəri fiqhinə məxsus olan məsələlərdəndir və digər islami" fiqhlərdə (məzhəblərdə) buna icazə verilmir. Mən İslamda şiə və sünni arasında mübahisə və təfriqə yaratmaq fikrində deyiləm. Burada sadəcə həmin məsələnin qısa .tarixçəsinə işarə edəcəyəm

Müsəlmanlar İslamın əvvəllərində müvəqqəti evliliyin olması və peyğəmbərin (s) də üzun səfərlər və müsəlmanların öz qadınlarının uzaq düşdükləri və sıxıntı keçirdikləri zamanlarda müvəqqəti evliliyə icazə verməsi barədə fikir birliyinə malikdirlər. Eyni zamanda, ikinci xəlifənin də öz xilafəti dövründə müvəqqəti evliliyi haram və qadağan etməsi barədə də müsəlmanlar ortaq fikrə sahibdirlər. İkinci xəlifə özünün tanınmış və :məşhur cümləsində belə demişdir

Peyğəmbər (s) zamanında halal olan iki şeyi mən sizə haram edirəm. Onlardan biri“ “həcci-təməttö”, digəri isə “mütə”dir. Sizlərdən hər kəs ona mürtəkib olsa, onu ”!cəzalandıracağam

Əhli-sünnədən olan bir dəstə müvəqqəti evliliyin “peyğəmbərin (s) özü tərəfindən ömrünün sonlarında qadağan edildiyi və ikinci xəlifənin də peyğəmbər (s) tərəfindən həmin mətləbi elan etməsi” məsələsinə etiqadlıdırlar. Amma xəlifənin özündən əlimizə .gəlib çatmış olan ifadələr bu mətləbin xilafı və əksini bildirir

Məsələnin düzgün bəyanı Əllamə Kaşiful Ğitanın söylədikləridir. İkinci xəlifə bu məsələni müsəlmanların vəliyyi-əmrinin (əmr sahibi) səlahiyyətlərinə daxil olduğunu güman edərək qadan etdi. O, özünə bu cür haqq qazandırdı ki, hər hansı bir hakim və .əmr sahibi öz ixtiyarından zamanın tələblərini nəzərə alaraq istifadə edə bilər

Başqa bir ifadə ilə desək, xəlifənin qoyduğu qadağa şəri və qanuni qadağa deyil, siyasi bir qadağa idi. İkinci xəlifə hakimiyyəti dövründə yenicə yaranan və genişlənən müsəlman ölkələrinə səhabələrin yayılması və pərakəndəliyi, eyni zamanda, təzəcə müsəlman olan millətlərlə qaynayıb qarışmasına olan nigarançılığını gizlətmirdi. Sağ və həyatda olduğu müddətdə onların Mədinədən uzaqlaşmasına mane oldu. İlkin olaraq, xəlifə onların İslamı yenicə qəbul etmiş və islami hökmlərin hələ əsaslı şəkildə təsir etmədiyi müsəlmanlarla yaxşı rəftar etməsindən narazı idi və onları gələcək nəsil üçün bir təhlükə kimi görürdü. Aydın məsələdir ki, bu səbəb müvəqqəti bir əmrdən başqa, bir şey deyildi. O zamankı müsəlmanların da xəlifənin bu cür qadağalarını qəbul etməsi onların həmin qanunu daimi bir qanun kimi deyil, xəlifənin əmrini siyasi və müvəqqəti bir məsləhət kimi qiymətləndirmələri idi, yoxsa, dövrün xəlifəsi “peyğəmbər (s) bu cür əmr vermişdir, mən isə onun əksinə hökm verirəm” - desəydi, camaat onun sözlərini qəbul etməz və tabe olmazdılar. Təəssüflər olsun ki, sonradan bu məsələ bir üslub və metod şəklini alaraq əvvəlki xəlifələr və xüsusən, iki xəlifənin dövründə sabit və dəyişilməz qanun halını aldı. Nəticədə, bizim əhli-sünnə

qardaşlarımıza tutduğumuz irad, həqiqətdə, xəlifəyə tutulan iraddır. Xəlifə siyasi baxımdan və müvəqqəti olaraq - on doqquzuncu əsrdə tənbəkiyə edilən qadağa kimi - müvəqqəti evliliyə qadağa qoymasına baxmayaraq, digərlərinin ona əbədilik donu .geyindirməməsi daha yaxşı olardı

Kaşiful Ğitanın sözlərindəki məqsəd o zamankı xəlifənin bu hökmü verib-verməməsi məsələsinin düzgün olub-olmadığını, müsəlmanların hansısa bir əmr sahibi və hakiminin qadağan etmək hüququnun onların səlahiyyətlərinə aid olduğunu və s. araşdırmaq deyil, əksinə İslamın əvvəllərindən müvəqqəti evlilik qanununun olmasını .və heç kəsin bu məsələ ilə müxalifət etmədiyini vurğulamaq və nəzərə çatdırmaqdır

Hər halda, xəlifənin nüfuz və şəxsiyyəti və ölkə idarəçiliyində yürütdüyü siyasət camaatın bu qanunu unutması və yaddan çıxartmasına səbəb olmuş və daimi evliliyin təkmilləşdirici və tamamlayıcısı və tətil edilməsi böyük problem və narahatçılıqlara .bais olan müvəqqəti evliliyin tamamən tərk olunmasına gətirib çıxarmışdır

Bu yerdə pak və məsum imamlar (ə) - İslam dininin mühafizəçiləridirlər - həmin islami sünnə və adət-ənənənin unudularaq tərk olunmaması üçün camaatı müvəqqəti .evliliyə rəğbətləndirərək təşviq edirilər

İmam Cəfər Sadiq (ə) buryurur: “Mənim barəsində heç vaxt təqiyyə etmədiyim mövzulardan biri “mütə” mövzusudur.” Beləliklə, məsləhət olaraq dəyərləndirilən və ikincili hökm daşıyan bir məsələ müvəqqəti evliliyin tərk olunmasına səbəb olmuşdur. İndi isə həmin hökmün dirçəldilməsinə səy və təlaş edilir. Pak və məsum imamlar evli kişiləri bu məsələdən çəkindirərək “müvəqqəti evliliyin onlar üçn deyil, daha çox .ehtiyacı olan kəslər üçün nəzərdə tutulduğunu” deməyə çalışırdılar

İmam Kazım (ə) Əli ibn Yəqtinə buyurur: “Sənin müvəqqəti evliliyə nə ehtiyacın var, belə ki, Allah səni həmin məsələdən ehtiyacsız etmişdir.” Başqa birinə isə belə deyir: “Bu məsələ Allah-taalanın qadınla bağlı ehtiyacsız etmədiyi şəxslər üçündür. Amma evli olan kəslər üçün müvəqqəti evlilik onların

”.öz qadınlarına əlləri çatmadığı zamanlarda lazımdır

Beləliklə, ümumi camaatı təşviq edən zaman imamların məqsədi “tərk edilmiş sünnə”ni dirçəltmək idi, amma ehtiyaclı olan şəxslərin təkcə bu məsələ ilə bağlı təşviq edilməsi və rəğbətləndirilməsi kifayət etmirdi. Barəsində danışdığımız mətləbi şiə .mənbə və rəvayətlərindən əldə etmək olar

Hər halda, aydın olan məsələ bu qanunun yaradılmasında və imamların camaatı təşviq etməsindəki əsil məqsəsin bir sıra heyvan xislətli insanların qafil və biçarə qadınlardan sui-istifadə edə və onları biçarə edərək hərəmxanalar yaratması, nəfs və şəhvətə .pərəstiş və ata-anasız uşaqların sayının çoxalmasının istənilməməsi məsələsidir

### Həzrət Əlidən (ə) bir hədis

Cənab İ.M.Zəncani - “Qırx təklif” əsərinin müəllifi - “Günün qadını” jurnalının ٨٧-ci sayında yazır: “Şeyx Məhəmməd Əbu Zöhrə “Ələhvaluş-şəxsiyyə” kitabında həzrət :Əlidən (ə) belə nəql edir

لا اَعَلمُ احداً تَمَتَّع وهو ُمحصِنٌ اِلاَّ رَجَمتُهُ بالحِجارَهِ

Əgər bir şəxsin mütə etdiyini bilsəm, möhsinə zinasının hökmünü onun üzərində“ ”.tətbiq edər və daş-qalaq (rəcm) etdirərəm

Birincisi, nə üçün şiə və qeyri-şiə hədis və rəvayət kitablarında həzrət Əlidən (ə) mütə barəsində nəql edilən o qədər hədisləri görməzdən gələrək, bir nəfər sünninin nəql etdiyi və sənədi də məlum olmayan həmin hədisin imam Əlidən (ə) olduğunu qəbul edib onun qarşısında təslim olmalı və o hədisdən yapışmalıyıq? Dəyərli və qiymətli cümlələrə sahib həzrət Əlinin (ə) sözləri belədir: “Əgər Ömər qabağa düşərək mütəni haram və qadağan etməsəydi, özlərinə zülm edən azğınlardan başqa, heç kəs zina ”.etməzdi

Yəni, mütə qadağan olunmasaydı, qanun pozuntusuna yol verərək günahı üstün .tutanlardan başqa, heç kim cinsi qərizələr ucbatından zina etməyə məcbur olmazdı

İkincisi, yuxarıda qeyd etdiyimiz ifadələrin “evli kişilərin mütə etdiyini eşitsəm, onları

olduğu halda, mən İ.M.Zəncaninin nə üçün “möhsin” (evli, qadını olan kişi) sözünü “heç .kəs” kimi tərcümə etdiyini başa düşə bilmirəm

Beləliklə, rəvayətdə məqsəd evli kişilərin müvəqqəti evliliyə haqqının olmamasıdır. Nəticədə, əgər heç kimə mütə etmək icazəsi verilməmiş olsaydı, onda “möhsin” sözü .və onun qeydi rəvayətdə gətirilməməli və ləğv edilməli idi

Bu rəvayətin həqiqət olduğunu qəbul etdiyimiz təqdirdə, mütənin qadına ehtiyacı olan, yəni subay və ya qadınları yaxınlarında olmayan və əlçatmaz kişilər üçün nəzərdə tutulduğunu və həmin qanunun bu səbəbdən yaradıldığını deməyimizə əsas verir, .nəinki, onun haram olmasını deməyə

## ÜÇÜNCÜ HİSSƏ

### Qadın və ictimai azadlıq Taleyi seçməkdə azadlıq

:Qorxmuş və narahat halda olan bir qızcığaz peyğəmbərin (s) yanına gələrək

....Ey Allahın Rəsulu! Atamın əlindən-

?Atan sənə nə əziyyət edib ki.....-

Onun bir qardaşı oğlu var və fikrimi soruşmadan məni onun əqdinə (nikahına)- .keçirmişdir

.Atan belə etdiyi üçün doğru olduğunu düşün və əmin oğlunun zövcəsi ol-

Ey Allahın peyğəmbəri! Mən əmim oğlunu sevmədiyim halda, necə onun zövcəsi- ?olum

Əgər onu sevmirsənsə, onda heç. İxtiyarın öz əlindədir. Kimi sevirsənsə, onu özün- .üçün ər olaraq seç

Həqiqətdə, mən elə əmim oğlunu sevirəm və atam mənim nəzərimi soruşmadan bu- işi etdiyi üçün, mən bilərəkdən yanınıza gəldim ki, sizdən bu barədə soruşum və bütün qadınlara ataların qızlarından xəbərsiz olaraq onları ürəkləri istəyən adama ərə .vermək haqlarının olmadığını elan edim

Bu rəvayəti Şəhid Sani və Cəvahir sahibi (sahibi-cəvahir) kimi fəqihlər “Məsalik” və .“Cəvahirul-kəlam” kitabında ümumi olaraq nəql etmişlər

Ərəbin cahiliyyət dövründə atalar öz qızları, ana və bacılarının mütləq ixtiyar sahibi olduğunu düşünür və onların ər seçimində azad və ixtiyara malik olduqlarını qəbul etmirdilər. Qərar vermək baxımından ata, oğul və onlar olmayanda da əmi mütləq şəkildə haqq sahibi idi. Bu iş o yerə qədər irəliləmişdi ki, atalar hələ qız uşaqları dünyaya gəlməmiş və analarının bətnində olduğu zaman, qabaqcadan onları başqa bir kişinin əqdinə keçirirdilər və bu yolla qız uşağı dünyaya gəldikdən və böyüdükdən .sonra, həmin şəxs onu özü ilə apara bilmək haqqına malik olurdu

**Dünyaya gəlməmiş qızı ərə vermək**

Peyğəmbər (s) yerinə yetirdiyi son həcc zamanı (həccətül-vida) atına mindiyi və əlində qamçı olduğu halda, yoluna davam edirdi. Bir nəfər o həzrətin yolunu kəsərək "şikayəti olduğunu" dedi. Peyğəmbər (s) onu dinlədiyini buyurduğu anda həmin şəxs sözə :başladı

Uzun illər öncə cahiliyyət dövründə mən və Tariq ibn Mürqə döyüşlərin birində iştirak - edirdik. Döyüşün ortasında, birdən Mürqə nizəyə ehtiyaclı olduğunu söyləyərək fəryad etdi və "kim mənə nizə gətirsə, ona əvəzində mükafat verəcəyəm" - dedi. Mən ona nəyi mükafat verəcəyini soruşdum. Cavabında : "Söz verirəm ki, dünyaya gələn ilk qız övladımı sənin üçün böyüdəcəyəm" - dedi. Mən qəbul edərək öz nizəmi ona verdim. Döyüş başa çatdı. İllər ötdükdən sonra, mən onun evində ərə getməli bir qızının olduğu xəbərini aldım. Onun yanına gedərək mənə olan borcunu ödəməsini tələb etdim. Amma o, əhdinə vəfa etmək istəməyib məndən ikinci dəfə mehriyyə istədi. İndi, ey ?Allahın peyğəmbəri, sizin yanınıza gəldim görüm mən haqlıyam, yoxsa, o

" ?Peyğəmbər (s) soruşdu: "Onun qızının neçə yaşı var-

.Qızı böyükdür, hətta, saçında ağarmış tükləri də var-

Əgər məsələnin doğrusunu bilmək istəyirsənsə, nə sən haqlısan, nə də Tariq. Öz - .işinlə məşğul olmağa çalış və həmin biçarə qızı rahat burax

O kişi çox təəccübləndi və heyrətdən donaraq peyğəmbərə (s) baxa-baxa qaldı. Öz-özünə fikrə qərq olaraq bunun necə bir qəzavət olduğunu və “bəyəm atalar qızlarının ixtiyar sahibi deyilmi?” - deyə düşünməyə başladı. Görəsən, nə üçün qızın atasına yenidən mehriyyə verməyim və o, öz razılığı ilə qızını mənə təslim etsə, bu iş düzgün deyil? Həzrət peyğəmbər (s) onun düşüncə və fikirlərini oxuyaraq buyurdu: “Əmin ol ki, mənim bu şəkildə hökm etməyimlə nə sən, nə də dostun Tariq günahkar ”.olmayacaqsınız

**Qız və ya bacıların qarşılıqlı olaraq (bir–biri əvəzində) dəyişdirilməsi**

Şiğar” adlı nikah da ataların qızları üzərində mütləq ixtiyar sahibi olmasının digər bir“ göstəricisi idi. “Şiğar” nikahı - qızların qarşılıqlı və bir-biri əvəzində (qız verib qız almaq kimi) dəyişdirilməsi deməkdir. Evində iki ərlik qızı olan hansısa bir şəxs digər bir çəxs ilə qızlarını əvəz-əvəz olaraq dəyişirdi. İslam bu evlilik adətinin batil olduğunu elan edərək .onu ləğv etmişdir

**Peyğəmbər–əkrəm (s) öz qızı Zəhranı (ə) ər seçməkdə sərbəst qoyur**

Peyğəmbərin (s) özü neçə qız köçürtmüşdü. Bununla yanaşı, heç vaxt onların iradə və ixtiyarlarını əllərindən almamışdı. Həzrət Əli (ə) xanım Zəhraya (ə) elçilik üçün peyğəmbərin (s) yanına gəldikdə, o həzrət deyir: “İndiyə kimi səndən əvvəl bir neçə şəxs də elçilik üçün gəlmişdi və mən (s) həmin məsələni, şəxsən, Zəharayla (ə) müzakirə etdim və o, öz narazılığını üzünü çevirərək bildirdi “ İndi də sənin gəldiyini ona xəbər verərəm. Həzrət peyğəmbər (s) əziz və sevimli qızı Zəhraya (ə) məsələni bildirdiyi zaman, o, əvvəlkilərdən fərqli olaraq bu dəfə üzünü çevirmədi və sükut )etməklə öz razılığını bildirdi. Təkbir

.Allahu əkbər) dediyi halda, peyğəmbər (s) xanım Zəhranın (ə) yanından qayıtdı

**Qadının islami inqilabı (hərəkatı) ağ idi**

İslam qadın cinsinə nisbətdə ən böyük xidmətini

göstəmişdir. İslam təkcə ataların mütləq ixtiyarını aradan qaldırmadı, qadına tamamilə istiqlaliyyət verərək müstəqil düşüncə, təffəkkür və şəxsiyyət azadlığı bağışladı və onun təbii olan hüquqlarını rəsmi olaraq tanıdı. Amma İslamın qadın hüquqları istiqamətində atdığı addım Qərbdə mövcud olan və digərlərinin təqlid etdikləri ilə iki :əsaslı fərqə malikdir

Birincisi, qadın və kişinin psixoloji xüsusiyyətləri baxımındandır. İslam bu sahədə möcüzələr yaratmışdır. Biz bu mövzu ilə əlaqədar gələcək məqalələrimizdə bəhs .edəcəyikk və siz həmin nümunələrlə tanış olacaqsınız

İkinci fərq İslamın qadına hürriyyət və şəxsiyyət verə və onları insanlıq hüquqları ilə tanış edərək müxalif cinsə – kişilərə – qarşı və onlara nisbətdə bədbin, üsyankar .olmağa təhrik və məcbur etməməsindədir

Qadının islami hərəkatı qara, qırmızı, bənövşəyi deyil, ağ idi, belə ki, qızların yanında ataya hörməti və qadın yanında ərə ehtiramı aradan aparmamış, ailənin təməllərini sarsıtmamış, qadınları ərləri və övladalrına qarşı bədbin və bədgümün və subay, müftə şikar axtarışında olan və cinsi ehtiyaclarını ödəmək istəyən tamahkar kişilərə faydalanmaq vasitəsi etməmiş və qızları ata qayğısından, qadınları ərlərindən ayıraraq pullu və varlı kişilərə təhvil verməmişdir. Bir sözlə, İslam atalara etimadın aradan qalxması, ailə təməllərinin sarsılması baxımından, fəryad və ah-nalələrin göyə ucalması və “bütün bu fəsadlarla necə mübarizə aparaq?”, “qırx faiz təşkil edən zinadan yaranmış, siqt olan və abort edilən uşaqlarla nə edək?” – deyilməsinin .qarşısını almışdır

Atası məlum olmayan və anası tərəfindən istənilməyərək dünyaya gətirilən uşaqlar qadınlar tərəfindən uşaq evləri və yetimxanalara verilir və bundan sonra həmin .valideynlər heç vaxt onların dalınca bir dəfə də olsun getmir və maraqlanmırlar

Bizim ölkəmizdə də qadınlarla bağlı islami hərəkata ehtiyac var, amma ağ – şəhvətpərəst və nəfsinə tabe kişilərin əli yetişməyən və dəxalət edə bilmədikləri, həqiqətdə, İslamın ali və yüksək qanunlarından yararlanan və birinci növbədə İslam

adlandırılan və onda cəmiyyət üçün məntiqli olaraq hansı işlərin görüldüyünü aydınlaşdıran islami hərəkata, nəiki, Avropaya mənsub qara - ictimai qanun dəyişikliyi .etməklə islami qanunların dəyişdirilməsinə çalışılan hərəkata

Əgər Allahın izni ilə yazdığımız məqaləni başa çatdıra bilsək, İslam hərəkatının qadınlarla bağlı nəzərdə tutduğu məsələləri əhatə edən praşuraların hazırlanması və yayılmasına çalışacağıq. O zaman iranlı qadın yaradacağı inqılabın bütün dünya tərəfindən bəyəniləcəyi və məntiqli olduğunu, həm də on dörd əsrlik bir fəlsəfədən qaynaqlanaraq əlini Qərbin dünənki köhnə dünyasına uzatmadığını daha yaxşı .anlayacaqdır

### Atanın "icazə vermə" məsələsi

Qızlar barəsində atanın vilayəti ilə bağlı bəyan olunan məsələ birinci dəfə evlənmək istəyən bakirə qızların atalarından icazə almalarının şərt olub-olmaması məsələsidir. :İslamın nəzərində, aşağıdakı bir neçə şey aydın şəkildə izah edilib

Oğlan və qızın iqtisadi baxımdan müstəqilliyi. Əgər oğlan və qız həddi-büluğ, aqil və yetkin olarsa, yəni ictimai cəhətdən lazımı qədər fikri inkişifa malik və şəxsən, öz var-dövləti və malını mühafizə və qoruya bilərsə, bu zaman onların var-dövlətini özlərinin ixtiyarında qoymaq lazımdır. Ata, ana, qardaş və ya digər şəxslərin onlara nəzarət və .işlərinə dəxalət etməsinə haqları yoxdur

Aydın olan digər məsələlərdən biri də evlilik və izdivac məsələsidir. Əgər oğlan uşaqları yetkin və normal əqlə sahib olsalar, onların özləri özlərinin ixtiyar sahibidir və kimsə onların işlərinə qarışa bilməz. Amma qızlara gəldikdə isə, əgər onlar bir dəfə ər görmüş (evlənmiş), hazırda isə duldurlarsa (ərsizdilərsə), qətən, kiminsə onların işlərinə dəxalət etmək ixtiyarı yoxdur və bu məsələdə oğlanlarla eyni haqqa malikdirlər. Əgər ?bakirə və birinci dəfə olaraq evlilik peymanı bağlamaq istəsələr necə

Əlbəttə, atasının onun mütləq ixtiyar sahibi olmaması və qızının razılığı olmadan onu ürəyi istədiyi şəxsə ərə vermək

haqqının olmaması barədə hansısa bir sözümüz yoxdur. Bu məsələni əvvəldə qeyd etdiyimiz və peyğəmbərin (s) özündən xəbərsiz və razılığı olmadan onu başqa bir şəxslə evləndirmək istəyən qızın atası ilə əlaqədar dediyi sözlərlə (əgər istək və meylin .yoxdursa, başqa biri ilə evlənə bilərsən) izah edə bilərik

Fəqihlər arasında ixtilaflı məsələ "atasının razılığını cəlb etmədən bakirə qızların evlənmə haqqına malik olmaması" və ya atanın razılığının onların evlənmələrinin düzgün olmasında (evliliyin düzgünlüyündə) heç bir əhəmiyyət kəsb etməməsi" .məsələsindədir

Əlbəttə, aydın və qəti olan digər mətləb atanın səbəbsiz olaraq qızının evlənməsinə razılıq verməkdən imtina etməsinin atanın haqqının aradan qalxmasına bais olması və belə olan halda, əksər İslam fəqihlərinin fikir birliyinə əsasən, qızın ər seçməkdə .tamamilə azad və müstəqil olması məsələsidir

Atanın razılığının şərt olub-olmaması barədə fəqihlər arasında fikir ayrılığı və ixtilaf vardır və əksər fəqihlər, xüsusən, son zamanların fəqihləri atanın razılığını şərt hesab edirlər, amma bir dəstə də bunun əksini düşünür. Bizim ictimai qanun ikinci dəstənin nəzərini - ehtiyyata müvafiq olaraq atanın razılığını şərt bilməyi - əsas götürmüşdür, çünki məsələ aydın olan bir islami məsələ deyil, yəni onu islami cəhətdən deyil, ictimai cəhətdən müzakirə etməyi lazım bilirik. Mənim (Şəhid Mütəhhəri) şəxsi nəzərim ictimai .qanunun bu istiqamətdə kor-koranə addım atmasıdır

**Kişi şəhvətin, qadın isə məhəbbətin əsiri olan məxluqdur**

Bakirə qızların atalarının razılığını istəmələrinin zəruriliyi - ən azı, bunun yaxşı və bəyənilən olması - fəlsəfəsi qızların ctimai cahətdən kişilərə nisbətdə daha gec inkişaf etdiyini düşünmək və onların qüsurlu olduğunu hesab etməkdən qaynaqlanmır. Əgər bu baxımdan olsaydı, onda on altı yaşlı dul qadının atasından icazəyə ehtiyac duymaması, amma on səkkiz yaşlı bakirə bir qızın isə atanın razılığına ehtiyaclı olması arasında nə fərq olardı? Əlavə olaraq, əgər qız öz işlərinin idarəsində hansısa qüsura

malikdirsə, onda nə üçün İslam yetkin və həddi-büluğ olan qıza iqtisadi müstəqillik verir və onun neçə milyon məbləğ dəyərindəki müamilə və ticarətini atası, qardaşı və ərinin rizayətinə ehtiyac duymadan düzgün hesab edir? Bu məsələnin ayrıca bir fəlsəfəsi var və biz onun fiqhi baxımdan dəlillərinə göz yumaraq ictimai qanunu .hazırlayanlara "afərin" deyə bilmərik

Bu məsələnin qadının əqli inkişaf, düşüncə və yetkinlik baxımından qüsurlu olmasına aidiyyatı yoxdur, əksinə qadın və kişinin psixoloji xüsusiyyətlərinə dəxaləti var. Yəni, bir tərəfdən kişinin şikarçı olması, digər tərəfdən də qadının onlara (kişilərə) nisbətdə tez inanan, sədaqətli və vəfalı olması məsələsi ilə bağlılıq və irtibatı vardır. Kişi şəhvətin, qadın isə məhəbbətin əsiri olan məxluqdur. Kişini titrədərək lərzəyə gətirən və taqətdən salan məsələ şəhvət məsələsidir. Psixoloqların nəzərincə, qadınlar bu baxımdan (şəhvət) kişilərdən daha dözümlü və səbirlidirlər. Amma qadınları taqətdən salan, əldən-ayaqdan düşməsinə və kişiyə əsir olmasına səbəb olan məsələ kişilərin eşq və məhəbbətdən dəm vurmasıdır. Qadının tez inanması da elə, bu yerdədir. Bakirə qızlar reallıqları müşahidə etmədən, kişilərin məhəbbət nəğmələrinə aldanır və onlara çox tez inanırlar. Mən sizin məşhur Amerika psixoloqu professor Rikin "Günün qadını" jurnalının doxsanıncı sayında "Dünya kişi və qadın üçün eyni deyil" adı altında verilən .nəzəriyyələrini oxuyub-oxumadığınızı bilmirəm

O deyir: "Kişinin qadına dediyi ən yaxşı cümlə və ifadə "Əzizim, mən səni sevirəm"dir." Davamında Rik qeyd edir ki, qadın üçün xoşbəxtlik "kişinin qəlbini ələ gətirə bilməsi və ".onu ömrü boyunca qorumağı bacarmasıdır

İslam peyğəmbəri (s) bir ilahi psixoloq olaraq on dörd əsr əvvəl həmin məsələyə toxunaraq belə buyurmuşdur: "Kişinin qadına "Səni sevirəm" - deməsi, heç vaxt qadının qəlbindən və yaddaşından silinməz. "Şəhvətpərəst və qadın ovçusu kişilər daimi olaraq qadının bu hissiyyatından sui-istifadə edir. Qadınları ovlamaq və tələyə salmaq üçün "Əzizim, mən sənin dərdindən dəli-divanəyəm və ölürəm" - deməsi ən yaxşı

vasitədir. Son zamanlarda Cavad adlı bir kişi tərəfindən aldadılaraq intihar etmək və özünü öldürmək istəyən Əfsər adlı bir qadının məsələsi dillər əzbərinə çevrilmiş və onların işi məhkəməyə düşmüşdür. Həmin şəxs qadını aldatmaq üçün yuxarıda işarə etdiyimiz düsturdan istifadə etmişdir. “Günün qadını” jurnalına müsahibə verən qadın belə danışır: “Onunla danışmamağıma baxmayaraq, qəlbimdə tez-tez onunla görüşmək və hər saat, hər an onunla birlikdə olmaq istəyirdim. Ona aşiq olmamışdım, amma mənə qarşı göstərdiyi münasibətə ruhən ehtiyacım olduğunu duyurdum. Bütün qadınlar belədir. Əvvəlcə, məhəbbəti duymaq əvəzinə, onlar aşiqə vurulurlar. Mən də ”.həmin qaydadan istisna olmadım

!Bu qadın hələ təcrübəli olanlardan biridir. Onda, vay təcrübəsizlərin halına

Belə yerdə təcrübəsiz qızların kişilərin xüsusiyyətlərindən agah olan ataları ilə məşvərət etməsi - istisna hallardan başqa, bütün atalar qızlarının səadət və xoşbəxtliyini istəyirlər - və onların rəyi ilə müvafiq olmaları və razılıqlarını ələ .gətirmələri məsləhətdir

Burada qanun, ümumiyyətlə, qadını təhqir edərək kiçik saymamış, əksinə öz himayə əlini ona tərəf uzatmışdır. Əgər oğlanlar iddia edərək “nə üçün qanun bizim ata və ya anamızın razılığını cəlb etməyimizi zəruri hesab etmir?” - desə, bu məsələ heç də qızlara atalarının rizayətini ələ gətirməsi məsələsinə görə etiraz edənlərin əməllərindən məntiqsiz deyil. Mən tez-tez qızların başına gələn xoşagəlməz hadisələrlə rastlaşan, bu barədə eşidib bilən kəslərin bir daha qızları valideynlərinə .qarşı etinasız olmağa çağırması və dəvət etməsindən çox təəccüblənirəm

Zənnimcə, belə məsələlər günümüzdə qadın ovçusuna çevrilənlərlə yalandan qadınlara qarşı ürəyi yandığını deyənlər arasında bir növ, saziş və anlaşmadır. Bu tip və xarakterli şəxslər qadınları ov timsalında görür və onları şikarçılara (kişilərə) tərəf .yönəldə və hürküdərək canlı hədəfə çevirirlər

:Qırx təklif”in müəllifi “Günün qadını” jurnalının səksən səkkizinci sayında belə yazır“

cu maddə həddi-büluğ və yetkinliklə bağlı olan bütün-۱۰۴۳“

qanunlara müxalif və naqis, eyni zamanda, insanların əsil azadlığı və millətlərin “ ....vəhdəti ilə ziddir

Elə bil, müəllif xatırladılan qanunun ataların qızlarını istədikləri kəsə verə bilmək haqqının olması və ya heç bir səbəb olmadan öz qızlarının evlənmələrinə mane ola .bilməsinə xidmət etməsi təsəvvüründədir

Əgər evlənmək ixtiyarının qızların öz əlində olduğunu və atanın razılığının da evliliyin düzgünlüyündə şərt – atanın öz qızı barəsində onun zərərini və evliliyinə mane olmaq istəmədiyini nəzərə almaqla – hesab edildiyini qəbul etsək, onun insan azadlığı ilə nə ziddiyyəti və nə eybi var? Bu, qanunun ehtiyyata müvafiq olaraq təcrübəsiz qızları xətərdən qoruması üçün atdığı addım və kişi təbiətinə etdiyi sui-zəndən qaynaqlanan .məsələdir

Qırx təklif”in müəllifi yazır: “Qanunu məyyən edən kəslər hələ fikri cəhətdən düzgün“ inkişfa malki olmayan on altı yaşındakı qızı evliliyin, zövcə olmaq və ərə sahib olmanın nə olduğunu dərk etmədiyi halda, evlənə bilmək səlahiyyətinə malik olmasına icazə verirlər. Onlar bu xüsusiyyətlərə sahib olan bir qız uşağına evlənmək icazəsi verir, amma iyirmi beş və ya qırx yaşında olan, universitet bitirmiş, ali təhsilli və yüksək səviyyəli bir qıza savadsız atası və ya babasının razılığı olmadan evlənməsinə icazə ”.vermirlər

Birincisi, qanunun hansı hissəsindən on altı yaşlı qızın atasının icazəsi olmadan evlənə bilməsi, amma iyirmi beş və qırx yaşlı ali təhsilli bir qızın isə əksinə, evlənə bilməməsi ?anlaşılır

İkincisi, atanın icazə verməsi şərti kişilərin xüsusiyyətlərini bilmək və qızına bu sahədə yardımçı olmaq baxımından, müəyyən hallarda lazımlıdır, əgər qızın evlənməsinə .maneə şəklini alarsa, heç bir etibar və əhəmiyyətə malik deyil

Üçüncüsü, indiyi qədər hansısa bir hakimin meydana çıxaraq ictimai qanunda qızın evlənməsi üçün düşüncə və əqli inkişafının şərt olmadığını və müəllifin dediyi kimi, evlilik və ərə getmənin nə olduğunu anlamadığı halda, evlənməsinə icazə verilməsinin .mümkünlüyünü iddia etdiyini güman etmirəm

Mülkiyyət qanunun ۲۱۱-ci maddəsində belə yazılır: “Müamilə edən tərəflərin səlahiyyətli hesab edilə bilməsi üçün onların aqil və yetkin olmaları lazımdır.” Qanunda müamilə edən tərəflər (mutəamiləyn) kəlməsinin işlədilməsinə baxmayaraq, evlilik bir müamilə deyil və qanunu tərtib edənlər onun ardının ۱۸۱-ci maddədən başlanmasını nəzərdə tutaraq ümumi başlıq altında (əqd, müamilə və s.) qeyd etmiş və ۲۱۱-ci maddəni (əql və yetkin olmanı) yuxarıdakı məsələlərin hamısı üçün “ümumi .xüsusiyyətlər” kimi vurğulamışlar

Bütün qədimi sənədlərdə kişi və qadının adını “baliğ”, “aqil” və “yetkin” sözlərindən sonra qeyd edirdilər. Belə olduğu halda, ictimai qanunla bağlı məqalə yazan müəlliflər !?bu məsələdən necə qəflət etmişlər

Qanunu təyin edənlər fikri dəyişikliyin bu həddə qədər gəlib çıxacağını və nikah maddəsinə yenidən nəzər salaraq əql, yetkinlik və inkişaf məsələsi ilə əlaqədar .yenidən diqqət etməli olacaqlarını gözləmirdilər

İctimai qanuna şərh verənlərdən biri (doktor Seyid Əli Şayqan) ۱۰۶۴-cü maddədə deyilən “Əqdi oxuyanın həddi-büluğ, aqil və iki tərəf arasında evlilik rabitəsini bərqərar etmək niyyətində olması vacibdir” cümləsinin evlənən tərəflərə şamil olduğunu və yetkinliyin şərt olaraq qeyd edilmədiyini düşünərək, onun ۲۱۱-ci maddə ilə ziddiyyət təşkil etməsini qeyd edir və ardınca izaha başlayır. Halbuki, o, ۱۰۶۴-cü maddədə qeyd edilənlərin əqdi oxuyana (aqidə) aid olduğunu nəzərdən qaçırmışdır və əqdi oxuyanın .(aqidin) yetkin olması lazım deyil

Bu bəhsdə etiraz olunmalı məsələ İran camaatının əməlidir, nəinki, islami və ictimai qanun. Bizim camaatın əksəriyyəti hələ də cahiliyyət dövründəki kimi, özünü qızlarına nisbətdə mütləq ixtiyar sahibi hesab edir və onların müqabilində gələcək övladlarının atası və həyat yoldaşı ünvanında seçim etdərək nəzərlərini bildirməsini həyasızlıq və nəzakətdən xaric olan bir əməl kimi qiymətləndirir və İslami cəhətdən də, qızların aydın olaraq nəzərdə tutulan fikri inkişaflarını görməzdən gəlirlər. Qızların fikri .inkişafını nəzərə almadan həyata keçirilən izdivacların çoxu batil və faydasızdır

Əqdi oxuyanlar qızların inkişaf və yetkinliyini araşdırmadan, onların həddi-büluğ olması ilə kifayətlənirlər. Amma hamımıza böyük alimlərdən qızların inkişaf, əql və yetkinliklərini imtahan edib yoxlamaqla bağlı hansı məsələrə daha çox riəyət etmələri ilə əlaqədar məlumatlar gəlib çatmışdır. Alimlərdən bəziləri qızların dini baxımdan inkişafını şərt bilmişlər. Onlar əqd və evliliyi sadəcə qızın üsulid-dindən (tövhid, nübuvvət, imamət, ədalət və məad) anlayışı olduğu zaman düzgün hesab edirdilər, amma təəssüflər olsun ki, indiki valideynlər, əqd oxuyanlar və kəbin kəsənlər həmin .məsələlərə riayət və diqqət etmirlər

Əlbəttə, camaatı tənqid atəşinə tutmaq niyyətində olmadıqları üçün, bütün eyibləri ictimai qanunda görərək çanağı onun başında çartladır və bütün insanların diqqət və .düşüncələrini onun üzərinə yönəldirlər

Mənim nəzərimcə, ictimai qanunun ۱۰۶۴-cü maddəsinə tutulan irad yerli iraddır. Həmin maddədə deyilir: “On beş yaşında olan qızlar on səkkiz yaşına çatmayana qədər, ”.atalarının icazəsi olmadan evlənə bilməzlər

Bu maddəyə əsasən, on beş və on səkkiz yaş arasında olan qızlar (dul olsa da belə) atasının icazəsi olmadan evlənə bilməzlər, halbuki, nə əqli, nə də şiə fiqhi baxımdan, bir dəfə ərə gedən (dul) və həddi-büluğ və yetkinlik şərtlərinə malik bir qızın ikinci dəfə .evlənmək istədikdə, atasının icazə və razılığını cəlb etməsinə ehtiyac yoxdur

## DÖRDÜNCÜ HİSSƏ

### (İslam və həyatın yenilənməsi (۱

### Zamanın tələbləri

Mən “İnsan və tale” kitabının müqəddiməsində “müsəlmanların əzəməti və onlardakı dəyişikliklərin səbəbləri” məsələsini araşdırarkən tədqiqat aparmağımı üç hissədə müəyyənləşdirdim: İslam, müsəlmanlar və xarici amillər. Müqəddimədə qeyd etdiyim və araşdırılmasına ehtiyac duyulan iyirmi yeddi mövzudan biri də, həmin mövzudur və mən bu zəmində “İslam və zamanın tələbləri” adı altında risalə nəşr etdirəcəyimə vədə vermiş və əlbəttə, bunun üçün əvvəlcədən çoxlu sayda qeydlər də apararaq .hazırlıq görmüşəm

Bu silsilə təşkil edən məqalələrə risalə təşkil edə bilməsi üçün bütün mətləbləri sığışdırmağın mümkün olmamasına baxmayaraq, bu mövzu ilə bağlı oxucuların zehnində olan məsələlərə aydınlıq gətirməyə çalışararaq izah verəcəyəm. “Məzhəb (din) və təkamül” mövzusu biz müsəlmanlardan daha çox digər məzhəbdən olanları düşündürən mövzulardan hesab edilir. Dünyanın əksər ziyalı və mütəfəkkirlərinin dini tərk etməsinə səbəb olan yeganə amil onların “həyatın yenilənməsi ilə dinin uyğun .olmadığı”nı düşünməsi olmuşdur

Onlar elə düşünürdülər ki, dindarlığın müqəddimə və əsası

ətalət, sükut və dəyişiklik və yenilənmə ilə mübarizə aparmaqdır. Başqa bir ifadə ilə desək, dinin xüsusiyyətini, “sabit”, “olduğu kimi” və “dəyişməz şəkildə qalmaq” mənasında başa düşürdülər. Hindistanın Baş Naziri Cəvahirləl Nehru dinə zidd olan əqidəyə sahib və heç bir din və məzhəbə etiqadlı olmayan bir şəxs idi. Onun dediklərinə əsasən, dinin “doqmatizm” və “ətalət” tərəfi Cəvahirləl Nehrunun dindən .nifrət etməsinə səbəb olmuşdur

Cəvahirləl Nehru ömrünün sonlarında öz vücudu və dünyada hansısa bir boşluğun olmasını müşahidə edir və həmin boşluğun mənəviyyatdan başqa, heç bir şeylə doldurula bilməyəcəyi qənaətinə gəlir. Bununla belə, öz düşüncə və əqlində yer tutmuş .“din və məzhəblərin ətaləti” fikrindən vəhşət hissi keçirir

Hindistanın qəzet müxbirlərindən Karancya adlı biri Cəvahirləl Nehrudan ömrünün sonunda müsahibə almağa nail olur (həmin müsahibə farscaya tərcümə edilmişdir) və demək olar ki, həmin müsahibədə o, ümumilikdə dünya barəsindəki sonuncu düşüncə və nəzərlərini bildirmişdir. Karancya onunla Qandi barəsində müzakirələr apararkən deyir: “Bəzi ziyalı və mütərəqqi fikirli ünsürlər Qandinin öz hissi və mənəvi həll yolları ilə sizin sosializmlə bağlı ibtidai etiqadlarınızı sarsıtdığını və titrətdiyini deyirlər.” Nehru cavab olaraq deyir: “Mənəvi və ruhani üsullardan istifadə etmək də çox yaxşı və lazımdır. Mən həmişə Qandi ilə bu barədə eyni əqidədə və həmfikir olmuşam və əvvəlkinə nisbətdə bu gün həmin vasitələrdən istifadə etməyin daha da zəruri olduğunu hesab edirəm. Çünki dünənə nisbətdə bu gün daha çox yayılan mədəniyyətin mənəvi boşluğunda dünənkindən artıq ruhi və mənəvi suallara cavab tapmalıyıq.” Karancya daha sonra Cəvahirləl Nehruya marksizmlə əlaqədar suallar verir və o, marksizmdə olan bir sıra çatışmamazlıqlara toxunaraq mənəvi və ruhi həll yollarına müraciət etməyi məsləhət görür. Bu zaman Karancya ona deyir: “Cənab Nehru! Sizin indi əxlaqi məsələlərin ruhi (psixoloji) və mənəvi həll yolları barəsində danışmağınız, əvvəllər (sizin cavanlığınızda) dediyiniz sözlərlə ziddiyyət və fərqlilik təşkil etmirmi? Sizin

dediklərinizdən ömrünüzün son anlarında Allah axtarışında olduğunuz anlaşılır.” Nehru cavab verir: “Bəli, mən dəyişilmişəm. Mənim əxlaqi və ruhi həll yolları üzərində təkid etməyim bilməyərəkdən və diqqətsiz olaraq deyil.” Sonra özü sözünə davam edərək deyir ki, “indi əxlaqi və mənəvi məsələləri ən ali və yuxarı səviyyəyə necə qaldırmaq :olar?” - problemi qarşıya çıxır. Özü də bu cür cavab verir

Bunun üçün dinlərin olması aydın məsələdir, amma təəssüflər olsun ki, dinlər təqlidi“ və qəlib şəklində olaraq bəzi quru və cansız göstərişlər və müəyyən işlərin yerinə yetirilməsi halında aşağı səviyyəyə enmiş və onun həqiqi məfhum və ruhu aradan ”.qalxmış və sadəcə onun xarici (zahiri) görünüşü qalmışdır

## İslam və zamanın tələbləri

Din və məzhəblər arasından heç biri İslam qədər insanlar və camaatın həyati məsələlərinə müdaxilə etməmişdir. İslam özünün nəzərdə tutduğu proqramında təkcə dualar, ibadətlər, zikrlər və əxlaqi öyüd-nəsihətlərlə kifayətlənməmişdir. Bəndələrlə Allah arasındakı rabitəyə toxunaraq onu izah etdiyi kimi, insanların bir-birinə nisbətdə hüquq və vəzifələrinin əsas xəttini də müxtəlif şəkillərdə bəyan etmişdir. Həqiqətdə, İslamın zamanla ayaqlaşması və uyğunluğu daha çox diqqət mərkəzində olan .məsələlərdəndir

## Xaricilərin (yadellilərin) nəzərində İslamın zamanla uyğunlaşma xisləti

Təsadüfi deyil ki, xarici alim və yazıçıların əksəriyyəti İslamı ictimai və ictimai qanunlar baxımından mütaliə edə və onun qanunlarını silsilə təşkil edən “mütərəqqi qanunlar” kimi dəyərləndirərək, bu dinin canlı və əbədi bir din və zamanın inkişaf və təkamülü ilə ayaqlaşmaq qabiliyyətinə malik olmasını tərifləmiş və onu diqqət mərkəzində .saxlamışlar

İngiltərəli azad fikirli və məşhur yazıçı Bernard Şav yazır: “Mən həmişə həzrət Məhəmmədin (s) dininə təəccüb doğuracaq qədər canlı və əbədi olması xüsusiyyətinə görə, sonsuz ehtiram göstərmişəm. Mənim nəzərimcə, İslam dini həyatın müxtəlif

halət və dəyişkənlikləri ilə uzlaşmaq və uyğunlaşa bilmək, eyni zamanda, əsr və qərinələrlə qarşı-qarşıya gəlmək istedadına malik olan yeganə bir dindir. Mən bu cür düşünür və təxmin edirəm ki, onun təsirləri elə indidən görülməkdədir və Məhəmmədə (s) inamı Avropanın sabahkı gələcəyi qəbul edəcəkdir. Orta əsrlərin ruhaniləri Məhəmmədin (s) dini üzərinə təəssüb və ya cahillikdən qaranlıq pərdə çəkirdilər. Onların kin və qəzəblərindən, o həzrət gözlərində Məsihə (ə) zidd olan bir şəxs kimi cilvələnirdi. Mən bu qeyri-adi və fövqəladə şəxsiyyətə malik şəxs barəsində mütaliə edərək belə nəticəyə gəlmişəm ki, əslində, onu Məsihə (ə) zidd biri kimi deyil, bəşərin xilasedicisi və nicat verəni kimi tanıtdırmaq lazımdır. Mənim etiqadıma görə, əgər dünya onun timsalındakı kimi birinin ixtiyarında qoyularsa, bəşərin bütün çətinlik və problemləri aradan qalxar və yer üzü sülh və əminamanlıqda və insanların arzuları ”.təmin edilmiş olar

Doktor Şibli Şmil Lüblanlı materialist məslək bir ərəbdir. O, ilk dəfə olaraq Darvinin “Növlərin əsası (özəyi)” əsərini almaniyalı Buxnerin “Şərhi” də əlavə olmaqla, ərəb dilinə tərcümə edərək din və məzhəb əleyhinə müharibə elan etmiş və həmin əsəri ərəbdilli insanların ixtiyarında qoymuşdur. O, materialist olmasına baxmayaraq, İslama müsbət və yaxşı münasibət bəsləməkdən və onun zamanla ayaqlaşaraq canlı .və əbədi bir din olmasını deməkdən də geri qalmır

Həmin şəxsin ərəbcə nəşr etdirdiyi “Fəlsəfətun-nuşu vəl irtiqa” əsərinin ikinci cildində “Əl-Quran vəl əmran” başlığı altında məqaləsi mövcuddur. O, bu məqaləni islami ölkələrə gələrək müsəlmanların həyatındakı dəyişikliyi İslamla əlaqələndirən və onu .əsas tutan bir xaricinin fikirlərini rədd etmək məqsədi ilə yazmışdır

Şibli Şmil öz məqaləsində müsəlmanların inkişaf və dəyişikliyinə səbəb olan amilin İslam deyil, İslamın ictimai təlimlərindən üz çevirilməsi məsələsi olmasını sübut etməyə və İslamı tanımayan və ona həmlə edən qərblilərin şərqliləri öz aralarında yaratdıqları və təyin etdikləri qanunlara qarşı bədbin edərək qul boyunduruğunu .onların boynuna salmaq istədiklərini diqqətə çatdırmağa səy etmişdir

Bizim əsrimizdə də “Görəsən, İslam zamanın tələbləri ilə uzlaşa bilir, yoxsa, yox?” – ümumilik təşkil edən suallardandır. Müxtəli təbəqələrlə, xüsusən, təcrübəli, dünya görüşünə malik və təsilli olanlarla ünsiyyətdə olduğum müddətdə, mən bu mətləb .qədər sual atəşinə tutulan digər bir mətləblə rastlaşmamışam

## İradlar

Bəzən suallara fəlsəfi don geyindirərək deyirlər: “Bu dünyadakı bütün şeylər dəyişir, sabit və eyni şəkildə qalmır. Bəşər cəmiyyəti də bu qaydadan istisna deyil. Belə olduğu halda, bir sıra silsilə təşkil edən ictimai qanunların həmişə sabit və dəyişməz qalması ”?necə mümkün olur

Əgər bu məsələni fəqət fəlsəfi cəhətdən diqqət mərkəzində yerləşdirmiş olsaq, cavabı aydındır. Həmişə dəyişiklikdə olan şeylərin köhnəlmə və yenilənmə, inkişaf və tərəqqi xüsusiyyətləri vardır və onlar daimən bu dünyanın maddi olan hissə və tərkiblərini təşkil edirlər. Bununla yanaşı, dünyanın qanunları həmişə sabit olaraq qalır. Məsələn, canlı varlıqlar xüsusi qanunlara uyğun olaraq təkamül və inkişaf edir və etməkdədir. Bu inkişaf və təkamül qanunlarının necəliyini alimlər bəyan etmişlər. Canlı varlıqların özünün daimi şəkildə inkişaf və dəyişiklikdə olmasına baxmayaraq, təkamül qanunu necə, dəyişkəndirmi? Əlbəttə, təkamül və inkişaf qanunları dəyişkən deyildir. Bizim söhbətimiz qanunlar barəsindədir. Bu baxımdan, qanunun təbii bir qanun, yoxsa, insanlar tərəfindən müəyyən edilən qanun olmasında heç bir fərq yoxdur, çünki insanlar tərəfindən müəyyən edilmiş qanunun təbiətdən istifadə edilərək (qaynaq və mənbəyi təbiət olaraq) müəyyən edilməsi, həmçinin, həmin qanunun bəşər cəmiyyəti .və fərdlərin təkamül və inkişafında “aparıcı xətt” mövqeyini daşıması mümkündür

Amma İslamın zamanın tələbləri ilə uzlaşıb-uzlaşmaması barədə mövcud olan suallar təkcə ümumi və fəlsəfi tərəf və yönə malik deyil. Bütün suallardan daha artıq və təkrarən verilən suallar “qanunların ehtiyaclar zəminəsində təyin olunması və bəşərin bü cür ictimai ehtiyacları sabit və ətalətdə

qalmadığı üçün, ictimai qanunların da sabit və ətalətdə qalmasının mümkün olmaması" .barədədir

Bu sual necə də dəyərli və yaxşı sualdır! Həqiqətdə, İslam dininin möcüzəli və təəccüb doğuran yönlərindən biri - bunu hər müsəlman bilir və hər alim həmin məsələyə görə qürur və iftixar hissi keçirir - sabit və dəyişməyən ictimai ehtiyaclara uyğun olaraq sabit ictimai qanunlar, lakin müvəqqəti və dəyişkən ehtiyaclar üçün də dəyişkən və əvəz edilən ictimai qanunları nəzərdə tutmasıdır. Biz Allahın yardım və köməkliyi ilə bu .silsilə təşkil edən məqalələrdə onunla bağlı şərh verəcəyik

**?Zamanın özü nələrlə uyğunluq təşkil edir**

:Bəhsə daxil olmazdan qabaq, iki mətləbi nəzərinizə çatdırmağı lazım bilirəm

Birincisi, zamanın inkişaf, dəyişiklik və təkamülündən dəm vuran əksər insanlar, ictimai vəziyyətdə yaranan hər cür dəyişikliyi - xüsusən, Qərbdən qaynaqlanan dəyişikliyi - inkişaf və təkamül hesab edirlər və bu, günümüzdəki camaatın azmasına səbəb olaraq onlar arasında yayılmış ən azğın düşüncə tərzidir. Həmin qrupun nəzərində, həyat üçün lazım olan vasitə və vəsilələr günbəgün dəyişdiyi, naqis olanın öz yerini daha da kamil olana verdiyi, elm və texnika inkişaf və tərəqqidə olduğu üçün, insan həyatında baş verən bütün dəyişikliklər də bir növ, inkişafdır və yaxşı qarşılanmalıdır. Əksinə, bunlar zamanın cəbr və məcburiyyətidir ki, istər-istəməz öz yerini tutur və əslində, nə bütün dəyişikliklər birbaşa elm və texnikanın inkişafının .nəticəsidir, nə də işin içində zərurət və cəbr yoxdur

Elmin inkişaf və təkamüldə olduğu həmin halda belə, insan təbiətinin yırtıcılıq və həvəsbazlığı boş-bekar qalmır. Elm və əqlin inkişafı insanı təkamülə doğru aparmaq istəyir, amma insanın yırtıcı və vəhşi təbiəti isə digər insanları inhiraf və azğınlığa sürükləməyə çalışaraq səy və təlaş edir. İnsanın bu xisləti elm və texniki inkişafı özünün heyvani və şəhvətlə bağlı olan ehtiyaclarını ödəmək istiqamətində bir alət kimi görərək ondan istifadə etməyə çalışır. Zamanın inkişaf və təkamülü

olduğu kimi, onun fəsad və zərərləri də vardır. Zamanın təkamülü ilə birlikdə inkişaf etmək və onun fəsadları ilə də mübarizə aparmaq lazımdır. Mürtəce (mənfi, zidd) və mütərəqqi amillərin hər ikisi zamanın əleyhinə çalışır. Mürtəce amillər zamanın inkişafına qarşı və ona mane olmaq üçün, mütərəqqi amillər isə zamanın inkişafı və zidd amillərlə mübarizə aparmaq üçün fəaliyyət göstərir. Əgər zaman və zamanın dəyişikliklərini bütün yaxşı və pis şeylər üçün ölçü və miqyas hesab etsək, onda, zamanın özü və dəyişikliyini nə ilə ölçək? Əgər hər bir şeyi zamanla tətbiq etsək, zamanın özünü nə ilə tətbiq edək? Əgər insan hər bir məsələni zamana tabe etdirərək onun dəyişiklitindən asılı olsa, bəs, onun xəlq olunmasındakı hədəf, fəaliyyət və iradəsi necə olsun? Zaman nəqliyyatına minmiş olan insan bir an belə, onu idarə etməkdən və hansı istiqamətə hərəkət etməsindən qəflət etməməlidir. Zamanın dəyişikliklərindən dəm vuraraq ona diqqətdən və onu idarə etməkdən qafil olan kəslər, ata minmiş, lakin .özlərini atın ixtiyarında qoymuş olan şəxslərə bənzəyirlər

**?Uyğunluq, yoxsa, aradan qalxma**

Burada xatırladılması zəruri olan ikinci mətləb bəzi insanların “İslam və zamanın tələbləri” problemini asanlıqla və sadə düsturlarla həll etməyə çalışaraq “İslam dini əbədi və bütün zaman və əsrlərlə uyğunlaşa bilən bir dindir” – deməsi məsələsidir. Elə ki, onlardan “bu uyğunlaşmanın keyfiyyəti və düsturu (qaydası) necədir?” – deyə soruşduqda, “zamanın vəziyyətində dəyişiklik olduğunu gördüyümüz zaman, biz əvvəlki qanunları aradan qaldıraraq onların yerinə yeni qanunlar təyin edirik.” – .deyirlər

Qırx təklif”in müəllifi məsələni həmin yolla həll edərək deyir: “Dinlərin dünyəvi“ qanunları təsir qəbul etmə xüsusiyyətinə malik olmalı və elm, texnika və mədəniyyətin inkişafı ilə ayaqlaşmalıdır. Bu kimi hələtlər və onun (dinin) zamanla uyğunlaşmaq məsələsi İslamın ali qanunları ilə nəinki, müxalif və ziddiyyət təşkil edir, əksinə onun

.(xüsusiyyət və ruhu ilə münasibdir” (“Günün qadını” jurnalının ۹۰-cı sayı, səh. ۷۵

Adı çəkilən müəllif bu cümlələrin əvvəlində və sonrasında belə deyir: “Zamanın tələbləri dəyişiklikdə olduğu və hər bir zaman yeni qanunlar tələb etdiyindən və İslamın mülki və ictimai qanunları da ərəbin cahiliyyət adət-ənənələri və sadə həyat tərzi ilə uyğun olduğu və hazırkı zamanın ehtiyaclarını ödəmədiyindən (zamanla tətbiq “ .edilə bilmədiyindən), onların yerinə günümüzdə digər qanunlar təyin edilməlidir

Bu tipli şəxslərdən soruşmaq lazımdır ki, əgər zamanla uyğunlaşmaq qabiliyyətinin olmasında məqsəd qanunların dəyişilməsidirsə, onda, hansı qanun bu cür xüsusiyyətlərə malik deyil? Hansı qanun bu mənada zamanla uyğunluq təşkil edə bilmir?! İslamın zamanla uyğunlaşması barədə verilən belə bir izah, eynilə hansısa bir şəxsin “kitab və kitabxanalar ömürdən ləzzət duymaq üçün ən yaxşı vəsilədir” - deməsinə bənzəyir. Elə ki, ondan izah etməsini istədikdə, “kitabları hərraca qoyaraq satmaq və onların pulu ilə də eyş-işrətlə məşğul olmaq üçündür” - deyə cavab verməsidir. Həmin müəllif (qırx təklif müəllifi) yazır: “İslam təlimləri üç qisimdir: Birinci qisim - tövhid, ədalət və məad və sairədən ibarət üsul və əqaiddir. İkinci qisim - namazın müqəddimati işlərinin həyata keçirilməsi, həcc, oruc və təharətlə bağlı olan ibadət məsələləridir. Amma üçüncü qisim dinin hissələrindən hesab edilmir, çünki dinin insanların həyatı ilə heç bir münasibəti yoxdur, eyni zamanda, Peyğəmbərin (s) özü də bu qismi dinin bir hissəsi və risalətə aid olan bir vəzifə kimi qeyd etməmişdir, əksinə o, rəhbər və hakim olduğu üçün bu məsələləri diqqətə çatdırmışdır və dinin vəzifəsi camaatı namaz, oruc və ibadətə məcbur etməkdir. Dinin camaatın dünyəvi həyatı ilə ”!nə işi var

Mən İslam ölkəsində yaşayan, amma İslamın məntiqindən bu qədər bixəbər olan bir şəxsin olmasına inana bilmirəm! Bəyəm, Quran peyğəmbər və ənbiyaların hədəflərini :bəyan etməmişdirmi?! Quran tamamilə açıq-aşkar bir surətdə demirmi ki

{لَقَدْ أَرْسَلْنَا رُسُلَنَا بِالْبَيِّنَاتِ وَأَنْزَلْنَا مَعَهُمُ الْكِتَابَ وَالْمِيزَانَ لِيَقُومَ النَّاسُ بِالْقِسْطِ}

Biz peyğəmbərlərimizi açıq-aşkar dəlillərlə (möcüzələrlə) göndərdik. Biz onlarla“ birlikdə (Allahın hökmlərini bildirən səmavi) kitab və ədalət tərəzisi (şəriət) nazil etdik (ki, insanlar bir-biri ilə ədalətli rəftar etsinlər.”(١)

Quran ictimai ədaləti bütün peyğəmbərlər üçün əsil hədəf ünvanında xatırlatmışdır. Əgər Qurana əməl etmək istəmirsinizsə, onda, nə üçün daha da böyük olan bir günaha mürtəkib olaraq Quran və İslama töhmət vurursunuz? Bu gün bəşər özünün nicat verəni və himayəedicisi olan dinin əxlaqi qanunlarından uzaq düşdüyü üçün, bədbəxtliklərə giriftar olaraq bataqlığa düşmüşdür. Biz yarım əsrdir ki, “İslm sadəcə məscid və məbədlərlə məhdudlaşsın və cəmiyyətlə heç bir işi olmasın” sözləri ilə tanışıq və qarnımız bunlara toxdur. Bu cür fikirlər islami ölkələrin sərhədlərindən kənarda yaradılmış və indi də müsəlman ölkələrində təbliğ edilməkdədir. Sizin .icazənizlə, mən bu cümlələri daha sadə və anlaşıqlı şəkildə izah edəcəyəm

Bunun xülasə şəkildə mənası “İslam kommunizmin müqabilində dayandığı və onun qarşısını aldığı müddətdə qalmalı, amma Qərbin mənafeləri ilə toqquşduğu zaman aradan getməlidir.” - deməkdir. Qərbli camaatın nəzərincə, İslamın ibadətlə bağlı qanunları yeri və zamanı gəldikcə, kommunizmin bir nömrəli sistem və Allaha zidd olması səbəbilə camaatın onun əleyhinə qaldırılması və hərəkətə gətirilməsi üçün saxlanılmalıdır. Amma müsəlmanların həyat fəlsəfəsi hesab edilən və buna sahib olmaqla qərblilər qarşısında daha artıq istiqlaliyyət və şəxsiyyət kəsb etmələrinə səbəb və onların hərislikləri müqabilində həzm edilmələrinə maneə olan İslamın .ictimai qanunları aradan qaldırılmalıdır

Quran ayələrinin bəzilərinə) {نُـــؤْمِنُ بِبَعْضٍ وَنَكْفُرُ بِبَعْضٍ} Birincisi, on dörd əsrdir ki, Quran (inanır, bəzilərinə isə kafir olurlar

məsələsini etibar və qüvvədən salmış və elan etmişdir ki, İslam parçalanmazdır. İkincisi, müsəlmanların bu fırıldaqlara aldanmamaları vaxtının gəlib çatdığını güman edirəm. Artıq

insanların ayırdetmə qüvvəsi daha da artmış və onlar elm və texnikadakı inkişafla Qərbdən qaynaqlanan fəsad və azğınlıqlar arasında fərq qoymağa qadirdilər. Müsəlman ölkələrində yaşayan insanlar hər şeydən öncə, islami təlimlərinin dəyərliliyinə önəm vermiş və müstəqil həyatın yeganə fəlsəfəsinin İslam qanunlarında olduğunu təşxis və müəyyən etmiş və nəyin bahasına olursa olsun, onu əldən vermək istəmirlər. Müsəlmanlar islami qanunlar əleyhinə aparılan təbliğatların istismarçıların məkr və hiyləsindən başqa, bir şey olmadığını bilirlər. Üçüncüsü, bu tezislərin həyata keçirilməsini başladanlar, İslamın məscid və məbədlərlə məhdudlaşmayaraq ən güclü və öndə gedən və ya digər sistemlər müqabilində müqavimət göstərərək dayana bildiyini və bir həyat fəlsəfəsi kimi cəmiyyətə hökmranlıq etdiyini bilməli və anlamalıdırlar. Məscidlərlə məhdudlaşmayan İslam meydanı Qərb təfəkkürü üçün boş qoyduğu kimi, Qərbə zidd olan məsələlərin yayılmasına görə də meydanı boşaldacaqdır. Bəzi İslami ölkələrdə Qərbin at oynatması həmin səhvdən (İslamın meydanı boş qoymasından) qaynaqlanan səmərədir.

### (İslam və həyatın yenilənməsi (٢

İnsan icma şəklində və cəmiyyətdə yaşayan yeganə canlı varlıq deyil. Digər heyvanların əksəriyyəti, xüsusən də, həşəratlar bir sıra silsilə təşkil edən hikmətli qayda-qanunlar və tənzimləmələrə tabedirlər. Onların icması və cəmiyyətinə "yardımlaşma qaydaları", "iş bölgüsü", "idarə etmə və tabeçilik", "əmr və itaət" və "nəsilartırma" kimi qanunlar hakimdir. Bal arıları, bəzi qarışqa növləri mədəniyyət (şəhər salma kimi), nizam və təşkilatçılıqdan istifadə edərək yararlanır və məxluqatın əşrəfi hesab edilən insan onları əldə etmək və yiyələnmək üçün, bəlkə də, uzun il və əsrlərə ehtiyaclıdır. Onların təşəkkül dövrü bəşər cəmiyyətindən fərqli olaraq ibtidai icma, daş, dəmir və atom dövrünü keçməmişdir. Onlar bu dünyaya ayaq basdıqları elə ilkin gündən indiyə qədər həmin mədəniyyət və təşəkkülə malik olmuş və hələ də onlarda

{خُلِقَ الْإِنْسٰانُ ,onların icmasında) hansısa bir dəyişiklik baş verməmişdir. O, insandır ki) ضَعِيفًا} (1) insan zəif yaradılmışdır) ayəsinin misadaq və nümunəsi olaraq həyatı sıfırdan) başlamış və nəhayət və sonu olmayana doğru hərəkət edərək irəliləyir.

Heyvanlar üçün zamanın tələbləri və ondakı dəyişikliklər eyni şəkildə olaraq qalır. Onların həyatını zamanın tələbləri dəyişə bilmir. Onlar üçün həyatın yeni və köhnəlməsinin heç bir mənası yoxdur və yeni və köhnə dünya da mövcud deyil. Elm onlara yeni kəşflər əta etmir, hallarını dəyişmir, ağır və yüngül sənaye malları onların bazarında tapılmır. Nə üçün? Çünki onlar əqlə əsasən deyil, qərizə və instinktə uyğun olaraq yaşayırlar.

Amma insan necə? Onun ictimai həyatı daim dəyişiklik və yeniləşmədədir. Hər əsrdə insan üçün dünya əvəz olunur. İnsanın məxluqatın əşrəfi olması sirri də elə buradadır. İnsan təbiətin yetkin və ağıllı övladıdır. Onun təbiətin qəyyumluğuna və onu instinktlərlə idarə etməsinə ehtiyacı yoxdur və insan instinkt və qərizələrə əsasən deyil, əqli ilə yaşayışına davam edir. Təbiət insanın həddi-büluğ və yetkin olduğunu qəbul edərək onu azad və müstəqil olmasına izin vermiş və onu himayə etməkdən əl çəkmişdir. Heyvanlar onlar üçün müəyyən edilmiş instinktə uyğun olaraq əməl edir və onda itaətsizlik edə bilmirlər. Amma insan öz elm və əqlinə uyğun olaraq təyin edilən qanunlara əməl və ya itaətsizlik edə bilmək qabiliyyətinə malikdir. İnsanların inkişaf və təkamül prosesi səbəbi ilə əldə etdikləri fəsad və inhirafların, həlakət və süqut etmələrin, durğunluq və ətalətlərin baş verməsinə bais olan məsələlər də elə bu yerdədir. İnsanın inkişaf və tərəqqi yolları açıq olduğu kimi, onun fəsad və inhirafa sürüklənmə qapıları da bağlı deyil. Qurani-kərimin ifadə etdiyi kimi, insan göylərin, yerin və dağların məsuliyyətini daşıya bilməyəcəkləri əmanəti öhdəsinə götürmək mərhələsinə yetişir, yəni azad və müstəqil yaşamağa və qanun, vəzifə və təklifləri (məsuliyyətləri) qəbul etməyə razılaşır. Bu baxımdan, insan zülm və cəhalətdən, səhv və özünəpərəstişdən amanda deyil. Qurani-



1-[1]. "İnsan" surəsi, ayə 28.

kərim insanın bu qəribə istedada malik olmasını qeyd etməklə yanaşı, onu zalım və cahil sifətlərilə də vəsf edir. İnsadakı bu iki istedad – inkişaf və təkamül və inhirafa yönəlmək – bir-birindən ayrılmazdır. İnsan heyvanlar kimi deyil ki, ictimai həyatında nə irəli, nə arxaya, nə də sağa və sola gedə bilsin. İnsanlar bəzi vaxtlar həyatda ya irəli gedirlər, ya da geri. İnsan həyatında təkamül və inkişaf varsa, inhiraf və azğınlıq da var, əgər onlar sürət və hərəkətə malikdirlərsə, geriləmə və durğunluğa da malikdirlər. Ədalət və yaxşılıq varsa, zülm və təcavüz də var. Əgər əql və elmin .təzahürləri varsa, cəhalət və nəfsəpərəstişin də təzahürləri vardır

Zamanda baş verən dəyişiklik və yenilənmələrin ikinci qismdən ola bilməsi də .mümkündür

### Beyinin təsir qəbul etməməsi (doqmatizm və ya köhnə fikirlilik) və cahillər

Bəşərin xüsusiyyətlərindən biri ifrat və digəri də təfritdir. Əgər insan orta həddə mövqe tutsa, birinci növlə ikinci növ arasındakı dəyişiklikləri fərqləndirməyə, zamanı elm, əməl, çalışqanlıq qüvvəsi ilə irəli aparmağa, eyni zamanda, özünü zamanın inkişaf və tərəqqisi ilə uyğunlaşdırmağa, onun inhirafları ilə mübarizə aparmaq və onlardan .kənarlaşmağa çalışar

Amma təəssüflər olsun ki, onun fəaliyyəti həmişə bu cür deyil. İnsanı iki təhlükəli xəstəlik daimi olaraq təhdid edir. Onlardan biri beyinin təsir qəbul etməməsi (köhnəfikirlilik), digəri isə cəhalətdir. Birinci xəstəliyin nəticəsi beyinin dayanması və onun inkişaf və təkamüldən qalmasıdır, ikinci xəstəliyin nəticəsi isə süqut (məhv olmaq) və inhirafdır. Köhnə fikirli insanlar yeni olan hər şeyə nifrət edir və onlar sadəcə köhnəliklə uyğunlaşırlar. Cahillər isə yaranan hər bir yeniliyi zamanın tələbi, tərəqqi və inkişaf hesab edir. Köhnə fikirli insan hər bir yeniliyi fəsad və inhiraf, cahil isə onların hamısını mədəniyyət, elm və biliyin inkişaf və genişlənməsi olaraq düşünür. Köhnə fikirli insan atomla elektron, vəsilə və hədəf arasında fərq qoymur. Onun nəzərində din qədim və antik

əsərlərin qorunması üçün təhkim edilmiş bir məmurdur. O, Quranın zaman cərəyanının durdurulması və dünyanın öz əvvəlki halında saxlanılması üçün nazil edildiyini düşünür. Həmin şəxs elə fikirləşir ki, qələmlə yazmaq, ümumi və cüzi adlandırmaq, neftlə işləyən çıraqlardan istifadə etmək, hamamların su xəzinələrində (hovuzlarında) yuyunmaq, əllə yemək yemək, cahil və ya savadlı kimi yaşamağı dinin nişanələri kimi qorumaq və mühafizə etmək lazımdır. Cahil isə əksinə, Qərb dünyasında hansı dəyişiklik və yeniliyin baş verməsini gözləyir ki, dərhal onu təqlid .etsin və adını zamanın məcburiyyəti və yenilənmə qoysun

Köhnə fikirli və cahil insan müttəfiq şəkildə qədimdə mövcud olan hər bir qanunun dinin nişanələrinin bir hissəsi olduğunu fərz edir. Onlar arasındakı fərq köhnə fikirli şəxsin həmin nişanələrin qorunmasının zəruriliyini düşünməsində, cahilin isə dinin .köhnəliyə pərəstiş, sabitlik və sükuta maraqlı olduğu nəticəsinə gəlməsindədir

Son əsrlərdə elmlə din arasında ziddiyyət və təzadların mövcud olması məsələsi qərblilər arasında geniş yayılaraq müzakirə obyektinə çevrilmişdir. Dinlə elm arasında ziddiyyətin olması məsələsinin iki əsası (kökü) var: Birincisi, bəzi kilsələrin qədimdəki elmi və fəlsəfi məsələlərin dində də mövcud olması və onlara da dinin bir hissəsi kimi inanılmasına etiqadlı olmaları idi ki, elmin inkişaf və tərəqqisi bunun əksini sübut etmişdir. İkincisi, elmin həyat tərzini dəyişdirərək onu yeniləşdirməsi məsələsi olmuşdur. Özlərini dinə etiqadlı kimi göstərən və həmin fəlsəfi və qədim məsələlərin dinin bir hissəsi olduğunu düşünən köhnə fikirli insanlar həyatın maddi sahələrinə aid olan mövzuları da dinin bir qismi olması kimi nəzərə çarpdırmaq istəyirdilər. Cahil və bixəbər insanlar da belə olduğunu və dinin insanların maddi yaşayış üçün də xüsusi məsələləri nəzərdə tutduğunu təssəvvür edirdilər. Elə düşünürdülər ki, elmin fətvasına uyğun olaraq maddi həyat tərzini dəyişmək lazımdır və elm dinin aradan qaldırılması hökmünü vermişdir. Hər iki dəstə bir-birindən xəbərsiz olaraq dinlə elmin ziddiyyət və təzadlı

.olması məfhumunu meydana gətirdi

**(Quranın məsəlləri (misal çəkməsi**

İslam öncül və insanı irəliyə doğru aparan bir dindir. Qurani-kərim müsəlmanları İslam dini ilə bərabər inkişaf və tərəqqi etməli olduqlarını diqqətə çatdırmaq üçün, təmsildən istifadə edərək misallar çəkir. Məsələn deyir: "Həzrət Məhəmmədin (s) tərəfdarları və onun yolunu gedənlər yerdə əkilən bir toxuma (dənəyə) bənzəyir. Həmin toxum ilkin olaraq bir yarpaq kimi torpaqdan baş qaldırır, sonra özünü gücləndirir və daha sonra öz gövdəsi üstə dayanır. O, elə bir sürət və qüvvətlə inkişaf edir ki, əkinçiləri heyrətə gətirir." Bu, Quranın çəkdiyi və arzuladığı misallardan biridir. Quran daimi olaraq .cəmiyyət və insanları inkişaf və təkamülə dəvət edir

Vil Dorant deyir: "İslam dini qədər heç bir din öz tərəfdarlarını güclü olmağa dəvət etməmişdir. İslamın əvvəllərinə aid olan tarix İslam dininin cəmiyyətdə yenidənqurma işlərini aparmaq və onu inkişaf etdirmək üçün hansı dərəcədə qüdrətli olduğunu sübuta yetirmişdir. İslam da köhnə fikirli olmaq və cahilliklə müxalifdir. İslam dini onu təhdid edən bu iki dəstənin xətər və təhlükəsindən xəbərdar və agahdır. Bu köhnə fikirli və ağıldan kəm olanlar İslam dininə aid olmayan qədim məsələləri dəstəkləməklə cahil insanların əlinə İslam dinini, həqiqətdə, belə olmadığı halda, onu "yeniliyin əleyhinə və ona müxalif " kimi düşünmələri üçün bəhanə verirlər. Digər tərəfdən, həmin məsələlər Qərbə meyillilərə, təqlidçilərə və köhnə fikirlilərə şərqlilərin xoşbəxtlik və səadətinin cismi, ruhi, zahiri və batini cəhətdən avropalaşmaqda olmasını və gözüyumulu şəkildə onların qanunlarına uyğun addım atmalarını düşünmək və etiqadlı olmaları üçün bəhanə olur və onların hər hansı bir yenilik və dəyişikliyə bədbin olmasında təsir göstərir. Eyni zamanda, həmin dəyişikliklərin öz millətləri, din və ictimai istiqlaliyyətləri və şəxsiyyətlərinə zərər vuracağını güman etmələrinə səbəb olur. Bu arada hər iki dəstənin səhv və yanlışlıqlarının zərərini ödəməli olan İslamdır. Köhnə fikirlilərin köhnəliyə meyli cahillərin

meydanda at oynatmasına, cahillərin də cahilliyi onların (köhnə fikirlilərin) öz etiqad və ".düşüncələrindən daha da möhkəm yapışmasına səbəb olur

Görəsən, özlərini dinə etiqadlı göstərən bu cahillər zamanın məsum və təqsirsiz olduğunu düşünürlərmi? Bəyəm, cəmiyyətdə baş verən dəyişikliklər insandan başqasının əli ilə həyata keçirilir? Hansı vaxt və tarixdən etibarən insan məsumluq və təqsirsizlik əldə etmişdir ki, zaman da məsum və təqsirsizliyə malik olmuş olsun? Bəşər elmi, əxlaqi, zövqi, dini meyllərin təsiri altında və hər zaman insanlığın məsləhəti üçün yeni-yeni yollar axtarışında olduğu kimi, xüdpəsəndlik, məqam tələbi, mal-dövlət sevgisi, nəfsə pərəstiş və istismarçılıq adlı meyllərin də təsirinə düşür. Həmçinin, insan yeni kəşflər etmək və ən yaxşı üsullar və vasitələr axtarmaqda müvəffəqiyyətli olduğu kimi, bəzən səhv və xətalara da düçar olur. Amma cahil onsuz da, bu sözlərin mənasını anlamır və cümləsinin dayaq nöqtəsi "dünya o cürdür", "dünya bu cürdür" - deməkdir. Daha təəccüb doğuran məsələ yaşayış qaydalarını (həyat təcrübəsini) onların libas, papaq və ayaqqabıyla müqayisə etməklə əldə etməsidir. Yəni, ayaqqabı və papaq nə qədər ki, təzə və yenidir, qiymətlidir onları alıb geyinmək lazımdır, əksinə nə qədər ki, köhnədir, onu kənara (zibilliyə) tullamaq lazımdır. Onlarının nəzərində dünyanın .həqiqətləri bu formadadır

Həmin cahillərin fikrincə, yaxşı və pis "yeni" və "köhnə" məfhumundan başqa, bir şey deyil. Bu kimi şəxslər elə düşünürlər ki, feodalizm (yəni, bir qoluzorlunun haqsız olaraq özünə malik və sahibkar adını götürərək öz kürsüsündə əyləşməsi və yüzlərlə işçinin onun ağzı hərəkətə gəlsin deyə (gəlir götürməsi üçün) işləməsi) artıq köhnəlməsi, bugünkü dünyanın onu qəbul etməməsi, vaxtının keçməsi və nəzərdən düşməsi səbəbilə pisdir. Amma ilk dəfə meydana çıxdığı, dünya bazarına yeni qəlib və formada təqdim olunduğu üçün yaxşı və bəyənilən idi. O cahillərin nəzərində qadının istismarı qəbuledilməzdir, çünki dövrümüzdə və bugünkü dünyada bəyənilmir və heç kəs onun məsuliyyəti altına girmək istəmir. Amma dünən qadın irs

aparmadığı, ehtiram edilmədiyi, mülkiyyət hüququ olmadığı, iradə və etiqadına hörmət göstərilmədiyi zaman yaxşı və bəyənilən idi, çünki o vaxt təzə idi və bazara yenicə .çıxarılmışdı

Onlar əsrin fəza əsri olduğu üçün təyyarələri qoyub ulağa minməyi, işığı (elektrik cərəyanını) qoyub neftlə işləyən lampalar yandırmağı, böyük tikiş fabriklərindən kecib əl çarxları ilə işləyən ipəkayırma alətlərini, çap maşınlarını qoyub əllə yazmağı qəbul etmirlər. Eyni zamanda, rəqs məclislərində iştirak etməkdən, poker və qumar oynamaqdan, məstedici maddələrdən istifadə etməməkdən, bikini partilərinə (yığıncaqlarına) getməkdən – bunların hamısı bizim əsrimizdə öndə gedən məsələlərdəndir – özlərini saxlaya bilmir və bunları etmədikləri təqdirdə, guya, daş .dövrünə qayıtdıqlarını təsəvvür edirlər

Əsrin tələbləri və onda meydana gələn bəzi məsələlər çoxlu sayda insanları bədbəxtliyə düçar etmiş və sayı bilinməyən neçə-neçə ailələrin dağılmasına səbəb .olmuşdur

Atom erası", "elm və texnika zəmanəsi", "qumar əsri" və "qırıcı təyyarələr dövrü"" olduğunu deyirlər. Lap yaxşı, biz də belə bir əsr və erada yaşadığımız üçün Allaha şükr edir və bundan daha yaxşı elm və texniki inkişafdan istifadə etməyi arzulayırıq. Görəsən, bu əsrdə elmdən başqa, digər bütün sahələr fəaliyyətdən qalmışdırmı? Bu əsrdə meydana çıxan bütün yeniliklər elmin inkişaf və tərəqqisi sayəsində və onun təsiri ilə gerçəkləşmişdirmi? Görəsən, elm yüz faiz aləmin təbiətini insana ram və müti edəcəyini iddia edirmi? Elmin bu barədə heç bir iddiası yoxdur. Alimlərdən bir qrupu pak və xalis niyyətlə çalışaraq elmi kəşflər aparmaqda, digər qrup insanlar da onların elmi kəşflərinin nəticələrrindən öz mənfur və pis məqsədləri üçün istifadə etməkdədirlər. Elm insanların təbiətdən sui-istifadə etdiyi üçün nalə və fəryad edir. .Əsrimizin bədbəxtçiliyi və giriftar olduğu məsələlər həmin məsələlərdir

Elm fizika sahəsində inkişaf edərək elektrik cərəyanına məxsus olan qaydaları kəşf edir. Öz xeyir və mənfəətlərini güdən bir qrup da həmin vasitələrdən qadınlarla bağlı filmlər çəkilməsində istifadə edir. Kimya elmi inkişaf və tərəqqi edərək

maddənin tərkib və xüsusiyyətlərini öyrənməkdə insana yardım edir, amma bir dəstə isə insanların başına bəla olan narkotik maddələr və heroin düzəldir. Elmin vasitəsi ilə insan atomun daxilinə qədər yol taparaq onun heyrət doğuran enerjisini kəşf edir, lakin hələ azacıq da olsa, insanların məsləhət və mənafeyi üçün istifadə edilməmiş, bir qrup məqamtələb ondan atom bombası düzəldərək onu günahsız insanların üzərinə .yağdırır

İyirminci əsrin məşhur ingilis alim və fiziki Eynşteynin uğurları ilə əlaqədar yığıncaq keçirilərkən, o özü tribuna arxasına keçərək "siz atom bombasının yaranmasına səbəb olan mənim elmi nailiyyətlərimə görə belə bayram keçirirsiniz?!" - deyir. Eynşteyn öz elmi qüvvəsi və istedadını atom bombası düzəldilməsi üçün istifadə etməmişdir, əksinə digər bir qrupun məqampərəstliyi onun bu nəticəsindən həmin yolda istidadə .etməsinə səbəb olmuşdur

Atom bombası, narkotik maddələr və müxtəlif fəsad yönlü filmləri "əsrin meydana çıxardığı məsələlərdir" deyərək qəbul etmək və onlara bəraət qazandırmaq olmaz. Əgər təhsilli və elmli insanlar atom bombası kimi ən güclü silahları günahsız insanların .üzərinə atmaqdan çəkinmirlərsə, onlardan artıq hər cür vəhşiliyi gözləmək olar

**(İslam və həyatın yenilənməsi (۳**

Biz ailə hüququ ilə bağlı Qərb sistemlərinə təqlid etməliyik" - deyən kəslərin ən ümdə" və əsaslı dəlili zamanın vəziyyətinin dəyişilməsi və XX əsrin ehtiyaclarının bu cür tələb etməsini düşünmələridir. Bu səbəbdən, əgər biz həmin məsələ barədə nəzərimizi aydınlaşdırmasaq, digər bəhslərimiz də naqis olaraq qalacaqdır. Eyni zamanda, bu məsələ ilə əlaqədar lazımı və kifayət qədər tədqiqat aparmağı düşünsək, bizim silsiləvi məqalələrə onları sığışdırmaq olmaz, çünki fəlsəfi, ictimai, əxlaqi və fiqhi olan bir çox məsələləri izah edib aydınlaşdırmaq lazım gələcək. "İslam və zamanın tələbləri" adı altında nəzərdə tutduğum risaləni yazaraq araşdıra və maraqlananların ixtiyarında qoya biləcəyimə ümid edirəm. Hazırda aşağıdakı iki mətləbin

:aydın olması, zənnimcə, kifayət edir

Birincisi, bixəbər və məlumatsız olanların dillərində əzbər olan və onların iddia etdikləri kimi, zamanın uyğunluq və dəyişiklikləri heç də bu sadə və asanlıqla deyil. Zamanda həm inkişaf, həm də inhiraf və azğınlıq mövcuddur. Zamanın inkişaf və tərəqqisinə uyğun olaraq irəliləmək, onun fəsad və inhirafları ilə də mübarizə aparmaq lazımdır. Həmin iki məsələni bir-birindən ayırd etmək üçün, zamanda baş verən və meydana çıxan dəyişiklik və cərəyanların mənbəyinə və onların hansı istiqamətə doğru irəliləməsinə, hansı meyl və təmayüllü insanlardan və ictimai təbəqələrdən qaynaqlandığına diqqət etmək lazımdır. Yəni, onun ali və yüksək keyfiyyətli insanlardan, yoxsa, alçaq və heyvan xislətlilərdən təsirlənərək yaranmasını nəzərə almaq lazımdır. Görəsən, alim və onların tədqiqatlarının nəticələri həmin dəyişikliklərin yaranmasına səbəb olmuşdur və ya cəmiyyətin məqam tələb, pulpərəst və nəfsinə .tabe olan fasid ictimai təbəqəsi? Bu məsələ əvvəlki iki məqalədə aydınlaşdı

**İslami qanunlarda hərəkətlilik və dəyişkənliklərin əsrar və sirri**

Aydınlaşdırılmalı olan məsələlərdən biri İslam mütəfəkkirlərinin İslam dininə onu zamanla uzlaşdıran və dəyişkənliyinə səbəb olan xüsusiyyətləri əta edib bağışlayan bəzi əsrar və sirlərin olmasına etiqad bəsləmələridir. Onlar bu dinin zamanın inkişafı, .mədəniyyətin tərəqqisi və yaranan dəyişikliklərlə uyğunlaşması fikrindədirlər

İndi həmin sirr və əsrarın nə olmasını bilməli, başqa sözlə, ona zamanın, elm və mədəniyyətin dəyişikliyi ilə öz qanun və göstərişlərindən heç birini kənara qoymağa ehtiyac duymadan və bu sahədə bir-birinə zərər vurmadan ayaqlaşmasına səbəb olan İslam dinin strukturunda istifadə edilən materiallarının necəliyini anlamağa .çalışmalıyıq. Həmin mövzu bu məqalədə aydınlaşdırılmalı olan mövzulardandır

Hər kəsdən öncə, özüm və eyni zamanda, oxuculardan da bəziləri diqqət etdikdə, başa düşürük ki, bu məsələnin mütəxəssislərə aidliyi və fənni bir yönü var və onu

mütəxəssislərə məxsus mühit və şəraitdə bəyan etmək lazımdır. Amma biz bu məsələ barəsində suallar verən və maraqlananların say çoxluğunu nəzərə alaraq – mən tez-tez onlarla üzləşirəm və qeyd etmək isyəyirəm ki, onlar arasında İslamın belə bir xüsusiyyətə malik olmasına inanmayan və bədbin olanlar da mövcuddur – bədbin insanları bədbinlik vəziyyətindən xaric etmək və digərlərinə də örnək olsun deyə, bu .bəhsə daxil oluruq

Möhtərəm oxucuların bu cür bəhslərin İslamın üzaqgörən alimlərinin nəzərindən qaçmadığını bilməsi üçün, mərhum Ayətullah Naininin çox əla bir kitabı olan "Tənbihul-umməh" əsərinə və Əllamə Təbatəbainin müasiri və əzəmətli ustadının qələmindən çıxmış və "Mərcəiyyət və ruhanilik" kitabında çap edilmiş dəyərli "Vilayət və rəhbərlik" .(məqaləsinə müraciət edə bilərlər (qeyd edək ki, hər iki kitab farscadır

Müqəddəs İslam dininin sabit və dəyişməz olan qanunlara malik olması ilə yanaşı, mədəniyyət və kulturaloji yeniliklərlə uzlaşma və həyatın müxtəlif və dəyişkən .formaları ilə uyğunlaşmasını bir neçə sirri var və biz onlardan bir qisminə şərh veririk

**Qəlib və formalara nisbətdə ruh, məna və fərqliliyin olmamasına diqqət etmək**

İslam dininin insanın bütün elm və bilik dairəsi ilə əlaqəli və onu əhatə edən həyatın .١ zahiri və müxtəlif formaları barədə düşüncə və nəzəri vardır. İslami göstəriş və əmrlər yaşayışdakı hədəf, ruh və məna, həmçinin, insanın həmin hədəflərə çata bilməsi üçün istiqamətləndirildiyi ən yaxşı və üstün yollarlala bağlıdır. Elm nə yaşayışın hədəf və ruhunu dəyişib əvəz edə, nə də həyati hədəflər üçün nəzərdə tutulan ən yaxşı, yaxın və təhlükəsiz yolu göstərə bilmişdir. Elm həmişə ən yaxşı və kamil vəsilələri yaşam .hədəflərini ələ gətirmək və həmin hədəflərə yetişmək üçün irəliləməyi insana önərir

İslam dini hədəfləri öz əhatə dairəsində saxlamaq, forma və qəlibləri isə elm, texnika və vasitələrin ixtiyarında qoymaqla elm və mədəniyyətin inkişaf və dəyişiklikləri ilə ziddiyyət təşkil

etmək və qarşı-qarşıya gəlməkdən qorunmuşdur. Daha dəqiq şəkildə desək, mədəniyyətin inkişafına səbəb olan amillərə təşviq etməklə, yəni elm, iş, təqva, iradə, səbr və s. ilə mədəni tərəqqi və təkamülə səbəb olan əsil amili özü öz öhdəsinə .götürmüşdür

İslam bəşərin təkamülü yolunda bir sıra əlamətlər qoymuşdur. Həmin əlamətlər bir tərəfdən hədəf və məqsədi insanlara nişan verir, digər tərəfdən də təhlükə və xətər əlamətləri ilə insanlara qarşıda süqut və azğınlıq olduğunu xəbərdarlıq edir. İslami qanun və göstərişlərin hamısı ya birinci qismdən olan (yol göstərən) əlamətlərdir, ya .(da ikinci qismdən (xəbərdarlıq əlamətləridir

Hər bir əsrdə insanların yaşam vasitələri onların elmi məlumat və biliklərinin ölçü və mizanına bağlıdır. Elm və informasiyanın genişlənməsi öz yerində həyat vasitələrini daha yaxşı və təkmilləşmiş etməli və naqislərin də hökmünü zamanın məcburiyyəti ilə .əlaqələndirməli idi

İslamda - istər maddi olsun, istərsə də zahiri (mənəvi) - hansısa bir müsəlman tərəfindən müqəddəs hesab edilən və bütün ömrü boyu sadəcə onu qoruyub saxlamağı özünə vəzifə bilən yeganə bir vasitə və qəlib (forma) tapmaq olmaz. İslam heç vaxt əkinçilik, toxuculuq, nəqliyyat, döyüş və ya digər sahələrdə ona məxsus eyni bir alət və texnikadan istifadə edilməsini deməmişdir ki, həmin məsələ elm və texnikanın inkişafının İslamla ziddiyyət təşkil etməsinə gətirib çıxarsın. İslam nə geyim və libaslar, nə tikinti və binalar üçün müəyyən bir stil və üslub nəzərdə tutmuş, nə də istehsal və istehlak üçün xüsusi bir vasitə və alətlərdən istifadə etməyə göstəriş vermişdir. Bu, İslam dinini zamanın inkişaf və tərəqqisi ilə uyğunlaşmasını .asanlaşdıran cəhətlərdən biridir

### Sabit və dəyişməz ehtiyaclar üçün sabit qanun, dəyişkən ehtiyaclar üçün isə dəyişkən qanunlar

İslam dininin daha çox əhəmiyyətə malik olan xüsusiyyətlərindən biri də sabit və .٢ dəyişməz ehtiyaclar üçün sabit, amma dəyişkən ehtiyaclar üçün isə dəyişkən qanunlar

təyin etdərək nəzərdə tutmasıdır. Bir sıra ehtiyaclar – istər fərdi və şəxsi zəmində olsun, istərsə də ümumi və ictimai zəmində – bütün zamanlarda bərabər və sabit .vəziyyətə sahibdir

Mən “əxlaqın nisbiliyi” və “ədalətin nisbiliyi” məsələsi ilə bağlı bir çox tərəfdarlara malik olanların düşüncələrindən xəbərdaram və bu məsələ tərəfdarlarının nəzəriyyələri ilə .əlaqədar öz əqidəmi bildirmək istəyirəm

Bəşərin ehtiyaclarının digər qısmini dəyişkən ehtiyaclar təşkil edir və onlar üçün sabit deyil, dəyişkən qanunlar tələb olunur. İslam dini həmin ehtiyaclarla bağlı fərqli və müxtəlif qanunlar nəzərdə tutmuş və bu yolla onları (dəyişən ehtiyacları) sabit üsulla əlaqələndirmişdir ki, həmin sabit üsul hər bir dəyişkənlik üçün xüsusi əlavə qanunlar yaradır. Mən bu məsələni indiki məqalədə qeyd ediləndən artıq izah edə bilmərəm, amma bir neçə misalı əziz və möhtərəm oxucuların diqqətinə çatdırmaqla onların :zehinlərində aydınlıq yaratmağa çalışacağam

İslamda {وَأَعِدُّوا لَهُمْ مَا اسْتَطَعْتُمْ مِنْ قُوَّةٍ} (١) (bacardığınız qədər düşmən müqabilində qüvvə toplayın) bu şəkildə olan ictimai bir təməl prinsip vardır. Digər tərəfdən fiqh elmində "müsabiqə və oxatma" adı altında bir sıra silsilə təşkil edən göstərişlər də peyğəmbər (s) sünnəsindən bizə gəlib çatmışdır. Həmin göstərişlərdə insanın özü və övladlarının atçapma və oxatama məharətinə kamil şəkildə yiyələnməli və öyrənməli olması bildirilmişdir. Atçapma və oxatma o dövrün hərbi fənlərindən hesab edilirdi. “Müsabiqə və oxatma”nın

{وَأَعِدُّوا لَهُمْ مَا اسْتَطَعْتُمْ مِنْ قُوَّةٍ} ((bacardığınız qədər düşmən müqabilində qüvvə toplayın)) əslində, bu təməldən qaynaqlandığı gün kimi aydındır. Yəni, qılınc, ox, nizə, kaman və sairənin İslamda əsaləti yoxdur, əsaləti olan şey güc və qüdrətli olmaqdır. Eyni zamanda, müsəlman hər bir dövr və əsrdə bütün imkanlar



---

١-[١]. “Ənfal“ surəsi, ayə ٦٠.

daxilində hərbi qüvvə və müdafiə baxımından düşmənlər qarşısında daha güclü olmalıdır. Başqa sözlə desək, atçapma və oxatma (zəmanın tələbinə uyğun olaraq) güc və qüvvətlilik üçün geyinilməsi məcburi olan bir libas kimi olmuş və onun icrası və ələ gətirilməsi üçündür. Düşmən müqabilində qüdrətli və güclü olmaq zərurəti sabit və .daimi ehtiyaclardan yaranan sabit və dəyişməz bir qanundur

Amma atçapma və oxatmaya olan tələb dəyişkən və müvəqqəti ehtiyacların nümunələrindəndir ki, zaman və əsrə mütənasib şəkildə dəyişir və mədəniyyətin .dəyişkənliyi ilə həmin silahlar öz yerini müasir dövrümüzdəki odlu silahlara verir

Digər bir misal: Quranda ikinci bir ictimai əsasdan söhbət açılır və o, sərvət mübadiləsinə aiddir. İslam fərdi və şəxsi mülkiyyəti qəbul etmişdir və əlbəttə, həmin mülkiyyət bugünkü sərmayədarların dünyasında "mülkiyyət" adlandırılan məsələ ilə bir sıra fərqlərə malikdir ki, indi onları müzakirə etməyə ehtiyac yoxdur. Fərdi .mülkiyyətin lüzum və müqəddiməsi "mübadilə"dir

bir-birinizin malını haqqınız) (١){وَلَا تَأْكُلُوا أَمْوَالَكُمْ بَيْنَكُمْ بِالْبَاطِلِ} İslam "mübadilə" üçün də olmadığı halda, yeməyin) kimi müəyyən bir müqərrərat təyin etmişdir. Yəni, sərvət və var-dövləti öz aranızda bihudə olaraq dövr elətdirməyin. Bu mənada ki, mal-dövlət əldən-ələ gəzərək birinci sahibi və istehsalçının əlindən çıxır və digərinin ixtiyarına keçir, həmçinin, ondan da sonra başqasının. Beləliklə, əgər həmin sərvət şəri baxımdan faydalı olarsa, sahibinə aid olar. Sərvətin insanlar üçün heç bir faydası olmadan əldən-ələ keçərək təkcə sahibinin ixtiyarında olması qadağandır. İslam mülkiyyəti mütləq ixtiyarla bərabər olan şəkildə hesab etmir. Digər tərəfdən də, İslam dini insan qanı və nəcasəti kimi bəzi şeylərin alınıb satılmasını qadağan



---

.Bəqərə" surəsi, ayə ١٨٨" .[١]-١

etmişdir. Nə üçün? Çünki insanın və ya heyvanın qanı onları dəyərli və insan sərvətinin bir hissəsi hesab ediləcək qədər faydalı istifadəyə malik deyil. Qan və nəcasət {وَلَا تَأْكُلُوا أَمْوَالَكُمْ بَيْنَكُمْ بِالْبَاطِلِ} ticarətinin qadağan olunması Qurandakı

prinsipinə görədir. Qan və nəcasətin qadağasında əsalət yoxdur. Əsaləti olan məsələ mübadilənin insanın mənafeyinə xidmət edəcək iki şey (məsələn, əmtəə və s) {وَلَا تَأْكُلُوا أَمْوَالَكُمْ arasında olmasıdır. Yuxarıda qeyd edilən məsələnin qadağan edilməsi prinsipinin icrası, başqa sözlə desək, sərvətin boş və əbəs yerə dövr {بَيْنَكُمْ بِالْبَاطِلِ etdirilməsinin qadağan olunması üçün bir libas rolunu daşıyır. Əgər işin içində mübadilə məsələsi olmasa, sərvətin bihudə olaraq əldən-ələ gəzməsi və kiminsə .mülkiyyətinə keçməsi də baş tutmaz

Bu əsas prinsip sabit və bütün zamanlarda eyni olan dəyişməz ictimai ehtiyaclardan qaynaqlanmasına baxmayaraq, qan və nəcasətin sərvət hesab edilməməsi və mübadilə qabiliyyətinə malik olmaması ilk növbədə əsr, zaman və mədəniyyət səviyyəsi ilə əlaqədardır və şərait dəyişkənliyi, elm və texnikanın inkişafı və onlardan .düzgün və səhih istifadə səbəbilə onunla bağlı hökmlər də dəyişilə bilər

Başqa bir misal: Əmirəl-möminin Əli (ə) ömrünün axırlarında saçı və saqqalınını ağarmasına baxmayaraq, həna qoymurdu. Bir nəfər o həzrətə dedi: "İslam peyğəmbəri (s) "saç və saqqalınızın ağlığını həna qoymaqla örtün" - deyə buyurmamışdırmı?" Həzrət cavab verir ki, bəli, buyurmuşdur. Həmin şəxs "onda, nə üçün siz həna qoymursunuz?" - deyə soruşduqda, Əmirəl-möminin (ə) cavabında belə deyir: "Peyğəmbər (s) bu əmri verdikdə, müsəlmanlar say baxımından çox az idilər və onlar arasında döyüşlərdə iştirak edən ağ saqqalı kişilər də var idi. Düşmənlər İslam ordusunun cərgələrinə nəzər saldıqda, yaşlı ağsaqqal kişiləri görür və özlüyündə düşünürdü ki, onunun tərəf müqabili zəiflərdir. Bu minvalla, onların döyüş ruhiyyəsi .daha da güclənirdi

Peyğəmbər (s) bu məsələni önləmək və düşmənin diqqətindən yayınmaq üçün onlara saqqallarına həna qoymaq əmrini verir. “Daha sonra həzrət Əli (ə) peyğəmbərin (s) həmin hökmü verdiyi zaman müsəlmanların sayca az olması və bu üsula ehtiyac duyulduğunu buyuraraq əlavə edir ki, hazırda İslam başdan-başa dünyanı əhatə etmişdir və bu işlərə artıq o qədər də ehtiyac yoxdur. Hər kəs indi həna qoyub-.qoymaqda azaddır

Həzrət Əlinin (ə) nəzərində peyğəmbərin (s) “həna qoyun” əmrini verməsinin əsaləti yox idi və hədəf və məqsəd başqa bir məsələdə idi, yəni, düşmənlərin ruhiyyəsinin .güclənməsinin qarşısını almaq üçün həyata keçirilən tədbir idi

İslam da həm formaya, zahir və görünüşə əhəmiyyət verir, həm də ruh, batin və qəlbə. Daimi olaraq forma ilə zahiri ruh və batin, qabığı toxum, libas və örtüyü isə .bədən üçün istəyir

**Xətt və yazının dəyişilməsi məsələsi**

Bu günlərdə ölkəmizdə bəyan edilən məsələlərdən biri də “xətt və yazının dəyişilməsi” məsələsidir. Həmin məsələ dil və ədəbiyyat baxımından araşdırılmaq qabiliyyətinə malik olduğu kimi, İslami üsul və qaydalara uyğun olaraq da tədqiq edilə bilər. Bu məsələni islami cəhətdən iki şəkil və formada bəyan etmək olar: Birincisi, görəsən, İslamın özünəməxsus əlifbası varmı və o, digər əlifbalara fərq qoyurmu? Bizim hazırda ərəb əlifbası kimi tanıdığımız əlifbanı İslam öz əlifbası, latın əlifbası kimi tanınan digər əlifbaları isə özünə yad bilirmi? Əlbəttə ki, xeyir. Dünyəvi bir din olaraq İslamın .nəzərində bütün əlifbalar özünəməxsus səciyyəyə malikdir

Bu məsələnin digər forması “xətt və əlifba dəyişikliyinin müsəlman milləti tərəfindən yadellilərin cəlb edilməsində hansı təsirlərə malikdir?” - məsələsidir. On dörd əsr ərzində öz islami maarif və elmini bu əlifba ilə yazmasına baxmayaraq, bu millətin öz mədəniyyətindən ayrı düşməsi ilə bağlı əlifba dəyişikliyinin hansı təsirləri mövcuddur? Görəsən, “xəttin dəyişilməsi” məsələsi fikrini kim irəli sürmüş və bu məsələnin icraçıları da kimlərdir? Bütün bu

.məsələlər araşdırılmalı olan məsələlərdəndir

### Tüfeylilik haramdır, nəinki, başa böyük papaq qoymaq

Mənim timsalımdakı insanlar bəzən digərlərinin təhqiramiz və məsxərə yönlü sualları ilə üzləşirlər. Məsələn, “yemək yeməyin şəri baxımdan hansı növləri var?”, “çəngəl və qaşıqla yeməyin necə?”, “başa böyük papaq qoymaq haramdırmı?”, “xarici dilə ....”?mənsub olan lüğətlərdən istifadə etmək necə

Onların cavabında mən belə deyirəm: “İslam bu barədə xüsusi bir göstəriş verməmişdir. İslam nə yeməyi əllə yeməyin lazım gəldiyini demişdir, nə də qaşıqla, amma bütün hallarda təmizlik və nəzafətə riayət etməyi buyurmuşdur. Libas, geyim və papaq barəsində də eynilə yemək barəsindəki kimi, xüsusi qanunlar verməmişdir. ”....İslamın nəzərində ingilis, fars və s dillər birdir, amma

Amma İslam digər bir məsələni - şəxsiyyəti alçaltmağın, digərlərinə yük olmağın, kor-koranə təqlid etməklə başqaları ilə qaynayıb-qarışmağın, tüfeyli həyat sürməyin, yadellilər qarşısında əfsunlanmağın (donub qalmağın) (məsələn, dovşanın ilan qarşısında donub qaldığı kimi), haram olduğunu buyurmuşdur. Eyni zamanda, kiminsə ölmüş ulağını qatır hesab etməyin, digərlərinin inhiraf və bədbəxtliklərini “əsrin tələbləri” (yeni yaranan şeylər) adı ilə özünə cəzb etməyin, “iranlılar cismən, zahirən və batinən avropalılara bənzəməlidir” məsələsinə etiqad bəsləməyin haram olmasını da .qeyd etmişdir

### Əhəmiyyətli və mühüm məsələlər

İslam dininə zamanın tələbləri ilə uyğunlaşmaq imkanı əta edən xüsusiyyətlərdən .۳ biri də bu dinin qayda-qanunlarının əqli və məntiqli olmasıdır. İslam onu qəbul edən tərəfdarlarına verdiyi bütün göstərişlərin bir sıra üstün məsləhətlərə xidmət etdiyini elan etmişdir. Bu xüsusiyyət müxtəlif və ziddiyyətli sahə və zəminələrdə meydana çıxan məsələləri həll etməkdə İslamın işini asanlaşdırır. Həmin məsələlərlə əlaqədar İslam dini islami mütəxəssislərə daha çox əhəmiyyət kəsb edən və mühüm olan

məsələ və məsləhətləri özünün (İslamın) yol göstərdiyi istiqamətdə seçim etmək icazəsi vermişdir. Fəqihlər bu qaydanı “əhəmiyyətli və mühüm” adlandırırlar. Bu zəminədə də əlimdə həddən artıq misalların olmasına baxmayaraq, onları .xatırlatmaqdan daşınıram

### Veto" (etiraz etmək) haqqı olan qanunlar"

İslam dininə uzlaşmaq və uyğunlaşmaq qabiliyyəti bağışlayan məsələlərdən digər biri bu dinin özündə başqa qanunların işi və icrasına nəzarət və onları kontrol edən bir sıra qanunların məyyən edilməsi məsələsidir. Fəqihlər bu qanunları fiqhə hakim olan “la hərəc” və “la zərər” qanunlarına bənzər “hakim qanunlar” adlandırmışlar Həqiqətdə, İslam dini bu qaydaların digər qanunlar üzərində “veto” haqqına malik olduğunu qeyd .etmişdir. Bu məsələlərin də izahı müfəssəl olduğundan bəhsə daxil olmuram

### Hakimin səlahiyyətləri

Deyilənlərə əlavə olaraq, bu müqəddəs diniə əbədilik və xatəmiyyət – sonuncu din olmaq – xüsusiyyətini əta edən bəzi qaydalardan istifadə edilmiş olduğunu da diqqətinizə çatdırmaq istəyirik. Mərhum Ayətullah Naini və Əllamə Təbatəbai bu cəhətdən daha çox isalmi hökumətdə səlahiyyətli şəxslərə verilən geniş ixtiyarlar .üzərində daha çox təkid etmişlər

### (İctihadın əsli (həqiqəti

Pakistanlı İqbal deyir: “İctihad(۱) İslamın mühərik və hərəkət verici qüvvəsidir.” Bu sözlər doğru sözlərdir, amma əsas və ümdə məsələ İslamın ictihad qabiliyyətli olmasındadır. Əgər İslamın yerinə başqa bir şeyi də qoysaq, onda görərik ki, ictihad nə qədər çətin bir məsələdir və hətta, onun qapısı bağlıdır. İnsanı düşündürən məsələ bu təəcüblü və asimani dinin



---

İctihad“ sözünün mənası “həddən artıq təlaş və çalışmaq“dır. İslam alimlərinin“ . [۱] –۱ islami hökümlər və Quranla bağlı apardıqları araşdırmalarda bütün səy və .təlaşlarından istifadə etmələridir

strukturunda onun mədəniyyətin tərəqqisi ilə uyğunlaşmasını təmin edən hansı kod və .rəmzlərin işlənməsidir

İbn Sina “Şəfa” adlı əsərində də ictihad zərurətini həmin məsələyə uyğun olaraq bəyan edərək deyir: “Zamanın vəziyyəti dəyişkən olduğu üçün yeni-yeni məsələlər meydana çıxır, digər tərəfdən də, İslamın bütün üsul və üslubu sabit və dəyişməzdir deyə, hər bir zaman və əsrlərdə kamilən mərifət və təcrübəli insanların yaranan yeni məsələləri ”.nəzərə almaqla, müsəlmanların ehtiyyaclarına cavab vermək zərurəti yaranır

İranın da konstitusiyasında bütün qanunlarla bağlı belə bir proqnoz verilmiş və hər əsrdə beş nəfərdən az olmayan və zamanın tələblərinə agah müctəhidlərdən ibarət heyət təşkil olunmuşdur ki, qəbul edilmiş qərarlara nəzarət etsinlər. Bu məsələnin həyata keçirilməsində məqsəd cahil və köhnəfikirli, zamanın inkişaf və tərəqqisi ilə müxalif və digərlərinə tabe olmayan və təqlid etməyən şəxslərin ölkə qanunlarına .nəzarət etməsidir

Xatırlatmaq istədiyimiz məsələ ictihadın sözün əsl mənasında, fərdin islami məsələlərdə mütəxəssis və təcrübəli olmasıdır və bu, elə bir məsələ deyil ki, hər hansı bir məktəbi bitirmiş şəxs elmi hövzədə neçə gün sübh etməklə ictihad iddiası edə .bilsin

Həqiqətdə, islami ixtisas və İslamda nəzər bildirmək səlahiyyətinə malik olmaq üçün insan ömrünün azlıq etməsinə baxmayaraq, çox da deyil, özü də fərdlərin xüsusi .istedad və ilahi tofiqdən yararlandığı bir şəraitdə

İxtisas və ictihadan əlavə, insanlar təqvalı olmaq, Allahı tanımaq və Allahdan qorxmadan yararlanmaq vasitəsi ilə digərlərinin nəzər və fikir öyrəndiyi müraciət mənbəyinə çevrilə bilər. İslam tarixi elmi və əxlaqi baxımdan nəzər və düşüncə bildirmək səlahiyyətinə malik olan şəxslərin həmin məqamda (nəzər bildirmək) .bədənlərinin lərzəyə gəldiyini nişan verə bilər

Möhtərəm oxuculardan bəhsin bu mərhələyə qədər uzanması səbəbilə bir daha üzr .istəyirik

## BEŞİNCİ HİSSƏ

### Quranın nəzərində qadının insanlıq məqamı

QURANıN NəZəRINDə QADıNıN INSANLıQ MəQAMı

İslam qadını necə bir məxluq olaraq tanıyır? Görəsən, qadını insanlıq və heysiyyət cəhətindən kişi ilə eyni səviyyədə tutur, yoxsa, onu ən alçaq cins hesab edir? Bunlar .indi bizim cavab vermək istədiyimiz suallardandır

### Ailə hüququ barəsində İslamın xüsusi fəlsəfəsi

İslamın ailə hüququ barədə nəzərdə tutuduğu xüsusi fəlsəfəsi var və həmin fəlsəfənin on dörd əsr əvvəlki ilə indiki arasında müəyyən fərqləri mövcuddur. İslam dini kişi və qadın üçün bütün hallarda eyni vəzifə, eyni hüquq və eyni cəzaları nəzərdə tutmamışdır. Bəzi hüquq, vəzifə və cəzaları kişi üçün münasib və uyğun bilmiş, bəzilərini də qadın üçün. Bir sıra hallarda kişi və qadının hər ikisi üçün oxşar və bəzən də fərqli qanunları müəyyən etmişdir. Nə üçün? Nəyə əsasən? Görəsən, digər məktəblər kimi, İslam da qadını ən aşağı və alçaq bir cins hesab etmişdir, yoxsa, onun ?bu barədə fərqli fəlsəfə və səbəbləri vardır

Dəfələrlə və təkrarən Qərbə yönəlmiş sistemlərin tərəfdarlarının nitqləri, konfrans və çıxışlarında oxunulmuş və eşidilmişdir ki, İslamın mehriyyə, nəfəqə, talaq və qadınların sayı və s. ilə bağlı qanunlarını müxalif cinsdən olan qadına nisbətdə təhqir və alçaqlıq hesab etmiş və bunların kişinin

mənafeyinə xidmət etməkdən başqa, digər bir dəlilinin olmadığını vurğulayaraq mənfi .reaksiya göstərmişlər

Onlar "XX əsrdən əvvəl dünyanın bütün qanun və müqərrəratları kişinin qadından üstün və şərafətli olması və qadının kişinin istifadəsi və cinsi təminatı üçün yaradılmış olması təməli üzərində qurulmuşdur." – deyir və qeyd edirlər ki, islami hüquqda kişinin .mənafeyi bu ox (mərkəz) ətrafında fırlanır

İslamın kişilərin dini olduğunu və qadını kamil bir insan kimi tanımadığını və onun barəsində bir insana lazım və zəruri olan hüquqları təyin etmədiyini deyirlər. Həmin şəxslər "əgər İslam qadını insan hesab etsəydi, zövcələrin sayını çoxaltmaz, talaq və boşanma haqqını kişinin ixtiyarında qoymaz, iki qadının şəhadətini bir kişinin şəhadətinə bərabər tutmaz, ailənin idarəçiliyini kişinin öhdəsində qoymazdı" – kimi düşünür, eyni zamanda, qadının irsinin kişinin irsinin yarısı qədər olmasına, mehriyyə adı ilə qadına qiymət biçilməsinə, ictimai və iqtisadi azadlığın verilməməsi və onun kişinin verdiyi nəfəqə və pulla dolanmaq məcburiyyətində olmasına razı olmadıqlarını .bildirirlər

Bunlar İslamın qadına nisbətdə təhqiredici düşüncəyə malik olduğunu və onu kişilərin mənafeyi üçün müqəddimə hesab etdiyini nişan verərək göstərir. İslamın müsavat və bərabərlik dini olması və digər yerlərdə bərabərliyi qoruyub riayət etməsinə .baxmayaraq, o, kişi və qadınla bağlı həmin məsələni gözləyib riayət etməmişdir

Onlar "İslam kişi üçün hüquqi imtiyazlar və seçim müəyyən etmişdir, əgər onlara görə həmin hüquqları müəyyən etməsəydi, yuxarıdakı qanun və müqərrəratları təyin etməzdi." – deyirlər. Biz əgər bu şəxslərin dəlillərinə Aristotelin məntiqi formasını tətbiq edərək şəkilləndirsək, belə bir şəkil meydana çıxacaq: "Əgər İslam qadını insan hesab etsəydi, onun üçün kişilərin hüququ ilə uyğun və bərabər hüquqlar təyin edərdi, lakin eyni və bərabər hüquqları nəzərdə tutmadığından, nəticədə, qadını, həqiqətən də, bir ".insan hesab etmir

Bu dəlillə bağlı istifadə edilən əsas məsələ müqəddimə olaraq, kişi və qadının insanlıq heysiyyəti və şərafətdə kişi ilə şərik və müştərək, eyni zamanda, onların hüquqi baxımdan bərabər və oxşar olmasıdır. Fəlsəfi cəhətdən üzərində dayanılaraq təkid edilən mətləb kişi və qadının insanlıq heysiyyəti və şərafətində müştərək olması üçün hansı müqəddimələrin zəruri olmasıdır. Görəsən, onun müqəddiməsi bir-biri ilə eyni və bərabər hüquqlara malik, amma hüquqi imtiyaz və seçimə sahib olmamalarıdır? Yoxsa, onun müqəddiməsi bərabər və eyni olmasından əlavə kişi və qadının hüquqlarının oxşar və eynisəviyyəliliyində və işin içində heç bir vəzifə və məsuliyyət ?bölgüsünün olmamasındadır

Şübhə yoxdur ki, kişi və qadının insanlıq heysiyyəti və onların insanlıq cəhətdən bərabərliyindəki müştərəkliyin müqəddiməsi onların insanlıq hüquqlarındadır, amma ?onların hüquqi oxşarlıqlarında necə

Əgər Qərb fəlsəfəsini kor-koranə təqlid və ona tərəfdarlıq etməkdən, eyni zamanda, qərblilər tərəfindən gəlib çatan fəlsəfi rəylərdən əl çəkərək bir qədər düşünsək, onda, hüquq bərabərliyindəki müqəddimənin hüquq oxşarlığında da olub-olmadığını fikirləşməliyik. Bərabərlik oxşarlıqdan fərqli bir şeydir. Bərabərlik “müsavailik”dir, .”amma oxşarlıq “eynisəviyyəlilik

Bir atanın öz sərvətini övladları arasında müsavi və bərabər şəkildə, amma oxşar şəkildə olmadan bölüşdürməsi mümkündür. Məsələn, həmin atanın ticarət obyektləri, əkin sahələri və icarəyə veriləcək mülkiyyətləri kimi neçə cür sərvətinin olmasını nəzərə alın. O, övladlarının hansı istedadlara malik olduqlarını əvvəlcədən bildiyi üçün, onlardan birinin ticarətlə məşğul olmasını münasib bilmiş, digərini isə əkinçilik və icarə ilə bağlı işlərə görə nəzərdə tutmuşdur. Həmin şəxs həyatda ikən sərvətini övladları arasında bölüşdürdükdə, bərabərliyi nəzərə alacaq şəkildə var-dövlətini bölüşdürəcək və bu cəhətdən onları bir-birindən üstün hesab etməyəcək və övladlarının hər birinə .əvvəlcə onlarda müəyyən etmiş olduğu istedadlara uyğun sərmayə verəcəkdir

Kəmiyyət keyfiyyətdən, bərabərlik də eynisəviyyəlilikdən fərqli bir şeydir. Aydın olan məsələ İslamın kişi və qadına bir cür və eynisəviyyəli hüquqlar vermədiyidir. Eyni zamanda, İslam heç vaxt qadına nisbətdə kişi üçün daha üstün hüquqi imtiyaz və seçim nəzərdə tutmamışdır. İslam dini insanların bərabərlik və müsaviliyini qadın və kişiyə nisbətdə riayət etmişdir. O, qadının kişi ilə hüquqi bərabərliyinə müxalif və zidd .deyil, əksinə onların oxşarlığı ilə müxalifdir

Bərabərlik" və "müsavilik" sözlərində "bərabərlik" və "imyiyazların olmaması"" məfhumu yerləşdirildiyindən, bu iki söz müqəddəslik əldə etmiş, cəzbetmə qüvvəsinə malik olmuş və xüsusən, "hüquq" kəlməsi ilə yanaşı işləndikdə, eşidənin ehtiramını .daha çox cəlb etmişdir

Hüquq bərabərliyi" - bu sözlər necə də iki sözdən yaranmış gözəl və müqəddəs bir" tərkibi əmələ gətirmişdir! O, hansı şəxsdir ki, pak vicdan və fitrətə sahib olmuş olsun, !?amma bu sözlər qarşısında təvazökarlıq göstərməsin

Amma mən bilmirəm nə üçün bizim işimiz - nə vaxtsa məntiq, fəlsəfə və elmdə dünyada aparıcı və bayraqdar idik - elə bir həddə gəlib çatmalıdır ki, digərləri "kişi və qadın hüquqlarının oxşarlığı" məsələsini müqəddəs "hüquq bərabərliyi" adı altında öz nəzəriyyələrini bizə yeritməlidir?! Bu məsələ eynilə bir nəfərin ləpə satmasına, amma ləpələrini armud adı ilə təbliğ etməsinə bənzəyir. Məsələnin aydın olan tərəfi İslamın bütün yerdə kişi və qadın üçün oxşar cəzalar və vəzifələri nəzərdə tutmadığı kimi, qadının kişi ilə hüquq bənzərliyi ilə bağlı qanunu da müəyyən etməməsidir. Görəsən, İslamın qadınla bağlı müəyyən etdiyi bütün hüquqlar toplusu kişinin hüquqlarına .nisbətdə daha az dəyərə malikdirmi? Əlbəttə, xeyr! Biz bunu sübuta yetirəcəyik

Burada ikinci bir sual meydana çıxır və həmin sual "İslamın kişi ilə qadının hüquqlarını bəzi hallarda bənzər şəkildə müəyyən etməməsinə səbəb nədir?" sualıdır. Nə üçün onları bir-birinə bənzər şəkildə təyin etməmişdir? Görəsən, kişi və qadının hüquqları ,bir-birinə bərabər və oxşar halda olsa daha yaxşıdır

yoxsa, təkcə bir-birinə bərabər olsa? Bu mətləbi kamil şəkildə araşdırmağımız üçün :onu üç qismdə bəhs etməyimiz lazımdır

Qadının insanlıq məqamı barədə İslamın nəzərini xilqət və yaradılış baxımından .١ .araşdırmaq

Kişi və qadının xilqətindəki fərqliliklər hansı hədəflər üçün nəzərdə tutulmuşdur? .٢ Həmin fərqliliklər kişi və qadının təbii və fitri hüquqlar baxımından bir-birinə bənzər ?olmayan vəziyyətlərinin yaranmasına səbəb olur, ya yox

İslamda kişi və qadın arasındakı fərqliliklərlə bağlı və onların bəzi hallarda bir-birinə .٣ oxşamayan hüquqlarının müəyyən edilməsinə səbəb olan müqərrəratlar hansı fəlsəfə və düşüncəyə əsaslanır? Görəsən, həmin fəlsəfə və düşüncələr hələ də öz yerində ?qalmaqdadırmı, ya xeyr, qalmaqda deyil

## İslami dünya görüşündə qadının məqamı

Birinci qisim. Quran təkcə qanunlar toplusundan ibarət deyil. Onun əhatə dairəsi fəqət bir sıra silsiləvi və təfsir edilməmiş quru qanunlardan təşkil olunmamışdır. Quranda həm qanun, tarix və öyüd-nəsihətlər mövcuddur, həm də xilqət və yaradılışın izahı və minlərlə digər mətləblər. Quran bir yerdə qanuna necə əməl edilməsi barədə göstəriş ferdiyi kimi, digər yerdə varlıq aləmi, yer və göylərin yaranışdan, olum və ölümdən, heyvanlar və bitkilər aləminin sirlərindən, izzətli və zəlil olmaqdan, tərəqqi və inkişafdan, sərvətlilik və fəqirlikdən bəhs edir. Quran fəlsəfə kitabı deyil, amma cəmiyyət, dünya və insanlar barəsində öz nəzər və düşüncəsini - bunlar fəlsəfənin üç əsas mövzusunu təşkil edir - bildirərək ona dəqiq və tutarlı şəkildə izah vermişdir. Qurani-kərim ona iman gətirənlərə təkcə qanunları təlim verib öyrətmir, eyni zamanda, onlara öyüd-nəsihət vermək və moizə etməklə də kifayətlənmir, əksinə yaranış və xilqətin təfsir və sirlərini izah etməklə öz tərəfdarlarına xüsusi təfəkkür .tərzi və dünya görüşü əta edib bağışlayır

İslami qanun və müqərrəratların təməli mülkiyyət, hakimiyyət, ailə hüququ və sairə kimi ictimai məsələlərin təfsir və bəyanı üzərində qurulmuşdur ki, bunlar da xilqət və

əşyanın təfsirinə qayıdır. Eyni zamanda, Quranda barəsində təfsir edilən mövzulardan biri də kişi və qadının xilqətidir. Quran bu barədə sükut etməyərək bəzi kəslərin kişi və qadın barədə fəlsəfə danışmasına və İslamın onlarla bağlı təyin etdiyi müqərrərat və qanunlar mənbəyinin həmin şəxslər tərəfindən qadına nisbətdə təhqiramiz bir məsələ kimi tanıtdırılmasına imkan verməmişdir. İslam qadın barəsində öz nəzərini açıq-aşkar .bəyan edərək bildirmişdir

Əgər Quranın kişi və qadının yaranış və xilqəti ilə bağlı nəzərinin nə olduğunu bilmək istəyiriksə, qadın və kişi ilə bağlı - digər dini kitablarda da izah edilən - xüsusiyyət və cəhətlərinə diqqət etməyimiz lazımdır. Quran da bu barədə sükut etməmişdir. Görəsən, Quranda qadın və kişi bir cəhətli olaraq nəzərdə tutulmuşdur, yoxsa, ?ikicəhətli? Yəni, Quran kişi ilə qadının təbiətini eyni hesab edir, yaxud fərqli

Quran çoxlu sayda əyələrində açıq və aşkar şəkildə qadını kişi cinsindən və onların xilqətinə uyğun olan bir xilqətdən yaratdığını vurğulamışdır. Qurani-kərim həzrət Adəmin (ə) xilqəti barədə belə buyurur: "Ey insanlar! Sizi tək bir şəxsdən (Adəmdən) və zövcəsini (Həvvanı) də öz cinsindən yaradan və onlardan da bi çox insanları xəlq edən Allahdan qorxun."(١) Bütün insanlar barəsində isə buyurur: "Allah sizin öz cinsinizdən sizin üçün zövcələr yaratdı."(٢) Qurandan fərqli olaraq digər dini kitablarda qadını alçaldaraq kişi yaradılan maddədən də pis və alçaq bir sudan yaradılması və "Həvvanın Adəmin sol qabırğasından xəlq edildiyi" kimi sözlərin heç bir əsası yoxdur. Quranda xilqət baxımından qadına nisbətdə bu cür təhqiramiz yönlü məsələlərdən .bəhs edilmir

Qədim zamanlarda geniş yayılan və dünya ədəbiyyatında özündən sonra xoşagəlməz əsərləri yadigar qoymuş nəzəriyyələrdən biri də qadının "günaha düşmək ünsürü" kimi



---

١-[١] . "Nisa" surəsi, ayə ١.

٢-[٢] . "Nisa","Rum" və "Nəhl" surələri.

tanıtdırılması, onun vücudunun şər olması və kiçik şeytana bənzədilməsi idi. Onlar “kişinin mürtəkib olduğu hər bir cinayətdə qadının dəxalətinin olmaması mümkün deyil” – deyərək kişinin zatı baxımdan pak və sudan arı olduğunu və qadının kişiləri günaha sürüklədiyini qeyd edirdilər. Onlar şeytanın birbaşa kişiyə təsir edə bilmədiyini və ancaq qadın vasitəsilə onu yoldan azdırdığını güman edirlər. Yəni, şeytan qadına vəsvəsə edir, qadın da kişiyə. Birinci dəfə Adəmin (ə) cənnətdən cıxarılması və onun şeytana aldanması qadın vasitəsi ilə olmuşdur. Şeytan Həvvanı yoldan çıxarmışdır, .(Həvva da Adəmi (ə

Quranda Adəmin (ə) cənnətdən çıxarılması məsələsinə toxunulmuş, amma heç vaxt deyilməmişdir ki, şeytan Həvvanı aldatmışdır, Həvva da Adəmi. Quran nə Həvvanı bu işin əsl səbəbkarı hesab edir, nə də onu həmin məsələdən kənar saxlayır. Quran buyurur: “Sən və zövcən cənnətdə sakin olun və onun meyvələrindən yeyin.” Şeytanın vəsvəsələri barədə söhbət açarkən də ikilik (müsənna) təşkil edən (yəni, onların hər :ikisinə şamil olan) əvəzliklərdən istifadə edir

{فَوَسْوَسَ لَهُمَا الشَّيطَانُ}

(Şeytan onların hər ikisinə vəsvəsə etdi. (١“

{فَدَلَّاهُمَا بِغُرُورٍ}

(Beləliklə, şeytan onları hiylə və kələklə aldadaraq (məqamlarından) endirdi. (٢“

{وَقَاسَمَهُمَا إِنِّى لَكُمَا لَمِنَ النَّاصِحِينَ}

(O ikisinə təkidlə and içdi ki, həqiqətən, mən sizin xeyrinizi istəyənlərdənəm.” (٣“

Beləliklə, Quran elə o zamandan, hələ də bugünkü dünyada geniş yayılmış olan yanlış fikirlə şiddətlə mübarizə aparmış və qadın cinsinin “şeytanın vəsvəsə vasitəsi” və “kişik şeytan” adı ilə ittiham edilməsini aradan qaldırmışdır. Qadınla bağlı mövcud olan təhqiramiz nəzəriyyələrdən biri də onun ruhi və mənəvi istedadları ilə əlaqədar idi. Onlar qadının cənnətə getməyəcəyi, mənəvi və ilahi məqamlara yiyələnməyəcəyini və

kişilərin ilahi dərgahda əldə etdikləri yaxınlıq dərəcəsinə çatmayacağını düşünürdülər. Quran açıq və aşkar şəkildə ilahi məqam və axirət nemətlərinə yetişməyin cinslə bağlı olmadığını bilirmiş və istər kişi tərəfindən olsun, istərsə də qadın, onun iman və əməldən asılılığına işarə etmişdir. Qurani-kərimdə əzəmətli və yüksək keyfiyyətlərə malik hər hansı bir kişinin yanında həmin keyfiyyətlərə sahib bir qadının olması xatırladılır və həzrət Adəm (ə) və həzrət İbrahimin (ə) qadınları, həzrət İsa (ə) və .Musanın (ə) anaları mədh edilərək təriflənir

Əgər Nuh (ə) və Lut (ə) peyğəmbərin qadınlarının ərlərinə layiq olmadıqları Quranda qeyd edilmişdisə də, fironun (tarixdə ikinci Ramzes kimi tanınır) əzəmətli qadınının yaxşı keyfiyyətlərinin bildirilməsindən və onun alçaq və rəzil bir insanın ixtiyarında olmasından da qəflət edilməmişdir. Qeyd edilən bütün bu hadisələrlə sanki Quran qəhrəmanların müvazinətini qorumağa çalışmış və sadəcə kişiləri diqqət mərkəzində saxlamamışdır. Müqəddəs Quranda Musanın (ə) anası barəsində deyilir: “Biz Musanın (ə) anasına vəhy edərək ona süd verməsini və uşağın canından qorxuya düşdükdə isə onu dəryaya (Nil çayına) atmasını və tezliklə uşağı ona qaytaracağımızı və nigaran ”.olmamasını bildirdik

Həzrət İsanın (ə) anası Məryəm (ə) barədə də belə buyurulur: “O, elə bir məqama yetişmişdi ki, mehrabda ibadət edərkən həmişə mələklərlə söhbət edir və ona qeybdən ruzi göndərilirdi. Mənəvi cəhətdən yüksək məqamlar əldə edərək zəmanəsinin peyğəmbərini (həzrət Zəkəriyyə (ə)) belə, özü müqabilində heyrətdə ”.qoymuşdu

İslam tarixində də müqəddəs və yüksək şəxsiyyətli qadınlar çoxluq təşkil edir. Xanım Xədicənin (ə) məqamına yetişə biləcək çox az kişilər mövcuddur və peyğəmbər (s) və həzrət Əlidən (ə) başqa, heç bir kişi xanım Zəhraya (ə) çata bilməz. Həzrət Zəhranın (ə) imam olan öz övladları və bütün peyğəmbərlərə - sonuncu peyğəmbərdən (xatəmul-ənbiya) başqa - üstünlüyü vardır. İslam dini məxluqatın Allaha doğru hərəkəti və istiqamət alması baxımından qadın və kişi arasında heç bir fərq qoymur. Təkcə Allah tərəfindən camaata doğru

hərəkətdə bir fərq vardır və o, peyğəmbərlik məsələsidir ki, bu çətin məsuliyyət və .vəzifə kişilərin öhdəsinə qoyulmuş və onlar həmin iş üçün daha münasib bilinmişlər

Qadına nisbətdə mövcud olan təhqiramiz nəzəriyyələrdən biri də cinsi riyazət və təkliyin (ayrı olmanın) müqəddəsliyi məsələsidir. Bildiyimiz kimi, bəzi dinlərdə cinsi münasibət pis və alçaq iş kimi qiymətləndirilir. Həmin dinlərin tərəfdarları mənəvi məqamlara çatmağın yeganə yolunu insanın ömrü boyu təklikdə yaşamasında bilirlər. Dünyəvi məzhəblərin tanınmış rəhbərlərindən biri deyir: "Bəkarət mişarı ilə izdivac və evlilik ağacını kökündən kəsin." Bu tipli rəhbərlər evliliyə sadəcə fəsadı aradan qaldırmaq üçün icazə verirlər. Onlar tənha və tək yaşamağa bütün insanların qadir olmadıqlarını və onların səbr və ixtiyarlarının əldən çıxaraq günaha düşdükləri və çoxlu sayda qadınlarla cinsi münasibətlərdə olmalarını nəzərə alaraq icazə verirlər ki, bir qadınla evlənsinlər, çünki bu çoxlu sayda qadınla cinsi rabitədə olmaqdan daha .yaxşıdır

Riyazət və özünü cismani əziyyətlərə salmaq fikri və tək yaşamağa tərəfdar olmaq qadın cinsinə qarşı bədbinlikdən qaynaqlanır. Onlar qadına məhəbbət və sevgini böyük .əxlaqi fəsad və inhirafların bir qismi və hissəsi kimi qəbul edirlər

İslam bu cür xürafat, azğın düşüncə və yanlışlıqla şiddətli mübarizə aparmış və evlilik və izdivacı müqəddəs bilərək təklik və tənhalığı pisləmişdir. İslam dini qadına məhəbbət və sevgi göstərməyin peyğəmbərlərin əxlaqından olduğunu vurğulamış və :belə buyurmuşdur

من اخلاق الانبياءِ حُبُّ النِّساءِ

İslam peyğəmbəri (s) buyurur: "Mənim üç şeyə - xoş iyili ətirə, qadın və namaza - ".məhəbbətim vardır

Bertrand Rassel deyir: "İslam dinindən başqa, bütün dinlərdə cinsi münasibətə qarşı müəyyən miqdarda bədbinlik mövcuddur. Əlbəttə, İslam dini ictimai məsləhətlər baxımından həmin məsələ ilə əlaqədar müəyyən qanunlar nəzərdə tutmuş, amma heç ".vaxt onu alçaq və pis bir iş kimi qiymətləndirməmişdir

Qadınlarla bağlı təhqiramiz nəzəriyyələrdən digəri qadının kişinin mövcud olması üçün bir müqəddimə olması və ona görə

səh:۱۱۷

xəlq edilməsidir. Ümumiyyətlə, İslam heç zaman belə bir söz söyləməmişdir. İslamda yaranışın əsl hədəf və səbəbi kamil bir şəkildə bildirilmiş və deyilmişdir ki, yer və göylər, bitkilər və hyvanlar, yağış və küləklər – bunların hamısı insan üçün yaradılmışdır. Amma qadının kişi üçün yaradılması barədə heç bir söz deyilməmişdir. :İslamda hər bir kişi və qadının bir-biri üçün xəlq edilməsindən söhbət açılır və deyilir

{هُنَّ لِبَاسٌ لَكُمْ وَأَنْتُمْ لِبَاسٌ لَهُنَّ}

Həm onlar sizin üçün libasdırlar və həm də siz onlar üçün libassınız (hər biriniz" (digərinin zinəti, eyiblərini örtən və onu günahdan qoruyansınız). "(١)

Beləliklə, əgər İslam qadını kişi və onun müqəddiməsi üçün yardılmış hesab etsəydi, bu baxımdan məxsus qanunlar müəyyən edərdi və həmin qanunların nəzərdə .tutulmaması İslamın qadına yararsız bir məxluq kimi baxmadığını aydınlaşdırır

Keçmişdə qadın barəsində yaılan digər təhqiramiz və alçaldıcı məsələ onun kişi üçün qaçılmaz bir bəla və şər kimi tanıtdırılması idi. Cahiliyyət dövründəki ərəblər və həmçinin, bəzi millətlər ananı kişinin nütfə və spermasını – uşaqların yaranması üçün əsas və aparıcı funksiya rolunu oynayır – daşımaq qabiliyyətinə malik və övladı özündə saxlayan bir qab və vasitə hesab edirdilər. Quranın bəzi ayələrində insanın kişi və qadından yaradılmasına işarə edilmiş və bəzi ayələrin təfsiri də həmin təfəkkür tərzi ilə .sona yetmişdir

Deyilənlərdən belə məlum olur ki, İslam fəlsəfi baxımdan və xilqətin bəyanı ilə əlaqədar olaraq qadına nisbətdə təhqiramiz düşüncədə olmamış, əksinə həmin nəzəriyyələri pisləmiş və məzəmmət etmişdir. İndi kişi və qadın hüquqlarında .oxşarlığın olmaması fəlsəfəsini anlamağın növbəsi gəlib çatmışdır

**Bənzərliyə xeyr, bərabərliyə isə bəli**

İslamın qadının ailə münasibətləri və hüquqları barədə xüsusi bir fəlsəfəyə sahib olduğunu və həmin fəlsəfənin on dörd əsr əvvəlki fəlsəfə ilə günümüzdəki fəlsəfədən fərqləndiyini diqqətinizə çatdırmışdıq. Eyni zamanda, İslamın nəzərində kişi və qadının -insanlıq baxımından bərabər və müsavi olub

olmaması, onların ailə hüquqlarının bir-birinə nisbətdə eyni dəyərə malikliliyi məsələsi də indiki bəhsimizin mövzusu deyil. İslami dünya görüşündə kişi ilə qadının hər ikisi .insandır və insanlıq hüquqlarından bərabər şəkildə bəhrələnə bilirlər

İslamın nəzərində bəyan edilən məsələ kişinin kişi və qadının qadın olması nəticəsində onların bir-birinə oxşar olmaması, dünyanın onlar üçün eynisəviyyəlik təşkil etməməsi, hər ikisinin təbiət və xilqət baxımından fərqli olması, kişi və qadının bir sıra hüquq bərabərliyi, təklif və məsuliyyət, həmçinin, cəza verilməsi cəhətindən bir-birinə bənzəməyən qanunların müəyyən edilməsinə gətirib çıxartmasıdır. Hazırda Qərb dünyasında qanun və müqərrəratlar, hüquq və vəzifələr baxımından kişi ilə qadın arasında vahid və oxşar bir qanunun təyin edilməsinə səy edilir və onların təbii və cinsi qərizələri görməzdən gəlinir. İslamın nəzəri ilə Qərb sistemləri arasında mövcud olan fərqlər də elə bu yerdədir. Beləcə, bizim ölkəmizdə islami hüquq tərəfdarları ilə Qərb sistemlərinə tərəfdar olan və ona təqlid edənlər arasında bəyan edilən məsələ kişi və qadının hüquqi birliyi və bənzərliyi məsələsidir, nəinki, onların hüquq bərabərliyi. "Hüquq bərabərliyi" kəlməsi Qərbin onun üzərinə "qərbyönlülük və Qərbə meyil" həkk .etdirdiyi saxta və qəlib bir pula bənzəyir

Mən həmişə yazılarımda, konfranslarda, öz söhbət və çıxışlarımda bu saxta və qəlib puldan istifadə edərək həmin fərziyyəni - bu fərziyyə kişi və qadının hüquqi oxşar və bənzərliyi iddiasından başqa, bir şey deyil - "hüquq bərabərliyi" adı ilə xatırlatmaqdan çəkinmişəm. Mən dünyanın heç bir yerində kişi və qadının hüquq bərabərliyi barədə edilən iddianın məna kəsb etmədiyini və dünyanın keçmiş və indiki qanunlarında kişi ilə qadın hüquqlarının bərabər tutulan dəyərlərə əsasən müəyyən edildiyini və təkcə bənzərliyin aradan qaldırıldığını demirəm. Xeyr, mənim belə bir iddiam yoxdur. Avropa özü XX əsrdən əvvəl buna ən yaxşı şahiddir. Avropada XX əsrdən öncə, qadın qanun və əməli baxımdan insanlıq hüquqlarından məhrum idi. O, nə kişi ilə bərabər, nə də .onunla oxşar və eyni səviyyəli hüquqlara malik deyildi

Son bir əsr ərzində tələskən və təcili şəkildə qadın adı ilə və qadınlar üçün baş vermiş mədəni hərəkatların nəticəsində qadın, haradasa, kişi ilə bərabər və eyni səviyyəli hüquqlar əldə etdi. Amma onun təbii vəziyyəti, cismi və ruhi təlabatlarına nəzər saldıqda, heç də, kişi ilə bərabər və oxşar hüquqlar əldə etmədiyi anlaşılır. Əgər qadın kişinin hüququna bərabər olan hüquq və onun səadəti kimi bir səadət əldə etmək istəsə, ona məxsus olan çıxış yolu hüquqi bənzərliyin ortadan qaldırılması və qadınla kişinin hər birinə mütənasib və uyğun şəkildə qanunların təyin edilməsidir. Fəqət bu yolla kişi və qadın arasında həqiqi vəhdət və səmimiyyət bərqərar olacaq və qadın eyni səviyyəli, bəlkə də, ondan da artıq şəkildə səadət və xoşbəxtlikdən yararlana biləcəklər. Belə olan halda, kişilər qadınları aldatmadan və hiylə işlətmədən onlar üçün .daha artıq və çox hüquqları nəzərdə tutmaq fikrində olacaqlar

Mən əməldə və İslamın zahiri baxımından cəmiyyətdə qadına nəsib olan hüquqların kişini hüquqları ilə bərabər və müsavi dəyərə malik olduğunu iddia eləmirəm. Dəfələrlə bugünkü qadının vəziyyəti ilə əlaqədar kamil şəkildə ona yardım edilməsinin lazım və zəruriliyini vurğulamış və İslamın qadına əta etdiyi və tarix ərzində əməli cəhətdən tərk edilən hüquqların ona geri qaytarılmalı olduğunu nəzərinizə çatdırmışıq, nəinki, kor-koranə və gözüyumulu halda, Qərb camaatının yanlış və batil olan üslubuna - həmin üslub onlar üçün minlərlə bədbəxtlik meydana gətirmişdir - qəşəng bir ad qoyaraq qadının qərb yönlü bədbəxtlikləri üzərinə şərq yönlü bədbəxtlikləri əlavə etməyi. Bizim iddia etdiklərimiz kişi və qadın hüquqlarının onların fitət və təbiətinin icazə verdiyi həddə oxşar və eyni səviyyəli olmayacaq şəkildə müəyyən edilməsinin həm ədalət və fitri hüquqla tətbiq olunması və həm də ailə səadətini daha yaxşı təmin .etməsi və cəmiyyəti irəli aparması məsələsidir

Bizim kişi və qadının insanlıq və fitri hüququ, eyni zamanda, ədalətin müqəddimə və zəruri məsələsi kimi bir sıra hüquqlarda onların oxşarlıq təşkil etməməsini iddia etdiyimiz mövzulara həddən artıq və kamil şəkildə diqqət yetirin. Beləliklə, bəhsimiz həm yüz faiz fəlsəfi yönlərə malikdir və

həm də hüququn fəlsəfəsi ilə əlaqəsi vardır və o, İslami kəlam (əqaid) və fiqhin rükn və .təməli hesab edilən “ədalət” adlı bir məsələ ilə irtibat və münasibətdədir

Ədalətin əsli İslamda qanunun əql və şəriətlə tətbiq edilməsini meydana gətirən məsələyə qayıdır. Yəni, islami fiqhin nəzərində və ya ən azı, şiə fiqhində əgər ədalət hansısa bir işin (məsələn) o cür deyil, bu cür olduğunu və əgər ona əməl edilmədiyi təqdirdə, zülm və ədalətin xilafına olacağını sübuta yetirərəsə, məcburən və istər-istəməz, din və şəriətin də həmin qaydada hökm etdiyini deməliyik. Beləliklə, İslam özünün təlim verdiklərinə uyğun olaraq ədalət çərçivəsindən, təbii və fitri hüquqdan .heç vaxt xaric olmaz

İslam alimləri “ədalət” məsələsinin əsas və təməlini bəyan və izah etməklə “hüquq fəlsəfəsi”nin bünövrəsini qoymuş və sanki tarixdə meydana gələn bir sıra maneələr nəticəsində, tutmuş olduqları yolu davam etdirə bilməmişlər. Bəşər hüququ və ədalətin əslinə zatı, təkvini və müqavilə və saziş qaydalarından xaric bir məsələ ünvanında diqqət etdikdə, onun birinci dəfə müsəlmanların vasitəsilə həyata keçirildiyi .və əqli və təbii hüquqların əsasının onlar tərəfindən qoyulduğu məlum olur

Amma tale belə gətirir ki, onlar (müsəlman alimləri) öz işlərini davam etdirməsinlər və haradasa, səkkiz əsrdən sonra həmin işi Avropa alim və filosofları irəlilədərək bu .iftixarı özlərinə mənsub edərək öz adlarına çıxsınlar

Onlar bir tərəfdən iqtisadi, ictimai və siyasi fəlsəfəni meydana çıxartmış və digər tərəfdən isə insanlar, cəmiyyət və millətləri onların insanlıq hüquqları, həyat və yaşam dəyəyərləri ilə tanış etmiş, hərəkat, hərəkat və yürüşlərin yaranmasına səbəb olaraq .dünyanın simasını dəyişmişlər

Mənim nəzərimcə, müsəlman Şərqin əsasını özü qoymuş olduğu “əqli hüquq” məsələsini izləməməsinə səbəb olan tarixi manelərdən əlavə, strateji və psixoloji səbəblər də həmin məsələdə dəxalətli olmuşdur. Şərq və Qərb arasında mövcud olan əsaslı fərqlər Şərqin əxlaqa, Qərbin isə hüquqa təmayüllü, Şərqin əxlaq aşiqi, Qərbin .isə hüquqsevər olmasındadır

Şərqlilər özlərinin şərqli təbiətinə əsasən, öz insanlığını hissiyyatlı olmaqda, güzəştə getməkdə, öz həmcinslərini sevməkdə və mərdi-mərdanə olmaqda görməsindədir. Amma qərblilər öz insanlıqlarını hüquqlarını bilmək və onu müdafiə etməkdə, .həmçinin, digərlərinin onun hüquqlarına təcavü etməsinə yol verməməkdə bilməsidir

Bəşəriyyətin həm əxlaqa, həm də hüquqa ehtiyacı vardır. İnsanlıq hüquqla əxlaqdan .asılı vəziyyətdədir və onlardan heç biri təklikdə insanlıq meyarı hesab olunmur

Müqəddəs İslam dini bu əsaslı xüsusiyyət və imtiyazlara malik olmuş və olmaqdadır, eyni zamanda, o, hüquqi və əxlaqi məsələləri əməldə diqqət mərkəzində saxlamışdır. Əvvəlki bəhslərdən də İslamın yaxşılıq və səmimiyyəti əxlaqi baxımdan müqəddəs olan əməllər hesab etdiyini, həmçinin, insanın öz hüquqlarını bilməsi və onu müdafiə etməsini də insani keyfiyyətlər ünvanında nəzərdə tutduğunu bildirmişdik. Bu məsələnin izahı müfəssəl olduğundan, hazırda həmin bəhsə girişməyi məsləhət .bilmirik

Şərqin xüsusi ruhiyyəyə sahib olması öz işini görə bilmişdir. Məsələnin əvvəlində hüquq və əxlaqı - onların hər ikisini İslamdan götürməsinə baxmayaraq, tədricən, .hüququ kənara qoyaraq bütün diqqətini əxlaqa yönəltmiş və ona həsr etmişdir

Uzun sözün qısası, hazırda bizim qarşı-qarşıya gəldiyimiz məsələ hüquqi, fəlsəfi, əqli, dəlil və sübutlara ehtiyaclı, ədalətin həqiqəti və hüququn təbiəti ilə münasibət və irtibata malik olan bir məsələdir. Ədalət və hüquq dünyada hələ heç bir qanun təyin edilməzdən əvvəl mövcud olmuşdur. Qnunların təyin edilməsi ilə bəşərin ədalət və .insanlıq hüquqlarının mahiyyətini əvəz edib dəyişdirmək mümkün deyil

Montesko deyir: “İnsanlar qanunları təyin etməzdən əvvəl, məxluqat arasında qanunlara əsaslanan ədalətli münasibətlərin mövcud olması imkanı vardı. Bu rabitənin varlığı qanunların müəyyət edilməsinə səbəb olmuşdur. Əgər biz indi əmr və nəhy edən (çəkindirən) ilkin və həqiqi qanunlardan başqa, digər ədalətli və ya zalım olan ,halların olmadığını desək, bu

dairənin şəklini çəkmədiyimiz halda, onun bütün şüalarının bərabər olmadığını"“ ”.deməyimizə bənzəyər

Herbart Spensir belə deyir: “Ədalət hissiyyatlardan başqa, insan fərdlərinin təbii hüquqları ilə qaynayıb-qarışmışdır və onun zehindən xaricdə mövcud ola bilməsi üçün ”.təbii hüquq və imtiyazlara riayət edilməli və onlara ehtitam göstərilməlidir

Bu əqidəyə sahib olmuş və hazırda da ona etiqad bəsləyən avropalı hakimlərin sayı çoxdur. Bəşər hüququ – onun üçün müəyyən elan və məlumatlar tənzim edilmiş və bir sıra maddələr nəzərdə tutulmuşdur – öz mənbəyini təbii hüquqlar fərziyyəsindən götürmüşdür, yəni təbii və fitri hüquq fərziyyəsi “bəşər hüququ”nun elanı şəklində .zühur etmişdir

Bildiyimiz kimi, Montesko, Spensir və başqalarının ədalət barəsində söylədikləri, eynilə, İslam mütəkəllimlərinin (əqaid alimlərinin) əqli xeyir və şər, (yəni, xeyirlə şərin əqli baxımdan yaxşı və pis olması) eyni zamanda, ədalətin həqiqəti barəsində dedikləridir. Avropalılar arasında zati hüquqları inkar edənlər və ədaləti saziş və müqvilə ilə əlaqələndirən şəxslər olduğu kimi, İslam alimləri arasında da bu əqidəni dəstəkləyənlər var idi. İngiltərəli Hubs da ədaləti həqiqi bir məsələ olaraq qəbul .etməyərək inkar edir

**Bəşər hüququnun elan edilməsi qanun deyil, fəlsəfədir**

Gülməli olan məsələ “bəşər hüququ” barədəki mətnin Milli Məclis tərəfindən qəbul olunduğunun deyilməsi və “kişi və qadın hüquqlarınını bərabər və müsaviliyi də həmin maddələrin bir qismini təşkil etdiyindən, Milli Məclis kişi və qadın hüquqlarının bir-birinə nisbətdə bərabərliyini qanuni hökm şəklində təyin etmişdir” – kimi başa düşülməsidir. Görəsən, “bəşər hüququ” barədəki mətn Milli Məclisin səlahiyyətlərinə daxildirmi ki, ?onu təyin və ya rədd edə bilələr

Bəşər hüququ” ilə bağlı mətnin əhatə dairəsi insanların saziş və müqavilələrinə“ söykənən məsələlər kimi deyildir və ölkələrin qanunverici orqanları onaları təsdiq və ya inkar edə bilməzlər. “Bəşər hüququ”nun elanı edilməsi ilə insanların zati və aradan

qaldırılması qeyri-mümkün olan hüquqları bəhs və müzakirə obyektinə çevrilmişdir. Bu elan və tezislər iddia etdiyi insanlıq heysiyyətinin müqəddiməsi və zərurətinin insanlar olması məsələsi ilə bağlı bəzi hüquqları bəyan etmiş və həmin məsələnin mənbəyi kimi yaradanı və qüdrət sahibini göstərmişdir. Yəni, insanlara əql, iradə və insanlıq şərafəti .əta edən qüdrət sahibi bu hüquqları da onlara əta etmişdir

İnsanlar nə bəşər hüququ ilə bağlı məsələnin əhatə dairəsini müəyyən edə, nə də onu aradan qaldıra bilərlər. Görəsən, Milli Məclis və qanunvericilik orqanları nəyi nəzərdə ?tutmuşdur

Bəşər hüququnun elan edilməsi fəlsəfədir, nəinki, qanun. Bu səbəbdən, millət vəkillərinin deyil, filosofların təsdiq etməsinə ehtiyyaclıdır. Məclis nümayəndələri rəy və səs toplamaq, təlaş etməklə camaat üçün fəlsəfə və məntiq müəyyən edə bilməzlər. Əgər belə olsaydı, onda, Enşteyn fəlsəfəsini və digər planetlərdə həyatın olması fərziyyəsini də Milli Məclisə çıxarmaq və nümayəndələrin təsdiqləməsinin ixtiyarında qoymaq lazım gələrdi. Təbiət qanunlarını da saziş və müqavilələrin təyin edildiyi qanunlara əsasən təsdiq və inkar etmək olmaz. Bu məsələ Məclis nümayəndələrinin "əgər armudla almanı calaq etsələr, onların calağı alınar, amma armudla tutu calaq etsələr alınmaz" deməlerinə bənzəyir. Deməli, özləri də filosof və mütəfəkkir olan bir qrup tərəfindən bəşər hüquq ilə bağlı belə məsələlər yaranırsa, millətlər onları özlərinin filosof və hüquq alimlərinin öhdəsinə buraxmalıdırlar. Əgər o məsələlər həmin millətlərin mütəfəkir və filosoflarının nəzərində təsdiq edilmiş olsa, onda, onların bütün fərdləri "qanunun həqiqətləri" ünvanında ona əməl etməkdə vəzifəlidirlər. Qanunverici orqanlar da həmin qanunlara zidd və müxalif olan başqa .qanunlar verə bilməz

Digər millətlərin nəzərində nə qədər ki, onlar üçün həmin qanunlar təbiətdə və deyilən keyfiyyətlərlə öz təsdiqini tapmayıb ona əməl etməyə məcbur deyillər, digər tərəfdən, bu məsələlər avopalıların malik olduğu, digərlərində isə olmayan təcrübə aparmaq və eksperimentləri gərəkdirən məsələlərdən

hesab edilmir və bunun üçün labaratoriyalara da ehtiyac yoxdur. Bunlar parçalanmasında bir sıra sirlərə malik atom deyil ki, çox məhdud insanların ixtiyarında .olsun, məntiq və fəlsəfədir və tələbatı da əql, beyin və dəlil gətirmək qüvvəsidir

Digər millətlər fəlsəfə və məntiqlə bağlı digərlərinə təqlid etmək istəsə və özlərini bu sahədən kənarda tutsalar da, biz iranlılar heç vaxt bu düşüncədə olmamalıyıq. Çünki biz keçmişdə fəlsəfi və məntiqi araşdırmalarla əlaqədar ən yüksək həddə məşğul ola bilmək qüdrətimizi sübuta yetirmişik. Bu səbəbdən, biz nə üçün həmin məsələlərdə ?digərlərinin müqəllidi və təqlidçisinə çevrilməliyik

Görəsən, İslam alimləri ədalətin həqiqəti və bəşərin zatı və fitri hüquqlarından söhbət düşən zaman ona həddən artıq əhəmiyyət verdiklərindən, sorğu-sualsız olaraq "şəriətlə əqlin uyğunluğu" qaydasına əsasən "həmin məsələdə şəriətin də hökmü belədir." - deyirlərmi? Yəni, şəriətin təsdiqinə ehtiyac duymurlarmı? Amma hazırda iş o yerə gəlib çatmışdır ki, Milli Məclis nümayəndələrinin təyin etməsi ilə biz bu .məsələlərin doğru və düzgün olmasının təsdiqlənməsini istəyirik

### Fəlsəfəni rəy almaq üçün yazılan sual-cavab kartları ilə isbat etmək olmaz

İnsanın daha da gülüş və təbəssümünə səbəb olan məsələlərdən biri də kişi və qadının hüquq bərabərliyini araşdıran zaman, oğlan və qızların rəyinə müraciət edilməsi, rəy və nəzər bildirilməsi üçün sual-cavab kartlarının hazırlanması və bu yolla insanlıq hüquqlarının nə olmasının kəşf edilməsi və kişi və qadın hüquqlarının bir və ya iki .cəhətliliyinin öyrənilməsidir

Hər halda, biz qadının insanlıq hüquqları məsələsini elmi, fəlsəfi şəkildə və bəşərin fitri hüquqları baxımından araşdırmaq istəyirik. Bilmək istəyirik görək, Allah tərəfindən verilən və bütün insanların bir sıra silsilə təşkil edən təbii və fitri hüquqlara malik olmasını təmin edən qaydalar kişi və qadının hüquqi cəhətdən oxşar vəziyyətlərə ,sahib olmasına səbəb olur

ya yox? Biz bu məsələlərlə əlaqədar fikir və nəzər bildirmək səlahiyyətlərinə malik olan ölkənin filosofları, mütəfəkkir və hüquqşünaslarından təqdim etdiyimiz dəlil və sübutlarla bağlı tədqiq və onlara irad gözü ilə nəzər salmalarını xahiş edirik. Əgər onlar .bu sahədə öz nəzər və iradlarını bildirsələr, bundan çox məmnun olacağımızı bildiririk

Bu mətləblərin araşdırılması üçün əvvəlcə, bəşərin insanlıq hüququnun əsası və kökü barədə bəhs etməyimiz, daha sonra isə kişi və qadın hüquqları haqda mütaliə etməyimiz zəruri və lazımlıdır. Bu cəhətdən, yeni əsrdə kişi və qadın hüquqlarının bərabərlik nəzəriyyəsinə əsaslanan hüquqi hərəkatlara da qısa bir nəzər salmağımız .lap yerinə düşərdi

**Avropada qadın hüquqları tarixinə bir nəzər**

Avropada XVII əsrdən sonra "bəşər hüququ" adı ilə zümzümələr edilməyə başlandı. On yeddi və on səkizinci əsrin mütəfəkkir və yazıçıları bəşərin təbii, fitri və ondan alınması mümkün olmayan hüquqları barədəki öz fikir və düşüncələrini insanı heyrətə salacaq şəkildə və sürətlə camaat arasında durmadan yaymağa başladılar. Jan Jak Russo, Marten Luter və Montesko kimilər həmin dəstədən olan yazıçı və .mütəfəkkirlərdən hesab edilir

İlk dəfə olaraq insanın təbii və fitri hüquqları tərəfdarlarının nəşr etdikləri düşüncələr barədə əldə etdikləri əməli nəticə İngiltərədəki hakim heyəti və millətlər arasında uzunmüddətli bir keçməkeşin meydana gəlməsi oldu. Sonunda, İngiltərə xalqı min altı yüz səksən səkkizinci ildə özünün siyasi, ictimai hüquqlarını hüquqi tezislər formasında (irəli sürməyə müvəffəq oldu.(١

Bu düşüncənin əməli olaraq bariz nəticələrindən biri Amerikanın İngiltərə əleyhinə apardığı istiqlal müharibəsi zamanı özünü nişan verərək göstərdi. Şimali Amerikadakı on altı ingilis müstəmləkəsi onlara edilən təziqlər nəticəsində tab gətirməyərək üsyan və hərəkatlara əl atdılar və nəhayət, öz



---

.Albert Mali tarixi"nin tərcüməsi, c.۴, səh. ٣۶۶" . [١] -١

.istiqlaliyyət və azadlıqlarını əldə edə bildilər

Min yeddi yüz yetmiş altıncı ildə Filadelfiyada ümumi istiqlaliyyətin elan olunması ilə bağlı konfrans təşkil edildi və bu zəminədə bildirişlər paylanmağa başlandı və onun müqəddiməsində belə yazılmışdı: "Bütün insan fərdləri xilqət və yaranış baxımdan bərabərdirlər və Allah hər bir insana sabit və dəyişdirilməsi mümkün olmayan – yaşamaq və azadlıq haqqı kimi – hüquqlar əta etmişdir. Dövlət və hökumətlərin təşkil edilib yaradılmasında əsas məqsəd bu hüquqların qorunmasıdır. Dövlətin güc "(strukturları və onun sözünün təsiri millətlərin razılığı üçündür.(١)

Amma dünyada "bəşər hüququ" adı ilə tanınan məsələ böyük Fransa hərəkatından sonra hüquq ünvanında yayılan bildirişlər şəklində olmuşdur. Həmin bildiriş və tezislər Fransa konstitusiyasının yaradılmasında ümumi üslubu təşkil edir və onun ayrılmaz bir hissəsi hesab olunur. O tezislər bir müqəddimə və yeddi maddədən ibarətdir. Onun birinci maddəsi belədir: "İnsan fərdləri azad xəlq olunmuş və bu şəkildə də "....qalmaqdadırlar. Onların hüquqları bir-biri ilə bərabərdir

On doqquzuncu əsrdə bəşər hüququ zəminəsində iqtisadi, ictimai və siyasi məsələlərlə bağlı və eyni zamanda, sosializmin yaranması ilə nəticələnən yeni-yeni fikir və dəyişikliklər meydana çıxdı və hakimiyyətin sahibkar və sərmayədarların əlindən çıxaraq fəhlə və zəhmətkeş təbəqənin əlinə keçməsinə və mənfəətlərin onlara .məxsus olmasına səbəb oldu

İyirminci əsrin əvvəllərinə qədər bəşər hüququ ətrafında bəhs edilən məsələlər təkcə dövlətlər müqabilində millətlərin və sahibkar və sərmayədarlar qarşısında da fəhlə və zəhmətkeş sinifin hüquqları ilə bağlı və onlarla əlaqədar olmuşdur. İyirminci əsrdə birinci dəfə olaraq kişilərin hüququ müqabilində "qadın hüquqları" məsələsindən söhbət açılmışdır. İngiltərə – dünyanın ən qədim demokratik ölkəsi kimi tanınır – ilk .dəfə XX əsrin əvvəllərində qadın və kişinin hüquq bərabərliyinə etiqad bəsləmişdir

Amerika Birləşmiş Ştatlarında XVII əsrdən etibarən bəşər

hüququ ilə bağlı ümumi istiqlaliyyət elan edilməsinə baxmayaraq, ۱۹۲۰-ci ildə kişi və qadının hüquq bərabərliyi ilə bağlı siyasi hüququda qərar qəbul edilmişdir. Eyni zamanda, Fransada da həmin məsələ XX əsrdə həyata keçirilmişdir. Hər halda, XX əsrdə dünyanın bir çox ərazilərində insanlar kişi və qadının hüquq və vəzifə bərabərliyi zəminəsində düşünməyə başlamış və bu sahədə dəyişikliklər yaranmışdır. Onlar elə düşünürdülər ki, millətlərin dövlət qarşısında və fəhlə, zəhmətkeş sinifin də sahibkar və sərmayədar qarşısındakı rabitələrdə və kişi və qadın hüquqları ilə bağlı islahatlar .həyata keçirilmədikcə, ictimai ədalət bərpa olunmayacaq

Bu səbəbdən, birinci dəfə olaraq bəşər hüququ ilə bağlı - ikinci dünya müharibəsindən sonra ۱۹۴۸-ci ildə Birləşmiş Millətlər Təşkilatı (BMT) tərəfindən - onun müqəddiməsində bunlar qeyd edilmişdir: “Birləşmiş Millətlər Təşkilatı (BMT) bəşər hüququ, insan fərdlərinin dəyər və qiymətli və kişi ilə qadının bərabər huquqlara malik ”....olması ilə bağlı öz inamını bir daha elan edir

On doqquz və XX əsrlərdə baş vermiş dəyişiklik və maşınlı (texniki) böhranlar, fəhlə və işçilərin fəlakətə düçar olması hüquqa, xüsusən də, hamıdan artıq qadınların hüquqları mövzusuna diqqət yetirilməsinə səbəb olmuşdur. “Albert Mali tarixi”nin ۶-cı cild, ۳۲۸-ci səhifəsində yazırlar: “Dövlətlər işçi və fəhlərin vəziyyəti və sahibkarların həmin təbəqə ilə rəftarı barədə maraqlanmayan zamana qədər, sərmayədarlar istədikləri şeyləri edirdilər.... Fabrik sahibləri qadın və azyaşlı uşaqları çox az bir əmək haqqı ilə işlədir və iş saatı həddən artıq olduğundan, onlar cürbəcür xəstəliklərə düçar olur və cavan ”.yaşlarında ölürdülər

Bu, Avropada mövcud olan “bəşər hüququ” hərəkatının qısa və müxtəsər bir tarixçəsi idi. Bildiyimiz kimi, hazırda avropalılar üçün yeni və təzə hesab edilən bəşər hüquqları barədə İslam dini on dörd əsr əvvəl söhbət açmış və bəzi ərəb və iranlı alimlər onlar haqda məlumatları müqayisəli şəkildə öz kitablarında qeyd etmişlər. Sübhə yoxdur ki, avropalıların tezislərindəki bəşər hüquqları ilə İslamın nəzərdə tutduqları arasında əsaslı fərqlər mövcuddur və bu barədə bəhs etmək çox maraqlıdır. Həmin

fərqlərdən biri İslamın kişi və qadın hüquqları zəminəsindəki bərabərliyi qəbul etməsi, .amma onların hüquqi oxşarlıqları və eynisəviyyəliliyini isə qəbul etməməsindədir

**İnsanlıq heysiyyət və hüququ**

Bəşərin bütün ailə üzvlərinin zati heysiyyətinin, bərabər hüquqlarının və onların yerinin dəyişməməsinin bilinib tanınması azadlıq, ədalət və sülhün əsasını təşkil edir. Əksinə, insan hüququnun təhqir edilərək kiçimsənilməsi bəşərin ruhiyyəsində üsyan və hərəkatların əmələ gəlməsi ilə nəticələnən əməllərə, insanların azad və sərbəst şəkildə öz fikir və əqidələrinin bəyan etməsi arzusunda olan dünya şəklinə düşməsinə səbəb olmuşdur. İmkan olduğu miqdarda bəşərin zülm və sitəmlə mübarizə aparmaqda son çarəsi olan hərəkat və üsyanlara əl atmaması üçün insanlıq hüquqlarını qanunların icrası ilə himayə etmək və millətlər arasında dostluq münasibət .və rabitələrini gücləndirərək bərpa etmək və buna təşviq üçün çalışmaq lazımdır

Birləşmiş Millətlər Təşkilatı özünün nəşr etdirdiyi bildiriş və elanlarda bəşər hüququna, fərdlərin insanlıq dəyərlərinə və kişi ilə qadının hüquq bərabərliyinə etiqad bəslədiyini yenidən bildirmiş və cəmiyyətin inkişafına kömək etmək və azad həyat mühitində daha yaxşı yaşayış vəziyyətlərin yaradılmasına çalışmaq məqsədi ilə ciddi qanunlar ......,qəbul etmişdir. Həmçinin

Həmin təşkilat bəşər hüququnun bu elanını bütün camaat və millətlər üçün müştərək hesab edir və cəmiyyətin bütün fərdləri və təbəqəsinin daimi şəkildə ona diqqət edərək nəzərə almasını, bu istiqamətdə fəaliyyət göstərməsini tövsiyə edir. Onlar təlim və tərbiyə vasitəsi ilə bəşər hüququna millətlər arasında – istər həmin təşkilata üzv olsunlar, istərsə də olmasınlar – ehtiram qoyulması və onun beynəlxalq səviyyədə .gerçəkləşməsinin təmin edilməsinə çalışırlar

Yuxarıda qeyd edilən qızıl cümlələr bəşər hüququ ilə bağlı elan edilənlərin müqəddiməsini təşkil edir. Onun barəsində “bu, insanlıq hüququnun təsdiqlənməsində bəşəriyyətə nəsib olan ən böyük müvəffəqiyyətdir” – deyirlər. Onun hər bir kəlmə və cümləsi

barəsində düşünülmüşdür və əvvəlki məqalələrdə də onun əsrlərdən bəri azadlıq tələb edən dünya fəlsəfə və hüquqşünaslığının fikirlərini əks etdirdiyini nəzərinizə .çatdırmışdıq

**(Bəşər hüququnun elan edilməsi ilə bağlı mühüm mətləblər (nöqtələr**

(BəşəR HüQUQUNUN ELAN EDILMəSI ILə BAĞLı MüHüM MəTLəBLəR (NöQTəLəR

Bəşər hüququ ilə əlaqədar elan edilən tezislər otuz maddədən təşkil edilmişdir. Bəzi məsələlərin bir sıra maddələrdə təkrar edilməsini nəzərə almadan, bir mətləbin bir maddədə xatırladılmasının mündəricatda xatırlatmaqdan daha yaxşı olduğunu və ya .bəzi maddələrin bir neçə müxtəlif maddələrə ayrıla bildiyini söyləməliyik

Bu tezislərin müqəddiməsi ilə bağlı diqqət edilməsi lazım olan mühüm mətləblər bir :neçə məsələdən ibarətdir

.Bəşər bir növ heysiyyətdən, ehtiram və dəyişilməz zati hüquqlardan yararlanır .١

Bəşərin ehtiram, heysiyyət və dəyişilməz zati hüquqları ümumilik təşkil edərək .٢ bütün insan fərdlərini şamil olur. O, ayrı-seçkilik yaradan deyil, ağ və ya qara dərili, uca və ya qısa boylu, kişi və ya qadın bərabər şəkildə həmin hüquqlardan yararlanırlar. Hansısa bir ailədə onun bir üzvü özünü digərlərindən üstün tuta bilmədiyi kimi, böyük ailədən ibarət bəşərin bütün üzvləri də bir-birinə nisbətdə şərafət məsələsində .bərabərdirlər və heç kəs digərindən daha artıq heysiyyət və şərəfətə malik deyil

Ədalət, azadlıq və sülhün əsası və həqiqəti insanların öz vicdanlarının dərinliyində bu .٣ məsələyə (bütün insanların zati ehtiram və heysiyyətinə) imanlı olması və onu etiraf etməsindədir. Həmin tezislər insanların bir-birinə nisbətdə yaratdıqları problemlərin mənşəyini kəşf etdiyini bildirir. Müharibələrin, təcavüzlərin və qövm və fərdlərin bir-birinə qarşı törətdikləri zülm və vəhşiliklərin səbəbi onların zati olan insanlıq heysiyyəti və ehtiramını tanımamasında idi. Bir dəstə tərəfindən həmin məsələlərlə bağlı məlumata sahib olmamaq digər dəstənin üsyan və tüğyan etməsinə gətirib çıxarır və bu

.yolla sülh və əmniyyət üçün təhlükə yaranır

Hamının onun gerçəkləşməsi üçün səy etdiyi və çatmaq istədiyi ən böyük arzu əqidə .۴ azadlığı, əmniyyət və kamil bir maddi rifaha sahib, hər cür qorxu və fəqirliyin kökü kəsilmiş olan dünyanın olmasıdır. Otuz maddəlik tezis də bu məsələlərin .gerçəkləşməsi üçün tənzim edilmişdir

İnsanların zati heysiyyətlərinə iman və onların aradan qaldırılması mümkün . ۵ olmayan hüquqlarına ehtiram, tədricən, təlim və tərbiyə nəticəsində bütün insanlarda .yaradılmalıdır

## İnsanın məqamı və ona ehtiram

Bəşər hüququ ilə bağlı tezisin elan edilməsi "insanlıq", "azadlıq" və "bərabərliyə ehtiram"a əsasən tənzim edildiyi və insanların hüquqlarının dirçəldilməsinə görə yaradıldığı üçün, hər bir vicdana sahib fərdin hörmət və məhəbbətini qazanmışdır. Biz şərqlilər qədim zamanlardan etibarən, insani keyfiyyət və dəyərlərə ehtiramdan bəhs etmişik. Müqəddəs İslam dinində – əvvəlki məqalələrimizdə də deyildiyi kimi – insana, insan hüquqlarına, azadlıq və bərabərliyə həddən artıq qiymət verilmiş və diqqət .göstərilmişdir

Bu tezisləri yazan və tənzim edənlər, və həmçinin, onun yazılmasında, yazıçılara, həqiqətdə, ilham verən filosoflar da bizim təzim və ehtiramımıza layiqdirlər. Bununla yanaşı, həmin tezislər fəlsəfi mətnlərdən təşkil olunduğu, mələklərin vasitəsi ilə deyil, insan əli ilə yazıldığından, bir sıra insan qruplarının dəlillərinə əsaslanır ki, bu da hər hansı bir filosofa onun barəsində tədqiqat aparmaq və təhlil etməklə onda olan zəif cəhətlərə öz fikir və düşüncələrini bildirmək haqqı verir. Şübhəsiz, həmin tezislər zəif nöqtələrə malikdir və biz burada onun zəif cəhətlərini göstərməyə təkid etmirik, .əksinə onun üstün cəhətlərini diqqətə çatdırmaqla üzərində dayanmaq istəyirik

Həmin tezislərin söykəndiyi məsələlər insanın "zati məqamları", "heysiyyət" və "şərafətinə" əsaslanır. Bu tezisləri tərtib edənlərin nəzərində, insan, bir növ, özünəməxsus kəramət və şərafətlərin vasitəsi ilə bir sıra silsiləvi hüquq və azadlıqlara

malik olmuşdur. Amma digər məxluq və canlılar ona (zati heysiyyət, kəramət və şərafətə) sahib olmadıqlarından, həmin hüquq və azadlıqlardan bəhrələnə .bilməmişlər. Tezislərin ən üstün cəhəti bu məsələ ilə bağlıdır

## Qərb fəlsəfəsində insanın süqut və məhvi

Bu yerdə biz bir daha "insanın dəyərləndirilməsi", "digər məxluqlara nisbətdə insanın məqam və şərafəti" və "ehtirama layiq olan insan şəxsiyyəti" kimi köklü fəlsəfi məsələlərlə qarşı-qarşıya gəlirik. İnsanın hüquq mənşəyinə çevrilən və onu at, inək və s. kimi digər heyvanlardan fərqləndirən zati insanlıq heysiyyətinin nə olmasını bilməyimiz gərəkir. Beləliklə, bir tərəfdən "bəşər hüququnun elanının əsası" və digər tərəfdən də insanın Qərb fəlsəfəsinə əsasən dəyərləndirilməsi" arasında açıq-aşkar .və aydın şəkildə ziddiyyət meydana gəlir

Qərb fəlsəfəsində uzun illərdir ki, insan dəyər və etibardan düşmüşdür. Keçmişdə insan və onun məqamı barəsində deyilən sözlərin əsası və kökü Şərqə mənsub olmuşdur və hal-hazırda Qərb fəlsəfi sistemlərinin əksəriyyəti məsxərə və təhqir .olunacaq bir hala gəlmişdir

Qərbin nəzərində, insanın dəyəri maşının qiyməti kimi aşağı enmiş və onun ruh (mənəviyyatı) və əsasləti inkar olunacaq həddə düşmdüşdür. Onlar səbəb-nəticə məsələsi və təbiətin hədəf və məqsəd daşıdığına etiqad bəsləməyi irticacı bir düşüncə .kimi qiymətləndirmişlər

Qərbdə insanın "məxluqatın əşrəfi" olmasından dəm vurmaq olmaz, çünki onlar insanın digər məxluqatdan üstün olması ilə bağlı bu cür etiqadları Ptolomeyin qədim nəzəriyyəsinə - günəş və yer kürəsi sistemi planetlərində yerin mərkəz təşkil etməsi və digər planetlərin onun ətrafında fırlanmasına - bənzədir və köhnə məsələlərdən qaynaqlandığını düşünürdülər. Elə hesab edirdilər ki, bu nəzəriyyələri izləməklə insanın "məxluqatın əşrəfi" olmasına yetişmək olmaz. Qərbin nəzərində bu məsələlər eqoizm kimi qiymətləndirilir və qədim dünyanı bürüyən mövzu olaraq dəyərləndirilirdi. Onlar bugünkü insanı çox təvazökar və digər

canlılardan fərqlənməyərək sadəcə torpaqdan yaranıb torpağa da qayıdacağı və .bununla da sona yetəcəyi kimi düşünürdülər

Qərblilər çox asanlıqla ruhun insan vücudundan (cismindən) fərqli, müstəqil və əbədi mövcud olmaq xüsusiyyətini inkar edir və bu cəhətdən insanlarla heyvan, bitkilər və s. arasında fərqlərin olduğunu qəbul etmirdilər. Qərblilər insanın fikir və ruhi qabiliyyətləri ilə kömür arasında mahiyyət və vücud baxımından fərqlərinin olmasına əhəmiyyət vermir, hər bir şeyi maddə və enerjinin zahir olması şəklində görürdülər. Qərbin nəzərində insan və digər canlılar üçün dünya döyüş və qantökmə meydanıdır və bu, həyatın ayrılmaz bir hissəsini təşkil edir. Bütün canlılara və xüsusən də, insana hakim olan əsas qanunlar yaşamaq və sağ qalmaq uğrundakı mübarizədir. İnsan həmişə bu mübarizədə nicat tapmaq üçün çalışır. Ədalət, bir-birinə kömək, xeyirxahlıq və digər əxlaqi və insani məfhumlar yaşamaq uğrundakı həmin mübarizədən doğan məfhumlardır və insan onları öz mövqeyini qoruyub hifz etmək üçün meydana .gətirmişdir

Qərbin bəzi əsalı və qüdrətli fəlsəfələrinin əsası və özəyində insanın bir maşına bənzədilməsi və onun mühərrik və hərəkətverici qüvvəsinin iqtisadiyyatdan başqa, bir şey olmaması dayanır. Din, əxlaq, fəlsəfə, elm, ədəbiyyat və digər məsələlər sərvətin istehsal, istehlak və bölüşdürülməsi ilə bağlı sütun rolunu oynamağa xidmət edir. Bunların hamısı insan həyatının iqtisadi yön və cəhətlərinin cilvələrini təzahür etdirir. Xeyr, bunun özü də insan üçün həddən artıq bir şeydir. Əslində, insanın bütün fəaliyyət və hərəkətlərinin mühərriki cinsi amilə bağlıdır. Din, əxlaq, fəlsəfə, elm və digər istedadlar dəyişkən şəkildə insan vücudunun cinsi amillərinin təcəssümü və onun .zahiridir

Əgər xilqətin hədəfə malik olmadığını düşünmək əsas götürülsə, onda, təbiətdə baş verən bütün cərəyan və hadisələrin kor-koranə olmasına etiqad bəsləməliyik və əgər insanların yaşayış uğrundakı mübarizəsində həyatda qalmağı təmin edən və ona zamin olan qanun təsadüfidirsə, deməli, insanın sağ qalması və mövcudluğu onun əcdadlarının milyon illərdən bəri digər

növlərə yetirdiyi xəsarət səbəbi və təsadüfi dəyişikliklərə əsaslanaraq indiki şəkil və formaya düşmüşdür. İnsanı istehsal prosesində avtomatik olaraq işləyən maşınlara bənzədərək ruh, əsalət və digər məsələrə eqoizm və xudxahlıq kimi diqqət etsək, onun bütün fəaliyyət və hərəkətliliyini iqtisadi, cinsi və üstünlük tələb etmə amilində görsək, yaxşılıq və pisliyə tamamilə nisbi məfhumlar olaraq yanaşsaq və fitri ilhamlar və vicdanı boş-boşuna şeylər hesab etsək, eyni zamanda insanı şəhvətin və nəfsi istəklərin qulu olduğunu və s. düşünsək, bəs onda, insanlıq heysiyyət və şərafətindən, ondan alınması mümkün olunmayan hüquqlar və ehtirama layiq olan insan ?şəxsiyyətindən necə söhbət edə və onu öz fəaliyyətlərimizin əsası kimi düşünə bilərik

## Qərb insan barəsində ziddiyyətlərə düçar olmuşdur

Qərb fəlsəfəsində mümkün olduğu miqdarda insanın zati və fitri heysiyyətinə zərbə vurulmuş və insanın məqamı kiçildilmişdir. Nəzərinizə çatdırırıq ki, bu kiçiltmə insanın meydana çıxma və yaranış səbəbləri, yaradanın onun barəsindəki hədəfi, vücud, molekul və cismi, əməllərinin mühəriki və məqsədi, vicdan və şəxsiyyəti baxımından olmuşdur. Belə olduğu halda, bəşər hüququ barədə yuxarıda elan edilən tezislərdə insanın məqam və dəyəri, onun zati olan insanlıq heysiyyət, kəramət və şərafətindən, müqəddəs və ondan alınması mümkün olmayan hüquqlardan danışılır və bütün insan .fərdləri həmin tezislərə etiqad bəsləməyə dəvət edilir

Qərbinəvvəlcə, insan barəsində verdiyi məlumatları bir daha nəzərdən keçirməsi və daha sonra bəşərin müqəddəs və fitri hüquqları barədə tezisləri elan etməsi daha .yaxşı olardı

Mən bütün Qərb fəlsəfəsinin insanı şərh verdiyimiz və layiq olmadığı kimi tanıtdırdığını demirəm. Onların əksəriyyəti insanı ən azı, Şərq fəlsəfəsində təfsir edildiyi kimi tanıtdırmışdır. Məni düşündürən məsələ Qərb camaatının əksəriyyətində yaranmış .olan və dünya əhalisini öz təsiri altına salan təfəkkür tərzidir

Bəşər hüququ barədə tezisləri insanın maddi tərkiblərdən təşkil edilmiş maşından daha üstün səviyyədə olduğunu

düşünən, onun fəaliyyətini heyvani və şəxsi məsələlərlə məhdud etməyən və insanın vicdana sahib olduğuna etiqad bəsləyən kəslər tərtib etməlidirlər. Bəşər hüququnu həqiqətən, mən yer) {إِنِّی جَاعِلٌ فِی الْأَرْضِ خَلِیفَةً} əslində Şərq müəyyən etməlidir, çünki onlar üzərində özümə xəlifə təyin etdim)(۱) məsələsinə və insanın ilahi (mənəvi) yönlərinin olmasına iman gətirmişlər. Bəşər hüququ ilə insanın mənzil başına və əsl hədəfinə Ey insan,) {یـا أَیهَـا الْإِنْسَـانُ إِنَّک کَادِحٌ إِلَی رَبِّک کَـدْحًا فَمُلَـاقِیهِ} - qədər seyr və səfər edəcəyinə şübhəsiz, sən öz Rəbbin(in camal və cəlalını, savab və cəzasını görməy)ə doğru böyük bir səylə (yaradılışla və təbii yol ilə) çalışıb-çabalayırsan. Beləliklə, sən ona .qovuşacaqsan)(۲) - etiqadı vardır

Bəşər hüququnun elanı bu hökmə

And olsun bu yerə və onu döşəyənə (o qüdrət) {وَنَفْسٍ وَمَـا سَوَّاهَـا * فَأَلْهَمَهَـا فُجُورَهَـا وَتَقْوَاهَـا} sahibinə) və and olsun (insanın) nəfs(in)ə və ona doğru-düzgün biçim verənə (bədən üzvlərini bir-birinə mütənasib və xüsusiyyətlərini isə həm bədən, həm də xarici mühitlə uyğun yaradana)(۳) - əsaslanaraq insanın xeyirə meyilli olmasına etiqad bəsləyən fəlsəfi sistemlərə layiqdir. Eyni zamanda, həmin məsələnin elan edilməsi bəşərin həqiqətən, biz insanı gözəl) {لَقَدْ خَلَقْنَا الْإِنْسَانَ فِی أَحْسَنِ تَقْوِیمٍ} üslubuna xoşbin olanlar və onun .biçimdə yaratdıq)(۴) bu hökmünü ən kamil üslub hesab edənlərə şamildir

İnsanla bağlı Qərbin ən yaxşı hesab etdiyi təfəkkür tərzi bəşər hüququnun elanı deyil, əksinə Qərbin əməldə insanla əlaqədar göstərdiyi rəftar formasıdır, yəni bəşərin bütün hissiyyat və atifələrinin məhv edilməsi, insani keyfiyyətlərin oyun-oyuncaq olduğunun düşünülməsi, kapital və sərmayənin insandan üstün tutulması, pulun (insandan öncə gəlməsi, maşınların (texnikanın



---

.Bəqərə“ surəsi, ayə ۳۰“ . [۱] -۱

.İnşiqaq“ surəsi, ayə ۶“ . [۲] -۲

.Şəms“ surəsi, ayə ۷-۸“ . [۳] -۳

.Tin“ surəsi,ayə ۴“ . [۴] -۴

aparıcı rola malik olması, sərvətə pərəstiş edilməsi, insanların istismarı, sərmayədar və kapitalistlərin sonsuz qüdrətə sahibliyidir, belə ki, əgər milyonçu olan bir nəfər öz sərvətini hansısa bir itə miras qoysa, həmin itə insandan daha artıq ehtiram göstərərlər. Eyni zamanda, varlı it müqabilində xidmətçiyə çevrilərək qarşısında təzim .edərlər

**Qərb həm özü, həm də Allahını unutmuşdur**

Bugünkü dünyada mühüm ictimai məsələlərdən biri Quranın ifadə etdiyi kimi insanın özünü unutmasıdır. O, həm özünü unutmuşdur, həm də onu yaradan Allahı. Digər bir məsələ insanın özünü alçaldaraq batin və daxilinə nəzər salmaqdan qəflətə düşməsi və bütün diqqətini hissiyyat və maddiyyatla əhatə olunmuş dünyaya yönəldərək sadəcə onunla məhdudlaşdırmasından ibarətdir. İnsan ona təyin edilmiş hədəfin hissiyyat və maddiyyatlardan başqa, digər bir şeyi duymamaqda olduğunu düşünür və özünü inkar edərək xilqətin boş və əbəs olduğunu təsəvvür edir və insanlıq ruhunu .əldən verir

Təəssüflər olsun ki, əksər bədbəxtliklər həmin məsələlərdən qaynaqlanır və bu cür təfəkkür tərzi bütün dünyanı bürümüş və az qalmışdır ki, bəşəriyyəti birdəfəlik məhv edərək aradan aparsın. Mədəniyyət hər nə qədər inkişaf edib genişlənsə də, insan barəsində bu cür düşüncə və təfəkkür tərzinə sahib olmaq onun daha da həqir və rəzil hala düşməsinə səbəb olmuşdur. Bu məsələ həqiqi insan və insanlığın keçmişdə axtarılmasına bais olmuşdur, çünki bugünkü əzəmətli mədəniyyət (sivilizasiya) və reformasiyalar (ictimai və iqtisadi quruluşlar) insandan başqa, hər bir şeyin yüksək .dərəcəli və birinci növdə düzəldilməsinə qadirdir

Qandi deyir: “Qərb özünü yer üzündə bütün imkan və sərvətlərə malik və yer kürəsinin Allahı kimi düşünür. O, öz düşüncəsində digər millətlərin onu Allah kimi qüdrətə malik hesab etməsinə səbəb olan işlərin yerinə yetirilməsinə qadirdir. Amma Qərb bir məsələdən – öz batini barədə düşünməkdən – qafildir. Təkcə bu məsələ yeni yaranmış mədəniyyət və dinlərin puç və aldadıcı yönə malik olduğunu sübuta yetirmək üçün .kifayət edər

Qərb mədəniyyətinin qərbliləri sadəcə yemək, içmək və cinsi meyllərə mübtəla və giriftar etməsinin bircə səbəbi vardır və o, qərblilərin özlərini anlamaq və dərk etmək .yerinə həyatlarını məhv və tələf etməyə çalışmasıdır

Onların əməli rəftarı, döyüş sursatları hazırlaması, kəşf və ixtira etmələri qərblilərin... özlərindən (öz vicdan və fitrətlərindən) qaçmasının verdiyi nəticələrdir, nəinki, onların özlərinə hakim olmaq qüdrətinə sahib olmalarının. Təklikdən qorxmaq və sükut, pula arxalanmaq onların batinlərinin (fitrətlərinin) səsinə qulaq verməsinə mane olmuşdur. Təkcə həmin məsələlər (pul, sərvət və s.) onların davamlı fəaliyyətlərinin hərəkətverici qüvvəsidir. Onların mühəriki "dünyanı fəth etmək"də və acizlikləri isə "özlərinə hakim ola bilməmək"dədir. Bu cəhətdən, qərblilər bütün dünyada fəsad və zərərlərin yaranmasına bais olurlar. Əgər insan öz ruhiyyəsi və ruhunu əldən verərsə, dünyanı fəth eləmək onun hansı işinə yarayar? Onlar İncildə yazılanlara əməl etmək və dünyada əminamanlıq, sülh və həqiqətlər üçün çalışmaq əvəzinə, qızıl və kölə axtarışındadırlar. Halbuki, İncildəki göstərişlərə itaət eməli və Allahın məmləktində ədalət və bağışlanmaq ardınca olmalıdırlar. Amma onlar bunun yerinə, öz mənfəətlərinə xatir insanların məzhəbi fərqlərindən istifadə edir və ilahi kəlamları ".yaymaq əvəzinə, millətlərin başına bombalar yağdırırlar

Bu səbəbdən, bəşər hüququnun elanına hamıdan daha çox Qərbin özündə etiraz edilmişdir. Qərbin izlədiyi fəlsəfə bəşər hüququnu tapdalamaqdan başqa, özündən .geridə bir iz qoymur

səh:۱۳۷

## ALTINCI HİSSƏ

### (Ailə hüquqlarının təbii mənbələri (۱

Əvvəlki bəhslərimizdə bəşər hüququ elanının əsas ruhunu "insanın, bir növ, zati heysiyyət və şəxsiyyətdən faydalanaraq ehtirama layiq olması, xilqət və yaradılış baxımından, ona bir sıra silsilə təşkil edən və aradan qaldırılması mümükün olmayan hüquq və azadlıqların əta edilməsi"nin formalaşdırdığını nəzərinizə çatdırmışdıq. Eyni zamanda, onun İslam və Şərq fəlsəfəsi tərəfindən təsdiq edildiyini və sadəcə bu tezislərin əsası və ruhu ilə uyğun gəlməyən və onu davamsız göstərən məsələlərin Qərb fəlsəfi sistemlərində insan və onun əsl hədəfi ilə bağlı verilən məlumat və izahlar .olduğunu da söyləmişdik

İnsan hüquqlarının tanınması üçün səlahiyyətli və müraciət ediləbiləcək yeganə dəyərli mənbəyin ilahi kitab (Quran) olduğu aydın məsələdir. Bu əzəmətli kitabın səhifə və vərəqlərinə müraciət etməklə insanların həqiqi müştərək hüquqları və kişi ilə .qadının bir-birinə nisbətdəki qarşılıqlı hüquqi xüsusiyyətləri aydınlaşmış olacaq

İnsanı təəccübləndirəcək məsələ bəzi sadə qəlbli və sadəlövh insanların bu əzəmətli mənbəni, ümumiyyətlə, rəsmi şəkildə tanımağa hazır olmamasıdır. Həmin şəxslərin nəzərində, bu barədə səlahiyyətli olan bir qrup insanlardır ki, onlar bəşər hüququ ilə əlaqədar tezislərin hazırlanmasında fəaliyyət göstərmişlər və özləri həmin hüquqlara ,əməl etməsələr də

dünyaya hökmranlıq edirlər və digər insanların da onların dedikləri müqbilində itaət etməkdən başqa, çarələri yoxdur. Amma biz onlar müqabilində öz düşüncə və fikrimizi söyləmək haqqına sahib olduğumuzu deyir və yeganə müraciət mənbəyi olaraq ilahi .kitabı (Quranı) bu məsələdə səlahiyyətə malik olan biri kimi qəbul edirik

Mən bir daha möhtərm oxuculardan bu məqalədə fəlsəfi olmayan mətləblərə toxunaraq onları yorduğum və məqalənin quru və cansıxıcı olması səbəbi ilə üzr istəyirəm. Özüm bu məsələlərə riayət etmək fikrindəyəm, amma bəzən qadın hüquqlarının fəlsəfənin bu quru mətləbləri ilə elə bir rabitəsi yaranır ki, onlardan .qaçmaq mümkün olmur

**Təbbi hüquqların rabitəsi və təbiətin hədəfə malik olması**

Bizim nəzərimizcə, təbii və fitri hüquqlar yaradılış nizamının məxluqatın vücudunda qoyduğu "təkamülə doğru hərəkət etmək" istedadı və hədəfinə əsasən meydana .çıxmışdır

Hər bir təbii istedad təbii hüquq üçün mənbə və sənəd funksiyasını daşıyır. Məsələn, insan övladının məktəbə getmək və dərs oxumaq haqqı vardır, amma digər heyvanlarda belə bir haqq mövcud deyil. Nə üçün? Çünki dərs oxumaq və elmə yiyələnmək istedadı adəm övladında var, lakin heyvanlarda yoxdur. Yaradılış və xilqətdə bu məsələ heyvanlar üçün deyil, insanlar üçün təyin edilmişdir. Eyni zamanda, .azad fikirlilik, iradə və düşüncə də bu cürdür

Bəzi şəxslər "təbii hüquqlar" fərziyyəsini insanının xüsusi imtiyaz və hüquqlarına əsasən yaradılması kimi başa düşür. Amma bu, puç və boş iddiadan başqa, bir şey .deyil. İnsanla qeyri-insan arasında hüquq baxımından fərqlər mövcud deyil

Əslində, təbii istedadlar müxtəlifdir. Yaradan bütün məxluqatı onun özünə məxsus olan təbii istedadına əsasən xəlq etmiş və o, həmin təbii istedadın oxu ətrafında təkamülə doğru addımlayaraq hərəkət edir və onun (insanın) səadəti də elə bundadır. Sözsüz ki, xaliqin həmin məsələlərlə bağlı nəzərdə

tutduğu hədəflər vardır və bu xüsusiyyətlər təsadüfi və məlumatsız şəkildə məxluqatın ixtiyarına verilməmişdir. Əlinizdəki məqalələrdə bundan artıq izah və .məlumat verməyimizə fürsət yoxdur

Ailə hüquqlarının əsas və özəyini - bizim bəhs etmək isdəyimiz məsələdir - digər təbii və fitri hüquqlar kimi təbiətdə axtarmaq lazımdır. Kişi və qadının təbii hüquqları və xaliqin onlara əta etdiyi sənəndlərdən onların eynişəkilli və oxşar hüquq və vəzifələrə malik olub-olmadıqlarını anlaya bilərik. Unutmayın ki, əvvəlki bəhslərdə dediklərimizə uyğun olaraq, bizim araşdırmaq istədiyimiz bəhs ailə hüquqları çərçivəsində kişi və .qadın hüquqlarının oxşarlığı məsələsidir, nəinki, onların hüquqi bərabərliyi

**İctimai hüquqlar**

İnsan fərdləri təkcə ailə hüquqları ilə bağlı deyil, ictimai hüquqlar baxımından, bir-birinə nisbətdə ailə mühitindən xaric hüquqlara da malikdirlər. Onlar bu cəhətdən həm bərabər, həm də oxşar xüsusiyyətlərə sahibdirlər, yəni onların ilkin təbii hüquqları bir-birinə bərabər və müsavi şəkildədir. Hamının xilqətdə onlara əta olunmuş nemətdən istifadə etmək, çalışmaq, həyat müsabiqəsində müştərək şəkildə iştirak etmək, ictimai pisliklərin muzduruna çevrilməmək şərti ilə təhsil almaq və şəri cəhətdən düzgün olan yolda çalışıb təlaş etmək və öz elmi və təcrübi istedadlarını üzə çıxarmaq hüququ .vardır

Əlbəttə, həmin ilkin təbii hüquqlar sonradan, tədricən, onların iktisabi və kəsb edilən hüquqlar baxımından qeyri-bərabər olmasına səbəb olur. Hamının bərabər şəkildə işləmək və həyat müsabiqəsində iştirak etmək haqqının olmasına baxmayaraq, onlar vəzifələrin yerinə yetirilməsi və müsabiqədə iştirak etmək cəhətindən eyni deyillər, yəni bəziləri digərlərinə nisbətdə daha istedadlı və çalışqan, elmli və hünərli və onlardan daha laqiqli kimi nəzərə çarpırlar. Şübhəsiz ki, onların iktisabi və kəsb etdikləri hüquqlar qeyri-bərabər şəkildə olacaqdır və əgər biz onların həmin hüquqlarını təbii və ilkin hüquqları kimi

bərabər və müsavi etməyə çalışsaq, bizim əməlimiz zülm və təcavüzkarlıqdan başqa, .bir məna daşımayacaq

Görəsən, nə üçün bütün fərdlər ilkin ictimai-təbii hüquqlar baxımından bərabər və oxşar xüsusiyyətlərə malikdirlər? İnsanlar barədəki məlumatları mütaliə etdiyimizdə, heç bir bəşər övladının yaranışda müəllim, müdir, zabit, işçi və sənətkar kimi dünya gəlmədiyi məlum olur. Bunlar bəşərin iktisabi hüquqlarının xüsusiyyət və məziyyətlərinin bir qismini təşkil edir. Yəni, insanlar iş, istedad, fəaliyyət və ləyaqətlərinin sayəsində həmin hüquqları cəmiyyətdən əldə etməlidirlər və cəmiyyət .saziş və müqavilə qanunlarına əsasən onları insan fərdlərinin ixtiyarında qoyur

İnsan cəmiyyətindəki həyat tərzini bal arıları və digər heyvan icmalarının yaşayış tərzindən fərqləndirən cəhət də elə buradadır. Həmin heyvanların yaşayış şəkili və təşəkkülü yüz faiz təbiidir. Onlar arasında iş və mövqelər onların(adları çəkilən həşəratların) özləri tərəfindən deyil, təbiət tərəfindən təyin edilərək bölüşdürülmüş və bəziləri təbii olaraq rəis və digərləri də onlara itaət edən olmuşlar. Amma insanın .ictimai yaşayışı bu formada deyil

Bu səbəbdən, alimlərdən bəzisi qədim fəlsəfi nəzəriyyədə deyilən “insan təbiətən ictimai varlıqdır” məsələni inkar edərək insan cəmiyyətinin müqavilə və sazişlərə .əsaslandığını söyləmişlər

**Ailə hüququ**

Yuxarıda qeyd edilən məsələlər ailədən xaric ictimai hüquqlarla bağlı idi. Görəsən, ailə icmasındakı qanunlar necədir? İnsan fərdləri ailə icması daxilində ilkin təbii hüquqlar baxımından oxşar və bərabər xüsusiyyətlərə malikdir və onlar arasındakı fərqlər təkcə iktisabi və kəsb edilən hüquqlarla bağlıdırmı? Yaxud da ailə icması, yəni ər, arvad, ata, ana, övlad, bacı və qardaşdan təşkil olunan icma ilə qeyri-ailə icması arasında da ilkin hüquqlar cəhətindən fərqlər vardır və təbii qanun ailə hüququnu xüsusi şəkildə ?müəyyən etmişdirmi

Burada iki fərziyyə mövcuddur: Birincisi, ərlə arvad, ata

və ana ilə övladlar digər ictimai rabitə və münasibətlərdə olduğu və fərdlərin bir-biri ilə dövlət və ya milli müəssisələrdə həmkarlıq etdikləri kimi, bəzi fərdlərin təbii olaraq, özlərinəməxsus xüsusiiyyətlərə malik olmasına səbəb olmur. Təkcə iktisabi və kəsb edilən xüsusiyyətlər fərqlilik yaranmasına səbəb olaraq onlardan birinin müdir, digərinin işçi, birinin az maaşla, digərinin isə ona nisbətdə daha çox maaşla işləməsinə gətirib çıxarır. Ata və ya ana, övlad, ər və ya arvad olmaq onlardan hər birinin xüsusi hüquqlara malik olmasına səbəb olmur. Fəqət və fəqət onların iktisabi keyfiyyətlərinə .əsasən, onların bir-birinə nisbətdə fərqlərə malik olduğunu müəyyət etmək olar

Səhv və yanlışlıqla “hüquq bərabərliyi” adlandırılan “ailə hüquqları daxilində kişi və qadın hüquqularının oxşar və bərabərliyi” fərziyyəsi həmin fərziyyəyə (iktisabi hüquqlar) əsaslanır. Bu fərziyyəyə uyğun olaraq kişi və qadın oxşar istedadlar və ehtiyaclar və təbiətin onlara verdiyi oxşar hüquqi sənədlərə əsasən, ailə yaşayışında iştirak edirlər. Belə aydın olur ki, ailə hüquqlarını bərabərlik, oxşarlıq və eyniliyə uyğun .olaraq tənzim etmək lazımdır

İkinci bir fərziyyə onların ilkin təbii hüquqlarının da fərqli olması ilə bağlıdır. Bu baxımdan, kişinin ailə başçısı olması onun üçün özünəməxsus hüquqların yaranmasını və qadının da evin xanımı olması səbəbilə ona məxsus fərqli hüquq və vəzifələrin yaranmasını zəruri edir. Ata, ana, valideyn və övlad olmaq da bu minvalladır və bir sözlə, ailə icmasının digər ictimai birlik, həmkarlıq və təşkilatlardan fərqləri vardır. “Qadın və kişinin ailə hüquqlarının oxşar olmaması “ fərziyyəsini İslam da qəbul edir və .bu fərziyyə həmin əslə söykənir

Həmin fərziyyələrdən hansı daha doğrudur və onların düzgün olmasını hansı üsulla ?öyrənmək olar

**(Ailə hüquqlarının təbii mənbələri (۲**

Möhtərəm oxucuların yaxşı nəticə əldə edə bilməsi üçün, əvvəlki fəsillərdə dediyimiz :mətləbləri nəzərlərində saxlamaları zəruridir. Biz belə demişdik

۱. Təbii hüquqlar təbiətin hədəfə malik olması və bu səbəbdən məxluqatın vücudunda bəzi istedadları qoyması və onlara hüquqlar təyin etməsindən yaranmışdır.

۲. İnsanlar insan olması baxımından, bir sıra silsilə təşkil edən və “insani hüquqlar” adlanan xüsusi hüquqlardan yararlanırlar. Heyvanlar isə belə hüquqlara malik deyillər.

۳. Təbii hüquqlar və onların keyfiyyətlərinin müəyyən edilərək bilinməsi üçün xilqət və yaranışa müraciət etmək lazımdır. Hər bir təbii istedad təbii hüquqlar üçün bir sənəd rolunu daşıyır.

۴. Bütün bəşər fərdləri mədəni cəmiyyətdə bərabər və oxşar olan təbii hüquqlara malikdirlər və onların fərqi iş, vəzifə və məsuliyyət baxımından iştirak etdikləri müsabiqədə yaranan iktisabi hüquqlara bağlıdır.

۵. İnsanların mədəni cəmiyyətdə bərabər və oxşar hüquqlara malik olmasının səbəbi insanların vəziyyəti barədə mütaliə etdikdə, onların – bal arısı və digər heyvanlara bənzər icmadan fərqli olaraq – təbiətən heç birinin rəis, zabit, müəllim, şüdir və işçi olaraq dünyaya gəlməməsini bildiyimiz zaman aydınlaşır. İnsanların yaşayış tərzi təbii şəkildə deyil, yəni onların iş, məsuliyyət və vəzifələri təbiət tərəfindən bölüşdürülməmişdir.

۶. “Kişi və qadının ailə hüquqları baxımından oxşar olması” fərziyyəsi ailə icmasının mədəni icmaya (cəmiyyətə) bənzədilməsinə əsaslanır, yəni ailənin fərdləri eyni və bərabər hüquqlara malikdirlər. Kişi və qadın oxşar istedad və ehtiyaclarla ailə yaşayışında iştirak edirlər və onların əllərində təbiətin verdiyi oxşar sənədlər movcuddur. Yaradılış qanunu onlar üçün (ailə) birlik və təşkilatçılığı, iş və məqamların onlar arasında bölüşdürülməsinin təbii şəkildə olmasını nəzərdə tutmamışdır.

Amma “ailə hüquqlarının oxşar olmaması” fərziyyəsi mədəni cəmiyyətin hesabını ailə icmasının hesabından ayırıb fərqləndirməyə əsaslanır, yəni kişi və qadın ailə yaşayışında eyni və oxşar ehtiyac və istedadlardan yararlanmır, eyni zamanda, təbiət onlara oxşar hüquqlar verməmişdir.

Yaradılış qanunu onlar üçün oxşar olmayan vəziyyətlər müəyyən etmiş və hər birinə

hərəkət edə biləcək istiqamət nəzərdə tutmuşdur. Hazırda bu iki fərziyyədən hansının düzgün və səhih olduğunu və bunun üçün hansı üsuldan istifadə edildiyini anlamaq .lazımdır

Əvvəlki bəhslərdə təqdim etdiyimiz müqayisə üsuluna əsasən, bunu müəyyən etmək o qədər də çətin deyil. Kişi və qadının təbii istedad və ehtiyaclarına, başqa bir ifadə ilə desək, yaradılış qanununun kişi və qadına əta etdiyi təbii sənədlərə müraciət etməklə, .məsələ aydın olacaq

**?Görəsən, ailə yaşayışı təbii şəkildədir, yoxsa, saziş və müqaviləyə əsaslanır**

Əvvəlki məqalədə "insanın ictimai yaşayışı" barədə iki nəzəriyyənin olduğunu demişdik. Bəziləri insanın ictimai yaşayışını təbii hesab edirlər. Elmi bir termin və ifadə ilə desək, insan "mədəniyyun bit-təb"dir, yəni təbiətən ictimai varlıqdır. Bəziləri isə əksinə, onun saziş və müqaviləyə əsasən olduğunu və insanın öz ixtiyarı və xarici amillərin icbari təsiri altında - nəinki, daxili və fitri amillərə söykənərək - seçim etməsi .fikrindədirlər

Amma ailə həyatı ilə bağlı necə? Görəsən, burada da iki nəzəriyyə mövcuddurmu? Xeyr, burada birdən artıq nəzəriyyə mövcud deyil. İnsanın ailə şəklindəki yaşayışı yüz faiz təbii şəkildədir. Yəni, insan təbiətən ailəvi şəkildə yaşaya biləcək halda yaradılmışdır. Məsələn, insanın mədəni şəkildə yaşa bilməsinin təbii olmasına tərddüd edə bilsək də, onun ailə daxilində yaşaya bilməsinə şəkk edə bilmərik. İctimai-təbii yaşayışa malik olmayan və ümumiyyətlə, belə yaşayışdan tamamilə məhrum olan göyərçin və digər həşaratlar kimi, heyvanlar təbii olaraq ailə və cüt halda yaşayışa .malikdirlər

Ailə şəklindəki yaşayışın hesabı ictimai yaşayış hesabından ayrı və fərqlidir. Təbiətdə insanın və bir sıra heyvanların ailə şəklində yaşayaraq ailə təşkil etməsi və övlad sahibi ola bilməsi üçün müəyyən tədbirlər həyata keçirilmişdir. Tarixdə insanın ailə şəklində yaşamadığını göstərən bir dövrün olduğu və göstərildiyi məlum deyildir. Yəni, kişi və qadının bir-birindən ayrı şəkildə yaşamaları və ya onların cinsi münasibətlərinin

ümumi və müştərək şəkildə həyata keçirilməsi görülməmişdir. İndiki əsrdə yaşayan vəhşi qəbilələrdə belə – daha çox qədim yaşayış tərzi keçirirlər – həmin vəziyyət .mövcud deyil

Qədim zamanlarda mövcud olan nə “Matriarxat” (ana şahlıq) və nə də “Patriarxat” (ata .şahlıq) kimi yaşayış tərzində də həmin hallar görülməmişdir

**Dörd dövr (əsr)" fərziyyəsi"**

Mülkiyyət məsələsində hamı onun ilkin olaraq müştərək şəkildə hayata keçirilməsi və daha sonra xüsusilik (xüsusi mülkiyyət) formasına düşməsi həqiqətini qəbul etmişdir, amma cinsiyyət məsələsində, ümumiyyətlə, belə bir mətləb mövcud deyildir. Mülkiyyətin ibtidai zamanlarda müştərək olmasının səbəbi bəşər cəmiyyətinin qəbilə və ailə şəklində yaşayışa malik olması idi. Yəni, qəbilə halında yaşayan insan fərdləri ailə xüsusiyyətlərindən (arifələrindən) bəhrələnmiş və bu cəhətdən də onlar müştərək mülkiyyətə sahib olmuşlar. İbtidai dövrlərdə kişi və qadının bir-biri müqabilində məsuliyyət və vəzifələrə sahib olmasını təyin edən qanun və adət-ənənələr olmamışdır və onların təbiət və hissiyyatları bir sıra hüquq və vəzifələrin aralarında bölüşdürülməsi və müəyyən edilməsində təsirli olmuşdur. Onların cinsi münasibətləri və yaşayış tərzi heç bir zaman qeydsiz və şərtsiz həyata keçməmişdir. Buna misal olaraq, cütlük şəkilində yaşayan heyvanları nümunə göstərmək mümkündür. Heyvanlar ictimai qanun və sazişlərə sahib deyillər, amma bununla yanaşı, təbii qanunların hökmünə əsasən, bəzi hüquq və vəzifələrə riayət edə bilirlər, eyni .zamanda, onların yaşayış və cinsi rabitələri də qeydsiz və şərtsiz deyildir

Xanım Mehrangiz Manuçehriyan “İranın konstitusiyası və ictimai qanunlarına irad” adlı kitabında belə deyir: “Sosialogiyanın nəzərində, kişi və qadının dünyanın müxtəlif məntəqələrindəki yaşayış tərzi bu dörd mərhələdən birini keşmişdir: ١.Təbii mərhələ, ٢. Kişinin hakimiyyəti mərhələsi, ٣. Qadının etiraz etdiyi mərhələ, ۴. Kişi və qadın hüquqlarının bərabər hüquqlara malik olduğu mərhələ. Birinci mərhələdə kişi

və qadınlar heç bir qeyd və şərtə malik olmadan cinsi münasibət və rabitəyə daxil ".....olurlar

Sosialogiya bu deyilənləri qəbul etmir. Ancaq onlar bir neçə vəhşi qəbilələr arasında neçə kişinin bir neçə bacıyla müştərək evliliyini qəbul edirlər. Bir-biri ilə qardaş olan həmin kişilər bacıların hər biri ilə cinsi münasibətdə olmuş və onların övladları da hamısına aid hesab edilmişdir. Eyni zamanda, kişi və qadınların izdivacdan qabaq heç bir məhdudiyyətə malik olmadığı və təkcə evliliyin onları məhdudlaşdıra bildiyini söyləmişlər. Həmçinin, bəzi vəhşi qəbilələr arasında vəziyyətin (cinsi rabitənin) bundan da artıq ümumi bir şəkil aldığını deyirdilərsə, başqa bir deyimlə, qadının müştərək və milli olduğunu düşünürdülərsə, bu istisna təşkil edən bir hal və təbii və normal .vəziyyətin dəyişilməsi kimi dəyərləndirilirdi

Vil Dorant özünün "Tarixe təməddön" (sivilizasiya tarixi) əsərinin birinci cild, səhifə əlli yedisində yazır: "İzdivac və evlilik bizim heyvani xislətimizin ixtirasıdır. Bəzi quşların həyatına nəzər saldıqda, həqiqətən də, onların sadəcə öz erkəyi ilə kifayətləndiyi məlum olur. Meymun növlərindən Aranqutan və Qorillanın erkək və dişisi arasında cinsi rabitə onların təzə doğulan övladlarının böyüdülməsi dövrünün başa çatdığı zamana qədər davam edir və bu, bir çox cəhətdən kişi və qadının münasibətlərinə bənzəyir. Əgər dişi digər bir erkəklə cinsi münasibətə girmək istəsə, öz erkəyi tərəfindən ciddi şəkildə tənbeh edilir. Dukerspini Aranqutanların xüsusiyyətləri barədə deyir ki, onlar dişi, erkək və övladları olduğu halda (ailə şəklində) yaşayırlar. Həmçinin, doktor Savaj da Qorillaların erkək və dişisinin ağac altında meyvə yediklərini, övladlarının isə agacdan-ağaca dırmaşaraq bir-biri ilə oynadıqlarını yazır. Evlilik və izdivacın bəşərin yaranmasından öncə meydana gəldiyini söyləmək olar. İzdivac və evlilik olmayan cəmiyyətlərin mövcud olmasını cox az hallarda söyləmək mümkündür. ".Amma kimsə bu barədə axtarış aparsa, onun az saylı nümunələrini tapa bilər

Məqsədimiz əksər heyvanların təbii olaraq sahib olduğu kimi, ailə hisləri və yaşayışının mədəniyyət və adətlərin

nəticəsindən yaranmasını deyil, onların təbii və instinktiv şəkildə əmələ gəldiyini deməkdir. Beləliklə, heç bir tarixi dövrdə dişi və erkək cinsinin ümumi şəkildə qeyd və şərtlərə əsaslanmadan – təbii olsa belə – cinsi münasibətə girərək birlikdə yaşaması müşahidə edilməmişdir. Bu cür fərziyyəyə əsaslanan dövr, hətta, mülkiyyətin müştərək olmasına tərəfdar olanların belə, ibtidai dövrlərdə iddia etmədikləri .müştərək cinsi həyat dövrünün olduğunu deməyə bərabərdir

Kişi və qadının cinsi münasibətləri ilə bağlı yaranan dörd dövr fərziyyəsi sosialistlərin mülkiyyətlə baqlı etiqad bəslədikləri dörd fərziyyənin təqlidindən qaynaqlanmışdır. Onlar bəşərin mülkiyyətlə əlaqədar dörd dövr və mərhələni keçdiklərini deyirlər. Həmin dövrlər belədir: ١. Müştərək olan ibtidai icma mərhələsi, ٢. Feodalizm, ٣. Kapitalizm, ۴. Sosializm və kommunizm mərhələsi – bunlar da öz növbəsində ibtidai icma dövrünə qayıdır, amma onlar arasındakı fərqlər həmin mərhələnin ali formada olmasındadır. İnsanda təəccüb doğuran məsələ xanım Manuçehriyanın dördüncü mərhələnin adını “kişi və qadın hüquqlarının müsavi və bərabərliyi” qoyaraq bu cəhətdən sosialistlərə təqlid etməməsi və son mərhələnin ibtidai icmaya qayıtdığını deməməsidir. O, dördüncü dövr ilə birinci dövr arasında bir çox oxşarlığın olmasını təsəvvür etməsinə baxmayaraq, deyir: “Dördüncü mərhələ birinci mərhələyə həddən artıq oxşasa da, kişi və qadın bir-biri üzərində heç bir hakimiyyət və qüdrətə sahib olmadan birlikdə yaşamışdır.” Mən hələ də onun həmin mərhələ ilə bağlı “bir-birinə .həddən artıq oxşamasını” dediyi məsələdə məqsədinin nə olduğunu anlamış deyiləm

Əgər məqsəd kişinin heç bir hakimiyyətə sahib olmaması və onların bir-birinə nisbətdə bərabər şərait və hüquqlara malik olmalarıdırsa, bu, adı çıkilən xanımın həmin dövr ilə kişi və qadının heç bir şərt və bərabərliyə malik olmadığı və onların ailə şəklində yaşamadıqları dövr arasında oxşarlığın olmasını düşünməsinə dəlil deyil. Əgər onun məqsədi dördüncü dövrdə, tədricən, bütün qeyd və şərtlərin aradan qalxması və ailə şəklində yaşayışın məhv olması və bir növ, bəşər fərdləri

arasında cinsi münasibətlərin müştərək və ümumi hal almasının onlara hakim kəsilməsidirsə, onda, məlum olur ki, Manuçehriyanın "hüquq bərabərliyi"ndən anladığı məsələ – özü israr edəcək qədər onun tərəfdarıdır – hüquq bərabərliyinə tərəfdar .olanların düşündüyündən fərqli bir şeydir

Hazırda biz bütün diqqətimizi kişi və qadının ailə hüquqlarının təbiətinə yönəltməli və bu zəminədə iki məsələni göz önündə tutmalıyıq: Birincisi, kişi və qadının təbii cəhətdən fərqlərə malik olub-olmaması masələsini. Başqa sözlə desək, onlar arasındakı fərqlər cinsiyyət üzvləri baxımındandır, yoxsa, ortada bundan da önəmli məsələlər mövcuddurmu? İkincisi, görəsən, işin içində başqa ixtilaf və fərqliliklər varsa, onlar hüquq və vəzifələrin müəyyən edilməsində təsirlidirmi və ya həmin fərqliliklər insanın hüquqi xüsusiyyətlərinə dəxaləti olmayan rəng və irqlə bağlı olan ?fərqliliklərdirmi

**Təbiətdə qadın**

Yuxarıda qeyd edilən birinci qisimlə əlaqədar bəhsə ehtiyacın olmasını güman etmirəm. Bu zəminədə müəyyən qədər mütaliəyə malik olanlar, kişi və qadın arasındakı ziddiyyət və fərqlərinin təkcə cinsiyyət üzvləri ilə əlaqədar olmadığını bilirlər. Məsələ həmin fərqlilik və ziddiyyətlərin onların hüquq və vəzifələrinin təyin .edilib-edilməməsi ilə bağlı olmasındadır

Avropa alim və tədqiqatçıları birinci qismi lazımı qədər bəyan etmişlər. Həmin alimlərin sosialoji, psixoloji və ictimai sahədəki qeydlərini mütaliə etməklə bu məsələdə azacıq belə olsa, şəkk və şübhəyə yer qalmır. Onların (həmin alimlərin) nəzərdən qaçırdıqları və çox az diqqət etdikləri məsələ həmin fərq və ziddiyyətlərin ailə hüquq və vəzifələrinin müəyyən edilməsində təsir edərək qadın və kişinin bu cəhətdən oxşar .olmayan hüquqlarının yaranmasına səbəb olmasıdır

Dünya şöhrətli Aleksis Karl – məşhur Fransa fizioterapevt, cərrah və ekoloqu – özünün çox dəyərli "İnsan tanınmamış varlıqdır" əsərində hər iki məsələyə toxunmuşdur. Yəni, o, yaradılış və xilqət baxımından həm qadın və kişinin fərqli və

ziddiyyətli şəkildə xəlq edilməsini etiraf etmiş, həm də bu fərqlilik və ziddiyyətlərin onların hüquq və vəzifələrini fərqləndirdiyini söyləmişdir. Aleksis Karl kitabında "Cinsi münasibət və nəsil artımı" başlığı altında yer verdiyi fəsildə belə deyir: "Cinsiyyət üzvləri və toxumluqlarının xüsusi funksiyaları vardır: Birincisi, kişi və qadın molekulları ifraz edərək yeni bir insan yaranmasına xidmət edirlər. Eyni zamanda, elə bir maddələr (məsələn, xromosomlar) yaradır və onu qanda yerləşdirirlər ki, onların vasitəsi ilə bizim şüur və düşüncəmizdə kişi və qadın cinsini ayırd edə bilmək qüvvəsi yaranır. Həmçinin, həmin maddələr bədənə möhkəm və davamiyyətlilik bəxş edir. Məsələn, bu xüsusiyyətlərin nəticəsində, yer şumlamağa yararlı olan öküz digər həmcinslərindən seçilmək qabiliyyətinə malik olur. Həmin maddələr qadınlarda da .təsirələrə malikdir

Kişi və qadın arasında mövcud olan fərqliliklər təkcə onların xoşagələn vücuda malik..... olması, övlad dünyaya gətirə bilməsi və s. ilə məhdudlaşmır. Əksinə, insanın tənasül üzvlərindən ifraz olunan kimyəvi maddələrin törətdiyi nəticələrdən daha üstün olan təsirlər mövcuddur. Bu önəmli məsələyə diqqət edilməməsi səbəbilə qadın hüquqları ilə bağlı hərəkat edənlər onların kişi ilə bərabər təhsil alması, eyni işlərdə çalışa bilməsi, bərabər səviyyəli məsuliyyət və vəzifələrə və bənzər hüquqlara malik olmasını düşünmüşlər. Həqiqətdə, qadın kişi ilə bir çox məsələlərdə fərqlərə malikdir. Xüsusən, molekullar (xromosomlar), əsəb sisteminin təşkili və bədən üzvləri baxımından bu fərqliliklər daha çox nəzərə çarpır. İnsanın meyil və istəklərinin ona yol tapa bilmədiyi fizioloji qanunlar da ulduz və planetlərə hakim olan qanunlar kimi, bu məsələdə ciddi və dəyişilməz rola malikdir və biz onları olduğu şəkildə qəbul etməyə məcburuq. Qadınlar onlar üçün təyin edilmiş istiqamətdə təbii xüsusiyyətləri çərçivəsində kişilərə kor-koranə şəkildə təqlid etmədən hərəkət etməlidirlər. Qadınların bəşəriyyətin təkamülü ilə bağlı oynadıqları rol kişilərinkindən qat-qat üstün və böyükdür və onlar bu məsələni

“(görməzdən gələrək onu kiçik hesab etməməlidirlər.(١

Aleksis Karl kişi və qadının hüceyrələrinin yaranması keyfiyyətini, onların cütləşməsini izah etdikdən və kişidən fərqli olaraq qadın olmadan nəsil artımının mümkün olmamasına işarə etdikdən və hamiləliyin qadının cisim və ruhunu təkmilləşdirdiyini söylədikdən sonra, həmin fəsilin axırında deyir: “Biz öz oğlanlarımız üçün nəzərdə tutduğumuz ideal təfəkkür və həyat tərzini qızlarımızla bağlı düşünməməliyik. Təlim və tərbiyə işləri ilə məşğul olan mütəxəssislər hər iki cinsin təbii vəzifələrini, psixoloji və cismani fərqliliklərini nəzərə almalıdırlar, çünki bu əsas və əhəmiyyətli məsələ bizim ”.dünyamızın gələcək sivilizasiyasında mühüm rola malikdir

Diqqət etdiyiniz kimi, bu böyük alim kişi və qadının həm təbii və fitri fərqliliyini nəzərə almışdır, həm də həmin fərqlilik və ziddiyyətlərin onların məsuliyyət və vəzifələrində .müxtəlifliyin yaranmasına səbəb olmasını

Gələn bəhslərimizdə də bəzi alimlərin kişi və qadın fərqləri ilə bağlı nəzəriyyələrini diqqətinizə çatdıracaq və sonra onların hansı sahələrdə oxşar istedad və ehtiyaclara sahib olduğunu və həmin cəhətdən onlara oxşar və eyni səviyyəli hüquqların müəyyən edilməsini və əksinə, hansı sahələrdə fərq və ziddiyyətlərə malik olduqlarından, hökmən, onlar üçün oxşar olmayan hüquqların təyin edilməsinin zəruri olmasını sizə .bildirəcəyik



---

.İnsan tanınmamış varlıqdır“, ٣-cü çap, səh. ١٠٠“ . [١] -١

## YEDDİNCİ HİSSƏ

### (Qadın və kişi fərqlilikləri (۱

Kişi və qadın fərqləri. Necə də boş-boş sözlərdir! İyirminci əsrin yarısını geridə qoymağımıza baxmayaraq, hələ də künc-bucaqda orta əsrlərdə yaşayan insanların təfəkkür tərzinə malik kəslər və kişi ilə qadın arasındakı fərqlərlə bağlı köhnə düşüncələri izləyən və onlar arsında bir-birinə nisbətdə müəyyən fərqlərin mövcud olduğunu xəyal edən fərdlərin varlığı məlum olur. Eyni zamanda, onlar orta əsrlərin camaatı kimi, qadının ən alçaq və aşağı bir cins, kamil olmayan insan, heyvanla insan arasında bərzəx (maneə), azad və müstəqil yaşayışa layiq olmayan və bu səbəbdən, kişinin qəyyumluq və nəzarəti altında həyat sürməyə məcbur bir məxluq olduğunu düşünürlər. Halbuki, bugünkü zamanda həmin sözlər atrıq köhnəlmiş və sıradan .çıxmışdır

Bu gün qadınlara hakim kəsilmək istəyən qoluzorlu kişilərin belə sözləri yalandan uydurduqları məlum olmuşdur. Məlum olmuşdur ki, məsələ əksinədir, yəni qadınlar ən .üstün cins, kişilər isə ən alçaq və daha naqisdirlər

Xeyr! Əslində, XX əsrdə elmin təəccüb doğuracaq qədər inkişaf etməsi ilə kişi və qadın arasındakı fərq və ziddiyyətlər daha da dərinləşmiş və aydınlaşaraq müəyyən olmuşdur. Bütün bu məsələlər uydurma və iftira deyil, əksinə elmi və təcrübi

həqiqətlərin nəticələrdir. Kişi və qadın fərqliliklərinin heç vaxt onlardan hansısa birinin digərinə nisbətdə alçaq, naqis və ya üstün olmasına səbəb olmadığını nəzərinizə çatdırırıq. Yaradılış qanununda bu cür fərqlərin qoyulmasında müəyyən hədəflər nəzərdə tutulmuşdur. Həmin fərqlərin yaradılmasında məqsəd ailədə kişi və qadın münasibətlərinin möhkəmləndirilməsi və onların bir-birinə daha çox bağlı olmasını təmin etməkdir. Yaradılışda belə ziddiyyətlərin meydana gətirilməsi onun (yaradanın) kişi və qadın arasındakı ailə hüquq və vəzifələrini özünün bölüşdürərək təqsim etməsi üçündür. Bu keyfiyyət və fərqlər cisimdəki bədən üzvlərinin fərqlərinə bənzər şəkildə yaradılmışdır. Xaliqin insan cismindəki göz, qulaq, əl, ayaq, fəqərə sümükləri və s. üzvlərini onların özlərinə məxsus olan yerlərində təyin etməsi, heç də həmin üzvlərə .qarşı ayrı-seçkilik və zülm etmək mənasında deyil

**?Kişi və qadındakı bu fərqlər mütənasiblikdir, yoxsa, naqislik və kamal**

Mənim üçün çox təəccüblü olan mövzulardan biri bəzi şəxslərin kişi və qadının cismi və ruhi (psixoloji) istedadlarındakı fərqliliklərin qadının naqis, amma kişinin isə daha da kamil olmasına səbəb olduğunu deməkdə israr etməsidir. Onlar özlərini elə göstərirlər ki, guya, yaradılış qanununda qadının naqis xəlq edilməsi hansısa bir məsləhətə .əsasən olmuşdur

Qadının "xilqət baxımından naqis olması" məsələsi şərqlilər arasında muzakirə məsələsi olmazdan qabaq, qərblilər arasında müzakirə obyektinə çevrilmiş idi. Qərblilər qadın və onun naqis olması barədə səs-küy qaldırmışdılar. Onlar bəzən din və kilsələr adından "qadın qadın olduğu üçün xəcalət çəkməlidir", bəzən də "qadının qəddi və qaməti ucadır, amma ağılı topuğundadır", "qadın kişinin əhliləşdirdiyi ən vəhşi məxluqdur", "qadın kişi ilə heyvan arasında olan bərzəxdir" və s. buna bənzər sözlər .deyirdilər

Qeyd etdiklərimizdən də təəccüblü olan məsələ hazırda qərblilərin yüz səksən dərəcə dönüş yaradaraq kişilərin ən

alçaq, rəzil, ən pis və zəif məxluq, qadının isə ən üstün və kamil bir varlıq olduğunu .deməsidir

Əgər Eşli Montaqonun “Qadın – ən üstün cins (varlıq)” adlı kitabını – “Günün qadını” jurnalında nəşr edilirdi – oxumuş olsaydınız, onda, həmin kitabda min cür dəlil-sübut və zəhmətlərlə qadının kişidən üstün və kamil bir varlıq olmasını sübut etmək üçün .necə çalışdığını bilərdiniz

Adı çəkilən kitab psixoloji, tibbi və ictimai məlumatları özündə əks etdirdiyi üçün dəyərli və qiymətli hesab edilir, amma şəxsən müəllif dəlillər gətirmək istədikdə, – kitabın məqsədi də elə həmin məsələdir – məqsədinə nail olmaq və hədəfinə çatmaq üçün hər bir işə əl atır. Görəsən, nə üçün bir gün qadının bu qədər naqis, alçaq və pis olmasını deyir, sonrakı gün isə həmin məsələnin aradan qaldırılması ilə bağlı dəlil və sübutlar axtararaq o xüsusiyyətləri kişilərin üzərinə yapışdırmağa çalışırlar? Kişi və qadın arasındakı fərq və ziddiyyətlərin birinin naqisliyi və digərinin kamilliyi kimi göstərilməsinə nə lüzum və ehtiyac var ki, sonra kişinin və ya qadının tərəfini !?saxlamağa məcbur olsunlar

Eşli Montaqo bir tərəfdən qadının kişidən  üstün bir cins olaraq tanıtdırılmasına israr edir, digər tərəfdən də kişinin imtiyaz və üstünlüklərinin təbii amillərdən deyil, ictimai və tarixi amillərdən yarandığını deyir. Hər halda, kişi və qadın arasındakı ziddiyyətlər mütənasiblikdir, nəinki, naqislik və kamal. Yaradılış qanunu kişi və qadın arasındakı fərq və ziddiyyətlərlə – həqiqətən də, müştərək həyata xidmət edir və tənha və təklikdə yaşamaq xilqət qanunundan kənarlaşmaqdır – onlar arasında daha çox mütənasibliyin meydana çıxmasına çalışmışdır. Bu mətləb fərqlərlə bağlı verəcəyimiz .sonrakı izahımızda daha yaxşı şəkildə aydın olacaq

### Platon nəzəriyyəsi

Bu məsələ bizim əsrdə bəyan edilmiş olan yeni bir məsələ deyil. Təqribən, onun iki min dörd yüz illik bir tarixi vardır. Həmin məsələ Platonun “Cumhuriyyət” adlı kitabında .bəyan edilmişdir

Platon tamamilə aydın şəkildə kişi və qadının bənzər və oxşar

istedadlara malik olmasını və bu cəhətdən, kişilərin öhdələrinə aldıqları vəzifələrə yiyələnə, eyni zamanda, onların yararlandıqları hüquqlardan da faydalana bilmələrinin .mümkünlüyünü iddia edir

İyirminci əsrdə kişi və qadınla bağlı meydana çıxan bütün yeni fikirlərin, hətta, bu əsrdə yaşayan camaatın nəzərində ifrat və qəbul olunması mümkün olmayan düşüncələrin əsası Platonun bu təfəkküründən qaynaqlanır və həmin səbəbdən də, - "fəlsəfənin atası" adlandırılan bu şəxs barədə - insanlarda bu cəhətdən təəccüb yaranmasına bais olmuşdur. Platon "Cumhuriyyət" adlı beşinci kitabında qadın və övladların rolu, irqin təmizlənməsi və nəsilin sağlamlığı baxımından bəzi kişi və qadınların cinsi münasibətlərinin qarşısının alınması və nəsil artırma məsələsinin ali və yüksək keyfiyyətli insanlara məxsus edilməsi, ailə mühitindən xaricdə övladların tərbiyə olunması və nəsil artımı ilə əlaqədar üstünlüyün kişi və qadınların həyat və yaşamaq istəyinin qüvvətləndiyi müəyyən yaş dövrlərində həyata keçirilməsi ilə bağlı .söhbət açmışdır

Platon kişilərə döyüş təlimləri verilə bildiyi kimi, qadınlara da həmin təlimlərin verilməsi, kişilərin idman yarışlarında iştirak edə bildiyi kimi, bu haqların qadınlara da əta edilməsinin zəruriliyinə etiqad bəsləyir. Onun dediyi məsələlərdə iki mətləb diqqəti :cəlb edir

Birincisi, Platon qadının kişilərə nisbətdə - istər ruhi baxımdan olsun, istərsə də cismi - zəif olmasını etiraf edir, yəni onların keyfiyyət fərqlərindəki ziddiyyətlərin istedadlarında olmasına baxmayaraq, kişi və qadın fərqlərinin kəmiyyət cəhətindən olduğunu da etiraf edir. O, eyni zamanda, kişi və qadında mövcud olan istedadların bir-birinə bənzədiyini güman edir. Qadının kişiyə nisbətdə zəif olmasını zəruri edən və onun vücudunda var olan məsələlər kişi və qadının bir-birlərinin işlərindən fərqli olan sahələrdə məşğul olmasına səbəb olmur. Platon qadının kişiyə nisbətdə zəif olmasına səbəb olan həmin xüsusiyyətlərinə toxunduqda, Allaha onu qadın deyil, kişi yaratdığı üçün şükr edir. O, belə deyir: "Allaha şükürlər olsun ki, qeyri-yunanlı kimi deyil, yunanlı kimi doğulmuş, qul kimi

".deyil, azad şəkildə dünyaya gəlmiş və qadın kimi deyil, kişi kimi xəlq edilmişəm

İkincisi, Platonun "nəsil artımının sağlamlaşdırılması", "kişi və qadının istedadlarının bərabər şəkildə inkişaf etdirilməsi", "qadın və övladlar" və s. kimi toxunmuş olduğu mövzuların hamısı hakim təbəqə ilə əlaqədardır, yəni Platon iqtidara malik olan filosoflar, filosof hakimlər və s. təbəqini, xüsusən də, hakimiyyət üçün layiqli bir təbəqə hesab edir. Bildiyimiz kimi, Platon siyasi quruluş baxımından demokratiyanın deyil, aristokratiyanın tərəfdarıdır. Deməli, Platonun yuxarıda qeyd etdiklərimizlə bağlı söylədiyi bütün sözlər aristokratiya təbəqəsi ilə bağlı və digər təbəqələrlə əlaqədar .fərqli nəzəriyyəyə malik olduğu aydın olur

**(Platon və Aristotel bir–biri müqabilində (qarşı–qarşıya**

Platondan sonra qədim dünyada əqidə və nəzərləri əl çatan (öyrənilmiş) olan şəxs onun şagirdi Aristoteldir. Aristotel özünün "Siyasət" adlı əsərində kişi və qadın fərqləri ilə bağlı öz nəzərlərini bildirmiş və öz müəlliminin düşüncələri ilə ciddi şəkildə müxalifət etmişdir. Aristotel qadın və kişi fərqliliklərinin təkcə kəmiyyət baxımından deyil, eyni zamanda, keyfiyyət cəhətindən də olduğu fikrindədir. O deyir: "Qadın və kişinin istedadları və xilqət qanununun onların hər birinin öhdəsinə qoyduğu hüquq və vəzifələr də bir-birinə nisbətdə çoxlu fərqlərə malikdir." Aristotelin nəzərincə, kişi və qadının əxlaqi fəzilətləri də bir çox cəhətdən fərqlilik təşkil edir. Məsələn, hansısa bir əxlaq və xasiyyət kişi üçün fəzilət ola, amma qadın üçün fəzilət sayılmaya bilər, eyni .zmanda, bunun əksinin olması da mümkündür

Aristotelin nəzəriyyələri qədim dünyada Platonun nəzəriyyələrinə zidd olmuş və onu qüvvədən salmışdır. Sonrakı nəsil alimlər Platonun deyil, Aristotelin nəzəriyyəsinə .üstünlük və əhəmiyyət vermişlər

**(Bugünkü dünyanın nəzəri (düşüncəsi**

Bundan əvvəl dediklərimizin hamısı qədim dünya ilə

əlaqədar nəzəriyyələr idi. Hazırda yeni dünyada hansı düşüncələrin olmasına diqqət etməliyik. Yeni dünyada təxminlərlə kifayətlənilmir, əksinə təcrübə, ekperimentlər, mütaliə, rəqəmlər və müşahidəyə əsalanırlar. Bizim əsrimizdə dərin və köklü tibbi, ictimai və psixoloji araşdırma və mütaliələrə söykənərək kişi və qadının fərqlilik və müxtəlifliyi zəminində daha çox məsələlər kəşf edilmişdir, halbuki, qədim dünyada .onlarla bağlı məlumatların əldə edilməsi heç cür mümkün deyildi

Qədim dünyada yaşan insanlar qadın və kişinin fərqləndirmək istədikdə, sadəcə kişinin kobud, qadının isə zərif, kişinin boyu uzun və qadının boyu qısa, birinin qalın, digərinin isə incə səsli olması kimi məsələlərə diqqət edirdilər. Bundan da artıq onların həddi-büluğ və yetkinlik çağları, əqli və hissi məsələlərini göz önündə tutaraq bir sıra fərqlərə malik olduğunu düşünür və qadının mehr-məhəbbət və hissiyyatlar, kişinin isə əqlin təcəllisi olduğunu deyirdilər. Amma hazırkı zamanda bunlardan əlavə, digər fərqli xüsusiyyətlər də kəşf edilmiş və kişi ilə qadın dünyasının bir-birindən daha artıq .fərqlərə malik olduğu məlum olmuşdur

Biz tədqiqat və araşdırma aparanların qeydlərinə istinad edərək kişi və qadın fərqlərini nəzərinizə çatdırmağa və daha sonra isə həmin fərqlərin fəlsəfəsini, onların neçə faizinin təbiətdən qaynaqlandığını və neçə faizinin isə tarix, cəmiyyət və mədəniyyət amillərinin təsiri ilə yarandığını sizə bildirməyə çalışacağıq. Əlbəttə, bu fərqlərin bir qismi ilə əlaqədar olan məlumatları müxtəsər şəkildə təcrübə aparmaq və müatliə etməklə də əldə etmək mümkündür və digər bir qismi də o qədər aydın və aşkardır ki, .onları inkar etmək olmaz

**İkililiklər (ziddiyyətlər) Cismi baxımdan**

Kişi cismi cəhətdən orta həddə möhkəm bədənə, qadın isə nisbətən kiçik bədənə sahibdir. Kişi uzun, qadın qısa boyludur. Kişi kobud, qadın isə zərif məxluqdur. Kişinin ,səsi çox qalın

qadının səsi çox incədir. Qadının bədəni daha tez inkişaf edir, amma kişilərin bədəni onlara nisbətən ləng. Hətta, qız rüşeyminin (embrionunun) oğlan rüşeymindən daha tez inkişaf etdiyini də deyənlər vardır. Kişi əzələləri və onun cismani qüvvəsinin inkişafı qadına nisbətdə həddən artıqdır. Əksər xəstəliklər müqabilində qadının müqaviməti kişinin müqavimətindən çoxdur. Qadın kişidən daha tez həddi-büluğ və yetkinlik mərhələsinə çatır və nəsil artımı baxımından da kişiyə nisbətən tez qüvvədən düşür. Qız uşağı oğlan uşağından qabaq dil açır. Kişinin orta həddəki beyin həcmi qadının beyin həcmindən artıqdır, amma onların cisimlərini nəzərə aldıqda, qadının beyin həcminin kişininkindən artıq olduğu məlum olur. Kişinin ciyəri qadının ciyərinə nisbətdə daha çox tənəffüs etmək və havanın dolmasına qabiliyyətlidir. Qadının ürək döyüntüsü .kişinin ürək döyüntüsündən daha sürətlidir

**Psixoloji baxımdan**

PSIXOLOJI BAXıMDAN

Kişinin idman, ov və həddən artıq hərəkətlilik tələb edən işlərə meyili qadından çoxdur. Qadının hissiyyatı sülh və əminamanlıqdan, kişinin hisiyyatı isə mübarizə və döyüşdən yanadır. Kişi döyüşkən və davakar, qadın isə aram və sakitdir. Qadın özü və digərlərinə qarşı qəzəbli olmaq və onlara zərər verməyə meyilli deyil, bu səbəbdən də intihar etmək kimi hallar qadınlar arasında kişilərə nisbətən azlıq təşkil edir. Kişilər intiharın keyfiyyətində də qadınlardan fərqlənirlər, yəni kişilər özlərini asmaq, hündür bir yerdən özlərini atmaq və güllə ilə vurmağa, amma qadınlar, yuxu dərmanı, tiryək və s. .maddələrdən istifadə etməyə meyillidirlər

Qadının hissiyyatı kişiyə nisbətdə daha coşqundur. Qadınlar kişilərdən daha tez həyəcanlanır və qorxurlar, yəni qorxu və həyəcana səbəb olan işlərin təsiri altına daha tez düşürlər, amma kişilər onlardan fərqli olaraq soyuqqanlıdırlar. Qadınlar təbiət baxımından, kişilərdən fərqli olaraq bəzənib-düzənmək, zinət əşyaları və gözəlliyə daha artıq üstünlük verirlər. Qadınlar kişilərdən daha imanlı, qorxaq, iltifata üstünlük verən, çox danışan

və alışqandırlar (tez öyrəşən). Qadının hissiyyatının analıq yönləri vardır və bu, kiçik yaşlarından onlarda qoyulmuşdur. Qadınlar ailəyə qarşı daha diqqətli və ailəcanlıdırlar .və bu kişilərə nisbətdə fərq təşkil edir

Qadınlar dəqiq və əqlə əsaslanan elmlərdə kişilərə çata bilməzlər, amma ədəbiyyat, incəsənət - yəni, hissiyyat və duyğularla bağlı olan - elmlərdə qadınlar kişilərdən üstündürlər. Kişilər sirli və narahatçılıqlara səbəb olan məsələləri qadınlardan fərqli olaraq müəyyən miqdarda gizlədə bilirlər və bu, onlarda gözlənilmədən xəstəliklərin yaranmasına səbəb olur. Qadınlar daha həssas qəlbə malikdirlər və bu cəhətdən tez .ağlaya və qəşş edə bilirlər

**Kişi və qadının fərqləri onların bir-birlərinə nisbətdəki hissiyyatları baxımından**

Kişi özünün şəhvətinin əsiri, qadın isə kişinin məhəbbətinə möhtacdır. Kişi onu seçən və qəbul edən qadını və qadın da onu dəyərləndirə və başa düşə bilən, eyni zamanda, öz dostluğunu əvvəlcədən bildirən kişini sevir. Kişi, şəxsən, qadına sahib olmaq istəyir, qadın da kişinin qəlbini ələ alaraq bu yolla onu özünə tabe etdirmək istəyir. Kişi qadına xaricdən hakim kəsilmək, qadın isə daxildən onun qəlbini ələ almaq və beləcə, onu tabe etməyə daha çox maraqlıdır. Onların hər biri digərinə hakim olmağa meyillidir. Qadın kişidə şücaət və mərdlik, kişi isə qadında gözəllik və cazibədarlıq axtarır. Qadın kişini himayə etməyi özü üçün ən dəyərli məsələ hesab edir. Qadın öz şəhvətinə kişidən artıq hakim kəsilə bilməyə qadirdir. Kişinin şəhvəti ibtidai və hücum .xarakterinə, qadının şəhvəti isə tələb və təhrik edici yönə malikdir

**(Kişi və qadın fərqlilikləri (٢**

Günün qadını" jurnalının doxsanıncı sayında məşhur və tanınmış Amerikalı psixoloq" professor Rikin - o, uzun illər kişi və qadının xüsusiyyətləri ilə əlaqədar tədqiqat və -araşdırmalar apararaq müəyyən nəticələr əldə etmiş və kişi və qadının saysız

hesabsız fərqləri barədə bir kitab yazmışdır – nəzəriyyələri nəşr edilmişdir. Professor Rik belə deyir: “Kişi və qadın dünyası bir-birindən tamamilə fərqlənir. Qadının kişi kimi düşünməsi və ya onun kimi əməl edə bilməməsinə səbəb onların fərqli dünyaya malik olmalarıdır. Sonra sözlərinə davam edərək Tövratda “Kişi və qadının eyni bir ətdən (cisimdən) yaradıldığı”nın yazılmış olduğunu deyir. Bəli, onlar eyni ətdən yaradılmış olmasına baxmayaraq, müxtəlif cisimlərə malikdirlər və tərkib baxımından da onlar bir-birindən tamamilə fərqlənirlər. Bundan əlavə, onların hissiyyatları heç zaman bir-birinə bənzəməyəcək və baş verən hadisələr müqabilində də eyni şəkildə əksül-əməl və reaksiya nişan verməyəcəklər. Kişi və qadın özlərinin cinsi tələblərinin xüsusiyyətlərinə uyğun olaraq fərqli şəkildə əməl edirlər və bu məsələ öz oxu ətrafında müxtəlif istiqamətlərdə hərəkət edən ulduzlara bənzəyir. Onlar bir-birini başa düşüb anlaya və bir-birinin təkmilləşdiricisi ola bilərlər, amma heç bir zaman eyni ola bilməzlər. Bu səbəbdən, onlar birgə yaşaya, biri digərinə aşiq ola bilir və ayrı-ayrılıqda onlara məxsus olan sifət (xüsusiyyət) və əxlaqlardan yorulmurlar (bezmirlər).” Professor Rik kişi və qadının ruhiyyəsindəki fərqliliklə bağlı təcrübə və eksperiment aparmış və onların müxtəliflik və fərqlilikləri ilə əlaqədar müəyyən nəticələr əldə etmişdir. Bu cəhətdən Rik deyir: “Kişi üçün daim sevdiyi qadının yanında yaşamaq yorucudur, amma qadın üçün məhəbbət bəslədiyi kişinin yanında həyat sürməsindən üstün bir şey yoxdur. Kişi hər gün həmişəki vəziyyətində qalmağı xoşlayır, qadın isə həmişə yeni və təzə şəkildə olmağı, sübhlər öz yatağından təzə bir qiyafədə qalxmağı sevir. Bir kişinin qadın üçün deyə biləcəyi ən yaxşı cümlə “əzizim, səni sevirəm”, qadının isə sevdiyi kişiyə deyə biləcəyi ən yaxşı cümlə “mən səninlə fəxr edirəm” cümləsidir. Hansısa bir kişinin yaşadığı müddətdə bir neçə məşuqəsi olmuşdursa, o, digər qadınlar tərəfindən cəlb edici hesab edilir. Amma kişilərin birdən .artıq kişiyə sahib olan qadınlardan acıqları gəlir

Kişilər qocaldıqları zaman özlərinə dayaq hesab etdikləri işlərini əldən verdikləri üçün, .özlərini bədbəxt hesab edirlər

Qadınlar isə yaşlandıqda öz hallarından razıdırlar, çünki öz nəzərlərində ən yaxşı hesab etdikləri şeylərə – bir ev və neçə dənə nəvə – sahib olduqlarını düşünürlər. Kişilərin nəzərində xoşbəxtlik cəmiyyətdə məqam və ehtirama layiq olan şəxsiyyətə malik olmaqdır. Qadın üçün isə xoşbəxtlik bir kişinin qəlbini ələ gətirmək və onu bütün ömrü boyu qoruyub saxlaya bilməkdir. Kişi sevdiyi və maraq duyduğu qadını özünün din və milliyyətinə gətirmək istəyir. Qadın üçün evlilikdən sonra öz soyadını dəyişməsi və ərinin soyadına keçməsi asan olduğu kimi, məhəbbət bəslədiyi kişiyə xatir din və “ .millətini dəyişmək də asandır

## Xilqətin şah əsəri

Kişi və qadın fərq və ziddiyyətlərinin onların ailə hüquqları və məsuliyyətləri ilə bağlı fərqlərinin yaranmasına səbəb olmasını və ya olmamasını görməzdən gəlsək, həmin məsələnin özünün təəccüblü və xilqətin şah əsəri olduğunu anlayarıq. Bunun özü tövhid dərsi, Allahı tanımaq, dünyanın hikmətli və nizamlı şəkildə idarə edilməsinə bir nişanə, məxluqatın təsadüfi olaraq yaranmadığına, təbiətdəki cərəyanların kor-koranə halda baş vermədiyinə nümunədir və aydın məsələdir ki, əsil hədəfin nə olmasını anlamadan, dünyada baş verən hadisələrin mənasını başa düşmək olmaz. Əzəmətli xilqət aparatında öz hədəfinə çatmaq və yer üzərindəki canlılar növünü qoruyub saxlamaq üçün “nəsil artımı” funksiyası meydana gətirilmişdir. Beləliklə, daimi olaraq kişi və qadın yaradılır və həmin prosesin yerinə yetirilməsi və nəsil artımına ehtiyac duyulduqda, iki cinsin həmkarlığı (xüsusən də, insan növü ilə bağlı) üçün onlar arasında vəhdət və birlik məsələsini icad etmişdir. Elə bir iş görmüşdür ki, həyata malik olan hər bir canlı üçün müqəddimə sayılan eqoizm və mənfəət tələb etmək fədakarlıq, yardımlaşma və bağışlanmağa xidmət və kişi və qadının birlikdə yaşamağını təmin etsin. Bütün bu funksiyaların əməldə həyata keçməsi və onların bir-birinə öyrəşə bilməsi üçün kişi və qadının ruh və cismində təəccüb doğuracaq fərqliliklər təyin etmişdir və həmin fərqliliklər kişi və qadının bir-birini cəlb etməsinə və aşiq olmasına .səbəb olur

Əgər qadın cismi və ruhi baxımdan kişiyə bənzəsəydi, onda, çətin ki, o, kişinin diqqətini cəlb edə bilər və kişi də onun vüsalının həsrətində olrdı. Eyni zamanda, kişi də qadının sahib olduğu cismi və ruhi xüsusiyyətlərə malik olsaydı, qadının onu öz həyatının qəhrəmanı hesab etməsi və onun qəlbini ələ almağı özünə bir hünər sayması çətin ki, .mümkün olardı. Kişi dünyanın fatehi, qadın isə kişinin fatehi kim xəlq edilmişdir

Xilqət və yaradılış qanunu kişi və qadını bir-birinə məhəbbət və sevgi göstərə biləcəkləri, həmçinin, ehtiyaclı lacaqları şəkildə müəyyən etmişdir. Amma bu, əşya və cisimlərə olan məhəbbət və maraq növündən deyil. İnsanın əşyaya olan marağı onun eqoizmindən qaynaqlanır, yəni insan əşyanı özü üçün istəyir, onları alət və vasitə gözündə görür və onları özü və həyatına qurban verməyi düşünür. Amma insanın zövcəlik (ər-arvad) məsələləri onlardan hər birinin digərinin səadət və asayişini istəməsi şəklində müəyyən edilmişdir və fədakarlıq onlar üçün ləzzət bəxş edən bir .əməl kimi dəyərləndirilir

**Şəhvətdən də üstün olan bağlılıq**

Bəzi şəxslərin şəhvətlə üstünlük arasında fərq qoya bilməməsi çox təəccüblü bir məsələdir. Onlar kişi və qadını (ər və arvadı) bir-birinə bağlayan məsələlərin - insanı yeyilən, içilən, toxunulan (ləms edilən) və nəqliyyat vasitələrinə cəzb edən hissiyyatlar kimi - təkcə şəhvət və tamahla, faydalanmaq hissi ilə əlaqədar olduğunu düşünürlər. Həmin şəxslər xilqət və təbiətdə eqoizm və xudxahlıqdan, mənfəəttələblikdən başqa, digər maraqların olmadığını güman edirlər. Həmin maraqlar xudxahlıqdan meydana gələn maraqlar deyil, əksinə digər məsələlərdən qaynaqlanır. Bu maraqlar bir nəfərin digərinin rahatlığı üçün öz istirahətindən keçməsi kimi fədakarlıq və bağışlamağa əsaslanır. Həmin maraqlar insanın insan olduğunu nümayiş etdirir və eyni zamanda, onun öz həmnövü və övladına olan maraqları kimi, onun müəyyən bir qisminin .heyvanlarda da müşahidə edilməsi mümkündür

Belə şəxslər kişinin qadına cavan bir şəxsin diqqət etdiyi kimi əhəmiyyət verdiyini, yəni qadına təkcə şəhvət gözü ilə

baxdığını və onları bir-birinə bağlayan məsələnin şəhvət olduğunu güman edirlər. Həqiqətdə isə, şəhvətdən də üstün məsələlər var ki, onların zövcə olması vəhdətinin əsasını təşkil etməyə xidmət edir. Bu məsələlər Quranın “məhəbbət” və “rəhmət” kimi :adlandırdığı məsələlərdir. Quranda buyurulur

{وَمِنْ آيَاتِهِ أَنْ خَلَقَ لَكُمْ مِنْ أَنْفُسِكُمْ أَزْوَاجًا لِتَسْكُنُوا إِلَيْهَا وَجَعَلَ بَيْنَكُمْ مَوَدَّةً وَرَحْمَةً}

Onların yanında aramlıq tapasınız deyə, sizin üçün (mələklərdən, cinlərdən və başqa“ məxluqlardan deyil) öz cinsinizdən zövcələr yaratması və sizin aranızda (ər-arvadın, yaxud insanların arasında) dostluq əlaqəsi, batini mehr-məhəbbət yaratması onun nişanələrindəndir, həqiqətən, bunda düşünən bir qövm üçün (Allahın tovhidi, qüdrət və (hikmətinə dair) nişanələr vardır.“(١)

Kişi və qadın münasibət və rabitələri tarixinin fəqət şəhvət, cinsi münasibət və faydalarla əlaqələndirilməsi nə qədər də yanlış bir məsələdir! Hələ də bu zəminədə bəzi məsələlər qalmaqdadır. Həqiqətən də, mən bəzi yazıları mütaliə edərkən kişi və qadın münasibətlərinin tarixini təkcə təzad və ziddiyyətlərlə (kişi və qadını cəmiyyətin iki qarşı-qarşıya dayanan və bir-biri ilə mübarizə apararaq keçməkeşdə olan təbəqəsi kimi nəzərə çarpdırırlar) əlaqələndirdiklərini gördüyüm üçün, çox təəccüb edir və onların cahillik və nadanlıqlarına təəssüflənirəm. Əgər insan və onun övladları ilə əlaqədar rabitə və münasibətlər tarixini istismarçılıq hislərinə əsasən təfsir etmək mümkündürsə, onda, kişi və qadın (ər-arvad) münasibətlərini də həmin məsələyə uyğun olaraq izah etmək olar. Doğrudur ki, kişi həmişə qadından qüvvətli olmuşdur, amma xilqət və yaradılış qanunu kişinin qul, nökər, qonşuları və s. kəslər barədə göstərdiyi zorakılığı qadınlara da tətbiq etməsinə icazə verməmişdir. Bu məsələ övladlarla da bağlı keçərlidir. Mən, həqiqətdə, kişinin qadınlara rəva bildiyi zülm və ,sitəmləri inkar etmək fikrində deyiləm

əksinə bu zülmləri dəstəkləməyə çalışanların verdikləri



---

.Rum“ surəsi, ayə ۲۱“ .[۱]-۱

.izahları rədd və inkar edirəm

Tarixlər boyu kişilər qadınlara çoxlu zülümlər etmişlər və həmin məsələlər onların məhəbbət göstərdikləri öz övladlarının səadət və xoşbəxtliyinə də zülm və sitəm etməsinə səbəb olmuşdur. O məsələlər onların özlərinə zülm etməsinə də bais olmuşdur, yəni həmin məsələlərin qaynaq və mənbəyi cəhalət, təəssüb və bir sıra adətlərdir, nəinki, mənfəət tələb etmək. Kişi və qadının münasibətlər tarixi ilə əlaqədar daha geniş şəkildə söhbət etməyimiz üçün bundan da artıq fürsətlərin olacağına ümid .edirik

**Kişi və qadının bir–birinə qarşı duyduqları hislərdəki ziddiyyətlər**

Kişi və qadının bir-birinə nisbətdə ailə münasibətləri əşyaya olan münasibətlərdən fərqlənməklə yanaşı, onların özlərinin də bir-birinə maraq və münasibətləri bənzər və oxşar şəkildə deyil. Yəni, kişinin qadına münasibət və maraqları qadının kişiyə olan münasibət və maraqlarından fərqlənir. Onlar arasındakı cazibə ikitərəflidir, amma cansız əşyalarda əksinə, kiçik cisimlər böyük cisimləri özlərinə tərəf cəzb edirlər. Xilqətdə kişi tələbkarlıq, eşq və istəyin məzhəri kimi yaradılmış, qadın isə məhbbubiyyət və məşuq olaraq təyin edilmişdir. Kişinin hisləri ehtiyaclılığa meyilli, qadının hisləri isə naz-qəmzəyə istiqamətlidir. Kişinin hissiyyatı tələb edən, qadın .hissiyyatı tələb olunandır

Bir müddət əvvəl xəbər qəzetlərinin birində intihar edən rusiyalı cavan bir qızın şəkili çap edilmişdi. Onun özündən sonra qoymuş olduğu məktubda belə yazılır: “Məni hələ ”.bir kişi öpməmişdir və həyat mənim üçün çox dözülməzdir

Bir qadın üçün hansısa bir kişinin sevgi və məhəbbətini qazana bilməməsi böyük məğlubiyyətdir. Görəsən, cavan bir oğlan qadının sevgisini qazanmadığı zaman .həyatdan naümid olarmı? Xeyr, naümid olmaz

Vil Dorant özünün geniş və müfəssəl bəhslərindən sonra deyir ki, əgər qadın təbii olaraq qəlb oxşayan xüsusiyyətlərinə deyil, elm öyrənmək və təhsilə daha çox əhəmiyyət verərsə, onun özünə ər tapa bilməsi çətin olacaq. Universitet bitirmiş

qızların altmış faizi ərsizdir. Sonra deyir: “Tanınmış alimlərdən olan Monya Kvaluski heç kimin onunla evlənmədiyindən şikayət edirdi. Deyirdi ki, nə üçün kimsə məni sevmir (bəyənmir)? Mən əksər qadınlardan daha yaxşı ola bilərəm. Bununla yanaşı, qadınların əksəriyyətinə az diqqət edilir, amma mən onlar kimi deyiləm. Siz bir qadının bu cür məğlubiyyət hisləri keçirməsinin hansısa bir kişinin məğlubiyyətlə bağlı keçirdiyi ”?hislərdən fərqli olduğuna diqqət edin. O (qadın), deyir ki, nə üçün məni sevmirlər

Kişi evlilik həyatında sevdiyi qadını tapa bilmədiyi zaman və ya əgər tapmış olsa belə, onunla evlənə bilmədiyində, ruh düşkünlüyünə düçar olur. Bütün bunların bir fəlsəfəsi vardır: “Möhkəm və əsaslı bağlılıq və vəhdətin yaranması üçündür.” Həmin bağlılıq nəyə xidmət edir? Kişi və qadının həyatdan daha çox ləzzət duymaları üçündürmü? Xeyr, təkcə bunun üçün deyil. İnsan cəmiyyətinin təməlləri və gələcək nəslin .tərbiyəsinin əsasları həmin məsələyə istinad edir və söykənir

**Psixoloq olan bir qadının nəzəriyyəsi**

Günün qadını” jurnalının yüz birinci sayında Kelyo Dalson adlı psixoloq xanımdan“ psixoloji bir bəhs nəql edilmişdir. Həmin xanım deyir: “Psixoloq bir qadın kimi, mənim ən çox maraq göstərdiyim məsələ kişilərin psixologiyası barədə mütaliə etməkdir. Bir müddət əvvəl, mənə kişi və qadına təsir edən psixoloji amillərlə bağlı tədqiqat :aparmaq və bunu təcrübədən keçirmək tapşırılmışdı. Mən belə bir nəticə əldə etdim

Bütün qadınlar başqa bir şəxsin nəzarəti altında işləməyi xoşlayırlar, yəni başlarının .١“ .üstündə bir rəisin olmasını istəyirlər

Bütün qadınlar kiminsə onlara ehtiyaclı olmasını və onların təsir etmək qabiliyyətinə .٢ malik olduqlarını hiss etmək istəyirlər.” Daha sonra o, öz düşüncə və əqidələrini belə bəyan edir: “Mənim nəzərimcə, bütün bu psixoloji hislər qadınların hislərinə tabe olması, amma kişilərin əqllərinə istinad etməsi həqiqətindən qaynaqlanır. Əlbəttə, qadınların kişilərə nisbətdə daha ağıllı olduqları və bu zəminədə kişilərdən üstünlük təşkil

etdiyi əksər hallarda müşahidə edilmişdir. Qadınların zəif cəhəti fəqət onların güclü hissiyyata malik olmasıdır. Kişilər həmişə təcrübəyə malik, daha yaxşı qəzavət edən və təşkilatçı, eyni zamanda, yaxşı yol göstərəndirlər. Deməli, kişilərin psixoloji üstünlükləri onlara təbii olaraq əta edilmişdir. Qadınlar bu məsələ ilə əlaqədar hər nə qədər mübarizə aparmaq istəsələr də, bu, faydasız olacaqdır. Qadınlar güclü hissiyyata malik olduqları səbəbindən, həyatda kişilərin idarəçiliyinə ehtiyaclı olduqları həqiqətini qəbul etməlidirlər. Qadınların həyatdakı ən böyük hədəfi təmin olunmaqdır və həmin hədəf təmin olunduğu zaman, onlar fəaliyyətlərini dayandırırlar. Qadın bu hədəfinə çatmaq uğrunda çətinliklərlə üzləşməkdən qorxub çəkinir. Qorxu qadının yeganə hissidir ki, onu aradan qaldırmaq üçün köməyə ehtiyac duyur. Daimi olaraq "".təfəkkür və əqlə söykənən işlər qadın üçün çox yorucu hesab edilir

## Tələskən hərəkat

Avropada qadının aradan getmiş hüquqlarının bərpası ilə bağlı baş verən hərəkat bu barədə (hüquqların bərpası) gec düşünüldüyü üçün həddən artıq sürətlə və tələskən şəkildə hayata keçirilmişdir. Hissiyyatlar elmin bu barədə öz nəzərini irəli sürməsinə və onun yol göstərən və bələdçi olmasına imkan və möhlət verməmişdir. Bu səbəbdən, qurunun oduna yaş da yanmalı olmuşdur. Bu hərəkat qadının bir sıra silsilə təşkil edən bədbəxtliklərini aradan qaldırmış və ona çoxlu hüquqlar əta edərək bağlı qapıların əksəriyyətini onun üzünə açmışdır. Amma bunun əvəzində, bəşər cəmiyyəti və qadının .özü üçün bəzi digər bədbəxtlik və bəlaların yaranmasına gətirib çıxarmışdır

Aydın məsələdir ki, əgər bu hərəkatın həyata keçirilməsində tələskənlik olmasaydı, qadın hüquqlarının bərpa edilməsi daha yaxşı şəkildə gerçəkləşər və qadının indiki və gələcəkdəki dəhşətli və biçarə vəziyyəti ilə bağlı mütəxəssislərin fəryadı ərşə qalxmazdı. Bununla yanaşı, hələ də elmin daha da inkişaf edərək öz yerini tutmasına və qadının hüquqları ilə bağlı hissiyyatlara əsaslanan hərəkatların deyil, elm və biliyə

söykənən hərəkatların baş verməsinə ümid vardır. Bu zəmində Avropa alimlərinin irəli sürdükləri nəzəriyyələr də bizim dediyimiz sözlərin həqiqət olduğunu təsdiqləyir. Belə nəzərə çarpır ki, kişi və qadın münasibətləri ilə əlaqədar Qərbə təqlid edənlərin məstliyinə səbəb olan məsələlər, qərblilərin özünün də xumar halda həmin mərhələni .başa vuracaqlarından xəbər verir

**Vil Dorantın nəzəriyyəsi**

Vil Dorant “Fəlsəfənin ləzzətləri” adlı əsərinin dördüncü hissəsində müfəssəl və geniş şəkildə ailə münasibətləri və cinsi rabitələr məsələsinə toxunmuşdur. Biz həmin kitabın müxtəsər olan hissələrini seçərək oxuculara təqdim edirik ki, onlar bu zəmində Qərb alimlərinin düşüncə və fikirləri ilə daha yaxşı və dərindən tanış ola bilsinlər və tələskən halda qəzavət etməsinlər. Vil Dorant kitabının dördüncü hissəsinin “Eşq” ünvanında olan yeddinci fəsilində belə deyir: “Eşqin aşkar nəğmələri həddi-büluğ və yetkinliyin yetişməsi ilə başlayır. İngilis dilində “puberti” adlanan sözün, yəni “həddi-buluğ”un latın dilindəki əsil mənasına diqqət etdikdə, onun “tük ili” adlandığı, yəni o yaşda oğlanların sinələrinin, həmçinin, üzlərinin tükü inkişaf etdiyi məlum olur. Tüklərin keyfiyyət və kəmiyyətinin (digər məsələləri nəzərə aldıqda) cinsiyyət və nəsil artırma qabiliyyəti ilə əlaqədar olduğu məlum olur və onun ən yaxşı halı həyatın coşqun çağlarıdır. Tüklərin bu şəkildə inkişafı insanın sima və səsinin dəyişilməsi ilə meydana çıxır və insanda müşahidə olunmağa başlayır. Amma bu proses qadınlarda insanı heyrətə salaca şəkildə inkişaf edərək onlar həddən artıq hərəkətlilik və incəlik əta edir və onların analıq dövrü və uşaq dünyaya gətirə bilməsinə hazırlaşmaq üçün yardım göstərir. Bu ?xüsusiyyətlərin yaranmasına səbəb hansı amillərdir

Bunu heç kim bilmir, amma professor Starlinqin bu zəmindəki nəzəriyyəsi özünə müəyyən qədər tərəfdarlar toplamışdır. Onun nəzəriyyəsinə əsasən, cinsiyyət sellülləri həddi-büluğa yetişən zaman, təkcə nütfə (sperma) və toxum istehsal etmir, əksinə bir növ hormon istehsal edir ki, həmin hormon qana

daxil olaraq insanın sima və cisminin də dəyişilməsinə səbəb olur. Bu yaşda (yetkinlik) .təkcə insanın cismi deyil, onun psixologiya və xarakteri də formalaşmağa başlayır

Romin Roland deyir: “İnsanın həyatında müəyyən illərin keçməsilə bir müddət gəlib çatır ki, kişinin cismində ahəstə şəkildə gedən dəyişikliklərə səbəb olur və qadınlar vücudunda isə əvvəldə dediyimiz kimi, ən mühüm dəyişikliklər baş verir, o cümlədən, ”...cəsarət və qüdrətlilik, incə qəlbin tez-tez döyünməsi və zəriflik və lətafət yaranır

Demuse deyir: “Bütün kişilər yalan danışan, ikiüzlü, hiyləgər və davakardırlar. Bütün qadınlar da eqoist, zahiri görünüşə əhəmiyyət verən və xəyanətkardır. Amma dünyada müqəddəs və ali olan bir şey var ki, o da bu iki naqis məxluqun cinsi münasibətidir...” Cütlük axtarışı (öz tayını axtarmaq) ədəbi böyük yaşlı insanlarda kişilərə təsərrüf etmək üçün, qadınlarda isə fəndgirlik və qəlbi ələ almaq üçündür (əlbəttə, bəzi yerlərdə istisna halların olması müşahidə edilmişdir). Çünki kişi təbiətən döyüş və heyvan ovlamağa meyilli, əməli müsbət və hücumçudur. Qadın kişi üçün müsabiqədə qoyulan mükafat kimidir. Kişi onu qazanmaq və ona malik olmaq istəyir. Özünə tay olan birini axtarmaq mübarizə və döyüş, evlənmək isə iqtidar və .sahiblənməkdir

Qadının həddən artıq iffətliliyi nəsil artımının hədəfinə xidmət edir. Onun mehribancasına imtina etməsi qarşı cinsin seçimi üçündür. İffətli olmaq qadının gələcək uşaqlarının atası kimi görmək istədiyi və sevəcəyi şəxsin axtarışı və seçimində böyük rola malikdir və onu bu cəhətdən qüdrətli edir. Eşqbazlıqda qadın kişidən daha artıq məharətə malikdir və onun meyili əqlin gözü görəcək qədər də şiddətli deyildir. Darvin öz düşüncələrinə əsasən, əksər növlərin, xüsusən də, dişi növün eşq aləminə .diqqətsiz olduğunu söyləyirdi

Limberzu, Kiş və Kroft belə deyirdilər: “Qadınlar əsasən, kişilərin onlara sitayişi, mütləq gözəllik və anlaşılmazlıqları ardıncadırlar və daha çox kişilərin onların istək və meyillərinə diqqət etməsini istəyirlər. Bu hiss onların cinsi münasibətdən

aldıqları ləzzətdən qat-qat üstündür.” Limberzu deyir: “Qadının təbii olaraq, eşq sifəti (məhəbbəti) onun analıq hisslərindən qaynaqlanır və qadının kişilərə nisbətdəki bağlılıq və münasibəti təkcə onların cismi xüsusiyyətlərinə əsaslanmır, əksinə təslim və tabeçilik hisslərindən (kişinin himayəsi altında olmaq) yaranır və bu qərizələr ””.vəziyyətə uyğunlaşmaqla meydana gəlmişdir

:Vil Dorant “Kişilər və qadınlar” adı altında qələmə aldığı fəsildə yazır

Qadının xüsusu vəzifəsi onun növlərin qalmasına, kişilərin xüsusi vəzifəsi isə qadın və“ uşaqlara xidmət etməkdir. Onların digər vəzifələrə malik olması da mümkündür, amma həmin işlərin hamısı hikmət və tədbirə söykənərək bu əsas məsələdən qaynaqlanır. Bu məqsəd əsasdır, amma yarımanlaşılmaz şəkildədir və təbiət insanın məna və səadətini onda yerləşdirmişdir... Qadının təbiəti daha çox sığınmaq və pənah axtarmağa (himayəyə) meyillidir, nəinki, döyüşkənliyə. Bəzi dişi növlərdə, ümumiyyətlə, mübarizə aparmaq qərizəsinin olmadığı nəzərə çarpır. Əgər dişi .döyüşmək üçün meydana gələrsə, bu, sadəcə onun balalarına xatirdir

Qadın kişidən səbirlidir. Amma kişinin şücaəti həyatın xətərli və təhlükəli... məsələlərində daha artıqdır. Qadının çoxlu sayda olan narahatlıqlar müqabilindəki daimi və ya gündəlik səbir və dözümü kişidən çoxdur... Qadının döyüşkənliyi başqa cinsdə axtarır. Qadın döyüşçü və qüdrətli kişiləri xoşlayır. Güc və qüdrəti müşahidə etdikdə, özü onun qurbanına çevrilsə də, ondakı əsrarəngiz və təəccüblü amillər qadını ...təhrik edir

Qüdrət və şücaətdən bu cür qədim olan xoşagəlimlik bəzən qadının iqtisadi... hissiyyatlarına qalib gəlir və onun şücaətli bir divanə ilə evlənməsinə gətirib çıxarır. Qadın əmr etməyə bələd olan kişilərə xoşhallıqla təslim olur. Əgər qadınların bəzi hallarda itaətsizliyi müşahidə olunursa, bu, kişilərin qüdrət baxımından əvvəlkinə nisbətdə zəifləməsini müşahidə edilməsi ilə əlaqədardır. Qadınlar, adətən, ailə məsələlərinə və ailə mühitinə daha çox diqqət edirlər. Ailə mühiti onun həm məhdud olan ev mühitinə, həm də geniş təbiətə bənzəyir. Qadının qərizə və

instinktləri onu qədimi məsələlərlə əlaqələndirir. Onlar nə zehni cəhətdən imtahan olunmağa layiqdirlər, nə də adətlər baxımından (əlbəttə, böyük şəhərlərdə yaşayan qadınıar istisnadırlar). Onların azad eşq ardınca olmasına səbəb bu yolla azadlıq axtarışında olmalarıdır. Qadınların adi evlilik və məsuliyyətli kişilərdən məyus və naümid olmaları da buna səbəb ola bilər. Qadınlar cavan yaşlarında siyasət və digər məsələlərlə məşğul olmağa məftun olsalar da, evləndikdən və özlərinə vəfalı həyat yoldaşı tapdıqdan sonra həmin məsələlərə bütövlükdə göz yumur və onlardan özü və ailəsini kənar saxlamağa çalışır. Onlar həyat yoldaşlarına vəfadarlıq hislərini təkcə öz ailəsinə yönəltmək lazım olduğunu bildirirlər. Qadınlar düşüncə və təfəkkürə ehtiyac duymadan sağlam islahatların ailədən başladığını başa düşürlər. Qadın xəyalpərəst və avara kişini öz ailə və uşaqlarına bağlı və şücaətli bir kişiyə çevirə bildikdə, növün qoruyub saxlana bilməsi amilinə çevrilir. Qadın təbiətinin dövlət və qanunlara etinası yoxdur. Onun məhəbbəti ailə və uşaqlarına həsr edilmişdir. Əgər onları qoruyub hifz edə bilməkdə müvəffəq ola bilsə, heç bir dövlətə əhəmiyyət və üstünlük verməz. Eyni zamanda, o, bu əsaslı qanunları dəyişməyə çalışan kəslərə gülərək onlara rişxənd edir. Əgər hazırda qadın təbiətinin ailə və uşaqların qorunması baxımından qüdrətsiz olması nəzərə çarpırsa, bunun səbəbi qadının öz təbiətini unutmasıdır. Amma bu məsələnin aradan qalxması (unudulması) həmişəlik deyil və məsləhət bildiyi anda onu yadına sala bilər. Sayca sizdən artıq olan irqlər və millətlər də vardır ki, təbiət öz ".naməlum davamiyyətini onların vasitəsi ilə təmin edə bilir

Diqqətinizə çatdırdıqlarımız məsələlər alimlərin kişi və qadın ziddiyyət və fərqlilikləri barədə olan nəzəriyyələri idi. Mən “ziddiyyətlərin sirri” adı altında ictimai və tarixi amillərin kişi və qadının ziddiyyətlərinin yaranmasında nə qədər təsirli olması ilə bağlı bəhs etməyi nəzərdə tutmuşdum. Amma söhbətin həddən artıq uzanmaması üçün, bu barədə ayrılıqda danışmaqdan çəkinirəm. Gələn bəhsimizdə həmin mətləb tamamilə .aydın olacaqdır

## SƏKKİZİNCİ HİSSƏ

**(Mehriyyə və nəfəqə (١**

Ailə münasibətləri zəminində mövcud olan qədim adətlərdən biri kişinin evlilik zamanı qadına mehriyyə verməsi idi. Yəni, kişi qadına və ya onun atasına müəyyən bir məbləğ ödəyir və evlilik müddətində qadın və uşaqlarının ehtiyaclarını ödəməyi öz öhdəsinə götürürdü. Bu adət-ənənə və sünnənin əsli hara gedib çıxır? O, necə meydana çıxaraq yaranmışdır? Mehriyyə necə müəyyən edilir? Qadına nə üçün nəfəqə vermək lazımdır? Əgər kişi və qadın özlərinin təbii və insanlıq haqlarından istifadə etmək və onlar arasında ədalətli və insani münasibətlərin hökmran olmasına nail olmaq və qadınla bir insan kimi rəfdar edilməsini istəyirlərsə, onda, mehriyyəyə və nəfəqəyə nə ehtiyac vardır? Yoxsa, mehriyyə qadının kişinin mülkiyyəti olmasını göstərən və ?qədimdən müəyyən edilmiş bir nişanədirmi

Ədalət və insanların hüquq bərabərliyinin tələbi - xüsusən də, XX əsrdə - mehriyyə və nəfəqənin ləğv edilməsi, qadının öz ehtiyaclarını ödəməyi öz öhdəsinə götürməsi və uşaqların xərclərinin təmin edilməsində kişi ilə eyni səviyyədə iştirak etməsidir. Bəhsimizi mehriyyə barədə söhbətlə başlayır və onun hansı fəlsəfəyə malik olması, necə meydana gəlməsi və sosioloqların bu məsələ barədə verdikləri izahları bilmək .istəyirik

Eradan əvvəlki tarixi dövrlərdə, yəni insanların ibtidai icma quruluşunda qəbilə və vəhşi halda həyat sürdükləri zamanlar naməlum səbəblərdən, onlar qan qohumluğuna əsasən evlənməyi doğru hesab etmirdilər. Evlənmək istəyən cavan qəbilə üzvləri özləri üçün digər qəbillərdən qadın və məşuqə seçmək məcburiyyətində qalırdılar. Bu cəhətdən, həyat yoldaşı seçmək üçün onlar digər qəbilələrin yanına gedirdilər. Həmin zamanlarda kişi özünün funksiyasını, yəni qadınla cinsi yaxınlıqdan sonra övladın dünyaya gəlməsində təsirli rola malik olduğunu bilmirdi. Uşaqlarını qadının uşaqları kimi tanıyırdı, nəinki, öz uşaqları kimi. Övladlarının özünə oxşadığını görür, amma bu oxşarlıq səbəbinin nə olduğunu anlaya bilmirdi. Aydın məsələdir ki, uşaqlar da özlərini atalarının deyil, analarını övladı hesab edirdilər və övladlar atalarına yox, analarına nisbətdə tanınırdı. Kişilər tabe olmaz və tüfeyli kimi tanınırdılar. Onlar evlilikdən sonra – qadının onun rəfaqət və cismani qüvvəsinə ehtiyac duyduğu üçün – qadının qəbiləsində yaşamağa başlayırdılar. Bu dövrü tarixçilər .“Matriarxat” (ana şahlıq) dövrü adlandırırdılar

Kişinin övladın dünyaya gəlməsindəki öz funksiya və rolunu anlaması və uşaqların həqiqi sahibi olduğunu başa düşməsi üçün elə də uzun bir müddət keçmədi. O, qadını bu cəhətdən özünə tabe edərək ailə idarəçiliyini öz öhdəsinə götürdü və beləliklə, “Patriarxat” (ata şahlıq) dövrünün əsası qoyuldu. Bu dövrdə də qan qohumluğuna əsaslanan evlilik qəbul edilmirdi və kişilər digər qəbilələrdən qadın almaq və onları öz qəbilələrinə gətirmək məcburiyyətində qalırdılar. Həmin zamanlarda tez-tez qəbilələr arasında müharibələr baş verdiyindən, qadın almaq o qədər də asan deyildi və onlar qadınları oğurlamaq vasitəsi ilə həyat yoldaşını seçirdilər. Yəni, qəbilənin cavan üzvü nəzərdə tutduğu qadını digər qəbilədən oğurlayırdı. Zaman keçdikcə, qəbilələr arasında baş verən müharibələr sülhlə əvəz olundu və buna əsasən, bir neçə qəbilə .birlikdə sülh və asayişdə yaşaya bildilər

Tədricən, evlənmək üçün digər qəbilələrdən qızların oğurlanması məsələsi aradan qaldırıldı və kişilər evlənmək üçün qadının atası yanında müəyyən müddət işləməklə istədikləri qızla evlənə bilir və onu öz qəbilələrinə gətirirdilər. Maddi sərvətlər artdıqca kişilər qayınatanın yanında müəyyən bir müddət işləməyi deyil, onlara bunun müqabilində layiqli hədiyyələr təqdim etməklə onun qızı ilə evlənməyi düşünürdülər. .Həmin işi həyata keçirdilər və beləliklə də, "mehriyyə" məsələsi meydana çıxdı

Bu minvalla, ilkin mərhələdə kişi qadının xidmətçisi kimi həyat sürməyə başlayırdı. Həmin dövrlərdə (Matriarxat dövründə) qadın kişi üzərində hakimiyyət və hökmdarlığa malik idi. Amma sonrakı mərhələdə (Patriarxat) hakimiyyət kişinin ixtiyarına keçdiyi üçün, o, qadını digər qəbilələrdən oğurlayırdı. Üçüncü mərhələdə kişi qadınla evlənmək üçün illərlə onun atasına işləməli olurdu. Dördüncü mərhələdə kişi qadının atasına müəyyən məbləğdə peşkəş verməklə evlənirdi və bu qayda ilə .mehriyyə məsələsi yaranmağa başladı

Kişi qadının hakimiyyətini (Matriarxatı) süquta uğratdıqdan sonra öz hakimiyyətini (Patriarxatı) təsis etdi və qadın üzərində hakim olaraq ona öz cinsi ehtiyaclarını təmin edə bilən vasitə kimi, yəni şəhvət nəzərləri ilə baxmağa başladı. Qadına ictimai və iqtisadi azadlıq verilmədi. Qadının əmək fəaliyyətində əldə etdikləri məhsullar onun ya atası, ya da ərinə məxsus hesab edilirdi. Qadın özünə ər seçmək, özbaşına şəkildə iqtisadi fəaliyyət göstərmək və sərvət toplamaq ixtiyarına malik deyildi. Həqiqətdə, kişinin "mehriyyə" ünvanında və qadının xərcləri və nəfəqəsi kimi verdiyi müəyyən məbləğdəki pul və ya hədiyyələr onun evlilik müddətində qadından öz mənfəəti üçün .istifadə edə bilmək müqabilində verdikləri idi

**İslami hüquq sistemində mehriyyə**

Bundan əlavə, sosioloq və cəmiyyətlə bağlı nəzər bildirənlərin onun barəsində sükut etdikləri beşinci bir mərhələ də mövcuddur. Bu mərhələdə kişi qadınla evlənən zaman ,onun özünə peşkəş olaraq müəyyən bir məbləğ təqdim edir ki

qadının valideynlərindən heç birinin onda təsərrüf etmək haqqı yoxdur. Qadın kişinin təqdim etdiyi həmin məbləği almaqla yanaşı, özünün ictimai və iqtisadi azadlıq və istiqlaliyyətini qoruyub hifz edə bilir. Birincisi, o, ata və qardaşının deyil, öz iradə və ixtiyarı ilə həyat yoldaşı seçə bilir. İkincisi, atasının evində olduğunda necədirsə, ərinin evində də o cürdür, yəni heç kəsin onu istismar etmək və öz xidmətçisinə çevirmək haqqı yoxdur. Onun əmək fəaliyyəti və zəhməti ilə əldə etdiyi sərvət başqasına deyil, özünə məxsusdur və öz hüquqi müamilələrində (ticarətində) kişinin qəyyumluğuna ehtiyac duyulmur. Qadının sadəcə bir vəzifəsi var və o, kişinin cinsi ehtiyaclarını təmin etməkdən ibarətdir və əgər kişi bunun davam etməsini istəyirsə, öz imkanı daxilində .qadının bütün ehtiyaclarını təmin etməyə mükəlləf və vəzifəlidir

Bu mərhələ İslamın qəbul etdiyi mərhələdir və evliliyin təməli həmin məsələyə əsasən .müəyyən edilmişdir

Quranda mehriyyənin başqa bir şəxsə deyi, məhz, qadının özünə aid olduğunu bildirən çoxlu sayda ayələr mövcuddur. Bu cəhətdən, kişi bütün evlilik müddətində qadının məişət ehtiyaclarını təmin etməlidir və qadının öz zəhməti ilə əldə etdiyi gəlir təkcə .onun özünə məxsusdur, nəinki, ata və ya həyat yoldaşına

Bu yerdə mehriyyə məsələsi mübahisəli məsələyə çevrilir. Belə ki, mehriyyə məsələsi qızın atasına aid olduğu zamanlarda qadın bir qul kimi kişinin evinə gedir və əri də onu istismar edirdi. Belə olan halda, mehriyyə qadını atasından almaq fəlsəfəsinə malik idi və nəfəqə və xərclərin ödənilməsi də malikin üzərində sahib olduğu şəxslə bağlı zəruriyyət təşkil edirdi. Əgər qadının atasına mehriyyənin verilməsi və ərinin də onu istismar və ondan iqtisadi mənfəət apara bilməsi nəzərdə tutulmursa, eyni zamanda, qadın kamil bir şəkildə iqtisadi azadlığa malik və hətta, hüquqi baxımdan icazə, qəyyumluq və idarə olunmağa ehtiyaclı deyilsə, mehriyyə verilib nəfəqə ödənməsi nə ?üçün lazımdır

**Tarixə bir nəzər**

Əgər beşinci mərhələdə olan mehr və nəfəqənin fəlsəfəsini

qəbul etmək istəsək, onda, bir qədər əvvəl nəzərinizə çatdırdığımız dörd dövrə diqqət yetirməliyik. Həqiqətdə, bu barədə deyilənlər bir sıra silsilə təşkil edən fərziyyə və təxminlərdən başqa, bir şey deyil. Bu məsələlər nə tarixi, nə də elmi və təcrübi həqiqətlər deyil. Bəzi fəlsəfi fərziyyə və təxminlər bir tərəfə və qərinələr də digər tərəfə dursun, bəşərin həyatı barədəki bu məsələlərin mənbəyinin eradan əvvəl yarandığını söyləmək olar. "Matriarxat" dövrü barədə deyilənlər çox tez bir zamanda inanılası məsələlər deyil, eyni zamanda, qızların ataları tərəfindən satılması və ərləri .tərəfindən də istismar edilməsi həmin məsələlər qismindəndir

Bu fərziyyə və təxminlərlə əlaqədar iki məsələ nəzərə çarpır: Birincisi, bəşəriyyət tarixinin ibtidai dövrlərinin ikrah doğuracaq, fövqəltəbii və insaniyyət xüsusiyyətlərindən kənar şəkildə göstərilməsinə səy edilmişdir. İkincisi, təbiətin öz hədəflərinə çatmaq üçün oynadığı heyrətamiz rol və tədbirləri bütövlükdə görməzdən .gəlinərək diqqətdən qaçırılmışdır

İnsan və təbiətin bu şəkildə bəyan edilməsi qərblilərə yaraşır, amma şərqlilər - əgər Qərbə təqlid etməyin təsiri altına düşməsələr - bu cür izahlardan kənardırlar. Qərblilər xüsusi səbəblərə əsasən, insani keyfiyyətlərə biganə və soyuq yanaşırlar. Onlar tarixdə insanlıq xüsusiyyətlərinin hansısa bir əsas rol oynadığına etiqad bəsləmirlər. Əgər qərblilər iqtisadi sürətlə yerlərindən təkan götürsələr, əlbəttə ki, onlar sadəcə çörək və s. kimi şeyləri görəcəklər. Onların nəzərində tarix elə bir maşına bənzədilir ki, əgər ona çörək (yanacaq) verməsən, hərəkətə gəlməz. Əgər qərblilər cinsi məsələlər baxımından hərəkətə gəlsələr, onların nəzərində insanlıq və bəşər tarixi bütün ali əxlaqi, dini, məzhəbi, ictimai, mədəni xüsusiyyətləri və mənəvi keyfiyyətləri ilə birlikdə şəkil dəyişdirən cinsi oyunlardan başqa, bir şey deyil. Əgər onlar üstünlük tələbi ilə nəzər salsalar, bəşəriyyət tarixi onlar üçün qan tökülməsi və rəhimsizlik xüsusiyyətini .daşıyır

Qərblilər orta əsrlər dövründə din və məzhəblərdən əzab görmüş, diri-diri atəş və tonqalda yandırılmaları müşahidə

edərək əziyyətlərə düçar olmuşdur. Bu cəhətdən, onlar din, məzhəb və Allahın adından, bir sözlə, mənəviyyatdan bəhs edən məsələlərdən vəhşət hissi keçirir və çoxlu sayda elmi nişanə və əsərlərin olmasına baxmayaraq, təbiətin hədəfsiz və dünyanın başlı-başına buraxılmadığını gördüyü zaman, yaradılışın əsas məqsədi .barədə etiraf etməyə cürət etmir

Biz bu fikrdə olan təfsirçilərdən peyğəmbərlərin olmasına - onlar bütün tarix boyu mövcud, insanlıq və ədalət carçısı olmuş və inhiraf və azğınlıqlarla mübarizə aparmışlar və həmin mübarizə də öz səmərəsini vemişdir - iqrar və etiraf etmələrini istəmirik, əksinə onları, ən azı, təbiətin rolundan xəbərsiz və qafil olmamağa çağırırıq. Kişi və qadının münasibətləri tarixində hədsiz dərəcədə zülm və sitəmlərin olduğu şübhəsizdir. Quran onların ən dəhşətli şəkildə olan forması barədə söhbət açmışdır. Bununla yanaşı, tarixin başdan-başa təcavüz və zülümkarlıqla dolu olduğunu .söyləmək olmaz

#### Mehriyyənin həqiqi fəlsəfəsi

Bizim etiqadımıza əsasən, mehriyyə məsələsinin meydana çıxması xilqət və yaradılışda qoyulan hikmətli tədbirin nəticəsidir və o, kişi və qadın münasibətlərinin və onların bir-birinə nisbətdəki bağlılıqlarının tənzimlənməsinə xidmət edir. Yaradılış nizamında kişi və qadının hər biri eşq və məhəbbət məsələsində bir-birindən fərqli rola malikdirlər. İrfanda bu qanunu həyatın bütün sahlərinə aid edir və məhəbbətin, cəzb etmə və cəzb olunmanın bütün məxluqlara hakim kəsilərək təsir etdiyini deyir və onlar arasındakı fərqin yalnız ifa etdikləri funksiya və xüsusi vəzifələrə əsasən müxtəlif olduğunu söyləyirlər. Məsələn, qurmaq və dağıtmaq - onların hər ikisi müxtəlif .tərəflərdə təyin edilmişdir

Biz silsilə təşkil edən on dördüncü məqaləmizdə kişi və qadın arasındakı fərqlilikləri bəyan edən zaman, onların bir-birinə qarşı hiss etdikləri məsələlərin eyni şəkildə olmadığını diqqətinizə çatdırmışdıq. Yaradılış qanununda gözəllik, qürur və ehtiyacsızlıq qadının vücudunda, tələb, ehtiyaclılıq və

məhəbbət kişinin vücudunda qoyulmuşdur. Qadının kişi cisminin güclülüyü müqabilindəki zəifliyi bu yolla aradan qaldırılaraq tarazlaşdırılmış və həmişə kişinin .(qadına elçi getməsinə səbəb olmuşdur (yəni, kişi qadının ayağına gedir

Əvvəlki bəhsimizdə də sosioloqların dediyinə əsasən, istər “Matriarxat” (ana şahlıq) dövrü olsun, istərsə də “Patriarxat” (ata şahlıq), kişilərin qadının sorağınca getdiyini .nəzərinizə çatdırmışdıq

Alimlər kişinin qadından daha artıq şəhvətə malik olduğunu söyləyirlər. Amma islami rəvayət və hədislərdə kişinin yox, əksinə qadının daha şəhvətli olduğu bildirilmişdir. Bununla yanaşı, qadın kişi müqabilində şəhvətini cilovlaya bilmək və səbr etmək baxımından iradəli yaradılmışdır. Hər iki cinsin nəticəsi eynidir. Kişinin qadına nisbətdə qərizələr müqabilində zəif olduğu məlum olur. Bu xüsusiyyət qadına daimi olaraq kişinin arxasınca getməmək və ona tez bir zamanda təslim olmamaq imkanı verir. Amma əksinə, kişinin qadının arxasınca düşməsi və ona ehtiyac duyduğunu bildirərək .bu yolda ilkin olaraq onun razılığını ələ gətirmək üçün addım atmasına səbəb olur

Kişinin atdığı həmin addımlardan biri qadının razılığı və onun verdiyi qərara ehtiram .göstərdiyini bildirmək üçün hədiyyə verməsi olmuşdur

Görəsən, nə üçün erkək cins həmişə dişi cinsə sahib olmaq uğrunda bir-birilə rəqabət apararaq mübarizə etmiş, əksinə müxalif cins heç vaxt bu barədə öz hərisliyini nişan verməmişdir? Çünki erkək və dişi cinsinin malik olduqları rol və funksiya eyni olmamışdır. Erkək cinsdən olanlar həmişə tələbkar rolunu oynayırlar, amma dişi cins isə belə deyil. Onlar heç zaman erkək cinsin ardınca düşmür və özlərini qane və .ehtiyacsız kimi göstərirlər

Mehriyyə qadının həya və iffəti ilə eyni kökə malikdir. Yəni, fitri xüsusiyyətlərə əsasən, ehtiram və ləyaqətinin özünü kişiyə ucuz və müft satmamaq və onun ixtiyarında qoymamaqda olduğunu düşünür, başqa bir ifadə ilə desək, özünü naza qoyaraq şirin satır. Bütün bu xüsusiyyətlər qadının cismi zəifliyinə baxmayaraq, kişini öz ayağına qədər elçi gəlməyə məcbur

etməsinə, kişilərin bir-biri ilə rəqabət aparmasına, özünü kişi üçün əlçatmaz edərək romantik bir eşqin yaranmasına, Məcnunların Leylilərin ardınca düşməsinə və evlilik məqamında kişinin sədaqəti kimi ondan peşkəş və müəyyən məbləğ (mehriyyə) .almasına səbəb olmuşdur

Bəzi vəhşi qəbilələrdə bir qıza talib bir neçə nəfər olduğunda onların "duelə" çağırıldığı da söylənilmişdir. Onlardan hansı biri digərinə qalib gəlsə və ya onu öldürsə, qalib olan həmin qızla evlənmək şansı qazanırdı. Bir müddət əvvəl, qəzetlərdə Tehrandakı bir qızın onunla evlənmək istəyən iki oğlanı duelə məcbur edərək öz yanında onların soyuq silahla bir-birinin canına düşməsinə səbəb olduğu çap edilmişdir. Güc və qüdrəti "qoluzorlu olmaq" hesab edən və kişi və qadın münasibətlərini tarix boyu kişilərin zülm və istismarı ilə əlaqələndirən kəslər zərif və zəif olan belə bir varlığın güclü və qoluzorlu insanları bir-birinin üzərinə saldığına inana bilmirlər. Amma azacıq belə olsa, xilqət və yaradılışın qadınların vücudunda yerləşdirdiyi xüsusiyyətlərlə tanışlığı olan .kəslər bu cür məsələlərə heç də təəccüb etmirlər

Qadının kişilərə təsiri həddən artıqdır. Qadınların təsiri kişinin onlara göstərdiyi təsirlərdən demək olar ki, qat-qat üstündür. Kişi özünün şücaət, qəhrəmanlıq, şəxsiyyət kimi xüsusiyyətlərini zərif və incə məxluq olan qadının həya və iffətinə, özünü naza çəkməsinə borcludur. Həmişə qadın kişinin islah edilməsinə çalışmışdır, kişi də cəmiyyətin. Əgər qadınlar öz həya və iffətlərindən keçərək kişi rolunu ifa etməyə çalışarlarsa, birinci zərbə elə qadının özünə dəyər və sonra kişilər öz .kişiliklərini unudar və nəticədə, cəmiyyət dağılmağa başlayar

Qadınlara tarixlər boyu öz şəxsiyyətini hifz edib qorumasını, kişilərin ardınca düşməməsini, kişilərin isə onların ayağına elçiliyə gəlməsini təmin edən, özü uğrunda kişilərin bir-birilə rəqabət edərək ölənə qədər vuruşmaq məcburiyyətində qoyan, həya və iffəti qadının şuarı olaraq müəyyənləşdirən və öz bədənini kişidən gizlədərək özünü sirli nümayiş etdirməsinə səbəb olan qüvvə kişinin eşq və məhəbbətinin, onun şücaətli

olmasının meydana çıxmasına, qadına sevgi və məhəbbət göstərməsinə, qadın müqabilində təvazökarlıq etməsi və öz çarəsizliyini bildirməsinə bais olmuşdur, eyni zamanda, həmin qüdrət evlilik zamanı kişini qadına “mehriyyə” adlı bəxşiş təqdim .etməyə məcbur etmişdir

Mehriyyə xilqət qanununda qoyulan və müəyyən edilən maddələrdən biridir və o, .məxluqatın əli ilə həyata keçirilmişdir

**Quranda mehriyyə**

Beşinci mərhələ ilə bağlı bəhsimizdə dediyimiz kimi, mehriyyəni Quran ixtira və kəşf etməmişdir. Mehriyyə xilqətin ixtirasıdır. Quranın bu zəminədə həyata keçirdiyi iş onu (mehriyyəni) fitri halına qaytarmaq olmuşdur. Qurani-kərimdə zəriflik və lətifliklə belə :buyurulur

{وَآتُوا النِّسَاءَ صَدُقَاتِهِنَّ نِحْلَةً}

Qadınların mehriyyələrini onlara könül xoşluğu ilə və bir hədiyyə kimi, verin (halbuki,“ bu, sizin boynunuzda vacib bir haqq, onlar üçün isə ilahi bir bəxşişdir). Əgər onlar könül (xoşluğu ilə ondan sizə bir şey bağışlasalar, onu nuşcanlıqla xərcləyin. “(١

Yəni, ayədə bildirilmək istənilən məsələ mehriyyənin qadınların ata və qardaşlarına deyil, məhz, onların özlərinə aid olduğudur. Quranda bu ayə ilə üç əsas mətləbə işarə :edilmişdir

suduqə” sözündən istifadə olunmuşdur. Bu söz(صدُقه) “ ,Birincisi, ayədə mehriyyə deyil “sidq” kökündəndir və mehriyyəyə “sidaq” deyilməsi kişinin qadına qarşı münasibətinin həqiqiliyi və ona vəfalı olduğunu bildirmək üçündür. “Kəşşaf” əsərinin müəllifi kimi bəzi təfsirçilər həmin məsələyə açıq-aşkar işarə etmişlər. “Mufrədatu ğəribil-Quran” əsərinin müəllifi Rağib İsfahaninin dediklərinə əsasən, mehriyyənin yuxarıdakı kimi adlandırılmasına səbəb imanın doğruçuluğudur (həqiqiliyi). İkincisi, eyni zamanda, hunnə) əvəzliyi ilə) (هُنَّ) həmin sözü

işlətmək mehriyyənin qadının ata və anasına deyil, xüsusən, onun özünə aid olduğunu bildirmək üçündür. Mehriyyə uşağa süd vermək, onu böyüdüb boya-başa çatdırmaq nihlə) sözünün istifadə edilməsi ilə) نِحْلَةً ,üçün qadına verilən muzd deyil. Üçüncüsü qadına verilən mehriyyənin peşkəş və hədiyyə ünvanından başqa, heç bir məqsəd .daşımadığı aşgarcasına bildirilmişdir

**(Heyvanların hislərindəki ikililik (ziddiyyət**

Hislərdəki ziddiyyət məsələsi sadəcə insanlara məxsus deyil. Bütün canlılarda iki müxtəlif cinsin mövcudluğu qanunu hökmran olmasına baxmayaraq, iki cins bir-birinə ehtiyaclı olsalar da, erkək cinsi dişiyə nisbətdə daha ehtiyaclı xəlq edilmişdir, yəni onun hisləri öz növbəsində erkək cinsin dişi cinsin razılığını ələ gətirməsində ilkin addım atmasına səbəb olmuş və iki cins arasındakı rabitə və münasibətlərin tənzimlənməsini təmin etmiş və erkək cinsin öz güc və qüdrətindən sui-istifadə edilməsinə maneə .yaradılmış və onun təvazökar olmasına xidmət etmişdir

**Qeyri–qanuni (şəri olmayan) münasibət və rabitələrdə hədiyyə və bəxşişlər**

Hədiyyə və bəxşişlərin verilməsi məsələsi təkcə evlilik münasibət və rabitələri və şəri olan əhd-peyman ilə məhdudiyyət təşkil etmir. Kişi və qadının hər ikisi qeyri-şəri münasibətlərdə də bir-birlərinin vücudundan ləzzət almaq istədikdə, başqa bir ifadə ilə desək, azad eşq və məhəbbət yaşadıqlarında da kişi qadına hədiyyələr təqdim edir. Əgər hansısa bir restoranda yemək yeyib bir fincan qəhvə içsələr, kişi öz vəsifəsini - hesabı özünün ödəməli olduğunu - yaxşı bilir və qadın kişi üçün pul xərcələməyi özündən sui-istifadə kimi başa düşür. Kişinin əyyaşlığı onun mal və pulunu çoxluğundan yaranır. Qadında isə bu məsələ onun hədiyyə və bəxşişlər əldə etmək vəsiləsidir. Bu cür məsələlər (hədiyyə verilib hədiyyə

alınması) qeyri-qanuni və qeyri-şəri münasibət və rabitələrdə də icra edilir və həmin məsələlər kişi və qadının bir-birinə nisbətdəki hislərinin bənzərlik təşkil etməməsindən .qaynaqlanır

### Fransızların məşuqəbazlıqları onların evliliklərindən daha təbii şəkildədir

Hüquq bərabərliyi adı ilə ailə hüquqlarının öz təbii halətindən xaric edildiyi, kişi və qadın hüquqlarının oxşar və eynisəviyəli olmasına çalışıldığı və ailə həyatında onların öhdəsinə eyni şəkilli vəzifələr oyulan Qərb dünyasında azad eşqdən, saziş və razılaşmaya söykənən qanunların qəbul edilməsindən söz düşdükdə, onları heç də öz təbii halətindən xaric etmirlər. Yəni, kişi elə əvvəlki funksiyası olan pul xərcləmək, tələbkarlıq və qadının ehtiyaclarını ödəməyi öz üzərinə götürməsini - nəzərinizə çatdırırıq ki, fransızlarda mehriyyə məsələsi yoxdur və onlar ağır məişət xərclərini qadınların öhdəsinə qoyur və bu halda belə, qeyd etdiklərimizi yerinə yetirirlər - həyata keçirir. Deməli, fransız qadının fransız kişi ilə məşuqə rolunu oynamasının .təbiiliyi evli olmağın təbiiliyindən daha artıqdır

Mehriyyə məsələsinin mövcudluğu kişi və qadının bir-birinə bənzəməyən istedadlara malik olararaq xəlq edildiyini nişan verir, eyni zamanda, xilqət qanunu onların .ixtiyarında bənzərsiz hüquqlara sahib olduqlarını göstərən sənədlər qoymuşdur

### Mehriyyə və nəfəqə

Əvvəlki bəhsimizdə mehriyyənin necə yarandığı barədə sizə məlumat verdik. Aydın oldu ki, həmin məsələ xilqət və yaradılışda kişi və qadının öhdəsinə müxtəlif vəzifə və hüquqların qoyulması səbəbilə yaranmışdır. Eyni zamanda, onun kişinin hökmran və əmiranə hislərindən deyil, zərif hislərindən meydana gəldiyini də söyləmək lazımdır. Qadının bu məsələdəki dəxaləti onun özünü kənara çəkməsi olmuşdur, nəinki, zəiflik və iradəsizliyi. Mehriyyə xilqət və yaradılış qanununda qadının səviyyəsini yüksəltmək və onun dəyərini artırmaq üçün təyin edilmişdir. Mehriyyə qadına şəxsiyyət əta

etmişdir. Onun (mehriyyənin) mənəvi cəhətdən dəyəri maddi olan dəyərindən qat-qat .artıqdır

### İslamda aradan qaldırılmış olan cahiliyyət adət–ənənələri

İslamda cahiliyyətə məxsus olan mehriyyə adət-ənənələri aradan qaldırılmış və öz əvvəlki təbii vəziyyətinə qaytarılmışdır. Cahiliyyət dövründə mehriyyə qadına verilən "zəhmət haqqı" və "uşağın süd pulu (haqqı)" kimi tanınırdı. "Kəşşaf" və digər təfsirlərdə yazılmışdır ki, əgər kiminsə bir qızı dünyaya gəlirdisə, digəri ona bu şəkildə təbrik Sərvətinin artmasına səbəb olan bu hadisə sənə mübarək olsun","هنيـاً لك النّافجهٌ :deyirdi yəni bu, qızın evlənmək vaxtı çatdığında, onun üçün çoxlu mehriyyə verəcəklərinə .işarə olaraq deyilən kinayə (bənzətmə) idi

Cahiliyyət dövründə qızın atası, onun olmadığı müdətdə isə qardaşı bir tərəfdən, qəyyum və himayəçi hesab olunduğundan qızı onun istəyi ilə deyil, öz isəyi ilə istədiyi şəxlə evləndirir, digər tərəfdən də, mehriyyəsini qıza aid yox, özünə şamil olduğunu düşünürdü. Bu cəhətdən, onlar qızları digər qızlarla evlənmək üçün əvəz edirdilər (əvəz-əvəz olan evlilik) Onlardan biri digərinə deyirdi ki, mən öz qızım və ya bacımı sənin əqdinə keçirirəm və sən də əvəzində qızın və ya bacını mənim əqdimə keçirt və hər ikisi bunu qəbul edirdi. Bu minvalla, qızlardan hər biri digəri üçün mehriyyə hesab edilir və ata və ya qardaşa aid hesab olunurdu. Belə formada olan nikahı "şiğar" nikahı adlandırırdılar. İslam bu şəkildəki nikahı ləğv etdi. Peyğəmbər (s) bu barədə buyurmuşdur: "İslamda qız və ya bacının evlənmək üçün digər qadınlarla əvəz ".olunması qadağandır

İslami rəvayətlərdə qızın mehriyyəsindən əlavə, evlilikdə ataya verilməsi üçün ayrıca olaraq nəyinsə nəzərdə tutulmasının da düzgün olmadığı nəql edilmişdir. Yəni, atanın qızından bu yolla mənfəət əldə etmək haqqının olmadığı bildirilmişdir, hətta, .mehriyyədən əlavə olaraq nəsə nəzərdə tutulsa belə

İslamda kürəkənin qayınata yanında evlənmək üçün müəyyən müddət çalışması – əvvəlki bəhslərdə həmin məsələ ilə bağlı sosioloqların söylədikləri nəzəriyyələri .diqətinizə çatdırmışdıq – da qadağan edilərək ləğv olunmuşdur

Kürəkənlərin qayınata yanında çalışmasının təkcə qız atasının onlardan fayda və mənfəətlər əldə etmək istəməsi ilə ölçülməməlidir. Bu məsələnin mədəniyyət və sivilizasiyanın inkişaf və tərəqqi etdiyi mərhələ ilə də əlaqə və rabitəsi olmuşdur və biz həmin məsələni sadəcə öz növbəsində kişilərə edilən zülm kimi qiymətləndirməməliyik. Hər halda, bu cür adət və ənənələrin qədim dünyada mövcud .olduğunu inkar edə bilmərik

Qurani-kərimdə həzrət Musa (ə) və Şüeyb peyğəmbər (ə) arasındakı macəranın nəql edilməsi dediyimiz məsələlərin cəmiyyətdə olmasını bir daha sübut edir. Həmin :macəra belədir

Həzrət Musa (ə) Misiri tərk etdiyi zaman Mədyən quyusuna gedib çatır və orada Şüeyb peyğəmbərin (ə) qızlarının qoyunlarını sulamaq üçün növbə gözlədiyini və digərlərinin buna riayət etmədiyini gördükdə, onlara quyudan su çəkir. Qızlar atalarının yanına qayıtdıqdan sonra baş verən əhvalatı ona danışırlar. Həzrət Şüeyb (ə) qızlarından birini Musanın (ə) arxasınca göndərir və onu öz evinə dəvət edir. Bir-biri ilə tanış olduqdan sonra, günlərin birində Şüeyb (ə) Musaya (ə) deyir: “Mən istəyirəm iki qızlarımdan birini səninlə evləndirim və şərtim sənin səkkiz il (və əgər istəsən, iki il də əlavə etməklə cəmi on il) mənim yanımdan qalıb işləməyindir. Musa (ə) şərti qəbul etdi və bu ”.minvalla, Şüeybin (ə) kürəkəni oldu

:Belə adətlər hələ o zamanlarda mövcud idi və o, iki məsələdən qaynaqlanırdı

Birincisi, sərvətin olmaması məsələsi idi. Kürəkənin qadın və ya onun atası üçün göstərə biləcəyi xidmət sadəcə onlara işləmək idi. İkincisi, atanın öz qızına cehiz vermək adəti vardı. Sosioloqların dediklərinə əsasən, atanın qızına cehiz verməsi çox-çox qədimlərə gedib çıxır və onun yaşı qədimdir. Ata qızına cehiz verə bilməsi üçün ,kürəkəni icarə edir (əcir tuturdu).və ya ondan müəyyən miqdarda pul alırdı. Həqiqətdə

.atanın pul alması qadın və onun xeyri üçün əməldə həyata keçirilən bir iş idi

İslamda bu qayda ləğv edilərək aradan qaldırıldı. Beləliklə, atanın qızının mehriyyəsini, hətta, onun xeyrinə istifadə və sərf etmək məqsədilə belə olsa, özünə aid etmək haqqı yoxdur. Əslində, mehriyyəni istədiyi kimi məsrəf edə bilmək haqqına sahib olan şəxs qızın özüdür. Hədislərdə mehriyyənin bu cür məyyən edilməsinin İslamın mövcud .olduğu zamanlarda rəva görülmədiyi də bildirilmişdir

Cahiliyyət dövründə bir sıra digər adətlər də var idi ki, qadınların mehriyyədən məhrum edilməsinə səbəb olurdu. Həmin adətlərdən biri zövcənin irs aparılması idi. Bir nəfər vəfat etdiyi zaman onun övladları, qardaşı, atası və s. qohumları ondan sərvətini irs apardığı kimi, qadını da irs aparırdılar. Şəxs öldüyündə ya onun oğlu, ya da qardaşı onun qadının başqa biri ilə evləndirmək və bu yolla mehriyyə əldə etməkdə özünü haqlı və səlahiyyətli hesab edir və yaxud əvvəlki ərinin verdiyi mehriyyəyə .əsaslanaraq və heç bir mehriyyə vermədən onu öz nikahına keçirirdi

:Quran qadının irs aparılması məsələsini ləğv edərək buyurur

{يا أَيها الَّذِينَ آمَنُوا لَا يحِلُّ لَكُمْ أَنْ تَرِثُوا النِّسَاءَ كَرْهًا}

Ey iman gətirənlər, (ərləri ölmüş) qadınları zorla (cahiliyyət adətlərinə uyğun olaraq“ (ərlərinin malları kimi) irs aparmağınız halal deyil.” (١)

Quran demək istəyir ki, ey iman gətirən şəxslər, varisləriniz olan qadınları özünüzə irs götürməyin. Onların sizin qadınınız olmağa meylləri yoxdur. Digər ayələrdə də Quranda oğulun atanın arvadı ilə evlənməsi qadağan edilmişdir, hətta, onlar azad şəkildə də bir-biri ilə evlənmək istəsələr də, buna icazə verilmir. Quranda belə :buyurulur

{وَلَا تَنْكِحُوا مَا نَكَحَ آبَاؤُكُمْ}

Atalarınızın evlənmiş olduğu qadınlarla - (cahiliyyət dövründə olub) keçən istisna“ (olmaqla - evlənməyin.”(٢)

İslamda qadınların mehriyyəsinin aradan qaldırılmasına səbəb olan hər bir qanun ləğv

xoşu gəlməyən bir kişi ona əziyyət və işkəncə verirdi və onun bu işdə məqsədi qadına verdiyi mehriyyənin bir qismini, ya da hamısını geri almaq və qadını boşanma və talaqa :razı salmaq idi. Quranda bu barədə buyururlur

{وَلَا تَعْضُلُوهُنَّ لِتَذْهَبُوا بِبَعْضِ مَا آتَيْتُمُوهُنَّ}

Eləcə də mehriyyə olaraq) onlara verdiklərinizin bir hissəsini (əllərindən) almaq üçün)“ onları (ərləri olduğunuz qadınları), (itaətsizlik və zina kimi) aşkar və çirkin bir iş görmələri istisna olmaqla, sıxıntıda qoymayın (amma aşkar şəkildə çirkin bir iş görmüş (olsalar onları halal yollarla sıxıntıda qoymaqla onlardan bir şey ala bilərsiniz). ”(١)

Qadına edilən zülmlərdən biri də kişi onunla evlənmək istədikdə, onun üçün həddən artıq mehriyyə verməsi, ondan kam aldıqdan və soyuduqdan sonra yeni bir qadınla evlənmək eşqinə düşməsi və bu yolda ona töhmət vuraraq zina və fahişəlikdə ittiham etməsi idi. Kişi beləliklə, talaqa can atır, onun heysiyyət və şərafətinə ləkə vurur və .verdiklərini ondan geri almaq məqsədi ilə bu cür işlərə əl atırdı

### İslamın mehriyyə sistemi onun özünə məxsusdur

İslamın aşkar məsələlərindən biri kişinin qadının mal və əldə etdiyi mənfəətdə haqqının olmamasıdır. Ona nə hansısa bir işi görməsi üçün göstəriş verə bilər, nə də qadın gördüyü hansısa bir işlə sərvət əldə edərsə, həmin sərvəti qadınının razılığı olmadan məsrəf edə bilməz. Bu cəhətdən kişi və qadının hüquqları eyni və bərabərdir. İyirminci əsrin əvvəllərinə qədər məsihi dininə malik Avropada tətbiq edilən qaydaların xilafı və əksinə, İslamda evli olan bir qadın öz ticarət və hüquqi münasibətlərində kişinin qəyyumluq və idarəçiliyinə ehtiyac duymur. Ticarət məsələlərini (müamilələrini) həyata keçirməkdə onun kamil bir azadlıq və istiqlaliyyəti vardır. İslam dini qadına kişinin müqabilində bu cür iqtisadi azadlıq verməsi və kişiyə onun ticarət və iş fəaliyyətindən əldə etdiyi gəlirindən istifadə haqqının olmamasını bildirdiyi halda, .qadının mehriyyə məsələsini ləğv etməmişdir



---

.Həmin surə, ayə ١٩ . [١]-١

Bu məsələnin özü İslam dininin nəzərində mehriyyənin qadının vücudundan iqtisadi mənfəətlər xatirinə istifadə və onun istismar edilməsi üçün verilmədiyini bir daha sübut edir. Buradan İslamın özünəməxsus şəkildə mehriyyə sisteminin mövcud olduğu məlum olur. Bu mehriyyə sistemi və onun fəlsəfəsini digər mehriyyə sistemi ilə qarışdırmaq olmaz, eyni zamanda, həmin sistemlərə tutulan iradlar islami mehriyyə sisteminə şamil deyil.

**Fitrət dini**

Əvvəlki məqalədə bildirdiyimiz kimi, mehriyyə qadına verilən peşkəş və hədiyyədir. Quran bu məsələni zəruri hesab edir. Quranda fitrətin rəmzələrindən hesab edilən məsələlərə kamil şəkildə diqqət edilmiş və hər bir kişi və qadının bir-birinə nisbətdə öhdələrinə qoyulmuş olan xüsusi təbii məhəbbət və maraq rolunu unutmamış, eyni zamanda, mehriyyənin zəruriliyi məsələsinə israr edilmişdir. Qadının ifa etdiyi rol kişinin məhəbbətinə cavab verməkdən ibarətdir. Əlbəttə, qadının məhəbbəti kişinin məhəbbəti müqbilində ona reaksiya kimi olsa yaxşıdır, nəinki, ibtidai şəkildə. Qadının ibtidai məhəbbəti dedikdə, kişi ona aşiq olduğunu elan etməzdən əvvəl qadının öz məhəbbətini bildirməsidir. Bu məsələ hansısa bir kişinin ona öz məhəbətini bildirdikdə, qadında yaranan sevgidən fərqli olaraq qadının şəxsiyyətinin zədələnməsinə və onun eşq və məhəbbətinin müvəffəqiyyətsizliyə düçar olmasına gətirib çıxarır.

Əlbəttə, kişinin sevgisinə cavab olaraq qadında yaranan sevgi heç vaxt onun şəxsiyyət və mənliyinə zərbə vurmaz və müvəffəqiyyətsizlik və uğursuzluqla da nəticələnməz. Görəsən, qadının vəfalı olmaması doğrudurmu? Qadın məhəbbətlə bağlı əhd-peymanda süstlük edirmi? Biz qadının məhəbbəti və sevgisinə etimad etməməliyikmi?

Bu məsələ həm doğrudur, həm yanlış. Məhəbbət qadın tərəfdən başlamış olsa, uğursuzluqla nəticələnəcək. Əgər qadın ilkin olaraq bir kişiyə aşiq olaraq ona qəlbini versə, məhəbbət alovu tez soyuyub sönəcək Bu şəkildə olan eşqə etimad etmək olmaz. Əksinə, qadının eşq və məhəbbəti kişinin sevgisinə

cavab olaraq meydana gələrsə, bu məhəbbət müvəffəq və uğurlu olacaqdır. Əgər kişinin qadına qarşı sevgi alovu sönsə, bu zaman qadının da məhəbbəti bitəcəkdir. Qadının məhəbbəti bu növdən olan məhəbbətdir. Qadının vəfasız kimi tanınmasına səbəb olan məhəbbəti yuxarıda qeyd etdiyimiz məhəbbətin birinci növündən, amma vəfalı kimi tanınmasına səbəb olan eşqi ikinci növdəndir. Əgər cəmiyyətdə evlilik məsələlərinin daha da möhkəm olmasını istəyiriksə, Quranın dediyi üsullardan istifadə etməkdən başqa, çarəmiz yoxdur. Yəni, kişi və qadının hər birinə məxsus olan funksiyaları nəzərə almaq və fitri qanunlara riayət etmək lazımdır. Mehriyyə qanunu təbiətlə uyğunluq təşkil edir və kişinin qadına olan məhəbbətinin ilkin olaraq başladığını və qadının məhəbbətinin onun sevgisinə cavab verdiyini göstərir və beləliklə, kişi qadına ehtiram əlaməti kimi mehriyyəni hədiyyə ünvanında ona təqdim .edir

Bu səbəbdən, mehriyyə qanunu – təbiət tərəfindən müəyyən edilən ümumi bir nizamnamədir – kişi və qadın hüquqlarının bərabərliyi adı ilə ləğv edilib aradan .qaldırılmamalıdır

Diqqət etdiyiniz kimi, Quran cahiliyyət dövrlərindəki mehriyyə qanun və adətlərini tamamilə dəyişdirmişdir. İslamın gətirdiyi mehriyyə ilə əlaqədar qanunlar cahiliyyət qanunları deyildi ki, biz onun olub-olmaması arasında fərq qoyulmadığını söyləyə bilək. İslam mehriyyəni tamamilə aradan qaldıra və kişiləri onu verməkdən azad edə bilmək .imkanına malik olmasına baxmayaraq, bu işi görməmişdir

**İradlar**

İndi İslamın mehriyyə ilə bağlı nəzəri və fəlsəfəsinin nə olduğunu bildiyiniz və onun barəsində tanış olduğunuza görə, İslamın bu qanunlarına irad tutan kəslərin sözlərini .də eşitməyiniz yaxşı olardı

Xanım Manuçehriyan "İran konstitusiyası və ictimai qanunlarına irad" adlı kitabının "Mehriyyə" adlı fəslində belə yazır: "Kişi bağ, ev, at və s. şeyləri almağa pul ödədiyi kimi, qadını almaq üçün də pul xərcləməlidir. Ev, bağ və atın qiymət

və dəyəri onun yaraşıq və gözəlliyinə görə fərqləndiyi kimi, qadının da dəyəri gözəllik, yaraşıq, imkanlı və fəqir olmasına görə dəyişiklik və fərqlərə malikdir. Bizim qanunvericilikdə xidmət göstərən cəsarətli və mərd məmurlarımız qadının qiyməti ilə bağlı on iki maddə müəyyən etmişlər. Həmin qanununların fəlsəfəsi pula əsaslanır və ”.işin içində pul olmasa, evliliyin əsasları tab gətirməyərək dağılmağa məhkumdur

Əgər mehriyyə qanunları əcnəbilər tərəfindən təyin edilsəydi, görəsən, onda da bu qədər töhmət vuraraq iftira atardılarmı? Bəyəm, bir şəxs digərinə pul versə, bu, onu satın almaq mənasındadırmı? Belə olduğu təqdirdə, hədiyyə və peşkəş vermək adət-ənənəsini ortadan qaldırmaq lazımdır. Bizim ictimai qanunlarımızda mehriyyə ilə bağlı təyin edilən qanunlar Qurana əsaslanır və Quran mehriyyənin hədiyyə və peşkəşdən başqa, bir rola malik olmadığına açıq-aşkar işarə etmişdir. Eyni zamanda, İslam iqtisadi qanunları kişinin qadından öz mənafeyi üçün istismarçı şəkildə istifadə edə bilməyəcəyi şəkildə tənzim edilmişdir. Belə olduğu halda, mehriyyəni qadının qiymət ?və dəyəri adlandırmaq necə mümkündür

Bəlkə də, siz demək istəyirsiniz ki, iranlı kişilər qadınlardan özlərinin iqtisadi mənafeyi üçün istifadə edirlər. Mən özüm də məsələnin bu cəhətini qəbul edirəm, amma bunun mehriyyə qanununa nə aidiyyatı vardır? Kişilər mehriyyə ödədikləri səbəbi ilə qadınlara hakim olduqlarını söyləmirlər. İranlı kişinin iranlı qadın üzərində hakim olmasının digər yönləri mövcuddur. İnsanları islah etmək yerinə, nə üçün fitrət qanunu məhv edib aradan qaldırmağa səy göstərirlər? Bu şəkildə söylənilən bütün sözlərdə bir məqsəd və hədəf yerləşdirilmişdir və həmin məqsəd iranlıların və şərqlilərin öz həyat fəlsəfəsi, insanlıq meyarları və yaşayış qanunlarını unudaraq əcnəbilərin xasiyyət və şəklini (formasını) özünə götürsün və Qərbin rahatlıqla uda biləcəyinə hazır olan bir .tikəyə çevrilsin

Xanım Manuçehriyan deyir: “Əgər qadın iqtisadi baxımdan kişi ilə eyni və bərabər səviyyədə olarsa, bizim onun üçün nəfəqə və mehriyyə ödəməyimizə nə ehtiyac vardır? Kişilər üçün belə məsələlər meydana gəlmədiyi kimi, qadınlar üçün də

”.həmin məsələlər nəzərdə tutulmamalıdır

Əgər bu sözləri daha yaxşı şəkildə araşdırsaq, onun mənası “qadının iqtisadi azadlıq və istiqlaliyyəti olmadığı zamanlarda mehriyyənin verilməsi zəruri və ehtiyac duyulan idi, amma indi qadın (İslamın ona əta etdiyi kimi) iqtisadi azadlığa malik olduğu bir zamanda, mehriyyə və nəfəqəyə heç bir ehtiyac yoxdur” - olacaqdır. Adı çəkilən xanım mehriyənin fəlsəfəsini qadının aradan qalxmış olan iqtisadi azadlığı müqabilində verilən pul kimi başa düşmüşdür. Həmin şəxsin bu sözləri sözyləməzdən əvvəl, Qurandakı ayələrə müraciət edərək onun bu barədə nə demək istəməsini nəzərdən keçirməsi və ölkəmizdəki Qurana əsaslanan belə ali qanunların olduğunu düşünərək ?fəxr etməsi lazım gəlmirdimi

Qırx təklif” müəllifi “Günün qadını” jurnalının səksən doqquzuncu sayının yetmiş birinci“ səhifəsində cahiliyyət dövründə qadınların pis vəziyyətini xatırlatdıqdan sonra, İslamın qadına bu sahədə göstərdiyi xidmətdən danışaraq yazır: “Qadın və kişinin bərabər və müsavi şəkildə xəlq edilməsi səbəbi ilə onlardan birinin digərinə müəyyən məbləğ ödəməsi məntiqi və əqli dəlillərə sığmır, çünki kişinin qadına ehtiyacı olduğu kimi, qadının da kişiyə ehtiyacı vardır. Yaradan onların xilqətini bir-birinə ehtiyaclı şəkildə müəyyən etmişdir və onlar bu məsələdə bərabər hüquqlara malikdirlər. Belə olduğu halda, onlardan birinin digərinə müəyyən məbləğ ödəməsinin zəruriliyinə heç bir dəlil yoxdur. Amma qadına talaq vermək haqqının kişinin ixtiyarında olması və ehtiyaclarını ödəməkdə kişi ilə müştərək olmadığı üçün, ona ərinə etimad etmək və onun vasitəsi ”....ilə maddi baxımdan təmin olunmaqda haqq qazandırılmışdır

Yetmiş ikinci səhifədə isə belə deyir: “İctimai qanunun ١١٣٣-cü maddəsində deyilən “kişi istədiyi bir vaxtda qadına talaq verib onu boşaya bilər” məsələsi islah olunaraq talaq vermək haqqı kişinin istəyinə şamil edilməzsə (aid olmazsa), mehriyyə məsələsi özünün var olmaq fəlsəfəsini əldən verərək itirəcəkdir.” Əvvəldə dediyimiz sözlərdən bu məsələlərin əsassız olduğu sübuta yetirilmişdir. Mehriyyənin əqli dəlillərə

söykəndiyi və onun kiminsə dəyər və qiyməti olmadığı məlum məsələdir. Eyni zamanda, kişi və qadının bir-birinə nisbətdə bərabər hüquqlara malik olmadığı və xilqətin onları iki müxtəlif şəkildə yaratdığını da nəzərinizə çatdırmışdıq. Ən çox insanın diqqətini çəkən və onun söylədiyi ən əsassız məsələ mehriyyəni talaq müqabilində qadın üçün maddi vəsiqə kimi görməsi və İslamın mehriyyəni bu cəhətdən təyin .etdiyini deməsidir

Belə düşünən insanlardan "İslam kişiyə talaq haqqını nə üçün vermişdir ki, qadın maddi vəsiqəyə ehtiyac duysun?" - sualını soruşmaq lazımdır. Bundan əlavə həmin sözlərin mənası bu cürdür: "Peyğəmbərin (s) öz qadınlarına mehriyyə verirməsinin səbəbi onlara özü müqabilində maddi vəsiqə əta etmək idi və ya həzrət Əli (ə) və xanım Fatimənin (ə) evliliyində həzrət Əlinin (ə) o həzrətə mehriyyə verməsi onun ".fikrinin asudəliyi və əmin olması üçün idi

Əgər məsələ belədirsə, onda, nə üçün peyğəmbər (s) qadınlara çox savabı olduğundan, mehriyyəni kişilərə bağışlamaq tövsiyəsi edirdi? Bundan əlavə, qadınların mehriyyəsinin çox olmamasını da niyə tövsiyə edirdi? Görəsən, kişinin qadına mehriyyə adı ilə hədiyyə verməsi və qadının onu ərinə bağışlaması İslam peyğəmbərinin (s) nəzərində kişi ilə qadın arasında evlilik münasibətlərinin möhkəmləndirilməsi və onların bir-birinə məhəbbətlərinin artmasından başqa, ?hansısa bir məna kəsb edirdimi

Əgər İslamın nəzərində mehriyyə maddi vəsiqə rolunu daşıyırsa, onda, nə üçün o, (asimani kitabda (Quranda

وَآتُواْ النَّسَاء صَدُقَاتِهِنَّ وثيقه

hədiyyə) deyə buyurur? Bunlar bir) {وَآتُوا النِّسَاءَ صَدُقَاتِهِنَّ نِحْلَةً} vəsiqə) kimi deyil, əksinə) kənara dursun, qeyd etdiyimiz müəllif mehriyyə adət-ənənəsinin İslamın əvvəllərində .də indiki kimi olduğunu düşünmüşdür

Günümüzdə mehriyyə daha çox zamin və öhdəçilik yönünə malikdir, yəni kişi müəyyən bir məbləği mehriyyə adı ilə əqd və sənədə əsasən öz öhdəsinə götürür və qadın da, adətən, onu evlilik müddətində kişidən tələb etmirdi. Amma müəyyən

münaqişə və ixtilaflar (məsələn, talaq kimi) meydana çıxdığı zaman, istəyə bilərdi. Bu şəkildə olan mehriyyələrin maddi vəsiqə xüsusiyyətinə malik olması mümkündür. İslamın əvvəllərində qayda belə idi ki, kişi öhdəsinə götürdüyü mehriyyəni nağd olaraq ödəyirdi. İslamın mehriyyəni qadın üçün maddi vəsiqə ünvanında heç vaxt nəzərdə tutmadığını bir daha sizə xatırladırıq. Tarixdə İslam peyğəmbərinin (s) hansısa br qadını mehriyyəsiz olaraq kişinin nikahına keçirməyə razı olduğu görülməmişdir. Əhli-sünnə və şiə kitablarında bu barədə azacıq fərqlə aşağıdakı bir macəra qeyd edilmişdir: "Bir qadın Peyğəmbərin (s) xidmətinə yetişdi və camaatın arasında ayağa qalxaraq dedi: "Ey Peyğəmbər! Məni özünə qadın olmaq üçün qəbul et. Peyğəmbər (s) qadının bu sözləri qarşısında sükut edərək heç bir şey demədi və qadın yerində əyləşdi. Səhabələrdən olan bir kişi ayağa qalxdı və dedi ki, ey Allahın peyğəmbəri (s), əgər siz qəbul etmək istəmirsinizsə, mən onunla evlənməyə hazıram. Peyğəmbər (s) ondan mehriyyə olaraq nə verə biləcəyini soruşduqda, kişi heç bir şeyi olmadığını söylədi. Peyğəmbər (s) ona evə gedib mehriyyə üçün bir şey gətirməsini söylədi. Kişi evə gedib qayıtdıqda, heç nə tapa bilmədiyini o həzrətə bildirdi. Peyğəmbər (s) bir daha ona gedib evi araşdırmasını və sadə bir üzük belə olsa, onun kifayət edəcəyini tapşırdı. Həmin şəxs ikinci dəfə gedib gəldikdə, kor peşman heç nə tapmadığını, amma əynindəki libası mehriyyə olaraq verməyə hazır olduğunu dedi. Onu tanıyan səhabələrdən biri Peyğəmbərə (s) dedi ki, ey Allahın peyğəmbəri (s), Allaha and olsun, onun bundan başqa, paltarı yoxdur, mehriyyəni paltarının yarısı təyin edin. Həzrət belə olan halda hər ikisinin paltarsız qalacağını söyləyərək mümkün olmadığını bildirdi. Kişi öz yerində əyləşdi. Həmçinin, qadın da intizar halında, öz yerində oturmaqda idi. Məclis əhli başqa bir məsələ ilə maraqlanmaqda idi və bu uzun çəkdi. Həmin şəxs yerindən qalxıb getməyə hazırlaşanda Peyğəmbər (s) onu yanına çağırıb Qurandan bir şey bilib-bilmədiyini soruşdu. O, cavabında bir neçə bildiyi surənin adını çəkdi. Peyğəmbər (s) məsələnin həll edildiyini

bildirərək qadını həmin kişinin əqdinə keçirdi və onunla şərt kəsdi ki, qadına Quranı öyrətsin. Kişi ilə qadın sevincək halda evlərinə getdilər. "Mehriyyə məsələsi başqa bir ".məsələdir və biz burada sözhbətimizi bitiririk

## Mehriyyə və nəfəqə

İslamın mehriyyə və onun fəlsəfəsi barədəki nəzərini sizə bəyan etdik. İndi isə növbə nəfəqə məsələsi barədə bəhs etməyindir. Əvvəlcə, bilmək lazımdır ki, nəfəqənin də özünəməxsus xüsusiyyətləri vardır və biz qeyri-islami dünyada baş vermiş və baş verəcək məsələlərlə onu qarışıq salmamalıyıq. Əgər İslam kişiyə qadını öz xidmətinə keçirərək onun əməyinin zəhmətini, bir sözlə, istehsalda ələ gətirdiyi sərvəti özünə məxsus etmək haqqı versəydi, kişinin qadına nəfəqə vermək məsələsi və onun fəlsəfəsi tamamilə aydın olardı. Yəni, insan hansısa digər bir insanı və ya heyvanı ondan iqtisadi məqsədlər üçün istifadə etmək fikrində olarsa, məcburi şəkildə onun məişət ehtiyaclarını təmin edib ödəməlidir. Məsələn, faytonçu öz atına ot və yem .(verməsə, at onun üçün işləyə bilməz (taqətdən düşər

İslam kişi üçün belə haqlar nəzərdə tutmamışdır. Qadına malikiyyət, sərvət toplamaq hüququ vermiş, amma kişinin ona aid sərvət və malında təsərrüf etmək ixtiyarı verməmişdir, əksinə bütün bunlarla belə, kişini ailə ehtiyaclarını - qadının, övladlarının ?və s. tələbatlarını - ödəməklə vəzifələndirmişdir. Nə üçün və hansı dəlilə əsasən

Təəssüflər olsun ki, bizim Qərbə meyilli olanlarımız bu barədə zərrə qədər də düşünmək istəmirlər. Onlar gözlərini döyərək Qərbin öz hüquq sistemlərinə tutduqları iradları - əlbəttə, həmin iradlar yerli iradlardır - islami hüquq sistemi ilə əlaqədar xatırladır və ona da aid edirlər. Əgər həqiqətən də, kimsə "Qərbin on doqquzuncu əsrin əvvəllərinə qədər qadın üçün verdiyi nəfəqə onların qul və kəniz olmalarının nişanəsindən başqa, bir şey deyil" - desə, düz söz demişdir, çünki qadın müft və havayı şəkildə kişinin tələbatlarını ödəsə və

mülkiyyət hüququna sahib olmasa, ona xərclənən pullar qul və əsirə verilən nəfəqə, yaxud da yük daşıyan heyvanlara verilən ot-ələf misalındadır. Amma dünyada xüsusi qanunlar yaradılaraq qadının mülkiyyət hüququna sahib olmasını, ona kamil şəkildə iqtisadi sərbəstlik verməsini təmin etsə və eyni zamanda, ailə ehtiyaclarının ödənilməsində kişi ilə müştərək olmağı onun öhdəsindən götürsə, məcburən digər bir .fəlsəfə nəzərdə tutulmalı və onun barəsində düşünülməlidir

## On doqquzuncu əsrin ikinci yarısına qədər fransalı qadınların acınacaqlı vəziyyəti

İran ictimai qanunlarının şərhi" əsərinin müəllifi doktor Şayqan kitabın üç yüz iyirmi" altıncı səhifəsində belə yazır: "Qadının malik olduğu və şiə fiqhinin də qəbul etdiyi istiqlaliyyət müəyyən bir müddətə qədər nə Yunanıstan, Roma, Yaponiya, nə də digər ölkələrin hüquq sistemində mövcud olmamışdır. Yəni, qadına da uşaqlar, divanə və dəlilər kimi, öz maddi (iqtisadi) hüquqlarından və malından istifadə etmək qadağan edilmişdi. İngiltərədə qadın öz ərinin şəxsiyyətində fəna və itib-batmış olduğu halda, biri min səkkiz yüz yetmişinci ildə, digəri isə min səkkiz yüz səksən ikinci ildə olmaqla, iki qanun qəbul edilmiş və ərli qadınlara malkiyyət hüququ verilmişdir. İtaliyada isə həmin qanun ۱۹۱۹-cu ildə təyin edilmişdir. Almaniyada ۱۹۰۰-cü ildə, İsveçdə isə ۱۹۰۷-ci .ildə qadın əri ilə bərabər hüquqlara malik oldu

Amma Fransada ərli qadınlar hələ də pis vəziyyətdə qalmaqdadır. Guya, Fransadakı ".۱۹۳۸-ci ildə verilən qanun onların vəziyyətini yaxşılaşdırmışdır

Diqqət etdiyiniz kimi, hələ (İngiltərədə min səkkiz yüz səksən ikinci ildə) Avropada qadına əri müqabilində iqtisadi azadlıq verilməsi və onun acınacaqlı vəziyyətdən .çıxarılmasından bir əsr keçmir

## ?Görəsən, nə üçün Avropa gözlənilmədən qadına iqtisadi azadlıq verdi

Görəsən, necə oldu ki, bir əsr ərzində belə mühüm bir hadisə

baş verdi? Avropa əhalisinin insanlıq hissiyyatları cuşa gəldi və onlar öz işlərinin ədalətsiz və zülümkarca olmasını başa düşərək belə bir addım atmaq məcburiyyətində qaldı? Bu sualın cavabını Vil Dorantdan eşidin. O, "Fəlsəfənin ləzzətləri" əsərinin yüz əlli səkkizinci səhifəsində "Səbəblər" adı altında bir bəhs açmış və orada qadının Aropadakı azadlığına geniş şərh vermişdir. Təəssüflər olsun ki, biz orada belə bir həqiqətlə rastlaşırıq: "Avropalı qadınlar öz azadlıqları və mülkiyyət hüquqlarına sahib olmalarını insanlara deyil, maşınlara (texnikaya) borcludur. və onlar avropalı kişilər müqabilində yox, böyük çarxlı və iri dişli maşınlar qarşısında təzim etməlidirlər. İngiltərədə qadına iqtisadi azadlıq verilməsinə səbəb fabrik və zavod sahiblərinin çox gəlir əldə etmək, amma az maaş vermək istəməsi olmuş və beləliklə, ".İngiltərə Milli Məclisində həmin qanun həyata keçirilmişdir

Vil Dorant deyir: "Görəsən, biz tarixdən də qədim və möhtərəm olan məsihilik qanun və adətlərinin tez sıradan çıxıb məhv olmasını hansı səbəblərlə əlaqələndirək? Ümumi səviyyədə bu cür dəyişikliklər texnikanın sayca çox olması maşınlı sənayenin inkişafı ilə həyata keçmişdir. Qadının azadlığı sənaye hərəkatının yaranması ilə meydana çıxmışdır... Bir əsr əvvəl, İngiltərədə kişilərin iş tapması həddən artıq çətin bir məsələ idi. Amma elanlarda kişilərdən öz qadın və uşaqlarını fabrik və zavodlara işçi kimi göndərmələri tələb olunurdu. Fabrik, zavod və sahibkarlar öz maddi gəlir və mənfəətlərini fikirləşməli və öz düşüncələrini dövlətin əxlaqi adət və ənənələri ilə məşğul etməməlidirlər. On doqquzuncu əsrdə fabrik sahibləri İngiltərədə vətənpərvərlər kimi tanınırdı. Qadının azadlığı barədə atılan ilkin addım min səkkiz yüz səksən ikinci ildə verilən qanun olmuşdur. Həmin qanuna əsasən, Böyük Britaniyadakı qadınlar indiyə qədər görülməmiş imtiyazlara malik oldular və artıq onlar əldə etdikləri gəlir və sərvəti özləri üçün saxlaya bilərdilər. Yəni, onlar mülkiyyət hüququna sahib olmuşdular. Bu yüksək səviyyəli əxlaq və məsihi qanununu "fabrik sahiblərinin avam şurası təyin etmişdi və onlar bu yolla ingiltərəli qadınları fabriklərə qədər çəkib

gətirmək istəyirdilər. Həmin ildən indiyə kimi, qadınlar öz evlərində qalmayaraq fabrik ".və mağazalarda ömürlərini tələf və zay etməyə başladılar

Diqqət etdiyiniz kimi, İngiltərə fabrik sahibləri və sərmayədarları öz maddi mənafelərini təmin etmək məqsədi ilə bu addımı qadının xeyrinə atmağa məcbur .olmuşlar

## Quran və qadının iqtisadi azadlıq və istiqlaliyyəti

:İslam min dörd yüz il əvvəl bu qanunu təyin etmişdir. Quranda belə buyurulur

{لِلرِّجَالِ نَصِيبٌ مِمَّا اكْتَسَبُوا وَلِلنِّسَاءِ نَصِيبٌ مِمَّا اكْتَسَبْنَ}

Heç vaxt Allahın birinizi digərinizdən üstün etdiyi şeyi arzulamayın (kişilər və qadınlar" bir-birlərinin şəri, qanuni, cismi və ruhi üstünlüklərini, eləcə də, heç bir şəxs və ya dəstə başqasının Allah tərəfindən verilmiş mal, məqam və övlad kimi üstünlüklərini arzulamasın. Çünki bu imtiyaz və üstünlüklər hikmət və yaradılış aləminin kamilliyinə əsaslanır və ona zidd arzular cəmiyyətdə paxıllığın və fəsadın aşkar olmasına səbəb (olur)."(١)

Ayədə kişi və qadınların qazanaraq əldə etdikləri şeylərdə onlar üçün bir mənfəətin .olduğu bildirilir

Quranda kişi öz fəaliyyətləri və gördüyü işlərin nəticəsininin ixtiyar sahibi olaraq tanıtdırıldığı kimi, qadın da öz fəaliyyət və işlərinin sahibi ünvanında tanıtdırılmışdır. :Başqa bir ayədə belə buyurulur

{لِلرِّجَالِ نَصِيبٌ مِمَّا تَرَكَ الْوَالِدَانِ وَالْأَقْرَبُونَ وَلِلنِّسَاءِ نَصِيبٌ مِمَّا تَرَكَ الْوَالِدَانِ وَالْأَقْرَبُونَ}

Kişilərin ata, ana və yaxın qohumlarının qoyub getdiklərində payları vardır. Qadınların" da ata, ana və yaxın qohumlarının qoyub getdiklərində payları vardır. Sərvət istər az olsun, istərsə də çox, müəyyən və vacib bir paydır. (Belə bir hökmün olması ağıl baxımından lazım və gərəklidir, onun miqdarı və necəliyinin təyini isə şəriətə uyğun (surətdə vacibdir). "(٢)

Ayədə məqsəd kişi və qadınlar üçün qoyulan mirasda müəyyən mənfəətlərin olmasının bildirilməsidir. Bu ayənin vasitəsi ilə qadının irs apara bilmək haqqına sahib olması sübuta yetirilmişdir. Həmin məsələnin geniş və müfəssəl bir tarixçəsi vardır və .biz Allahın izni ilə sonradan ona toxunacağıq

Cahiliyyət dövründəki ərəblər qadına irs verməyə hazır deyildilər, amma İslam qadının .irs aparmaq hüququna malik olduğunu sübuta yetirdi

**Bir müqayisə**

Deməli, Quranın on üç əsr Avropadan öncə, qadına aşağıdakı bir fərqlə iqtisadi azadlıq :və istiqlaliyyət verdiyi məlum olur

Birincisi, İslamın qadına iqtisadi azadlıq verməsinə səbəb onun ədalət, insanlıq və mənəvi yönləri nəzərə alması olmuşdur. İslamda İngiltərədəki fabrik sahiblərinin "öz qarınlarını doldurmaq və mənfəətlərini güdmək, sonra isə dünyaya bar-bar bağıraraq qadına iqtisadi azadlıq verdiklərini və onun hüquqlarının kişi ilə bərabər olduğunu .demək" kimi bir məqsəd olmamışdır

İkincisi, İslam qadına iqtisadi azadlıq verməklə yanaşı, Vil Dorantın dediyi kimi, onun evdən çölə çıxması, ailə təməllərini sarsıtması və qadınların ərlərinə, qızların isə atalarına qarşı çıxaraq onların üsyan etməsinə heç vaxt icazə və bu barədə onlara ixtiyar verməmişdir. İslam yuxarıda qeyd etdiyimiz iki ayə ilə cəmiyyətdə dönüş yaradaraq əzəmətli bir hərəkat əmələ gətirmişdir. Amma həmin hərəkat zərərsiz, .aram və xətərsiz şəkildə həyata keçmişdir

Üçüncüsü, Vil Dorantın dediklərinə uyğun olaraq, Qərb dünyasının bağışladığı qadının iqtisadi azadlığı onun evdən xaric olması və canını fabrik və mağazalarda tələf etməsinə səbəb olmuşdur. Yəni, Avropa qadının əl və ayağındakı qandalları açmış, amma heç də əvvəlkindən sadə olmayan digər qandal və zəncirləri onun əl və ayağına bağlamışdır. Amma Avropanın əksinə olaraq, İslam qadını kişinin istismarı və ona nökərçiliyindən xaric edərək ailə və məişət ehtiyaclarının təmin edilməsini kişinin öhdəsinə qoymuş və bu yükü, yəni qadının

həm özü, həm də məişət ehyiyaclarını ödəməyi onun (qadının) çiyinlərindən götürmüşdür. İslamın nəzərində, insanlıq qərizələrinə əsasən, qadının sərvət toplamaq, onun qorunması və artırılmasına çalışmaq haqqının olması ilə yanaşı, həyat məcburiyətləri ona təziq göstərərək gözəllik və camalının – həmişə qadında olmalıdır – .aradan getməsinə səbəb olmamalıdır

Amma bizim bir sıra yazıçı və ziyalılarımızın bu tarixi həqiqətləri görməyə gözünün !?olmaması və onun fəlsəfəsi barədə düşünməməsi ilə nə etmək olar

**İrad və ona cavablar**

Xanım Manuçehriyan "İran konstitusiyası və ictimai qanunlarına iradlar" əsərinin otuz yeddinci səhifəsində belə yazır: "Bizim ictimai qanunlarımız kişini bir tərəfdən, sahibinin at, inək, qoyun və s. heyvanlara verdiyi yemək-icmək kimi, qadına nəfəqə verərək onun məişət və yaşayış tələbatlarını ödəməsinə vadar edir. Amma digər tərəfdən, ictimai qanunun ١١١-ci maddəsində qadının əri vəfat edən zaman, qadının iddə saxladığı, öz malik və sahibini (ərini) əldən verdiyi üçün əzadar olduğu və təskinliyə ehtiyac duyduğu müddətdə ona nəfəqə verilməməsinin nə üçün nəzərdə tutulduğu məlum deyil. Sizin "əgər azadlıqdan dəm vuraraq kişi ilə qadının hər bir məsələdə bərabər olmasını istəyirsinizsə, onda, nə üçün bu yerdə qadının bir daha kişidən asılı və ona qul olmasını və sonra da qul və nökərçiliyinin davam etməsi intizarında qalmasını istəyirsiniz?" – deməyiniz mümkündür. Biz isə cavabında deyirik: "Qadınların qul və köləyə çevrilməsinə əsaslanaraq təyin edilən ictimai qanun yaxşı olardı ki, kişilərin özlərindən sonra qadın üçün nəfəqə müəyyən etməsinə yönəldilsin və bu ".məsələyə qanuni cəhətdən riayət edilsin

Biz bu sözləri yazan müəllifdən harada və hansı yerdə İslamın və ya bizim ictimai qanunlarımızın kişini "qadının sahibi" və ona verilən nəfəqənin "qadın üzərindəki mülkiyyət" (və ya qadının qul olması) fəlsəfəsi olduğunu nəzərə çarpdırdığını və onun bu məsələni haradan əldə etdiyini soruşuruq. Belə olduğu halda, o (kişi), necə malikdir ki, qadına

onun üçün bir stəkan su gətirməsini əmr etmək haqqına sahib deyil? Eyni zamanda, necə malikdir ki, tabeçiliyində olan (qadın) hansı bir işi görsə, malikə deyil, onun özünə ?aid olur

Kişi qadın üzərində necə malikiyyət (mülkiyyət) hüququna sahibdir ki, əgər qadın onun üçün hansısa bir işi yerinə yetirsə, qadın (əlbəttə, əgər istəyərsə) ondan muzd verməsini tələb edə bilər? Kişinin, hətta, qadından dünyaya gələn öz uşağına süd verməsini ondan tələb etmək haqqı yoxdur və qadın istəsə, bunun (süd verménin) .müqabilində ondan muzd ala bilər

Bundan əlavə, əgər bir şəxs digərinin nəfəqəsi ilə dolanırsa, onda nəfəqə verən onun malikidirmi? İslamın və digər qanunların nəzərində, övladlar atanın və ya onların hər ikisinin nəfəqəsi ilə təmin olunmalıdırlar. Görəsən, bu qanunların mövcud olması ata və ananın uşaqların maliki olmasını deməyə əsas verirmi? İslami dünya görüşünə əsasən, ata və ana əgər fəqir olsalar, onları övladları təmin etməlidir. Bütün bu .məsələlərdən İslamın ata və ananı övladın maliki kimi tanımadığını anlamaq olar

Deyilənlərdən daha təəccüb doğuranı "nə üçün qadının əri öldüyündə və qadın iddə saxladığı müddətdə ona nəfəqə verilmir, halbuki, qadının belə zamanlarda ərinin puluna daha çox ehtiyacı vardır?" - kimi sözlərin söylənilməsidir. Elə bil, həmin müəllif yüz il əvvəlki Avropada yaşayır. Kişinin qadına nəfəqə verməsinin meyarı onun .(qadının) ehtiyacllı olması deyil

İslamın nəzərində, əgər qadın əri ilə həyat sürdüyü müddətdə mülkiyyət hüququna malik deyildisə, ərinin ölümündən dərhal sonra qadının vəziyyətinin dəyişməsi labüd idi. Amma qadına mülkiyyət hüququnun verilməsi qanununu nəzərə alaraq, kişi tərəfindən ehtiyacları təmin edilir və onlar öz sərvətlərini hifz edə bilirlər. Belə olduğu halda, onların münasibətləri aradan qalxdığı zaman, onun müəyyən müddət qədər bir daha nəfəqə almasına nə ehtiyac var? Nəfəqə kişinin qadına olan münasibətini zinətləndirmək üçündür. Həmin münasibətlər pozulduqdan sonra qadına nəfəqənin .verilməsini davam etdirməyin heç bir zərurəti yoxdur

## Üç növ nəfəqə

:İslamda nəfəqənin üç növü mövcuddur

Birinci növ nəfəqədə malik öz tabeçiliyində olanı (mülkiyyətini) təmin etməyə borcludur. Bu növ nəfəqəyə malikin heyvanların ehtiyaclarını ödəməsini misal göstərmək olar. İkinci növ nəfəqəyə insanın öz kiçik yaşlı övladları və ya fəqir olan ata və anası, eyni zamanda, fəqir övladlarına verdiyi nəfəqə şamildir. Bu növdən olan nəfəqədə malik və mülkiyyət meyarı mövcud deyil. Onun yaranmasına səbəb təbii şəkildə övladların dünyaya gəlməsinin valideynlər üzərində hüquqa malik olmasını meydana gətirməsi, həmçinin, ata və ananın öz övladlarının kiçik yaşlarında onu boya-başa çatdırmaq üçün çəkdikləri zəhmətdir və onların övladı da valideynləri fəqir olanda onları təmin etməlidir. Bu növ nəfəqinin verilməsində nəzərdə tutulan şərt .(nəfəqə veriləcək tərəfin qüdrətə malik olmamasıdır (zəifliyidir

Üçüncü növ nəfəqə kişinin qadın fəvat etdiyində ona xərclədikləridir. Bu növdən olan nəfəqədə meyar nə malik və mülkiyyət, nə ikinci növdə bildirilən təbii hüquqlar, nə də .ki, qadının aciz, zəif və fəqir olması məsələləridir

Qadın əgər milyonçu və hədsiz sərvətə malik, amma kişi isə az gəlirli olsa da belə, yenə də ailə xərclərini ödəmək və qadının şəxsi ehtiyaclarını təmin etməklə vəzifəlidir. Üçüncü növdən olan nəfəqənin digərləri ilə fərqi bundadır ki, birinci və ikinci növdəki nəfəqəni ödəməkdən əgər kişi imtina etsə o, günahkar hesab edilir. Amma həmin məsələ hüquqi bir yönə malik deyil. Üçüncü növ nəfəqədə kişi öz vəzifələrini yerinə yetirməkdən və qadını təmin etməkdən boyun qaçırsa, qadının onu məhkəməyə verə bilmək və məsələ sübuta yetirildiyi zaman, öz haqqını almaq hüququna sahibdir. Bu ?cür nəfəqədə meyar və ölçü nədir

.Allahın izni ilə gələn bəhsimizdə bu barədə bəhs edəcəyik

## ?Görəsən, qadın günmüzdə mehriyyə və nəfəqə istəmirmi

Ailə xərclərinin təmin edilməsi və qadının şəxsi

ehtiyaclarının ödənilməsinin kişinin öhdəsinə olduğunu demişdik. Qadının bu baxmdan (ehtiyacların təmini) heç bir məsuliyyəti yoxdur. Hətta, qadın ərinin sərvətinin neçə bərabəri qədər var dövlətə sahib olsa da belə, ailə ehtiyaclarının ödənilməsində iştirak etməyə məcbur deyil. Qadının bu məsələdə iştirakı istər pul xərcləmək baxımından, .istərsə də işləmək cəhətindən olsun, sadəcə onun istək və meyilinə bağlıdır

İslamın nəzərində qadının ehtiyaclarının ailə büdcəsinə daxil olması və kişinin öhdəsində qoyulmasına baxmayaraq, kişinin qadından iqtisadi cəhətdən faydalanmaq və onun əməyindən istifadə etmək haqqı yoxdur, yəni o, qadını istismar edə bilməz. Qadının nəfəqəsi bu cəhətdən kişinin öz valideynlərinə verdiyi nəfəqə kimidir və bəzi xüsusi hallarda övladların da öhdəsinə düşür və onlar bu vəzifələri yerinə yetirdikləri .üçün sonradan valideyinlərindən hansısa hüquqları tələb etmək haqqına malik deyillər

### Maddi (iqtisadi) məsələlərdə qadının hüquqlarına riayət etmək

İslam heç bir yerdə görülməmiş şəkildə iqtisadi və maddi məsələlərdə qadının hüquqlarına riayət etmişdir. Bir tərəfdən, qadına iqtisadi azadlıq və istiqlaliyyət verərək kişinin əlini onun mal və əmək fəaliyyətinin nəticələrindən üzmüş və qadının ticarət müamilələrində kişinin qəyyumluğunu – bu məsələ qədimdə uzun tarixə malikdir və Avropada yirminci əsrin əvvəllərinə qədər davam etmişdir – aradan qaldırmış və digər tərəfdən də, qadının çiyinlərindən ailə büdcəsini təmin etmək yükünü qaldıraraq onu hər cür məcburiyyət və pul arxasınca qaçmaqdan azad .etmişdir

Qərbə meyilli olan şəxslər qadını himayə etmək adı ilə bu qanunlara irad tutmaq və onu tənqid etmək istədikdə, yalan və uydurmadan başqa, hansısa bir şeyə istinad edə bilmirlər. Bu baxımdan, onlar nəfəqənin qadın üzərində mülkiyyət hüququ yaratdığını və bu yolla kişinin qadından özünə xidmətçi kimi istifadə edə bilməsini təmin etdiyini deyirlər. Onlar heyvan

sahibinin malik olduğu heyvanlardan minik, yük daşıma və s. kimi məsələlərdə istifadə edə bilməsi üçün onlara xərc çəkmək məcburiyyətində qaldığını söyləyərək qadına kişi tərəfindən verilən nəfəqə qanununun nəzərdə tutulmasını da onun həyatda qala .bilməsi üçün verilən bir məbləğ kimi dəyərləndirirlər

Əgər kimsə bu məsələ ilə əlaqədar islami qanunlara həmlə edərək İslam qanunlarının qadına həddən artıq nəvaziş göstərdiyini və kişinin müft şəkildə qadının xidmətində durmasını təmin etdiyini və ailə ehtiyaclarını ödəməklə vəzifələndirdiyini söyləsə, onda, öz iradına hansısa bir forma və şəkil verə bilər, nəinki, İslam qanunlarına qadını .himayə adı ilə irad tutduqda

Həqiqətdə, İslam nə qadının xeyrinə və kişinin zərərrinə, nə də kişinin mənfəəti və qadının zərərinə hansısa bir qanunu təyin etməyi nəzərdə tutmamışdır. İslam nə kişi və nə də qadın üçün tərəfkeşlik etmir. İslam öz qanunlarında kişi və qadının, onların dünyaya gələcək övladlarının səadət və xoşbəxtliyini, başqa bir ifadə ilə desək, bəşər cəmiyyənin firavan həyat sürməsini nəzərdə tutmuşdur. İslam kişi və qadın, eyni zamanda, övladlar və bəşər cəmiyyətinin səadəti ilə bağlı xilqətin onlar üçün müəyyən .etdiyi təbii və fitri qanunların gözdən qaçırılmamasını istəmişdir

Dəfələrlə dediyimiz kimi, İslam dini öz qanunlarında kişinin ehtiyac və tələbat, amma qadının isə ehtiyacsızlıq məzhəri ünvanında nəzərdə tutulması qaydasına riayət etmişdir. O, kişini alıcı, qadını isə mal sahibi ünvanında tanıtdırmışdır. İslamın nəzərində kişi və qadının evliliyi və müştərək həyatlarında kişi bəhrələnən şəxs ünvanında göstərilmiş və bu cəhətdən də xərclərin ödənilməsi kişinin öhdəsinə qoyulmuşdur. Kişi və qadın bir-birinə məhəbbət göstərmək məsələlərində onların öhdəsinə təbii və fitri olaraq müxtəlif funksiya və rolların qoyulduğunu ununmamalıdırlar. Evlilik və izdivac kişi və qadının özlərini olduğu kimi nişan verdikləri zaman daha möhkəm və uzunömürlü olacaqdır. Nəfəqə ödənilməsinin kişinin ixtiyarında qoyulmasının digər bir səbəbi övlad dünyaya gətirmək çətinliyi və .zəhmətinin təbii olaraq qadının vəzifəsi olması və onun öhdəsinə həvalə edilməsidir

Kişinin bu məsələdə təbi olaraq öhdəsinə qoyulan iş onun ləzzət almasıdır. Amma aylıq (menstruasya) xəstəliklərə (uşaqlıq və yaşlı vaxtdan başqa), hamiləlik dövrünün və uşağın dünyaya gətirilməsi çətinliklərinə dözmək məcburiyyətində qalan, uşağa süd verən və qayğı göstərən qadındır. Adı çəkilən işlərin hamısı qadının qüvvəsini azaldan və əmək fəaliyyətinin aradan qalxmasına səbəb olan işlərdir. Əgər qanun bu məsələlərdə qadını himayə etməyərək onu kişi ilə oxşar hüquqlara malik və ailə büdcəsini təmin etməyə vəzifəli olduğunu bildirsə, qadın üçün çox ağır və dözülməz problemlər meydana çıxar. Həmin məsələlər, hətta, heyvanlarda belə erkək cins tərəfindən dişi cinsin nəsil artırılması və zəiflik dövründə onların yemək və s. ilə təmin .edilməsinə səbəb olmuşdur

Bundan əlavə, kişi və qadın əmək fəaliyyəti, istehsal və iqtisadi məsələlər cəhətindən də oxşar şəkildə xəlq edilməmişdir. Əgər kişinin qadına qarşı biganə olması nəzərdə tutulsa və ona öz gəlirindən heç bir pul xərcləməsə, qadının kişi ilə bu məsələdə ayaqlaşması çox çətin olar. Qadının pula olan ehtiyacının kişilərinkindən daha artıq olduğunu da diqqətinizə çatdırmağı lazım bilirik. Bəzənib-düzənmək və zinət məsələlərinə üstünlük vermək qadın həyatının ən əsas hissəsini təşkil edir. Bir qadının öz gözəlliyinə xərclədiyi pulun miqdarı bir neçə kişinin özünə xərclədikləri qədərdir. Gözəlliklərinə diqqət etmək hissi onlarda, bir növ, əyləncə və istirahət xarakteri almağa başlamışdır. Kişilər əynindəki libas köhnə və nimdaş olana qədər onunla kifayətlənə bilirlər, amma qadınlar necə? Qadın üçün bir dəst libasın dəyəri onlara zinət və gözəllik verdiyi müddətə qədərdir və hətta, hansısa bir zinət əşyası onların nəzərində bircə dəfə istifadə edilməyə qabildir. Qadınların mal və sərvət ələ gətirmək qüdrəti kişilərinkindən çox aşağıdır. Lakin onların istehlak və məsrəfi kişilərdən qat-.qat artıqdır

Qadının qadın olaraq qalması onların şad, sifət cizgilərinə görə gözəl qalması və rahat və asudə yaşayışa malik olması, eyni zamanda, çox az çalışması deməkdir. Əgər qadın ,kişilər kimi səhərdən axşama qədər pul və qazanc dalınca qaçsalar

onların qururlarından əsər-əlamət qalmaz və zəhmət və əziyyətlərin kişilərin simalarında yaratdığı qırışlar onların da sifət cizgilərində görülərək müşahidə edilməyə .başlayar

Dəfələrlə fabrik və zavodlarda ağır zəhmətlərə qatlaşaraq məişət ehtiyaclarını ödəməyə çalışan qərbli qadınların şərqli qadınlar kimi həyat sürmək arzusunda olduqlarını deməsi eşidilmişdir. Asudə və asyişdə olmayan qadınların özünə diqqət edə .bilməyərək kişi üçün şadlıq və sevinc gətirə bilmədiyi də aydın bir məsələdir

Cəmiyyətdə ailə münasibətlərinin qorunması və kişinin məsləhətinə olan məsələlər qadının ağır zəhmət tələb edən işlərdən kənarda qalmasını tələb edir. Kişilər də ailənin onun üçün asayiş və yorğunluğunun aradan qaldırıldığı və çoldəki problemlərinin unudulmasına yardımçı olan bir yer olmasını istəyirlər. Əlbəttə, qadınlar bu məsələnin gerçəkləşməsi və çöldən evə gələn kişinin yorğunluğunun aradan qalxmasına çalışaraq səy etməlidirlər. Evə ayaq basaraq özündən daha çox yorğun olan qadınla üz-üzə gələn kişinin vay halına! Qadının asudə və rahatçılığı da kişi üçün əhəmiyyət .kəsb edir

Min bir zəhmətlə pul qazanan kişinin qadının israfçılığa yol verərək özünü bəzəməsi və istədiyi şeylərə xərcləməsi üçün pul verməsinə iki əlli razı olmasına səbəb olan məsələ onun öz ruhi asayiş və ehtiyaclarının ödənməsini qadında tapmasıdır. Kişi anlayır ki, Allah onun öz asudəliyi və xoşbəxtçiliyini qadın vasitəsi ilə təmin edir

{وَجَعَلَ مِنْهَا زَوْجَهَا لِيَسْكُنَ إِلَيْهَا}

Sizin hər birinizi bir candan (atanızdan) yaradan və yanında rahatlıq tapması üçün (zövcəsini də onun cinsindən xəlq edən odur) (١)

və bu istiqamətdə qadına və ailəsinə xidmət etmək və onları razı salmaqla öz səadətini də dolayı yolla əldə etmiş və bu minvalla, ailəsinə sevinc bəxş etmiş olur. Bu zəminədə məlum olan məsələlərdən biri həyat yoldaşlarından birinin ailədə digəri üçün ruhi qida rolunu oynaması, digərinin isə ailənin bütün çətinlik və problemələrini öz öhdəsinə götürməsinin zəruriliyidir və birinci

.məsələdə qadın, ikinci məsələdə isə kişi aparıcı rola malikdir

Qadın maddi və iqtisadi cəhətdən kişiyə ehtiyaclı və kişi isə ruhi baxımdan qadına möhtac şəkildə xəlq edilmişdir. Qadın kişiyə istinad etmədən özünün maddi ehtiyaclarını – həmin ehtiyaclar bir neçə kişinin xərcini təşkil edir – heç zaman ödəyə bilməz. Bu baxımdan, İslam fəqət qanuni olan həyat yoldaşının həmin ehiyaclarının .təmin edilməsi üçün kişini ona dayaq nöqtəsi təyin etmişdir

Əgər qadın özünün istədiyi kimi, qanuni ərinə istinad etmədən yaşamağa və maddi ehtiyaclarını ödəməyə çalışsa, onda, başqa kişilərə söykənməlidir. Bu, təəssüflər olsun ki, günümüzdə nümunəsi həddən artıq görülən və getdikcə də artmağa başlayan bir .məsələdir

## Nəfəqənin əleyhinə aparılan təbliğatların fəlsəfəsi

Qadınları tələyə salmaq istəyən əyyaş kişilər ərləri tərəfindən qadınlara verilən nəfəqənin kəsiləcəyi təqdirdə, qadınların öz maddi ehtiyaclarını təmin etməkdən ötrü, başqa kişilərə istinad edəcəkləri və bu yolla onların tələsinə asanlıqla düşəcəklərini çox yaxşı başa düşmüşdülər. Siz əgər qadınlara verilən bəzi mənasız hüquqların fəlsəfəsinə diqqət etsəniz, mənim demək istədiyim sözlərin mənasını daha yaxşı dərk .edəcəksiniz

Nəfəqənin ləğv edilməsinin fəhşa (fahişəlik) və fəsadın yaranması və artmasına gətirib çıxarmasında heç bir şəkk və şübhə yoxdur. Özünün həyati ehtiyaclarının hesabını ərindən ayıran hansısa bir qadın üçün təbiətinin tələbinə uyğun olaraq onu ödəmək qabiliyyətinə malik olduğunu düşünmək necə mümkündür? Əgər həqiqəti bilmək istəyirsinizsə, nəfəqənin ləğv edilməsi məsələsi həddən artıq israfçılığa yol verən qadınların öz ərlərinin bu məsələ ilə razılaşması vasitəsi ilə də dəstəklənir. Əslində, kişilər bu yolla qadınların öz əlləri ilə onlara hüquq bərabərliyi və azadlıq verilməsini bəhanə etməklə, zərbə vurmaq və onlardan israfçılıqlarının və bəzənməklərinə sərf .etdikləri xərclərin intiqamını almaq istəyirlər

Vil Dorant özünün "Fəlsəfənin ləzzətləri" adlı əsərində

səh:۲۰۶

yenidən evlənməyin həyata keçirilməsini belə izah edərək deyir: “Qanuni şəkildə olan ikinci evlilikdə hamiləlik qanuni yolla qadağan edilir və boşanma hər iki tərəfin razılığı ”.ilə həyata keçirilir və burada nəfəqə və uşaqlardan söhbət getmir

O, sözlərinə belə davam edir: “Orta təbəqədən olan və bəzənməyə pərəstiş edən qadınlar zəhmətkeş kişilərin bütün qadın cinsindən intiqam almasına səbəb olacaqlar. Evlilik və izdivac elə bir şəkil alacaq ki, artıq evlərdə öz gözəlliyi və bəzənməsi ilə məşğul olan hansısa bir bekar qadın tapılmayacaq. Kişilər qadınlarından öz .ehtiyaclarını təmin etmək üçün çalışmalarını tələb edəcəklər

Yeni dostcasına evlilik qadınların da hamilə olana qədər işləmələri hökmünün yaranmasına gətirib çıxaracaq. Burada da qadının azadlığını təkmilləşdirən bir məsələ var və o, bundan sonra qadının ömrünün sonuna qədər öz ehtiyaclarını özünün ödəmək məcburiyyətində qalmasıdır. Sənaye hərəkatının baş verməsi özünün .qadınlarla bağlı rəhimsiz və qəddarcasına nəticələrini göstərməyə başlayır

Qadın fabrik və zavodlarda öz əri ilə birlikdə çalışmalıdır, çünki evdə boş-bekar qaldığı müddətdə o, ərinin onun ehtiyaclarını təmin etmək üçün iki bərabər çalışmasına səbəb olur, bu baxımdan, o (qadın) da əri ilə eyni və bərabər vəzifələrə malik olmalıdır (yəni, “ .(onun kimi çalışmalıdır

”.Belə olan halda, kinayə və satira ilə deyirlər ki, “qadının azadlığı elə budur

#### Kişinin yerinə dövlətin qadına ərlik etməsi

Qadının uşaq dünyaya gətirmə və nəsil artırılması məsələlərində özünə iqtisadi və maddi nöqteyi-nəzərdən dayaq tapmalı olması inkar ediləsi bir məsələ deyil. Hazırda Avropada qadının azadlıq məsələsini önə çəkməklə onu (Avropanı) “Matriarxat” (ana şahlıq) dövrünə qaytaran və kişiləri ailədən birdəfəlik xaric edilməsinə gətirib çıxaran .qanunların verilməsinə çalışan insanlar mövcuddur

Həmin şəxslərin əqidəsinə əsasən, qadının kamil şəkildə

iqtisadi azadlığı və onun kişilərlə bütün məsələlərdə bərabərlik əldə etməsi vasitəsi ilə gələcəkdə kişi evin artıq bir üzvü kimi tanınmağa başlayacaq və onu həmişəlik olaraq evdən (ailədən) çıxaracaqlar. Bu cür təfəkkürə malik olan kəslər dövləti atanın canişini olmsına dəvət edir və təklikdə ailə təşkil etmək və onun bütün məsuliyyətini öz öhdələrinə götürmək vəzifəsi ilə razılaşmayan qadınlara insan nəslinin kəsilməməsi üçün uşaqları dünyaya gətirməsinə görə, dövlətin onlara pul və maddiyyatla təmin etməkdə yardım etməsi təklifini irəli sürmüşlər. Yəni, ailə ehtiyaclarını təmin etmək əvvəlcə kişilərin ixtiyarında idisə, bundan sonra bu məsələ kişinin qadın üzərində mülkiyyət hüququna sahib olduğunu deyərək etiraz edənlərin istəyincə, dövlətin ixtiyarına keçir (indi də bu məsələdən dövlətin qadını öz mülkiyyətinə keçirdiyi məlum .(olur

Kaş ki, bizim Allah tərəfindən əsası qoyulan və müqəddəs hesab edilən ailə məsələləri və münasibətlərini kor-koranə şəkildə pisləyən və onu dağıtmağa çalışan kəslər bir !qədər uzaqgörən olmağı bacara və işlərin aqibətini düşünə biləydilər

Bertrand Rassel “Evlilik və əxlaq” adlı kitabında “Ailə və dövlət” adlı bir fəslə yer vermiş və orada dövlət və mədəniyyətin uşaqlara göstərdiyi bəzi təsirlər barədə danışdıqdan sonra belə demişdir: “Atanın öz bioloji varlığını əldən verməsinə elə də bir şey qalmayıb... Atanın rədd edilməsində təsirli olan ən mühüm və güclü amillərdən biri qadınların maddi (iqtisadi) azadlığa təmayüllü olmasıdır. Səs vermə və seçkilərdə iştirak edən qadınlar, adətən, evli olmayanlardır və onların çətinlik və problemləri evli qadınlarınkı qədər də çox deyil. Onlar qanuni şəkildə imtiyazlarının olmasına baxmayaraq, rəqabətdə məğlubiyyətə düçar olurlar... Evli qadınların öz maddi istiqlaliyyətlərini qoruyub saxlaya bilmək üçün iki yolu vardır. Birincisi, onlar ya evlərində qalaraq əvvəlki məşğuliyyətlərinə davam etməlidirlər, yəni ya uşaqlarını saxlamaq və onlara qulluqla məşğul olmalı, ya da onları ödənişli olan uşaq bağçalarına təhvil verməlidirlər. Belə edildiyi təqdirdə, uşaq bağçalarının sayı getdikcə artacaq

və uşaqların həmin yerlərdə qalmasının məntiqi nəticəsi bu olacaq ki, uşaq psixoloji baxımdan, həm analıq, həm də atalıq qayğısından məhrum olacaq. İkinci yol, cavan qadınlara müəyyən məbləğin ödənilməsidir və bu şəkildə onlar öz uşaqlarına qulluq edə bilərlər. Bu ikinci yol daha faydalıdır və qanuni şəkildə tənzimlənərək uşaqların müəyyən yaşa çatdıqları zamana qədər həmin məbləğ qadınlara ödənilməlidir. Bu qanun qadına kişinin təhqiramiz yardımını qəbul etmədən öz uşaqlarına baxmaq imtiyazı verir... Belə bir qanunun təyin edilməsi ilə ailədə əxlaqi cəhətdən mənfi reaksiyaların yaranmasına gətirib çıxara biləcəyi ehtimalının da gözlənilməs mümkündür. Qanun qadınların qeyri-qanuni olan uşaqlarına həmin məbləğin ödənilməməsini və ya qadının zina etməsi səbəbilə onun ataya verilməsini də müəyyən edə bilər. Belə olan halda, bölgə üzrə təyin olunmuş polis evli qadınlara nəzarət etməlidir. Bu məsələ əxlaqi baxımdan o qədər də xoşa gələn nəticələr verməyəcəkdir. Polisin bu cür nəzarəti aradan qaldırıla və qeyri-qanuni olan uşaqlara da həmin məbləğ ödənilə bilər. Belə olan halda, kişinin iqtisadi vəzifəsi işçilər təbəqəsində tamamilə aradan qalxacaq və onun qədir-qiyməti övladlarının yanında it və pişikdən artıq olmayacaq... Hazırda mövcud olan sivilizasiya və mədəniyyətlər analıq hislərinin zəiflədilməsinə yönəldilmişdir. Əlbəttə, inkişaf edən və dəyişikliyə uğrayan sivilizasiyanın qorunması üçün hamilə "qadına özünü təmin edə biləcək qədər pulun ödənilməsi" məsələsi meydana çıxacaqdır. Bu zaman, qadınların özlərinə analıqdan fərli olan hansısa bir məşğuliyyət seçməsinə gərək qalmayacaq və onlar bunu çox yaxşı qarşılayacaqlar. Bütün bunların fərziyyədən başqa, bir şey olmadığı məlumdur və mənim məqsədim qadınlarla əlaqədar baş verən hərəkatların miladdan öncə, kişinin qadın üzərindəki qələbəsini göstərən "Patriarxat" (ata şahlıq) ailəsinin dağılmasına səbəb olduğunu deməkdir. Qərbdə üzləşməli olduğumuz dövlətin kişinin "...yerini tutması məsələsi inkişaf və tərəqqi hesab edilir

Nəfəqənin ləğv edilməsi (həmin şəxslərin nəzərində qadının

:maddi istiqlaliyyətidir) yuxarıda deyilənlərə əsasən aşağıdakı nəticələri verəcəkdir

Atanın ailədə süqutu və ya ən azı, onun nüfuzdan düşməsi və "Matriarxat" dövrünə qayıtmaq, atanın yerinə dövlətin canişin olması və qadınların kişilərdən deyil, dövlətdən nəfəqə alması, analıq hislərinin zəiflədilməsi və onun (analıq hislərinin) .məşğuliyyət, əmək fəaliyyəti və sərvət kəsb etməyə çevrilməsi

Deyilən nənicələrin ailənin və eyni zamanda, insanlığın tamamilə süqut etməsinə səbəb olduğu aydın məsələdir. Hər bir çətinlik həll edilə bilər, amma bir məsələ – .ailənin səadəti və ondakı mənəvi ləzzətlərə malik xüsusiyyətlər bərpa edilməzdir

Mənim məqsədim "görəsən, qadının kamil bir şəkildə iqtisadi azadlığı və ailə mühitindən kişinin xaric edilməsinin tərəfdarı olan şəxslər qadının nəsil artımındakı təbii funksiyasını da kişinin təbii rolundan fərqli olaraq ödəniş tələb etdiyini və dövlətin də bu məsələyə görə onlara müəyyən məbləğ ödəməli olduğuna etiqad .bəsləyirlərmi?" – deməkdir

Dünyanın əmək məcəlləsində bir kişi üçün nəzərdə tutulan əmək haqqı, haradasa, onun ailəsi və uşaqlarının ehtiyaclarını ödəməsinə kifayət edəcək miqdardadır. Yəni, .dünyanın əmək qanunları qadının nəfəqə haqqının olmasını rəsmi olaraq tanıyır

**?Görəsən bəşər hüququnun elan edilməsi ilə qadına töhmət vurulmuşdurmu**

Bəşər hüququ ilə bağlı tezislərin iyirmi üçüncü maddəsinin üçüncü bəndinə əsasən, belə qeyd edilmişdir: "Əmək fəaliyyəti ilə məşğul olaraq hansısa bir işdə çalışan şəxsə ailə ehtiyaclarını ödəyə biləcək qədər maaş verilməli və onun insanlıq hüquqları təmin edilməlidir." Onun iyirmi beşinci maddəsinin birinci bəndində isə deyilir: "Hər bir şəxsin yaşayış səviyyəsi və ailə rifahını tibb, ictimai, məişət və s. cəhətdən təmin etmək haqqı ".vardır

Bu iki ay ərzində ailə quran hər bir kişinin qadın və uşaqlarının ehtiyaclarını ödəyə biləcək qədər imkana malik olması və qadına nəfəqə verməsinin zəruriliyi təsdiqlənmiş .və həmin məsələlər kişin öhdəsində vacib bir məsələ kimi qoyulmuşdur

Bəşər hüququnun elan edilməsi ilə kişi və qadının eyni və bərabər hüquqlara malik olduğu bildirilsə də, kişinin qadına nəfəqə verməsi məsələsi bu hüquqlara zidd kimi göstərilməmişdir. Bundan əlavə, məclisdə bu qanunun ləğvi ilə bağlı təşəbbüs göstərənlər həmin məsələnin sona yetdiyini bilməlidirlər. Bütün islami qanunlara irticaçı gözü ilə baxan qərbə meyilli insanlar, görəsən, bəşər hüququnu da kişinin qadın ?üzərində mülkiyyətini təsdiqləyən bir qanun kimi tanıtdıra bilərlərmi

Bəşər hüququnun iyirmi beşinci maddəsində belə yazılır: "İşsizlik, bədən üzvlərindən hansısa birinin əlil olması, xəstəlik, dul qalmaq, qocalıq və digər insan iradəsindən xaric olan məsələlər əgər insanın maaşının əldən çıxmasına səbəb olarsa, onların həyat ".şəraitlərinin yaxşılaşdırılması üçün, dövlət tərəfindən təmin olunmaq haqları vardır

Həmin insanlar bu qanunların adını "bəşər hüququ" qoymuş və qadının ərini itirərək dul qalmasını onun maaş (qazanc) vəsiləsinin əlindən çıxması kimi tanıtdırmışlar. Yəni, dul qalmaq xəstəlik, əlillik, işsizlik və s. məsələlərlə yanaşı qoyulmuş və onlarla eyni səviyyədə tutulmuşdur. Görəsən, bütün bunlar qadına vurulan töhmət və ona qarşı edilən hörmətsizlik deyilmi? Əgər belə qanunlardan hansısa biri Şərqdə olsa, .insanların buna etiraz səsi - belə hallar çox görülmüşdür - ucalaraq göyə qalxar

Əlbəttə, təsirlərdən kənar qalan və məsələlərə ədalətli şəkildə yanaşan şəxslər xilqətin kişini qadın üçün maaş vəsiləsi kimi müəyyən etmədiyini, eyni zamanda, qadının dul qalmasının da əlindən mənfəətinin çıxması şəklində dəyərlindirmədiyini bilir. Amma ortada təbii olan bir məsələ var və o da, qadının kişiyə ehtiyaclı şəkildə xəlq edilməsidir. İslam qadına heç vaxt hörmətsizlik etməmişdir. Kişi qadın üçün dayaq nöqtəsi hesab edilir. Xilqət qanununda kişi və qadını bir-birinə daha möhkəm bağlamaq və ailə təməllərini davamlı etməkdən ötrü - bu məsələ səadət və xoşbəxtliyin əsas məsələsidir - kişi və qadın bir-birinə ehtiyaclı şəkildə yaradılmışdır. Qadın kişinin ruhi və mənəvi asayiş və dayaq nöqtəsi, eyni zamanda, kişi də

qadının iqtisadi və maddi ehtiyaclarının təminatçısı hesab edilir. Bu iki müxtəlif formadakı ehtiyaclar qadın və kişini bir-birinə bağlayır və onlar arasında vəhdət yaradır.

## DOQQUZUNCU HİSSƏ

### İrs məsələsi

Qədim zamanlarda ya qadına, ümumiyyətlə, irs verilmirdi, ya da onunla kiçik yaşlılar kimi rəftar edirdilər. Yəni, ona hüquqi azadlıq və şəxsiyyət vermirdilər. Bəzən də onun özünə irs aparmağa icazə verdiklərində, övladlarına irs aparmağa icazə vermirdilər və oğlundan fərqli olaraq babanın irsini də qadın aparırdı. Qadına verilən irs Quranın ifadəsi ilə desək, vacib olan bir fərizə kimi deyildi, əksinə vəfat edən zamanlarda kişi .əgər istəyərsə, onu varis seçə bilmək haqqına sahib idi

Qadının varis olmaq məsələsinin tarixçəsi uzundur. Bu barədə çoxlu tədqiqat və mütaliələr edilmiş, eyni zamanda, bir sıra əsərlər insanların ixiyarında qoyulmuşdur. Biz bu barədə söhbət açmağa ehtiyac duymuruq. Demək istədiklərimizin xülasəsi belə .idi

### Qadının irsdən məhrum olmasının səbəbləri

Həqiqətdə, qadının irsdən məhrum olmasının əsas səbəbi sərvət və mal-dövlətin bir .ailədən başqa bir ailənin əlinə keçməsini istəməmək olmuşdur

Qədimdəki nəzəriyyələrə əsasən, qadın kişinin nütfəsinin qoyulduğu bir zərf (qab) və övladların inkişafı üçün bir yer hesab edilirdi və onun uşağın dünyaya gəlməsində elə .də rolu yox idi

Onlar ailədə dünyaya gələn oğlan uşaqlarını öz xanədanlarından, amma qız uşaqlarını isa qadının ərinin ailəsindən hesab edirdilər və bu minvalla, sərvətin bir ailədən digərinə keçməsinə mane olurdular. Belə fərz etməklə, əgər qız irs aparmış olardısa, onun mirası sonradan övladlarına keçə və bu qayda ilə sərvətin digər ailələrə .ötürülməsinə səbəb ola bilərdi

Mərhum Musa Ümid "İran ictimai qanunlarında irs" adlı kitabının səkkizinci səhifəsində "qədimdə ailənin əsasını təbii münasibətlər deyil, din təşkil edirdi" – dedikdən sonra belə yazır: "Matriarxat (ata şahlıq) olan ailədə dini idarəçilik babanın öhdəsində olurdu və ondan sonra isə bu məsələlər həmin nəslin oğul övladlarının vasitəsi ilə davam etdirilirdi. Qədim insanlar nəslin qalıb davam edə bilməsinin kişilərlə bağlı olmasına etiqad bəsləyirdilər Oğul övladın dünyaya gəlməsinə səbəb olan ata öz dini əqidə və adətlərini, eyni zamanda, bəzi xüsusi dini duaları və odun (atəşin) qorunması məsələlərini oğluna öyrədirdi. Bu cür xüsusiyyətlət qədinm Yunan, Roma və Hind ailələrində də mövcud olmuş və onlar nəsil artırma məsələlərini kişilərə mənsub edir .və qadını vasitəsiz olaraq öz ərinə və ya atasına şamil olduğunu deyirdilər

Bu qədim adətlərin nəticəsində ailələrin kişilərə məxsus edilməsi məsələsi meydana çıxmışdır. Qadınlar dini idarəçiliyə malik olmadıqlarından, dini mərasimlərdə və ailənin digər hüquqi imtiyazlarından yararlanmaqda onların heç bir səhm və payları yox idi. Sonradan da miras və irs məsələsi meydana çıxdı və onlar bu minvalla, irsdən ".məhrum oldular

Qadının irsdən məhrum olmasında başqa səbəblər də mövcud olmuşdur, o cümlədən, qadının döyüşçülük baxımından zəifliyi məsələsi və bura şamil idi. Qədimdə sərvət məsələləri qəhrəman və cəngavərlik xüsusiyyətlərinə görə bölüşdürülürdü və belə xüsusiyyətlərə malik olan bir insan yüzlərlə zəif insandan üstün hesab edilirdi. Amma qadın özünün müdafiə və döyüşmək qabiliyyətinə malik olmadığına görə, onu irsdən məhrum etmişdilər. Cahil ərəblər də təbəqələşdirməçilik və qeyd etdiyimiz məsələlərə əsasən, qadına kişi ilə bərabər irs

.verilməsinin əleyhinə idi

Quran ayəsi nazil olaraq qadına da irs verilməsini bildirdiyi zaman, ərəblər bu :məsələyə həddən artıq təəccüb etdilər. Həmin ayə belədir

{لِلرِّجَالِ نَصِيبٌ مِمَّا تَرَكَ الْوَالِدَانِ وَالْأَقْرَبُونَ وَلِلنِّسَاءِ نَصِيبٌ مِمَّا تَرَكَ الْوَالِدَانِ وَالْأَقْرَبُونَ مِمَّا قَلَّ مِنْهُ أَوْ كَثُرَ نَصِيبًا مَفْرُوضًا}

Kişilərin ata, ana və yaxın qohumlarının qoyub getdiklərində payları vardır. Qadınların" da ata, ana və yaxın qohumlarının qoyub getdiklərində payları vardır. (Mal istər) az olsun, istərsə də çox, müəyyən və vacib bir pay(dır). (Belə bir hökmün olması ağıl baxımından lazım və gərəklidir, onun miqdarı və necəliyi isə hər bir şəriətə uyğun (surətdə vacibdir)."(١)

Qeyd edilmişdir ki, ərəbin məşhur şairlərindən olan Həssan ibn Sabit vəfat etdiyində, onun qadını və qız övladları qalmışdı. Amma onun əmisi oğlanları şairin irsindən bəhrələndilər, lakin onun qadın və qız övladlarına həmin mirasdan heç bir şey vermədilər. Onun xanımı peyğəmbərin (s) yanına şikayətə getdi. O həzrət Həssan ibn Sabitin əmisi oğlanlarını yanına çağırtdırdı. Onlar dedilər: "Qadınlar silah götürüb döyüşdə iştirak edə bilmirlər və biz onların yerinə vuruşur və onları müdafiə edirik. Bu səbəbdən, irs onlara deyil, bizə çatmalıdır." Peyğəmbər (s) Allahın bu barədəki .(hökmünü onlara başa salaraq təbliğ etdi (onları bu işdən çəkindirdi

**Ögey oğulun irsi**

Cahil ərəblər bəzən bir nəfəri oğulluğa götürürdülər və həmin şəxs vəfat etdiyi zaman, ögey övlad da ailənin digər üzvləri kimi irs aparmaq hüququna malik olurdu (onlar bu .(cür düşünürdülər

Ögey övlad götürmək məsələsi qədimdə İran və Romada da məşhur və mövcud olmuşdur. Bu adət və ənənəyə uyğun olaraq, ögey olan oğul övladlar ailədə elə bir imtiyaz və hüquqlara malik olurdular ki, həmin nəsilin qız övladları ona sahib deyildilər. ,Həmin üstünlüklərdən biri mirasın aparılmasında

digəri isə hansısa bir şıxsin ögey qızla evlənə bilməməsi idi. İslam bu adət və ənənələri .də ləğv edərək aradan qaldırmışdır

### Bir–biri ilə əhd–peyman bağlayanların irsi

Ərəblərin Qurani-kərimdə qadağan edilən irslə bağlı adətlərindən bir də əhd-peyman bağlayanların bir-birindın apardığı irs idi. Onların əhdi belə idi: "Sənin qanın mənim qanım, sənə edilən təcavüz də mənə edilən təcavüzdür. Mən səndən, eyni zamanda, sən də məndən irs aparırsan." Bu sözlərlə onlar arasında peyman bağlanırdı və onlar həyatda olduqları müddətdə bir-birini müdafiə edirdilər və onlardan hansı biri tez .dünyasını dəyişərdisə, digəri ondan irs aparırdı

### Qadının da aparılan irsin bir hissəsi olması

Ərəblər bəzən ölən şəxsin qadının da irsin bir qismi olduğunu düşünür və digər mallar kimi ona da sahiblənirdilər. Əgər ölən şəxsin başqa bir qadından oğlu olardısa, həmin qadının əyninə xüsusi bir paltar geyindirirdilər və həmin paltar onun (qadının) artıq sahibi olduğunu bildirməyə xidmət edirdi. Həmin qadını özünün nikahına keçirmək və ya başqa biri ilə evləndirərək onun əvəzində mehriyyə almaq isə şəxsin istəyi və meyilinə bağlı idi. Bu məsələ təkcə ərəblərə şamil deyildi və digər millətlərdə də mövcud idi. İslam bu qanunu da ləğv edərək aradan qaldırmışdır. Qədim zamanlarda İran, Hindistan, Yunan, Roma və Yaponiyada da qadına bu cür zülümlər edilmiş və kişi ilə qadın arasında ayrı-seçkilik qoyulmuşdur. Əgər biz onlarla bağlı söhbət açmaq istəsək, həddən artıq çox zaman alar və bu kitaba sığmaz. Bu cəhətdən onu barəsində .ətraflı danışmırıq

### İranda Sasanilər dövründə qadının irsi

Mərhum Səid Nəfisi "Sasanilər zamanından Əməvilərin süqutuna qədər İranını ictimai tarixi" adlı əsərinin qırx ikinci səhifəsində belə yazır: "Sasanilər dövründə ailə təşkili ilə bağlı diqqəti cəlb edən məsələlərdən biri atanın həddi-büluğ və yetkinlik yaşına çatan oğluna sayca çoxluq təşkil edən

qadınlarından birini evlənmək üçün bağışlaması idi. Sasani mədəniyyətində geniş yayılan digər bir məsələ qadının hüquqi azadlığa malik olmaması, əksinə ər və atanın qadının malı üzərində geniş imtiyaz və hüquqlara sahib olması məsələsidir. Qız uşaqları on beş yaşına çatdığı zaman, ata və ya ailənin rəisi onu ərə vermək ixtiyarına .malik idi, amma oğlanların evlilik yaşı iyirmi yaşdan hesab edilirdi

Eyni zamanda, atanın razılıq məsələsi də burada əhəmiyyətə malik idi və şərt hesab edilirdi. Ərə verilən qadın ata və ya ərindən hansısa bir irs aparmaq haqqına layiq bilinmirdi və onun ərlə bağlı seçim etmək ixtiyarı da yox idi. Qızlar yetkinlik yaşına çatdığında, əgər atası onu evləndirmklə əlaqədar səhlənkarlıq etsəydi, bu zaman onun qızı istədiyi adamla evlənə bilərdi və bu halda da o, atasından irs aparmırdı. Kişinin ala biləcəyi qadınların sayında məhdudiyyət yox idi və yunan sənədlərində .onların yüzə qədər qadınları olduğu da bildirilmişdir

Sasanilər dövründə evlilik qaydaları - onların qədim dini abidələri hesab edilən zərdüştlük əsərlərində (Avestada) bildirilib - həddən artıq qarışıq hala malik idi və .orada beş növ evliliyə işarə edilmişdir

Ata və anasının razılığı ilə evlənən və ondan dünyaya gələn uşaqlar həm bu, həm də .١ .o dünyada qadına mənsubdur. Bu cür qadın "şah qadın" adlandırılırdı

Ata və anasının yeganə övladı olan qadını "yeganə övlad" adlandırırdılar. Həmin .٢ qadın ailə qurub övlad dünyaya gətirir və o övladı ata və anasına verirdi ki, .nəsillərindən gedən qızın (özünün) yerini tutsun. Belə qadına "şah qadın " deyirdilər

Əgər hansısa bir kişi yetkinlik yaşında ölsə və qadını olmasaydı (evlənməmiş .٣ olsaydı), onun ailəsi yad bir qıza cehiz verərək onu yad bir kişinin nikahına keçirirdilər və həmin qadını "ögey qadın" adlandırırdılar. Eyni zamanda, o hər nə qədər övlad dünyaya gətirsəydi, onların yarısı həmin dünyadakı insanların təfəkkürünə əsasən, .ölən kişiyə şamil edilir və qalan hissəsi isə sağ olan qadının ərinə mənsub edilirdi

Dul qalan və ikinci dəfə evlənmiş olan qadını "xidmətçi .۴

.qadın" adlandırırdılar

Ata və ananın razılığı olmadan evlənmiş olan qadın qadınlar arasında ən pisi hesab .۵ edilirdi. O qadın da atasından irs aparmırdı. Amma oğlan övladı olsa və yetkinlik yaşına ".çatsaydı, onda irs apara bilərdi

İslami qanunlarda irslə bağlı keçmiş zamanda olan heç bir çatışmamazlıq mövcud deyil. Hüquq bərabərliyi iddiasında olanların etiraz etdikləri məsələ İslamda qadının irsinin kişinin irsinin yarısı qədər olmasıdır. İslamın nəzərində oğlan iki qızın mirası bərabəri, qardaş iki bacının və ər də iki qadının irsi miqdarında mirasa malikdir. Təkcə ata və ananın irsi fərqə malikdir və əgər onların oğulu vəfat etsə və ondan miras .qalsa, özləri həyatda olan müddətdə hər bir valideynə onun mirasının altıdabiri çatır

İslamda qadının irsinin kişinin irsinin yarısı qədər təyin edilməsinin bir sıra səbəbləri vardır. Həmin səbəblər, onun nəfəqəyə, mehriyyəyə və s. məsələlərə malik olmasıdır. Bu xüsusi qanunlar onun irsinin kişinin irsinin yarısı qədər olmasına səbəb olur. Əvvəlki bəhslərdə də bildirdiyimiz kimi, İslam ailə münasibətlərinin qorunması, kişi və qadın arasındakı rabitələrin möhkmlənməsi və onlar arasında vəhdətin meydana gəlməsi üçün mehriyyə və nəfəqə məsələsinin zəruri olduğunu, eyni zamanda, həmin məsələlərinin evlilik təməllərinin möhkəmlənməsinə xidmət etdiyini bildirmişdir. Mehriyyə və xüsusən də, nəfəqənin ləğv edilməsi İslamın nəzərində ailə təməllərinin .sarsılması və qadınların fahişəliyə sürüklənməsinə gətirib çıxaran amillərdir

Qadına mehriyyə və nəfəqənin verilməsi zəruri olduğundan, o, ailə büdcəsinin azalmasına səbəb olmuşdur. Kişi mehriyyə və nəfəqə yükünü öz çiyinlərində daşıdığı üçün, irs məsələsində qadının mirası kişinin mirasının yarısı qədər təyin edilməklə həmin çətinliklər, bir növ, təlafi və bərpa edilmişdir. Beləliklə, qadına nəfəqə və .mehriyyə verildiyi kimi, kişinin irsi iki qadının irsi qədər müəyyən edilmişdir

Qərbə meyilli olan bəzi insanlar ədalətdən dəm vurub danışdıqları zaman, qadının irs məsələsindən İslamın əleyhinə bir təbliğat vasitəsi kimi istifadə etməyə çalışır və səs-küy qaldırıraraq nəfəqə və mehriyyə məsələsinə toxunurlar. Onlar deyirlər ki, qadının irsini kişinin irsinin yarısı qədər təyin edib sonra həmin azlığı mehriyyə və nəfəqə ilə təmin etməyə nə ehtiyac vardır? Nə üçün çətinliyə əl ataraq tikəni ağzımıza başımızın arxasından gətirib qoymalıyıq? Elə əvvəlcədən, qadının irsini kişinin irsi qədər müəyyən edək ki, sonradan onun təlafi və bərpası üçün mehriyyə və nəfəqəyə əl .atmayaq

Birincisi, anadan da mehriban olmağa çalışan bu dayılar səbəb yerinə nəticə, nəticə yerinə də səbəbi götürərək səhvə düçar olmuşlar. Onlar qəflətə düşərək nəfəqə və mehriyyəni irsin müəyyən edilməsinin xüsusi nəticəsi olduğunu təsəvvür etmişlər, .halbuki, irsin təyin edilməsinin xüsusi nəticəsi mehriyyə və nəfəqənin təyin edilməsidir

İkincisi, onlar bu barədə mövcud olan bütün məsələlərin maddi və iqtisadi yönünü nəzərdə tutmuş və təkcə bu cəhətin olduğunu güman etmişlər. Aydın məsələdir ki, əgər maddi və iqtisadi yönlər nəzərdə tutulmuş olsaydı, işin içində mehriyyə və nəfəqə olmaz və qadının irsi kişinin irsindən fərqləndirilməzdi. Əvvəlki bəhslərdə də nəzərinizə çatdırdığımız kimi, İslam bəziləri təbii və bəziləri də psixoloji olan bir çox məsələləri .diqqətə almışdır

Başqa sözlə desək, qadın nəsill artırılması baxımından həddən artıq əziyyət çıkdiyi halda, kişi həmin məsələlərdə azad və sərbəstdir. Qadın kişyə nisbətdə gəlir əldə etmək cəhətindən zəif, amma istehlak və pul xərcləməkdə kişilərdən daha çox bədxərcdirlər. Onlar (kişi və qadın) psixoloji və ruhi baxımdan da bir-birləri ilə fərqlərə malikdirlər. Xülasə, İslam ailə münasibət və təməllərinin möhkəmlənməsinə xidmət edən bütün məsələləri nəzərə almış və bu səbəbdən də qadın üçün mehriyyə və nəfəqə təyin etmişdir. Həmin məsələ kişinin yükünün ağırlaşmasına gətirib çıxarmış və İslam bu məsuliyyət

və çətinliyi aradan qaldırmaqdan ötrü, kişinin irsini qadının irsinin iki bərabəri .miqdarında müəyyən etmişdir

Deməli, işin içində sadəcə iqtisadi və maddi məsələlər yoxdur və bu baxımdan, “nə üçün bir tərəfdən qadının irsi azaldılır və digər tərəfdən də onu təlafi edirlər” demək .olmaz

## İslamın əvvəllərində irs məsələsinə edilən iradlar

İslamın nəzərində mehriyyə və nəfəqənin səbəb və irs məsələsinin isə nəticə olduğunu söyləmişdik. Bu məsələ yeni yaranan bir məsələ deyil, o, elə İslamın .əvvəllərindən mövcud idi

İbn Əbil Ovca ikinci əsrdə yaşamış və dinə etiqadı olmayan bir şəxs idi. O, özünün azadlığından istifadə edərək hər yerdə öz etiqadlarəni yaymağa çalışırdı. Hətta, bəzi vaxtlarda Məscidül-həram və ya Məscidün-nəbiyə gələrək “tövhid”, “əqaid”, “məad” və “üsul” elmləri barəsində alimlərlə elmi mübahisələr edirdi. Onun mübahisə və etiraz etdiyi məsələlərdən biri də kişidən zəif olan qadına nə üçün irsin yarısı, amma qadından qüvətli olan kişiyə isə irsin iki bərabərinin verilməsi məsələsi idi. Onun .düşüncəsində bu, ədalət və insafın ziddinə idi

İmam Sadiq (ə) həmin məsələni ona izah edərkən qadının döyüşdən azad edilməsi, kişinin mehriyyə və nəfəqə ödəməsinin zəruri olması, bəzi cinayət məsələlərində əgər diyə tələb edilərsə, qadının diyə verməkdən azad olması kimi halları qeyd edərək vurğulayır və mirasın bu cür bölgüsünü həmin səbəblərlə əlaqələndirir. İmam Sadiqin (ə) irsi mehriyyə və nəfəqənin nəticəsi olaraq göstərməsi də diqqəti cəlb edən məsələlərdəndir, həmçinin, digər imamlardan da bu barədə söhbətlər edilmiş və .onların hamısı eyni cavabı vermişlər

## ONUNCU HİSSƏ

### (Talaq (boşanma) haqqı (۱

Bizim əsrdə olduğu kimi heç bir əsrdə ailə münasibətləri və onun dağılmasına bais olan səbəblərə bu qədər diqqətsizlik edilməmişdir. Eyni zamanda, bizim dövrümüzdə insanlar həmin çətinlik və problemlərlə daha çox üzləşməli olmuşlar. Qanunları müəyyən edənlər (qanunverici orqanlar), hüquqşünaslar, psixoloqlar – onların hər biri ixtiyarlarında olan imkan və vasitələrlə ailə və evlilik təməllərinin möhkəm və sarsılmaz olmasına çalışmışlar, amma bununla belə, həmin çətinliklər getdikcə artmağa başlamışdır. Eyni zamanda, statistik məlumatlar da talaq və boşanma, həmçinin, əksər ailələrin dağılmasına səbəb olan problem və məsələlərin ildən-ilə .artması hallarının hər tərəfə kölgə saldığını göstərir

Adətən, cəmiyyətdə hansısa bir xəstəliyin artması müşahidə edilib diqqəti çıkdiyi zaman, bütün maddi və mənəvi qüvvələrdən istifadə edərək onun kökünün kəsilməsi və tələfatının azaldılmasına çalışılır. Amma talaq xəstəliyi həmin məsələnin əksinə .olaraq günbəgün artmaqdadır

### Yeni həyatda (əsrdə) talaq və boşanma hallarının artması

Keçmiş zamanlarda talaq və onun mənfi təsirləri, oun yaranma və artmasına səbəb olan amillər, eyni zamanda, talaq

və boşanmanın baş verməsinin qarşısının alınması yolları barədə düşünmək bir qayda halını almışdı. Bu səbəbdən talaq halları çox az müşahidə edilir və çox az ailələr bir-birindən ayrılırdı. Dünənki günlə bugünkü günün fərqi talaq və boşanma səbəbləri və sayının həddən artıq artmasıdır. Hazırda ictimai həyat elə bir şəkil və formaya düşüb ki, onda boşanma səbəbləri, ailələrin dağılması və təfriqə və münaqişələr artmağa başlamış və bu barədə alim və xeyirxah insanların fikir və düşüncələri indiyə qədər də təəssüflər olsun ki, bir nəticə verməmişdir. Gələcəkdə bu kimi məsələlərin daha da .fəsadlı və təhlükəli bir şəkil alacağı qaçılmazdır

Günün qadını" jurnalının yüz beşinci sayında "Nyuz vik" (həftəlik xəbərlər) jurnalından" "Amerikada talaq və boşanma" adlı maraqlı bir məqalə dərc edilmişdir. Həmin məqalədə belə yazılır: "Amerikada boşanmaq taksi tutmaqdan da asan bir məsələdir. Amerikadakı camaat arasında talaq və boşanma ilə bağlı olan iki zərbül-məsəl digər məsəllərdən daha çox məşhurdur. Həmin məsəllər belədir: "Kişi və qadın arasındakı ən çətin maddəli saziş və müqavilələr belə, talaq və boşanmadan daha yaxşıdır. Bu məsəli Migel De Servantes adlı bir şəxs dord yüz il əvvəl dilinə gətirmişdir. İkinci məsəl Sami Kahen tərəfindən XX əsrin ikinci yarısında söylənilmişdir. Həmin məsəl birinci məsəlin tamamilə əksinə olan bir şüar şəklindədir. O məsəldə deyilir: "İkinci eşq daha ".çox ürəyəyatandır

Məqalənin mətnindən ikinci məsəlin Amerikada öz işini görərək təsir qoyduğu anlaşılır. Çünki ardınca belə qeyd edilmişdir: "Talaq və boşanma ilğımı təkcə yeni evlənənləri deyil, əksinə daha əvvəl evli olan ər və arvadı özünə tərəf çəkməkdədir. Qeyd edək ki, Amerikada talaq və boşanmanın sayı ildə dörd yüz minə çatmışdır və onun qırx faizini on il və on üç faizini isə iyirmi illik evliliklər təşkil edir. Amerikada boşanan iki milyon qadının orta yaşı qırx beşdir. Talaq verilmiş qadınların altmış iki faizi ayrılan zaman, on səkkiz yaşdan az olan övladlara sahib olmuşlar. Ayrılan qadınlar, hıqiqətdə, xüsusi bir nəsli təşkil edir. Talaqdan sonra boşanamış qadınlar

özlərini azad hiss edirlər. Amma orta və cavan yaşlı boşanmış qadınlar özlərini heç də .şad və xürrəm hesab etmirlər

Bu məsələni çoxlu sayda psixoloqlara müraciət edən, özünə qəsd edərərk intihara əl atan, içki və digər məsələlərə pənah aparan qadınların hallarından da anlamaq mümkündür. Boşanmış qadınlar arasında dörd nəfərdən biri içkiyə qurşanır və intihar edərək özünü öldürənlər isə evli qadınların üç bərabərini təşkil edir. Başqa bir ifadə ilə desək, məhkəmədən talaq almaq qələbəsi ilə xaric olan amerikalı qadın talaqdan sonrakı həyatın heç də özünün zənn etdiyi kimi, cənnətə bənzəmədiyini başa düşür. Təbii olaraq evlilik münasibətləri ilə möhkəmləndirilən həyatda bu cür səhvlərə yol verən və ayrılan qadınlar barədə yaxşı düşüncəyə malik olan və ikinci dəfə onlarla evlənmək istəyən insanlar həddən artıq azlıq təşkil edir. Belə qadınlara cəmiyyətdə yaxşı münasibət bəslənilməsi, onlara ehtiram edilməsi və hətta, qibtə edilməsi də mümkündür. Amma çətin ki, öz xoşbəxtliyini axtaran bir şəxs həmin səadəti bu .qadınlarda görə bilsin

Bu məqalələrdə kişi və qadın arasındakı talaq və boşanma hallarının yaranmasına anlaşılmazlıqlar, münaqişə və əxlaqi çatışmamazlıqların olmasının səbəb olduğu, yoxsa, digər məsələlərdən qaynaqlandığı barədəki suallara cavab verilərək belə bildirirlir: “Yeni evli olan cavanların boşanması amilinə anlaşılmazlıqları misal gətirsək, ?onda, köhnə evlilərin ayrılıq və boşanmasını necə izah edə bilərik

Amerikada boşanmış qadınlara verilən imtiyaz və hüquqları təmin edən qanuna nəzər saldıqda, ayrılıq və talaq hallarının anlaşılmazlıq və uyğunsuzluqlardan meydana gəlmədiyi, əksinə tərəflərin həmin çatışmamazlıqlara tab gətirmək meyil və istəyinə malik olmadığı, daha çox ləzzət axtarışı və kam almaq ardınca olmasından yarandığı .məlum olaraq anlaşılar

Bizim əsrimizdə hamiləlik hallarının qarşısını almağa xidmət edən dərmanlardan istifadə edilməsi və qadınlarda cinsi həssasiyyətlərin artırılmasına çalışmaq qadınlar arasında cinsi ləzzət və istəklərin ödənməsinin ailə təməlləri və onun qorunmasından müqəddəm və öncə olması əqidəsinin meydana çıxmasına səbəb

olmuş və şiddətlənmişdir. Bəzən uzun illərlə birlikdə yaşayaraq qəm və kədərlərini bir-biri ilə bölüşmüş ər və arvadları müşahidə etmək mümkündür ki, gözlənilmədən qadın onun maddi və mənəvi həyatında heç bir dəyişiklik olmadan (mənfi mənada) boşanmaq və talaq verilmək fikrinə düşür. Buna səbəb, onun dünənə qədər ailədəki eyni səviyyəli və yorucu məsələlərə tab gətirə bilmək dözümü və səbrinin olması, amma bu gün isə həmin məslələlərə dözə bilməməsidir. Amerikanın bugünkü qadınları dünənin qadınlarından daha artıq kam almaq axtarışı və ardıncadır, eyni zamanda, onlar uyğunsuzluq və çatışmamazlıqlara dözmək və səbir baxımından, öz ".nənələrindən də səbirsizdirlər

### İranda boşanma və talaq

Talaq və boşanmanın artması təkcə Amerikaya şamil və mənsub deyil. Bu məsələ əsrin ümumi bir xəstəlik və infeksiyasıdır. Qərb adət və ənənəsinin daha çox nüfuz etdiyi yerlərdə ayrılıq və boşanmanın statistikasi artmağa doğru irəliləyir. Məsələn, elə İranın özünü götürək. İranın şəhərlərində boşanma halları onun əyalətlərinə nisbətdə çoxdur. Amma Qərb mədəniyyətinin daha çox nüfuz etdiyi Tehranda boşanma və .ayrılıqlar digər şəhərlərdən daha artıqdır

Məlumat" jurnalının on bir min beş yüz on ikinci sayında İranda baş verən evlilik və" boşanmanın statistik göstəriciləri xülasə şəkildə qeyd edilmiş və orada yazılmışdır: "Ölkəmizdə qeydə alınan talaq və boşanma hallarının dörddəbiri Tehran şəhərinin payına düşür. Halbuki, bu şəhərin əhalisi ölkə əhalisinin on faizini təşkil edir. Ümumi halda, Tehrandakı evlilik və izdivacın sayı boşanma və ayrılıq sayından qat-qat azdır. Yəni, buradakı evliliyin statistik göstəriciləri bütün ölkə əhalisinin evlilik göstəricisinin " .on beş faizini təşkil edir

### Amerikada getdikcə artmaqda olan boşanma və talaq mühiti

Söhbət "Həftəlik xəbərlər" jurnalına istinadən Amerikadakı qadınların cinsi ləzzət və daha çox kam almaq ardınca gedərək bu

məsələni ailə təməllərinin möhkəmlənməsi və qorunmasından üstün tutmasından düşdüyünə görə, icazə verin bir qədər artıq bu barədə araşdırma apararaq Amerika qadınının nə üçün belə bir vəziyyətə düşməsi məsələsinə toxunaq. Bu məsələ sadəcə qadınla bağlı deyil, onun ictimai səbəbləri də mövcuddur. Amerika ictimai mühitinin ona belə bir ruhiyyə əta edərək zəminə yaratdığı aydın bir məsələdir. Avropaya meyilli olan iranlılar bizim qadınlarımızı da Amerika sayağı qadınların addımladığı bir yola sürükləmək istəyirlər. Əgər onlar belə bir işə iran cəmiyyətində əməli don geydirə bilsələr, şübhəsiz ki, İran qadınının taleyi və onun ailəsi də Amerika qadınlarının .ailəsinin vəziyyətinə düşəcəkdir

Həftəlik nəşr edilən qəzetlərdən birinin altmış altıncı sayında belə yazılmışdır: “İş elə bir yerə çatıb ki, faransızlar da amerikalıların hədlərini aşaraq lap ağ elədiklərini söyləmişlər. Fransanın məşhur qəzeti olan “Frans Sevar”da Kaliforniyadakı əksər bar və kafelərdə sinəsi və başıaçıq qadınların xidmətçi ünvanında işlədiyi qeyd edilmişdir. Qadınların sinələrini örtən geyimlərin olmaması Los Anceles və Kaliforniyada iş forması kimi qələmə verilmişdir. Nyuyorkda isə cinsi məsələlərə həsr edilmiş çılpaq qadınlarla bağlı filmlər translyasiya olunur. Həmin filmlərə də bu cür adlar qoyurlar: “Əxlaqla müxalif olan qızlar”, “Bir-biri ilə qadınlarını dəyişən kişilər”, “Heç bir şey geyinməyən qadın”, eyni zamanda, kitabxanalarının vitrinlərində qoyulmuş kitablarının cildində lüt qadın şəkili olmayanını tapmaq qeyri-mümükündür. Hətta, klassik kitablar arasında da bu şəkildə olanlar hədsiz dərəcədə çoxdur. Həmin kitabların adları belədir: “Amerikalı kişinin cinsi pozaları”, “Qərbli kişilərin cinsi həyatı”, “Yaşı iyirmidən aşağı olan cavanların cinsi vəziyyəti”, “Cinsi məsələlərdə yeni pozalar ən təzə məlumatlarla” Beləliklə, “Frans Sevar” qəzetinin redaktoru heyrət və təəccüblə özündən bu minvalla Amerikanın hara doğru irəlilədiyini soruşur və ardınca yazır: “Düzü, mən sadəcə bu məmləkətin millətinə acıyıram, çünki onlar özlərinə yaxşı bir əyləncə tapdıqlarını ””.düşünür və bu sahədə it yiyəsini tanımır

Əgər amerikalı qadın öz cinsi ləzzətləri və kam almaq

istəyini ailə və ərindən üstün tutursa, bu məsələdə tənha həmin qadının özü müqəssir deyil, Amerika mühiti və onun bu zəminədə göstərdiyi fəaliyyət ailə təməllərinin sarsılmasına və onun müqəddəs dayaqlarının çökməsinə gətirib çıxarmışdır. Görəsən, uzaqgörənlər bizim əsrimizdə günbəgün artan talaq amilləri və ailələrin dağılması barədə düşünür və bu məsələlərin artma səbəbi ilə maraqlanırlarmı? Belə şəxslər bir tərəfdən boşanma amillərinin artmasına səbəb olur və digər tərəfdən də onun qarşısını qanunla almaq istəyirlər. Bu məsələlər insanları düşündürən məsələlər .olmalıdır

## Fərziyyələr

İndi mətləbi əsaslı şəkildə bəhs edəcəyik. Əvvəlcə, nəzəri cəhətdən diqqət edək görək talaq və boşanma yaxşıdır və yaxud pis? Əgər yaxşıdırsa, onda, talaq və boşanma qapısı ümumi şəkildə açıq olmalı və ailə təməlləri bir-birinin ardınca dağılmalıdırmı? Əgər onun yaxşı olduğunu qəbul etsək, deməli, boşanmağa səbəb olan amillərin günbəgün artması yaxşı bir şeydir. Yaxud da əksinə, talaq və boşanma qapısını tamamilə bağlamaq, evlilik və icdivacın məcburən əbədi şəkil almasını təmin etmək və boşanmaya və evliliyin müqəddəs təməllərinin sarsılmasına gətirib çıxaran bütün amillərin qarşısını almaq lazımdırmı? Yoxsa, işin içində üçüncü bir həll yolu mövcuddur və o, qanunun talaq qapısını ümumi şəkildə aradan qaldırması və kişi ilə qadının üzünə bağlaması deyil, əksinə onun saxlanılmasını zəruri və lazımlı bilməkdən ibarətdir. Bu cəhətdən, cəmiyyət də həmin məsələlərlə bağlı səy və təlaş etməli və ailə münasibətlərində meydana çıxan münaqişə və çatışmamazlıqların aradan .qaldırılmasına çalışmalıdır

Cəmiyyət özü ailələrin dağılması, ərlə arvadın ayrılması və uşaqların başsız qalmasına, eyni zamanda, təfriqə və münaqişəyə səbəb olacaq amillərlə mübarizə aparmalıdır. Qanun özü bu barədə təkcə fəaliyyət göstərməklə boşanma və talaqın qarşısını ala .bilməz. Yəni cəmiyyətin də rolu bu sahədə əhəmiyyətə malikdir

Qanunun boşanma qapısını hamının üzünə açıq qoyması

nəzərdə tutulsa, bu, hansı formada həyata keçirilməlidir. Bu qanun təkcə qadına, yoxsa, kişiyə şamil olmalıdır, yaxud onların hər ikisinə? Eyni zamanda, onu kişi və qadın üçün eyni şəkildə nəzərdə tutmalıdırmı? Yəni kişi və qadının evlilik əhatə dairəsindən xaric olması bərabər şəkildə olmalıdırmı? Bu barədə ümüumilikdə beş :dənə nəzəriyyəni sizin diqqətinizə çatdıra bilərik. Həmin nəzəriyyələr belədir

Talaqa əhəmiyyət verilməməsi və bu barədə qanun və əxlaqi qeyd və şərtlərin .١ .nəzərə alnmaması

Evlilik məsələlərinə sadəcə cinsi ehtiyacların ödənilməsi kimi baxan, ailə məsələlərinə cəmiyyətdə əhəmiyyət verməyən, həmçinin, evliliyin tez bir zamanda yenilənməsini düşünən və daha çox ləzzətlər almaq ardınca olan kəslər bu fərziyyənin tərəfdarıdırlar. “İkinci məhəbbət və eşq daha çox ürəyə yatandır” – deyən şəxs, şübhəsiz ki, belə fərziyyəni təsdiqləyəcəkdir. Bu formada irəli sürülən fərziyyədə həm ailə münasibətlərinin cəmiyyətdəki dəyəri unudulmuş, həm də ailə və evliliyin davam etməsi, kişi və qadın arasındakı səmimiyyətlərin yaranması və onların vahid bir ruh kimi formalaşmasından yaranan səadət və xoşbəxtlik görməzdən gəlinmişdir. Bu .fərziyyə həmin zəminədə mövcud olan ən pis və nalayiq fərziyyələrdən biridir

Evlilik və izdivac müqəddəs bağlılıq, ruh və qəlblərin vəhdəti olması səbəbi ilə bu .٢ bağlılıq həmişəlik olaraq qorunub saxlanılmalı və talaq və boşanma məsələsi ictimai .həyatdan silinib aradan qaldırılmalıdır

Evlilik münasibətləri ilə bir-birinə bağlanan ər və arvad onları ölümdən başqa, heç bir şeyin ayıra və aralarında fasilə sala bilməyəcəyini başa düşərək anlamalıdırlar. Bu fərziyə katolik kilsəsinin əsrlərdən bəri tərəfdar olduğu və heç bir yolla aradan qaldırılmasına razılaşmadığı fərziyyədir. Həmin fərziyyənin tərəfdarları dünyada sayca .azalmaq üzrədir

Hazırkı dövrdə həmin məsələlərə İtalya və İspanya katolikləri istisana olmaqla, heç kəs əməl etmir. Son zamanlarda qəzet və jurnallardan İtalyada da qadın və kişilərin fəryad səsi ucalaraq talaq və boşanma qanununun rəsmi şəkildə tanınmasını

tələb etdiklərini və onların müvəfəqiyyətsiz və uğursuz evliliklərə son qoyaraq həmin .evlilikləri davam etdirməməyi düşündüklərini oxuyuruq

Bir müddət bundan öncə, "Əsr" qəzetində "Deyli ekspress" qəzetindən "İtalyadakı qadının evliliyi onun qula çevrilməsidir" adı altında bir məqalə tərcümə edilmişdir. Həmin məqalədə İtalyada talaq və boşanma qanununun olmaması səbəbindən əksər insanların qeyri-şəri və qeyri-qanuni olaraq cinsi münasibətlərlə məşğul olduğu yazılmışdır. Eyni zamanada, İtalyadakı insanların hal-hazırda həyatlarının günahla keçdiyi və talaq qanunu olmadığından, qeyri-qanunu münasibətlərə düçar olduqları da həmin məqalədə qeyd edilmişdir. Qəzetdə "Feyqar" qəzetinə istinad edilərək İtalyadakı insanların talaq və boşanma olmaması səbəbi ilə böyük bir çətinliklə üzləşməli olduqları yazılmışdır. Bildirilmişdir ki, ölkə əhalisinin əksəriyyəti ölkəni tərk .edərək başqa yerlərə gedir

İtalya təşkilatlarından biri son zamanlarda qadınlardan talaqın icra edilməsinin din və məzhəblə ziddiyyət təşkil edib-etmədiyi barədə öz nəzərlərini bildirməsini istəmişdir. Qadınların doxsan səkkiz faizi bu suala mənfi cavab vermişdir. Yəni, din və onların məzhəbi ilə heç bir ziddiyyət təşkil etmir. Katolik kilsələri isə evliliyin sabit qalması məsələsində israr edərək öz nəzərində təkid edir və hətta, bunun üçün çoxlu dəlillər .də gətirir

Evlilik münasibətlərinin müqəddəs olması məsələsində heç bir şübhı yoxdur, amma bu, o zaman keçərlidir ki, həmin münasibətlər hər iki tərəf arasında sabit və qorunmuş olaraq qalsın. Bəzən kişi və qadın arasında ailədə elə hallar yaranır ki, onların bir-biri .ilə razılıq və saziş əldə etməsi qeyri-mümükün olur

Bu cür vəziyyətlərdə qanunun zoru ilə kişi və qadını bir-birinə bağlayaraq həmin münasibətlərinin adını evlilik qoymaq olmaz. Kilsə düşüncə və nəzəriyyəsinin məğlubiyyətə düçar olacağı qəti bir məsələdir. Katolik kilsəsinin öz nəzəriyyələrini yenidən diqqətdən keçirməyə məcbur olacağı qaçılmaz bir həqiqətdir və bizim bu .barədə bundan daha artıq bəhs etməyimizə gərək qalmır

Bu fərziyyədə qadının heç bir şəkildə talaq vermək .٣

haqqına malik olmadığı və əksinə, kişinin bu haqqa sahibliyi barədə söhbət açılır. Qədim dünyada bu cür düşüncələr vardı, amma hazırkı dünyada həmin fərziyyənin tərəfdarlarının olmasını güman etmirik və bu barədə həddən artıq bəhs etməyə .ehtiyac duyulmur

Evlilik və izdivacın müqəddəs olmasına baxmayaraq, talaq və boşanma məsələsi evli .۴ olanların hər biri üçün mümkün olmalıdır. Eyni zamanda, onların bu labirintdən çıxış .yolları da eyni şəkildə və eyni cür nəzərdə tutulmalıdır

Kişi və qadın hüquqlarının oxşar və bənzərliyi iddiası edərək ona səhvliklə "hüquq bərabərliyi" adını qoyan şəxslər bu fərziyyənin tərəfdarıdırlar. Bu dəstədən olanların nəzərində qadın üçün nəzərdə tutulan bütün məsələlər eynilə də kişi üçün olmalı və bunun əksinə olan şəraitdə qadına zülm və haqsızlıq, həmçinin, ayrı-seçkilik edilmişdir. .Yəni, kişi üçün boşanma haqqı necədirsə, qadın üçün də o cür olmalıdır

Evlilik və icdivac müqəddəs və ailə münasibətləri ehtirama layiq, amma boşanma və .۵ talaq nifrət doğuran olduğu üçün, cəmiyyət ayrılıq və boşanmalara səbəb olan məsələlərin qarşısını almağa çalışmalıdır. Bununla yanaşı, qanun müvəffəqiyyətli olmayan evliliklərdə boşanma məsələsini mane olmamalıdır. Kişi və qadın üçün nəzərdə tutulan yollar açıq olmalıdır. Diqqət etmək lazımdır ki, talaq və boşanma ilə əlaqədar kişi üçün müəyyən edilmiş yollar qadın üçün təyin ediləndən fərqlidir, çünki onlar oxşar və bənzər olmayan hüquqlara malikdirlər. Bu, İslamın qəbul etdiyi və .müsəlman ölkələrində kamil şəkildə deyil, naqis olaraq həyata keçirilən qanundur

**(Talaq haqqı (۲**

Bizim əsrimizdə talaq və boşanma məsələsi, beynəlxalq bir çətinlik və problemə çevrilmişdir. Bu barədə hamı ah-nalə və şikayət edir. Qanuni şəkildə boşanmanı ümumilikdə qadağan edən ölkələrdə insanlar uğursuz və namüvəffəq evliliklərdən xilas ola bilmədikləri səbəbi ilə dad-fəryad edirlər. Əksinə, kişi və qadına talaq və boşanma məsələlərində yaşıl işıq olan

ölkələrdə də insanlar ailə münasibət və təməllərinin möhkəm və davamlı olmaması, eyni zamanda, getdikcə talaq və boşanma sayının artmasından meydana gələn xoşagəlməz hadisələrdən gileylənərək şikayət edirlər və onların fəryadı asimana qalxır. Talaq haqqının sadəcə kişilərə verilməsindən şikayətlənənlərin etirazı iki :istiqamətdədir

İllərlə eyni bir qadınla birlikdə yaşayan alçaq və namərd (nanəcib) kişilərin ikinci bir .١ qadın sevdasına düşərək ona ömrünü-gününü, sağlamlığını fəda edən və ailəsinə bağlı olan qadınlara onların heç vaxt gözləmədiyi bir şəkildə talaq vermək istəməsi və .bu məsələni məhkəməyə qədər gedib çıxması

Boşandıqdan sonra yenidən bir araya gəlmələrinə ümid bəsləyən qadınların ümidini .٢ .boşanmış kişilərin üzməsi və buna onların etirazı

Adətən, həyatda ər və arvad arasında elə bir münaqişə və xüsusi anlaşılmazlıq yaranır ki, islahedici işlərin heç biri bu məsələdə fayda və nəticə vermir və həmin münaqişələr onlara hakim kəsilir ki, bu zaman onlar əməldə bir-birindən ayrı şəkildə həyat sürməyə başlayırlar. Təbii olaraq, belə bir şərait və vəziyyətdə onların hər ikisi əməldə qırılan münasibətlərin qanuni şəkildə də bitməsini və sona çatdırılmasını düşünür və həm kişi, həm də qadın digər şəxslərlə evlənməyi düşünür. Amma bəzi şəxslər qadınla qəddar şəkildə rəftar edərək ondan ayrılmır və onun ömür boyu əzab-əziyyət çəkməsinə .səbəb olaraq, Quranın təbiri ilə desək, asılı vəziyyətdə saxlayır

Müsəlmanlıqdan heç bir nəsib almamış və payı olmayan, özlərini müsəlman kimi göstərən həmin kişilərin bu cür əməl və münasibətləri islami qanunlarla dərindən tanış olmayan və ruh və qəlblərinə hələ sirayət etməmiş kəslər şübhəyə düşür və elə hesab edirlər ki, İslam qadınla bu cür rəftar etməyə icazə verir və İslamın istədiyi də elə .budur

Ona görə də həmin şəxslər təccüblə belə sual verirlər: “Görəsən, İslam dini həqiqətən də, kişiyə bəzən qadına talaq vermək, bəzən də onu boşamamaqla öz şəri hüquq və -ixtiyarından bu cür istifadə edərək qadına işkəncə və əzab

əziyyət verməsinə razı olmuş və icazə vermişdirmi? Bəyəm, bu cür işlər zülm deyilmi? Əgər zülm deyilsə, bəs onda, zülm nə olan şeydir?! Siz İslamın hər hansı bir forma və şəkildə olursa olsun, zülmlə müxalif olduğunu və onun bütün işləri haqq və ədalətə əsasən tənzimlədiyini demirsinizmi? Əgər bu zülmdürsə və İslam da zülmə qarşı şıxırsa, bir deyin görək, bunun qarşısını almaq üçün İslam dini hansı tədbirləri nəzərdə ”?tutmuşdur

Bu işin zülm olmasında heç bir sözümüz yoxdur. Sonrakı bəhslərdə diqqətinizə çatdıracağıq ki, İslam bu barədə düşünmüş və həmin məsələni başlı-başına buraxmamışdır. Amma bizim ondan qafil olmamağımızı gərəkdirən bir məsələ də var və o, həmin problemlərin qarşısını alma yollarının hansı olmasıdır. Belə problemlərin meydana çıxmasına sadəcə talaq və boşanma qanunu səbəb olmuşdurmu və biz qanunda dəyişiklik etməklə onun qarşısını ala bilərikmi? Yoxsa, qanunun da onların qarşısını almaqda aciz olduğu üçün, biz bu zülm və sitəmlərin kökünü başqa yerdə axtarmalıyıqmı? İslamla cəmiyyətin digər qanunları arasında olan fərqlər cəmiyyətdəki qanunların həmin məsələlərin həll edilməsində kifayət etdiyini .düşünməkdir, halbuki, İslamın nəzəri belə deyil

İslamın nəzərində qanunlar quru və sadə münasibətlərdən söhbət gedən zaman təsirli ola bilir, amma iş hissiyyat, qəlb və atifə ilə bağlı məsələlərə gəldikdə, başqa .vasitələrdən istifadə edərək faydalanmaq lazımdır

Biz İslamın qanunların təsirli ola biləcəyi yerlərdə ondan kamil şəkildə istifadə edərək .bu zəminədə səhlənkarlığa yol vermədiyini sübuta yetirəcəyik

**Namərdcəsinə verilən talaqlar**

Əvvəlcə, bizim günümüzdə əsas problemlərdən sayılan namərdliklə verilən talaq məsələsindən bəhs etmək istəyirik. İslam dini talaq və boşanma ilə ciddi şəkildə müxalifdir və mümkün olan həddə boşanmanın baş verməməsinə çalışır. İslamın nəzərində talaq ayrılmaq üçün nəzərdə tutulan xüsusi bir çarə funksiyasını daşıyır. Allah-taala günda bir qadını alaraq

.boşayan şəxsləri özünə düşmən bilir

Üsuli-kafi”də belə yazılır: “Peyğəmbər (s) kişilərin birindən qadını ilə münasibətlərinin“ necə olduğunu soruşduqda, o, öz arvadını boşadığını söyləyir. Peyğəmbər (s) ona deyir ki, qadın sənin xoşuna gəlməyən bir iş görmüşdürmü? O, “heç bir xoşagəlməz iş görməmişdir” - deyə cavab verir. Həmin hadisədən bir müddət keçdikdən sonra peyğəmbər (s) yenə onunla rastlaşaraq yenidən evlənib-evlənmədiyini soruşur. Kişi müsbət cavab verir. Başqa bir vaxt da ondan qasınla münasibətlərinin necə olduğunu sual verdikdə, həmin şəxs o qadını da boşadığını deyir. İslam peyğımbəri (s) “o qadından da nəsə pis bir iş görmüşdünmü?” - deyə soruşduqda, həmin kişi deyir ki, xeyr, heç bir pis iş görməmişdi. Həmin hadisədən də bir müddət kecdikdən sonra o kişi üçüncü dəfə evlənir. Peyğəmbər (s) ona bu dəfə də həmin sualları verdikdə, onun cavabı mənfi olur. O həzrət “ürəyi istədiyi zaman ərini və ya arvadını dəyişən kişi və ”.qadınları Allah özünə düşmən bilir və onlara lənət göndərir” - deyə söyləyir

Günlərin birində peyğəmbərə (s) Əbu Əyyub Ənsarinin öz xanımı Ümmü Əyyubu boşamaq istədiyini bildirirlər. Əbu Əyyub Ənsarin yaxşı tanıyan o həzərət onun bu hərəkətinin düzgün bir dəlilə əsaslanmadığını bildiyindən deyir: “Ümmü Əyyubu boşamaq böyük günahlardandır. “Eyni zamanda, peyğəmbərin (s) “Cəbrayıl mənə qadınlar barədə o qədər sifariş etdi ki, elə bildim, fahişəlik kimi bir günaha mürtəkib olmaqdan başqa, onlara talaq vermək cayiz deyil.” - kimi buyurduğu da bildirilmişdir. İmam Sadiq (ə) peyğəmbərdən (s) belə bir hədis nəql edir: “Allah yanında evlilik münasibətləri olan evdən daha sevimli bir şey və həmin münasibətlərli talaqla ”.qırmaqdan da ən qəzəbləndirici bir şey yoxdur

Digər bir hədisdə imam Sadiq (ə) buyurur: “Quranda talaq və boşanma barədə təkrar olaraq bəhs etmək və onu diqqət mərkəzində saxlamağın özü də Allahın ayrılığı ”.sevmədiyini və onu düşmən tutduğunu göstərir

(Təbərsi “Məkarimul-əxlaq” əsərində peyğəmbərdən (s

onun belə buyurduğunu nəql edir: “Evlənin, amma talaq verməyin, çünki bu işdən ilahi ”.ərş lərzəyə gəlir

İmam Sadiq (ə) buyurur: “Allah dərgahında halal olan şeylərdən talaq kimi mənfur və Allahın qəzəbinə səbəb olacaq bir şey yoxdur. Allah-taala çox talaq verib boşanan ”.camaatı özünə düşmən bilir

Bu rəvayətlər təkcə şiəyə aid deyil, eyni zamanda, əhli-sünnə də buna oxşar rəvayətləri nəql etmişlər. Əhli-sünnə alimi Əbu Davudun “Sünən” əsərində İslam :peyğəmbərindən (s) belə bir hədis nəql edilir

ما احَلَّ اللاهُ شيأً ابغض اليه من الطلاق

Allah-taala talaq kimi heç bir şeyi eyni zamanda qəzəblənəcəyi şəkildə halal“ ”.etməmişdir

Fars şairi Mövləvi də peyğəmbərin (s) həmin hədisinə özünün məşhur dastanı olan “Musa və Şaban” əsərində işarə etmişdir. Din rəhbərlərinin əməllərində müşahidə edilən məsələlər onların imkan daxilində talaq və boşanmadan çəkindikləri və bu cür hadisələrin onların həyatında nadir hallarda baş verməsidir. Eyni zamanda, həmin məsələləri həyata keçirdikləri zaman, onların tutarlı əqli və məntiqi dəlilləri olmuşdur. Məsələn, imam Baqir (ə) bir qadınla evlənir və ondan çox xoşu gəlmiş olur. Amma günlərin birində həmin qadının Əli ibn Əbu Talibə (ə) düşmənçilik və nifrət bəsləyən nasibilərdən olduğunu və qəlbində o həzrətə qarşı kin saxladığını başa düşür və bu səbəbdən, onu boşayır. İmamdan onu çox sevdiyi halda, nə üçün talaq verdiyini soruşduqları zaman, o həzrət belə buyurur: “Mən istəmədim ki, cəhənnəm atəşindən bir ”.parça od mənim kənarımda olsun

### Əsassız şayiələr

Biz bu bəhsimizdə cinayətkar Abbasi xəlifələrinin meydana gətirdikləri və ümumi camaat arasında şöhrət taparaq məşhurlaşan xüsusi və əsassız bir şayiə haqda söhbət açmaq istəyirik. Bir sıra mənbələrdə qeydə alınaraq yazılan və camaata bildirilən məsələlərdən biri Əmirəl-mömininin (ə) övladı imam Həsən Müctəbanın (ə) həddən çox qadınla evlənməsi və onun

çoxlu sayda talaq verməsi məsələsidir. Bu şayiələr o həzrətin vəfatından bir əsr sonra yayıldığı üçün, imam Həsənin dostları və ona məhəbbət göstərən kəslər həmin məsələyə heç bir tədqiqat və araşdırma aparmadan iman gətirmişlər. Halbuki, bu cür məsələlərin həyata keçirilməsi İslamın nəzərində nifrət və ikrah yaradandır, eyni zamanda, bu cür işləri görmək piyada halda həcc ziyarətinə gedən, iyirmi dəfədən artıq bütün malını iki hissəyə ayıraraq yarısını özünə götürüb digər qismini fəqirlər arasında paylayan və pak və tahir olaraq imamət məqamına layiq imam Həsən (ə) kimi insanlara mənsub deyil, əksinə əyyaş və qəflətə düçar olan şəxslərə şamil və .yaraşandır

Bildiyimiz kimi, xilafət Əməvilərin əlindən Abbasilərin əlinə keçdiyi zamanlarda imam Həsənin (ə) övladları və nəvələri onlarla iş birliyinə girmişlər, amma imam Hüseynin (ə) övladlarından heç biri - onların başında həmin vaxtlarda imam Sadiq (ə) dururdu - həmin sülalələrlə saziş və razılığa gəlməmişdir. Abbasilər əvvəlcə imam Həsənin (ə) nəslindən olanlar müqabilində təslim və onlara tabe olslar da, işin sonunda xəyanətə .əl ataraq onların bir qismini qətl, bir qismini də həbs etməklə aradan apara bilmişlər

Abbasilər öz siyasətlərini həyata keçirmək və irəlilətmək üçün imam Həsənin (ə) övladları əleyhinə təbliğatlar aparmağa başladılar. Bu cəhətdən, onlar peyğəmbərin (s) əmisi olan Əbu Talibin müsəlman deyil, kafir olduğunu və bu şəkildə də dünyadan getdiyini, amma Abbasın isə müsəlman olduğunu və müsəlman olaraq da vəfat etdiyini deyirdilər. Belə olduğu halda, onlar "biz peyğəmbərin (s) müsəlman olan əmisinin övladları olduğumuz üçün, kafir olan əmisinin övladlarından xilafətə daha layiqik "- deyirdiər. Onlar həmin zamanlarda həddən artıq çox pullar xərcləyərək yalançı hədislər uydurmağa başladılar və təəssüflər olsun ki, indinin özündə belə, əhli-sünnənin bəzi alimləri həmin hadisələrin və təbliğatların təsiri altında qalaraq Əbu Talibin kafir olması barədə fətva verməkdədir. Son zamanlarda bu məsələ ətrafında əhli-sünnə alimləri tərəfindən tədqiqat və araşdırmalar həyata keçirilməkdədir və biz

.ümidvarıq ki, həmin məsələ tarixin dəlillərinə əsasən aydınlaşacaqdır

Onların bu sahədə apardıqları ikinci əks-təbliğat Bənil-Həsənin (imam Həsənin (ə) övladları) onlara çatan xilafəti əyyaşlıq, arvad alıb arvad boşamaqla məşğul olduqları səbəbindən idarə edə bilmədiklərini və onların ciddi rəqibi olan Müaviyyədən külli miqdarda pul alaraq öz əyyaşlıqlarına davam etməsini və xilafəti Müaviyyəyə təhvil .verdiklərini deməleri idi

Xoşbəxtlikdən, son zamanlarda bizim əsrimizdəki tədqiqatçılar bu yalanın kökünü meydana çıxarmışlar. İlk dəfə olaraq bu sözləri xəlifə Mənsurun göstərişi ilə söyləyən şəxs qazı İntisabi Mənsur Dəvanəqi olmuş və həmin şayələri yaymaqla vəzifələndirilmişdir. Məşhur tarixçilərdən birinin dediyi kimi, əgər imam Həsən (ə) evlənib-boşanmaq işləri ilə məşğul idisə, onda, o həzrətin övladları hanı? Axı, nə üçün imamın övladlarının sayı bu qədər azlıq təşkil etməkdədir? Eyni zamanda, həmin .dövrlərdə də abort və uşağın siqt edilməsi məsələsi də yox idi ki, dəlil gətirilsin

Mən şiə məzhəbli hədis söyləyən şəxslərin bir tərəfdən peyğəmbərdən (s) həddən artıq çox talaq verən şəxsləri Allahın sevmədiyini və özünə düşmən tutduğunu, həmçinin, ona lənət göndərdiyini söyləmələrinə və digər tərəfdən də imam Həsənin (ə) çoxlu qadınla evlənib sonra onları boşadığını deyərək sadəlövhlük etmələrinə çox :təəccüblənirəm. Bu şəxslər üç yoldan birini seçməli olduqlarını heç düşünməmişlər

Ya deməlidirlər ki, çoxlu talaq verməyin heç bir eybi yoxdur və Allah da belə kəsləri düşmən hesab etmir, ya da imam Həsənin (ə) həddən artıq talaq vermədiyini söyləməlidirlər, yaxud da nəuzu billah imam Həsənin (ə) İslam qanunlarına riayət etmədiyini bildirməlidirlər. Bu cür şəxslər həm talaqın bəyənilməz və Allahın qəzəbinə səbəb olduğunu nəql edir, həm imam Həsənə (ə) ehtiram və hörmətlə yanaşır, həm də .heç bir irad tutmadan onun çoxlu qadını boşadığını deyirlər

-Bəzən də iş o yerə gəlib çıxmışdı ki, onlar Əmirəl

mömininin (ə) oğlu imam Həsənin (ə) bu əməllərindən narahat olaraq minbərdə camaata ona boşayacağı üçün qız verməməsini nəql edirdilər. Guya, camaat isə imama onlar qızlarının peyğəmbər (s) nəvəsi ilə evlənməsindən iftixar duyduğunu və imam Həsənin (ə) onları istəsə, saxlayacağı və istəməsə də, boşayacağına razı .olduğunu deyirdi

Bəlkə də, bəzi qızlar və onların ailələrinin talaq verilməsi ilə razılaşmaları boşanmanın mənfiliyinin və ikrah doğuracaq məsələlərin aradan qalxmasında onu (boşanmanı) kifayət hesab etmələri olmuşdur. Onlar elə düşünürdülər ki, talaq tərəflər razı olmadığı müddətdə ikrah hissi yaradan və pisdir, amma hansısa bir qadının onun iftixarına səbəb olacağı bir kişi ilə evlənib onunla müəyyən müddət yaşaması və .sonradan boşanmasında heç bir maneə yoxdur

Həqiqətdə isə belə deyil. Qızların atası və şəxsən onların özlərinin talaqa razı olması talaqdan hansısa bir mənfi xüsusiyyəti azaltmır. İslamın nəzərdə tutduğu əsas məsələ ailə münasibətləri və onun təməllərinin möhkəm və sabit qala bilməsidir. Bu baxımdan, tərəflərin ayrılmaq qərarına gəlməsi o qədər də təsirli deyil. Talaq və boşanmanı xoşagəlməz və mənfi olaraq nəzərdə tutan İslamın məqsədi qadınların razılq və rizayəti deyil və qadın və onun ailəsinin razı olması ilə talaqın mənfi cəhətləri heç də .aradan qalxmır

Mənim imam Həsənlə (ə) bağlı bu tarixi mövzunu bəyan etməyimin səbəbi ilk növbədə tarixi şəxsiyyətə vurulan bu töhməti aradan qaldırmaq və bəzi Allahdan qafil olan şəxslərin həmin işləri həyata keçirərək məsum imamı özlərinə dəlil və örnək gətirməsi ehtimalının olması idi. Hər halda, bizim demək istədiyimiz məsələ İslamın nəzərindı .ayrılıq və boşanmanın zatı baxımdan bəyənilməz olması məsələsidir

### ?İslam nə üçün talaq və boşanmanı haram etməmişdir

Burada qarşıya belə bir sual çıxır ki, əgər Allah-taala kişinin bu işini (boşanmasını) xoşlamayaraq ondan bu qədər acığı gəlirsə, onda, nə üçün İslamda talaq məsələsi qadağan

edilməmişdir? Əgər İslam bəzi xüsusi hallardan başqa, talaq verilməsini qadağan etsəydi, hansı çətinlik və problem yarana bilərdi? Başqa bir ifadə ilə desək, görəsən, İslamın talaq və boşanma üçün müəyyən şərtləri nəzərdə tutması və həmin şərtlər gerçəkləşdiyi zaman kişinin talaq vermə haqqına sahib olmasını müəyyən etməsi daha yaxşı olmazdımı? Belə olan halda, boşanma və ayrılıq məsələsi özünə qanuni və hüquqi bir forma qazana bilər və kişilər boşanmaq istədikləri zaman, məhkəmədə dəlil və sübut gətirməyə məcbur olardılar və əgər həmin dəlillər məqbul və hakim tərəfindən qəbul olunardısa, qadına talaq verilərdi və əks təqdirdə isə, talaq .verilməzdi

Ümumiyyətlə, "halal olan məsələlər arasında ən çox qəzəb doğuran talaqdır" cümləsindəki mənada məqsəd nədir? Talaq əgər halaldırsa, qəzəb doğuran deyil, yox, qəzəb doğuran və Allahın nəzərində xoşagəlməzdirsə, halal deyil. Axı, "halal olmaq"la ."qəzəb doğurmaq" məsələləri bir-biri ilə tərs mütənasib və uyğun deyildir

Bütün bu məsələlərdən sonra, görəsən, həmin heyət, yəni məhkəmə heyəti talaqla bağlı olan məsələlərdə - İslamın nəzərində talaq bəyənilməz və qəzəb doğurandır - deyərək bu işdə kişini öz qərarından döndərmək və boşanmağa mane olmaq üçün müddəti həddən artıq uzatmağa və yaxud da məhkəmə heyətinə həmin evliliyin heç bir sazişlə uyğun gəlmədiyi və müvəffəqiyyətsizliyi aydın olduqda, onu ləğv etməyə ?haqqı varmı

**(Talaq haqqı (٣**

Mətləbimiz İslamın talaq və boşanmanı sevmədiyini və ailə münasibət və təməllərinin möhkəm olmasına çalışdığını dediyimizə yetişdi. Biz belə bir sualı diqqətinizə :çatdırmışdıq

Əgər talaq və boşanma bu qədər ikrah hissi doğuran və bəyənilməzdirsə, onda, nə" üçün İslam onu haram etməmişdir? İslam hansısa bir şeyi və ya əməli qəbul etmədiyi zaman - şərbxorluq, qumarbazlıq və s. kimi - onu haram etmirdimi? Bəs, nə üçün İslam talaq məsələsini birdəfəlik qadağan etməmiş və ona qanuni bir maneə yaratmamışdır? Eyni zamanda, talaqın

həm halal, həm də qəzəb doğuran olması necə bir məntiqdir? Əgər halaldırsa, qəzəb ?doğuran olması və qəzəb doğuran bir məsələdirsə, halal olmasında nə məna vardır

İslam bir tərəfdən, kişinin talaq verməsini qəbul etməyərək onun bu işini sevmir və ikrah hissi keçirir, digər tərəfdən də, o, istədiyi zaman talaq verdiyində qarşısını heç bir "?qanunla almır. Görəsən, nə üçün

Bu suallar həqiqətən də, yerli və münasib suallardır. Bütün sirlər və məsələnin izahı bu suallarda yerləşdirilib. Məsələnin həqiqəti evliliyin saziş və razılaşmaya tabe olan bir məsələ deyil, onun təbii xüsusiyyətlərə malik olmasıdır. Eyni zamanda, xüsusi təbii .qanunlar bu məsələdə nəzərdə tutularaq müəyyən edilmişdir

Evlilik əhd-peymanı digər ictimai saziş və razılaşmalar olan ticarət, vəkalət, icarə, girov və s. kimi məsələlərdən tamamilə fərqlənir və sadaladığımız məsələlər sadəcə ictimai sazişlərdir və onlara təbii və instinktiv xüsusiyyətlər dəxalət etmir və təbii olaraq, onlar üçün bu cəhətdən qanunlar da müəyyən edilməmişdir. Amma izdivac və evlilik mexanizmi təbii və hissi keyfiyyətlərə əsaslanır və ona uyğun da tənzimlənməlidir. Həmin səbəbdən, digər saziş və müqavilələrlə fərqlərə malik olan .evlilik məsələlərində o qədər də təəccüb etməyə ehtiyac yoxdur

**Evlilik və boşanma məsələlərində fitri qanunların rolu**

Mədəni cəmiyyətin azadlıq qanunuda təbii olan yeganə qanun sadəcə bərabərlik və müsavat qanunudur. Cəmiyyətin bütün müqərrəratları müsavat və azadlıq olan iki təməl prinsipə əsasən tənzim olunmalıdır, nəinki, digər məsələlərlə. Bu məsələ evlilik və izdivacla bağlı olan hallarda fərqə malikdir və onda bərabərlik və müsavilikdən başqa, digər təbii qanunlar da təsirlidir və biz həmin qanunlara riayət etmək və tabe olmaqda məcburuq. Talaq və boşanma da bütün saziş və razılaşmalardan əvvəl, təbii .olaraq, qanunlara malik olmuşdur

İşin əvvəli və ortasında olduğu kimi, izdivac və evlilik zamanı da təbii və fitri qanunlara riayət olunmalıdır (biz bu barədə elçilik, mehriyyə, nəfəqə və xüsusən də, kişi və qadın

fərqlilikləri bəhsində söhbət açmışdıq). Həmçinin, bu məsələ işin sonu hesab edilən talaq məsələsinə də aiddir və təbii və fitri qanunlar onda da gözlənilməlidir. Təbii .məsələləri görməzdən gəlməyin heç bir fayda və əhəmiyyəti yoxdur

Aleksis Karlın dediyi kimi, həyat və yaşayış qanunları ulduz və planetlərin qanunlarında .olduğu kimi sərt, ciddi və müqavimət göstərilməsi mümkün olmayandır

Evlilik vəhdət və qovuşmaq, boşanma və talaq isə ayrılıq deməkdir. Kişi və qadın arasında evlilik münasibətləri ilə vəhdət və cüt yaşayışı meydana gətirən həmin təbii qanunlar onlardan birinin məhəbbət tələb edən, digərinin isə nəvaziş göstərən, qadının kişi qəlbini ovlamaq və ələ gətirməkdə mahir və kişini ona aldanan yaratdığı kimi, aydın məsələdir ki, bu münasibətlərdə ayrılıq və boşanma adlı iki xüsusiyyəti də nəzərdə tutmuşdur. Həmçinin, ailə münasibətləri zərif cinsin mərkəz təşkil etməsi və əks cinsin, yəni kişinin onun ətrafında fırlanmasına, dostluq və rəfiqlik xüsusiyyətlərinə görə deyil, insanların qəlbi bağlılıqlarına əsasən müəyyən edilmişdir. Bu .münasibətlərin qırılması və ayrılıqların özü də xüsusi qanunlara tabedir

On beşinci məqaləmizdə alimlərin birindən belə nəql etmişdik: “Cütlük (öz tayını tapmaq) axtarışı kişilərdə hücumçuluq, qadınlarda isə onların geri çəkilməsi və kişinin qəlbini ələ keçirməklə nəticələnən xüsusiyyətlərə malikdir. Çünki kişi təbiət və fitrət baxımından, ovçu qabiliyyətlidir. Qadın onun üçün müsabiqədə təyin edilmiş mükafata bənzəyir və o, həmin mükafatı ələ gətirmək üçün çalışır. Öz cütü və öz tayını tapmaq ”.axtarışı döyüş və mübarizə, evlilik isə sahiblik və iqtidardır

Vəhdət və məhəbbətə əsaslanan əhd-peymanlar dostluq və rəfiqlik münasibətlərinə söykənmir və belə münasibətlərdə məcburiyyətə ehtiyac yoxdur. Qanuni və icbari şəkildə iki nəfərin bir-biri ilə saziş və müqavilə bağlaması və həmin məsələlərə ədalətlə yanaşaraq ehtiram göstərməsi, eyni zamanda, bu işi uzn illər boyu davam etdirməsi mümkündür, amma qanuni və məcburi olaraq iki şəxsin bir-birinə sevgi və məhəbbət göstərməsini, onların fədakarlıq etməsini və səmimi

münasibətlərə malik olması və onlardan birinin digərinin səadət və xoşbəxtliyini öz .səadəti hesab etməsini təmin etmək mümkün deyil

Əgər iki şəxs arasında yuxarıdakı kimi münasibətlərin yaranmasını istəyiriksə, icbari və qanuni olmayan digər əməli və ictimai məsələəri işə salmalıyıq. İslamın təbii mexanizmlərə əsasən müəyyən etdiyi evlilik və izdivac qanunlarında qadının ailə daxilində möhtərəm və sevilən olması nəzərdə tutulmuşdur. Beləliklə, hansısa bir səbəb üzündən, artıq qadın öz məqamından tənəzzülə uğrayaraq kişinin məhəbbətini cəlb edə bilməsə və onun üçün maraq kəsb etməsə, deməli, ailə münasibətləri və onun təməlləri süquta uğramağa başlamışdır. Yəni, təbii bir icma təşkil edən topluluq .təbii və fitri hökmlərə söykənərək dağılmışdır

İslam bu formada olan məsələlərə sadəcə təəssüf hissi ilə yanaşır və bu baxımdan .onun öz yerində saxlamaq üçün hansısa bir qanuni maneə yaratmır

Əlbəttə, İslam ailə əsasları və təməllərinin təbii olaraq sabit və möhkəm qalması üçün müəyən tədbir və qanunları nəzərdə tutmamış deyil. Yəni, o, kişinin kişi olaraq tələbkar və ehtiyaclı və qadının isə sevilən və diqqət mərkəzində qalmasını təmin etməyə çalışmışdır. İslamın qadınlara etdiyi tövsiyələr onların öz ərləri üçün bəznməsi, onların diqqətini çəkməsi və cinsi ehtiyac və tələbatlarını ödəməyə çalışmalarıdır. Eyni zamanda, qadınlar öz ərlərinə bu sahədə mənfi münasibət bəsləyərək onlarda ruhi sarsıntı və qadınlarına qarşı soyuq münasibətlərin yaranmasına səbəb olmamalıdırlar. Bununla yanaşı, kişilərə də qadınlarına qarşı mehriban olmağı və onlara olan sevgi və .məhəbbətlərini gizlətməyərək bildirmələrini də İslam tövsiyə edir

Bir sözlə, İslamın bu zəminədəki fəaliyyət və tədbirləri kişi və qadının cinsi münasibətlərini ailə daxilində tənzim etməkdən ibarətdir və aiə münasibətlərinin .dağılması və ayrılıqların baş verməməsi üçün İslam əlindən gələni əsirgəməmişdir

səh:۲۴۰

Qadın üçün ən dözülməz və alçaldıcı bir məsələ öz ərinin onu sevmədiyini, ondan nifrət etdiyini söyləməsi və qanunların da heç bir şey olmamış kimi, qadını icbari və zorla kişinin evində qalmağa məcbur etməsidir. Sözsüz ki, qanun qadını məcburi şəkildə kişinin evində qalmasına məcbur edə bilər, amma onun təbii funksiyası olan ərinin diqqətini çəkməsi və məhəbbətin mərkəzində dayanmasını həyata keçirə bilməsini təmin edə bilməz. Qanun kişinin qadının nəfəqə və ehtiyaclarını ödəməyə məcbur etmək qabiliyyətninə malikdir, lakin onu qadına məhəbbət göstərməyə vadar edə .bilməz

Beləliklə, kişinin qadına olan məhəbbət alovu söndüyü zaman, təbii olaraq ailə münasibətlərinin dağılacağına gətirib çıxardığını söyləmək mümkündür. Burada yeni bir sual meydana gəlir və o, bundan ibarətdir: “Əgər qadının kişiyə olan məhəbbəti aradan qalxsa, onda necə? Bu halda da ailə münasibətləri dağılmaq təhlükəsi ilə üzləşəcəkmi? Əgər qadının sevgisinin aradan qalxması ilə həmin münasibətlərə heç bir xələl gəlməyəcəksə, belə olan təqdirdə, kişi ilə qadın sevgisi arasında hansı fərqlər mövcuddur ki, kişinin sevgisi bitdikdə, ailə həyatı da sona yetmiş olur? Əksinə, qadının ərinə qarşı sevgisi tükəndiyi zaman da ailə münasibətlərinin dağıla biləcəyini deyiriksə, ”?onda, kişi ilə qadına eyni şəkildə talaq haqqının verilməsi lazım gəlmirmi

Bu sualın cavabında ailə münasibətlərinin bir tərəfli deyil, qarşılıqlı olmasını deməyimiz lazımdır. Bu zəminədə (ailə münasibətlərində) fərqli olan məsələlər sadəcə kişi və qadınn psixologiyasıdır və biz bu barədə əvvəlki bəhslərimizdə alim və tədqiqatçıların apardıqları araşdırmaları sizin nəzərinizə çatdırmışdıq. Təbii və fitri xüsusiyyətlər qadını kişinin sevgisinə cavab verəcək şəkildə xəlq edilməsini zəruri etmişdir. Qadının bu cəhətdən əsas funksiya və vəzifəsi ona ehtiram və hörmətlə yanaşan kişinin məhəbbətinə reaksiya və cavab verməsi məsələsidir. Deməli, qadının kişiyə olan məhəbbəti kişinin ona bəslədiyi məhəbbətin nəticəsidir və qadın həmin məhəbbətə .bağlıdır

səh:۲۴۱

Təbii olaraq, tərəflər arasındakı münasibətlərin açarı (ixtiyarı) kişinin ixtiyarında qoyulmuşdur. Əgər kişi öz qadınına məhəbbət bəsləyərək onu sevsə və vəfadar olsa, .qadın da kişini sevəcək və ona vəfadar olacaqdır

Aydın məsələdir ki, qadınlar kişilərdən daha çox vəfalıdırlar və onların vəfasızlığı .kişilərin vəfasızlığına cavab reaksiyası olaraq dıyırləndirilməlidir

Təbiət və fitrətdə izdivac və evliliyin ləğv edilməsi məsələsi də kişinin ixtiyar və öhdəsində qoyulmuşdur. Yəni, kişinin məhəbbəti bu münasibətlərdə daha çox təsirə malikdir və əgər qadın kişiyə qarşı soyuq münasibət bəsləsə və məhəbbətini azaltsa, bu, kişidə əksinə olaraq ona məhəbbəti daha da artıracaqdır. Həmin səbəbdən, kişinin meyilsizliyi qadının məhəbbətini azalmasına gətirib çıxarır, nəinki, qadının kişiyə sevgi .bəsləməməsi

Kişinin ailə münasibətlərində öz qadınına məhəbbət göstərməməsi ailə təməllərinin sarsılması və evliliklə izdivacın aradan qalxması deməkdir, amma qadında belə məsələ yaransa, o, sanki bir xəstəliyə bənzəyir və onun müalicəsi və sağalması mümkün olandır. Kişi üçün ondan uzaqlaşmağa çalışan qadınının məhəbbətini zamanla geri qaytara bilməsi üçün qanuni yollara əl atması və onu zorla evində saxlaması heç bir eyib və maneəyə malik deyil, amma qadının öz hamisi və ərini əldə saxlamaq üçün .qanunlardan kömək alması bəyənilən və qadına yaraşan hesab olunmur

Əlbttə, deyilən hallar qadının kişiyə məhəbbət göstərməməsinin kişidə əxlaqi fəsad və zülümkarlıq hisslərinin artmasına bis olmadığı zamanlarda keçərlidir. Əgər kişinin zülmünün artmasına səbəb olarsa, İslam heç vaxt bu məsələdə kişiyə icazə verməmişdir ki, öz talaq haqqından sui-istifadə edərək qadını zorla evində saxlasın və onu boşamasın. Biz bu barədə bəhsin ikinci hissəsində, yəni, namərdcəsinə talaqdan .çəkinməklə bağlı olan bəhsdə söhbət açacağıq

Hər halda, kişi və qadının fərqləri kişinin qadın şəxsiyyətinə və qadının da kişinin .qəlbinə ehtiyaclı olması məsələsindədir

Kişinin mehriban və qayğıkeş olmasının qadın üçün həddən artıq çox əhəmiyyəti vardır .və bunlar olmadan evlilik və izdivac qadına görə dözülməz hesab edilir

**Psixoloq olan bir qadının nəzərləri**

Günün qadını" jurnalının yüz on üçüncü sayında "Anaların psixoloqluğu" başlığı altında" Beatris Maryo adlı fransalı qadının qələmindən çıxmış bir kitabdan məqalə dərc edilmişdir. Həmin məqalənin əvvəlində qeyd edildiyi kimi, o qadın psixologiya sahəsində doktorluq dissertasiyasına malikdir, Parisdəki psixoloji xəstəxanaların psixoloqu və üç uşaq sahibidir. Məqalənin müəyyən qismində hamiləlik dövründə və ya uşağa sahib olduqdan sonra qadınların ərlərinin ehtiyac və qayğısına nə qədər ehtiyaclı olması barədə şərh verilmişdir. Orada belə yazılır: "Hansısa bir qadın özünün hamilə olduğunu və tezliklə uşaq dünyaya gətirəcəyini bildiyi zaman, özünə nəzər salmağa, öz bədəninin ətini qoxulamağa, özü barədə araşdırma aparmağa başlayır. Bu məsələlər, xüsusən də, onun ilkin övladı olacağı zaman baş verir. Qadınlarda araşdırma aparmaq hissi çox şiddətli şəkildədir və sanki o, öz vucudunu kəşf etməyə çalışır. Qadın birinci dəfə bətnindəki uşağın zərbələrini hiss etdikdə, qarnındakı bütün səslərə qulaq asmağa çalışır. Onun bətnində mövcud olan yeni bir varlıq qadına hədsiz bir səadət bağışlayır və o, yavaş-yavaş təklik və tənhalığa meyl etməyə və dünyadan ...təcrid olmağa başlayaraq bütün fikrini və vaxtını ona ayırmağa çalışır

Qadınlar yeni hamilə olduqları vaxtlarda kişilərin üzərinə mühüm və əhəmiyyətli bir vəzifə düşür və təəssüflər olsun ki, onlar həmişə bu vəzifə və məsuliyyətlərdən yayınırlar. Gələcək ananın ərinin onu başa düşməsinə, onu dəstəkləməsinə və anlayış göstərməsinə həddən artıq ehtiyacı vardır. Əgər kişidən ona qarşı diqqətsizlik görsə, qadının fizioloji quruluşunun dəyişilməsindən ikrah hissinin yarandığını duysa, uşağı dünyaya gətirməkdən qorxar, narahatçılıq hissi keçirər və gözəlliyinin dəyişilməsində ((məsələn, qarnının şişməsi ilə

kişini məsuliyyətli və bu baxımdan günahkar bilər... Qadın hamilə olduğu hallarda kişinin əvvəlkindən daha çox ona dəstək və qadının yanında olması zəruridir. Ailənin mehriban və qayğıkeş bir ataya ehtiyacı var, yəni qadın həmişə sözləri mənasız və yorucu olsa da belə, qəmli və sevincli hallarda dərdləşə biləcəyi, fikirlərini bölüşəcəyi birinin olmasını istəyir. Qadın daha çox onunla uşağı barədə söhbət edilməsini xoşlayır. .Bir qadın üçün ən yaxşı hiss onun ana olacağı hissidir

Əgər ərindən ona və hələ dünyaya gəlməmiş uşağa qarşı etinasızlıq etdiyini duysa, bu qadın üçün böyük və dözülməz bir əzab olar və analıq sevinc və iftixarı onun gözündən düşər və bətnindəki uşağı candərdi daşımağa başlayar. Belə vəziyyət və şəraitlə qarşılaşan hamilə qadınların doğuş ağrılarını şiddətli şəkildə hiss etdikləri müşahidə edilmişdir. Ana və övlad arasındakı rabitə ikitərəfli bir rabitə deyil, əksinə üçtərəfli – ata, ana və övlad arasında olan – rabitədir. Hətta, qadına talaq verilərək ondan ayrılsalar və ya kişi uzaqda olsa da belə, qadın öz təxəyyül və təsəvvüründə həmin rabitəni canlandıraraq onu qoruyub saxlayır. Bu məsələnin qadının hissiyyatında çox ".mühüm bir rolu vardır

.Bütün bunlar həm psixoloq, həm də ana olan bir qadının söylədikləri idi

**Hissiyyatlara əsasən meydana çıxan (yaradılan) ehtiyaclar**

Digər bir varlığın mehribanlığı, məhəbbət və himayəsinə ehtiyac duyaraq bütün çətinliklərə dözə və tab gətirə bilən qarşı tərəfin (qadının) bu xüsusiyyətlərsiz övladının və başqa hislərinin də heç bir məna kəsb etmədiyinə hazırda biz diqqət yetirməliyik. Deməli, digər bir varlığın (kişinin) mehr və məhəbbətinə, qayğısına ehtiyaclı olan bir qadını qanunlar vasitəsi ilə kişiyə məcburi şəkildə necə sıramaq və yapışdırmaq mümkün ola bilər? Bir tərəfdən, kişinin öz qadınına qarşı etinasız və məhəbbətsiz olmasına çalışmaq və bu yolda bütün vəsilələri hazırlamaq və digər tərəfdən isə ,qanuni vasitələrdən istifadə edərək kişinin meylli və məhəbbəti olmadığı halda

?qadınla onun arasında zorla necə ünsiyyət yaratmaq olar

İslam bu sahədə elə bir fəaliyyət göstərmişdir ki, kişi qadını sevən və ona məhəbbət bəsləyən olsun. Eyni zamanda, qadının zorla kişilərə sırınmasına da heç vaxt razılıq .göstərməmişdir

Ümumi şəkildə, məhəbbət, xalis niyyət və meyil olduğu və bu məsələlər işin (izdivac və ailə münasibətlərinin) əsas və təməli hesab edildiyi zaman, qanunun məcbur etməsi və icbariliyinə ehtiyac duyulmadığını söyləmək yerinə düşərdi. İşin içində təəssüf və narahatçılığın olması mümkündür, amma icbar, ikrah və məcburiyyətə əsla yer .yoxdur

:Bir misalı nəzərinizə çatdırırıq

Camaat namazında pişnamazın (hamıdan öndə dayanan şəxsin) ədalətliliyi və ona iqtida edənlərin buna etiqadlı olması şərtdir. Pişnamazla iqtida edənlər arasındakı münasibət və əlaqə pişnamazın ədaləti və iqtida edənlərin (məmumun) onun ədalətinə inam və etiqadına əsasən bərpa edilmişdir. Qəlb və hissiyyatlar bu münasibət və ictimai rabitənin əsasını təşkil edir. Həmin səbəbdən, belə rabitələr məcburiyyət və zorla həyata keçirilməklə bir araya sığmır və mümkün deyil. Bu cür məsələlərdə qanun onun qorunması və qalmasına zəmanət verə bilməz. Pişnamazla ona iqtida edənlərin irtibat və münasibəti adalət və ixlas aradan qalxdığı zaman – istər yerli olsun, istərsə də yersiz – aradan qalxmış olur. Məsələn, pişnamaz ən yüksək təqva, ədalət və digər xüsusiyyətlərə malik olsa da, iqtida edənləri ona iqtida etməyə .məcbur edə bilməz

Pişnamazın məhkəməyə müraciət edərək camaatın ona nə üçün iqtida etmədiyini, inanmadığını söyləməsi, şübhəsiz ki, gülməli və rişxənd ediləsidir. Əslində, pişnamazlıq məqamına xəyanət camaatı məcburi şəkildə iqtida etməyə məcbur etməkdir. Nümayəndələrlə seçicilər arasındakı münasibət və rabitələr də bu şəkildədir. Yuxarıda qeyd edilən bütün məsələlər də burada əhəmiyyət kəsb edir. Hissiyyat və qəlb həmin ictimai münasibətlərdə də keçərlidir. Camaat səs verdikləri nümayəndəyə qarşı inamlı olmalıdır. Bir sözlə, demək istədiyimiz məsələ camaatın seçim etmək hüququnun məcburiyyətlə uyğunluq təşkil

etmədiyini və onlar səhvə yol verərək düzgün olan və layiqli nümayəndəyə səs verməsələr də belə, həmin şəxsin şikayət etmək haqqının olmamasını deməkdir. Yəni, həmin şəxs "camaat nə üçün məni bütün bu üstün keyfiyyətlərlə seçməmişdir?" – deyə .məhkəməyə şikayət edərək öz etirazını bildirə bilməz

Belə məsələlərdə insanın həyata keçirə biləcəyi işlər camaatın təfəkkür və düşüncə səviyyəsini yüksəltməyə çalışmasıdır. Sadəcə bu zaman camaat öz dini vacibat və fərizələrini yerinə yetirə bilməkdə düzgün addım ata bilmək üçün tərbiyə edilər və onlar iqtida zamanı həqiqətdə də ədalətli olan şəxsləri seçər və ictimai münasibətlərdə də səlahiyyətli şəxslərə müraciət edər və onlara öz istəklərinə əsasən səs və rəy verərlər. Əgər nə vaxtsa, camaat səhvə yol verə və öz düşüncə və rəyini dəyişərək həmin şəxslərə səs veməkdən çəkinərsə, təəssüf etmək mümkündür, amma camaatı .bu məsələdə hansısa bir addım atmağa icbari şəkildə məcbur etmək olmaz

Ailə münasibətlərində də mövcud olan məsələlər eynilə yuxarıda sadaladığımız ictimai və dini məsələlərə bənzəyir. Biz İslamın ailə həyatını təbii bir icma kimi qəbul etdiyini və bu icma üçün xüsusi mexanizmi nəzərdə tutduğunu və həmin mexanizmə riayətin zəruri və onun dəyişilməsinin qeyri-mümkün olduğunu bilməliyik. İslamın ən böyük .möcüzəsi həmin mexanizmin müəyyən edilməsindədir

Qərbli ailələrin həmin problem və çətinlikləri həll edə bilməməsi və problem üstünə problem artırmalarının səbəbi həmin xüsusiyyəti (mexanizmi) diqqətə almamlarıdır. Xoşbəxtlikdən, aparılan yeni araşdırmalar tədricən bu məsələni aydınlaşdırmaqdadır. Mənə gün kimi aydındır ki, Qərb dünyası gələcəkdə ailə münasibətlərinin tənzimlənməsində islami elmi üsullardan istifadə edərək ondan yararlanacaqdır. Əlbəttə, mən İslamın nəzərdə tutduğu nurani təlim və mətin məsələlərini camaatın .hazırda düşüncəsində olduğu ilə bir tutmuram

**Ailə təməllərini möhkəmləndirən məsələlər bərabərlikdən də üstün olan bir məsələdir**

Hazırkı əsrdə İslamın min dörd yüz il əvvəl həmin məsələni

həll etdiyindən qəflət edərək Qərbin özünü onun aşiqi kimi göstərdiyi məsələ bərabərlik məsələsidir. Ailə münasibətləri çərçivəsində mövcud olan nizam-intizamı təmin edən məsələ bərabərlikdən də üstün olan bir məsələdir. Xilqət qanununda mədəni cəmiyyət üçün sadəcə bərabərlik qanunuları nəzərdə tutulmuş və müəyyən edilmişdir, amma ailə münasibətləri zəminəsində həmin qanunlardan əlavə, digər qanunlar da təyin edilmişdir. Ailə münasibətlərinin tənzim edilməsində sadəcə bərabərlik və müsavilik qanununun olması təklikdə kifayət etmir və ailə icmasında .mövcud olan digər qanunların təbiətini də tanımaq lazımdır

**Fəsad və günah işlərdə bərabər və müsavilik**

Çox təəssüflər olsun ki, "bərabərlik" sözü həddən artıq təkrar olması səbəbi ilə öz həqiqi mənasını itirmişdir. Bəzən bərabərliyin təkcə hüquqda olduğunu düşünürlər və digər məsələlərə də onun şamil olması unudulmuşdur. Elə zənn edirlər ki, bərabərlik sözü hansısa bir məsələdə özünü doğrultsa, bununla iş bitir. Belə bixəbər şəxslərin nəzərində, əvvəllər kişilər qadınlar üzərində zorakılığa malik idilər, amma indi qadınlar da həmin səlahiyyətə sahib olduqlarından, hər bir məsələ qaydasına düşmüş və bu sahədə hüquqi bərabərlik təmin edilmişdir. Keçmişdə talaq və boşanmanın haradasa, on faizinə kişilər səbəb olurdusa, hazırkı dövrdə dünyanın müxtəlif məntəqələrində evlilik və izdivacın boşanma və ayrılma ilə nəticələnməsinin qırx faizinə qadınlar səbəb olur. Belə isə biz şadlanıb bayram etməliyik, çünki artıq kişilərlə qadınlar arasındakı .bərabərlik kamil bir şəkildə bərqərar olmuş və həmin məsələ onlara hakimdir

Qədimdə təkcə kişilər öz qadınlarına xəyanət edir, təqva və iffət məsələlərini gözləmirdilər, indi isə Allaha şükürlər olsun ki, qadınlar da həmin məsələlərə qoşulmuş və iffət və təqvaya riayət etməyərək xəyanətə əl atmışlar. Bundan daha yaxşı nə ola !?bilər ki

Əhsən sənə, səd əhsən, ey bərabərlik! Ölüm olsun sənə, ey fərqlilik! Əvvəlki dövrlərdə kişilər rəhimsiz və daş qəlbli kimi

tanınır və iki-üç uşağı olduğu halda, öz ailə və uşağını yenicə tapdığı məşuqəyə görə atıb gedirdilərsə, indi bu məsələ öz yerini qadınlara vermişdir. Onlar hansısa bir əyləncə və kef-damaq məclisində yenicə tanış olduğu kişiyə qoşularaq illərlə sahib olduğu evliliyini dağıdır və ev-eşiyini, oğul-uşağını tərk edərək öz istək və meyilləri ardınca gedirlər. Bəh, bəh, necə də gözəl bir rəftardır (əlbəttə, bunların hamısı bir kinayədir)! Kişi və qadın artıq eyni bir səviyyə və dərəcəyə malikdirlər və beləliklə, !bərabərlik də təmin edilmişdir

Bütün bu dediklərimizdən İslamın nə üçün talaq və boşanmadan xoşu gəlməsə də, onun qarşısını almaq və maneə yaratmaq üçün müəyyən qanunları təyin etmədiyi aydın olur. Eyni zamanda, hansısa bir məsələnin bir zamanda həm halal, həm də .haram və qəzəb yaradan olması başa düşüldü

### (Talaq haqqı (۴

Əvvəlki bəhslərdə söylədiklərimizdən İslamın ailə münasibətlərinə ehtiramla yanaşdığı, onun təməl və dayaqlarının dağılma və sarsılmasını sevmədiyi və bu sahədə onun qorunması üçün bütün ictimai və əxlaqi tədbirləri işə saldığı və boşanmanın qarşısını almaqda icbar (məcburiyyət) və qanuni səlahiyyətlərdən başqa, .bütün vasitələrdən istifadə etdiyi anlaşılmış oldu

İslam kişiyə qanuni yolla zor tətbiq edilməsi və qadının da məcburi olaraq kişinin evində saxlanılması məsələsi ilə müxalif və buna qarşıdır. Həmin məsələ İslamın nəzərində qadının ailə daxilindəki tutmuş olduğu mövqe ilə ziddiyyət təşkil edir. Deməli, ailə münasibətləri hissiyyat və atifələrə əsaslanır və ailədə ər və uşaqların məhəbbətini qazanmaq və onları özünə tərəf çəkərək cəzb etmək qadının üzərinə .düşən bir vəzifə və funksiyadır

Hansısa bir ailədə kişinin qadına olan məhəbbət və meyli həlledici rola malikdir və ailəyə işıq verib onu aydınlaşdıran da, məhz, həmin məsələdir, eyni zamanda, övladların da anaya qarşı məhəbbət bəsləməsində də ərin qadına olan məhəbbəti əhəmiyyət və önəm daşıyır. Xanım Beatris Maryonun - onun barəsində əvvəlki bəhsdə bildirmiş və nəzərlərini diqqətinizə

çatdırmışdıq – da söylədiyi kimi, qadının övladlarına qarşı olan məhəbbəti azalmadan sabit qalan bir məhəbbət deyil və bəzən həmin məhəbbət ərin qadına göstərdiyi .münasibət və məhəbbətə əsasən dəyişə bilir və bu, analıq hissində təsirlidir

Nəticədə, qadının ərinin hissiyyat və məhəbbətindən yararlanaraq öz övladlarına sevgi və məhəbbətini verə bilməsinin əhəmiyyət kəsb etdiyini bildirmək istəyirik. Kişini dağlıq əraziyə, qadını oradakı çeşməyə və övladları da çəmənlikdə bitən güllərə bənzətmək olar. Çeşmə və bulaq dağ yağışlarından yaxşı şəkildə bəhrələnə bilməlidir ki, gülləri su ilə təmin edə bilsin. Əgər həmin yağış suları kifayət miqdarda olmasa və torpaq da onu cəzb etməsə, bulaq quruyacaq, güllərə su yetişməyəcək və onlar məhv .olacaq

Yuxarıdakı misala əsasən, səhra və güllər yağışa ehtiyaclı olduğu kimi, ailə münasibətləri və ailə həyatının davamlı olmasında da qadın kişinin məhəbbətinə ehtiyaclıdır. Bu məhəbbətin təsiri ilə həm qadın, həm də övladlar şad və səfalı həyat sürə bilirlər. Belə olduğu təqdirdə, qanundan silah kimi kişinin əleyhinə istifadə ?edilməsi düzgün və ağıla batandırmı

İslam namərdliklə verilən talaq və boşanmalarla, yəni müəyyən müddət bir qadınla həyat sürüb ondan faydalanan və bəhrələnən kişinin yeni bir qadın həvəsinə düşməsi səbəbi ilə verilən talaqlarla şiddətli şəkildə müxalifətçilik edir. Amma bu, İslamın namərd kişiləri həmin qadınları boşamamağa məcbur etməsi mənasında deyil. Çünki belə addımlar ailə münasibətlərinin təbiəti ilə fərq və ziddiyyətə malikdir. Qadın qanuni və icbari yolla ərinin evinə qayıda bilər və bu məsələyə onun evi işğal etməsi kimi baxa bilərik. Amma belə işlərlə qadın heç zaman özünün kişi məhəbbətinə olan ehtiyacını .təmin edərək ödəyə, həmçinin, evinin xanımı ola bilməz

İslam kişilərin bu cür rəftar etməsinin qarşısını almaq üçün müəyyən tədbirləri nəzərdə tutmamış deyil. Amma ailə münasibətlərinin mərkəzində dayanan, hislərlə əlaqədar dəf və cəzbetmə rolunu oynayan qadınların zor və qanuni yolla kişinin yanında qalmasını qəbul etmir. İslamın bu zəminədə həyata

keçirdiyi işlər Qərb və qərbəmeyillilərin yerinə yetirdiklərinin tamamilə əksi və onun tərs mütənasibidir. İslamın kişilərin namərdlik, vəfasızlıq və həvəsbazlığı ilə şiddətli mübarizə aparmasına baxmayaraq, o, qadınları zorla belə kişilərin yanında saxlamağa razı deyil. Amma qərblilər günbəgün kişilərin namərdlikləri və vəfasızlıq amillərini .artıran işləri görməklə qadının onların yanında zorla qalmasına çalışır

İslamın namərdcəsinə talaq vermək istəməyən kişilərin qadını zorla saxlamasına məcbur etmədiyini və insanlıq xüsusiyyətlərinin qorunub saxlanmasına çalışdığını təsdiqləmək lazımdır. O, bu zəminədə müəyyən tədbirləri həyata keçirərək belə talaq verilmə hallarının azaldılmasına çalışmışdır. Halbuki, digərləri həmin məsələni zorla həyata keçirmək istəyirlər. Şərqə nisbətdə Qərbdə baş verən talaqların sayı "Nyuz vik" qəzetinin verdiyi məlumatlara əsasən, qadınların həvəsbazlıqlarına görə həddən artıq .armış və artmaqdadır

### Ailə asayişi və əmin–amanlığının təbiəti digər sülh və əmin–amanlıqlardan fərqlənir

Qadın və kişi arasında ailədə sülh və sazişin olması aydın məsələdir. Əlbəttə, ailədəki bu sülh və əminamanlıq iki qonşu və həmsərhəd olan dövlət, iki şərik və iki qonşu arasında olan sülh və sazişlərdən həddən artıq fərqlənir. Həmin məsələlərdəki sülh və anlaşmalar ata, ana və övladlar arasındakı münasibətlərə bənzəyir, yəni onlar arasında bir-birinə qayğı, digərinin səadət və xoşbəxtliyini özünün xoşbəxtliyi və problemlərini isə öz problem və çətinliyi kimi hesab edilir. Amma iki şərik, iki dövlət, .qonşu və digər şəxslər arasında bu cür münasibətlər mövcud deyil

Belə olan sülh və sazişlərdə bir-birinin haqqına təcavüz və onu aradan aparmaq kimi məsələlər meydana çıxmır. İki düşmən dövlət arasında da silah gücünə sülhün yaradılması da kifayətdir. Əgər hansısa üçüncü bir dövlət iki dövlətin sərhədlərini işğal edərək onların müharibə etməsinə mane olarsa, bu sülhdür. Çünki siyasi sülh təcavüz və hücum olmayan sülhün bərqərar edilməsi mənasından başqa, bir mənaya malik

deyildir. Amma ailədəki sülhün siyasi sülhdən fərqləri vardır. Ailə saziş və sülhündə sadəcə bir-birinin haqlarına təcavüz edərək onları aradan aparmamaq kifayət etmir. Burada daha üstün məsələlər vardır. Ata, ana və övladlar arasında olan ruhi vəhdət .kimi bir vəhdətin olması zəruridir

Təəssüflər olsun ki, Qərbdə tarixi və geoloji səbəblərə əsasən, onlar hiss və duyğulara (hətta, ailə daxilində də) əhəmiyyət verilmir və bu məsələlərə biganə yanaşılır. Qərblilərin nəzərində ailə daxilindəki sülh və sazişin siyasi və cəmiyyətdə həyata keçirilənlərlə heç bir fərqi yoxdur. Onlar iki ölkə arasında onların sərhədlərinə qoşun yeridib sülh yaratdıqları kimi, istəyirlər ailədə də məhkəmə və qanunların təsir qüvvəsindən istifadə edərək ailə daxilində kişi və qadın arasında sülh və saziş yaratsınlar. Amma onlar ailədə sülh və saziş yaradılmasının kişi ilə qadın arasındakı sərhədlərin aradan qaldırılmasında, vəhdət təşkil edilməsində və digər qüvvələrə əhəmiyyət verilməməsində olduğunu unudaraq ondan (həmin məsələdən) qafil .olmuşlar

Qərbə pərəstiş edən kəslər qərbliləri onların ailə məsələləri ilə bağlı səhvlərdən xəbərdar və agah etmək əvəzinə, onlarla o qədər həmrəng və həmxasiyyət olmuşlar ki, özlərini unutmuş və bu sahədə heç bir şeydən çəkinməmişlər. Əlbəttə, qərblilərə pərəstiş edənlərin bu şəkildə çaşğınlıqda qalması heç də çox çəkməyəcək və şərqlilər özlərinin şəxsiyyətinə dəyər verərək həyatlarını öz fəlsəfə və düşüncələrinə uyğun davam etdirəcəkləri zaman uzaq deyil. Bu yerdə iki mətləbin xatırladılmasını zəruri :hesab edirik

**İslam boşanma və talqdan yayınmağa səbəb olan hər bir amili yaxşı qarşılayır**

Bizim əvvəlki bəhslərimizdən bəzi şəxslər belə bir nəticəyə gələ bilərlər ki, guya, biz .١ kişi boşanmaq istədiyi zaman onun üçün bütün qapıları üzünə açmaq və heç bir maneə yaratmamağın lazım gəldiyini iddia edirik. Xeyr, əslində bizim demək istədiklərimiz bunlar deyildi. Biz İslamın talaq və

boşanmanın qarşısını zorla almaq üçün qanuni vasitələrdən istifadə etmədiyini diqqətinizə çatdırmağa çalışırdıq. İslam kişini boşanmaqdan yayındıran hər bir səbəbi xoş və yaxşı qarşılayır. Təbii olaraq, İslam talaq və boşanmanın təxirə düşməsi üçün müəyyən şərt və müqərrəratları nəzərdə tutmuşdur. İslam bu zəminədə boşanmanın düzgün və səhih olması üçün iki adil şəxsin şahid tutulmasını tələb edərək bu yolla kişi yanlış olaraq boşanmağa çalışarsa, onun doğru addım atmadığını deməl追 çalışır ki, boşanma həyata keçməsin. Yəni, həmin iki adil şəxs əslində səy və təlaş göstərməlidirlər ki, kişi ilə qadın arasında sülh və saziş yaratsın və onların .boşanmasına haradasa, mane olsun

Amma günümüzdə bir qayda halını alaraq iki şahidin hüzurunda ər və arvadı görüb tanımadan sadəcə onların adlarını oxumaqla talaq vermək başqa bir məsələdir və bu cür talaq və boşanma İslamın nəzərdə tutduğu hədəf və məqsədlərdən tamamilə .fərqlənir

Məsələn, iki nəfər adil şəxsin hüzurunda talaq məsələsini icra edən şəxs belə deyir: “Mən qadının əri Əhmədin vəkili olaraq xanımı Fatiməyə talaq verirəm. Görəsən, Fatimə və Əhməd kimdir? İki ədalətli şəxs ünvanında talaqın verilməsinə şahid olanlar onları görmüş və tanıyırlarmı? Belə olan təqdirdə, onlar həqiqətən də, şahid olaraq həmin şəxslərin boşanmasına dair şəhadət verə bilərlərmi? Əlbəttə, xeyr! Bəs, bu ”.necə şəhadətdir? Mən bundan baş açmıram

Əgər talaq veriləcəksə, onun düzgün həyata keçirilməsi üçün iki adil şahidin olması zəruridir və bu məsələ kişilərin boşanmadan vaz keçməsinə səbəb olur. İslamda evliliyin müqəddiməsi üçün iki adil şəxsin iştirakının zəruriliyi və şərt olması nəzərdə tutulmamışdır. Buna səbəb xeyir işin təxirə salınmaması olmuşdur. Amma işin sonu olmasına baxmayaraq, boşanma zamanı iki adil şəxsin olması şərt və zəruridir. Eyni zamanda, qadının menustrasiya (aybaşı) dövrünü də evlilik və izdivaca maneə hesab etməmişdir, amma talaq və boşanma məsələsində həmin məsələ bir maneə ,funksiyasını daşıyır. Yəni

həmin məsələ cinsi münasibətlərin yerinə yetirilməsinə maneə sayılır. Talaq zamanı qadın aybaşı olarsa, ona pak olacağı müddətə qədər talaq verməyə icazə verilmir. Bəlkə də, İslamın qadınların menustarsiya dövrlərinidə evlənməsinə və izdivac əqdinin oxunmasına icazə verməməsi daha yaxşı olardı, çünki yeni evlilər həmin məsələlərə mümkündür, riayət etməsinlər. Əksinə, aylıq xəstəliyin ayrılıq və uzaqlığa səbəb olan talaqda o qədər də təsiri yoxdur. Evliliyə tərəfdar və ayrılığa müxalif olan İslam həmin məsələni talaqdan fərqli olaraq, evliliyə maneə hesab etməmişdir. Hətta, bəzi hallarda .üç ay gözləmək lazım gəlir ki, sonradan talaq verilə bilsin

Bu cür maneə və məsələlərin yaradılmasının kişi və qadının müəyyən müddətdən sonra öz adi həyat tərzlərinə qayıda bilməsi üçün bir fürsət olması aydın məsələdir. Əgər qadına qarşı ikrah hissi duymaq kişi tərəfindən olar və o, talaq verərsə, İslam kişinin yenidən qadınını qaytarmaq istədikdə, qadın üçün iddə adlanan bir müddəti nəzərdə tutmuşdur ki, həmin müddətdə fikrindən daşına bilsin. İslam evlilik, övladlar və qadının xərclərini kişinin öhdəsinə qoymaqla yanaşı, burada əməli bir maneəni də kişi üçün nəzərdə tutmuşdur. Yəni, öz əvvəlki qadınına talaq verib onu boşamaq istəyən kişi qadının iddə saxladığı müddətdə onun xərclərini, həmin qadından olan övladlarının ehtiyaclarını ödəməyi öz öhdəsinə götürməlidir və bundan əlavə, yenidən evlənmək istədiyi qadın üçün mehriyyə nəzərdə tutmalı və evlilik məsələlərinə təzədən başlamalıdır. Eyni zamanda, ikinci qadın və ondan dünyaya gələcək övladların xərcləri də bura daxildir. Belə məsələlər birinci qadından olan övladlarını anasız boyütmək baxımından, kişidə vəhşət və çətinlik yaradaraq onun istər-istəməz .boşanmaq fikrindən dönməsinə yardımçı olur

Ailə münasibət və təməllərinin aradan qalxdığı zamanlarda da İslam həm qadın, həm də kişi tərəfindən nümayəndə olmaq üçün bir hakimi təyin edir və hadisələrin ailə məhkəməsinə qədər gedib çıxmasına və həmin məsələlərin öz həllini tapmasına çalışır. Bu zəminədə hakimlər kişi və qadının münasibətlərinin islah edilərək

onlar arasındakı ixtilaflı məsələlərin həll edilməsi baxımından bütün səy və təlaşlarını edirlər. Əlbəttə, onlar ayrılmaqdan başqa, bir çarənin olmadığı nəticəsinə gəlsələr, qadın və kişi ilə məşvərət etdikdən sonra onlar arasında ayrılmanı təmin edirlər. Kişi və qadının ailəsində hakimlik etmək səlahiyyətinə malik olan şəxslər bu cür məsələlərdə hökm vermək üçün daha üstün və birinci dərəcəlidirlər. Qurani-kərimin “Nisa” :surəsinin ٣٥-ci ayəsində göstərildiyi kimi, Allah-taala buyurur

{وَإِنْ خِفْتُمْ شِقَاقَ بَيْنِهِمَا فَابْعَثُوا حَكَمًا مِنْ أَهْلِهِ وَحَكَمًا مِنْ أَهْلِهَا إِنْ يُرِيدَا إِصْلَاحًا يُوَفِّقِ اللَّهُ بَيْنَهُمَا إِنَّ اللَّهَ كَانَ عَلِيمًا خَبِيرًا}

Siz, ey şəriət hakimləri, yaxud ey qövmün ağıllıları ) əgər o ikisinin (ər ilə arvadın))“ arasındakı çəkişmə və ziddiyyətdən qorxsanız, onda bir hakim kişinin ailəsindən və bir hakim qadının ailəsindən seçin ki, əgər (aranı) düzəltmək qəsdləri olsa, Allah o ikisinin ”.arasında uyğunluq (saziş) yaradar. Həqiqətən, Allah bilən və xəbərdardır

:Kəşşaf” təfsirinin müəllifi ayədəki “həkəm” (hakim) kəlməsi barədə belə deyir“

ای رجلاً مقنعاً رضیا یصلح لحكومه العدل والإصلاح بینهما

Yəni, “hakim ünvanında seçilən şəxs etimad ediləsi, güclü məntiqə sahib və sözü keçən olmalıdır. Eyni zamanda, ədalətli və kişi ilə qadın arasında sülh yaratmağı ”.bacarmalıdır

Deməli, kişi və qadının yaxınları arasından yad olan şəxslərə nisbətdə hakim seçməyə üstünlük vermək onların məsələlərdən daha çox xəbərdar olması və kişi ilə qadın arasında razılıq və anlaşma yarada bilmələri baxımındandır. Yəni, onlar yadlara nisbətdə baş verən hadisələrdən xəbərdar və onlar arasında sülh və razılaşma yaratmağa daha çox meyillidirlər. Bunlardan əlavə, kişi və qadın öz ürək sirlərini yad olan şəxslər arasında deyil, qohum-əqrəba və yaxınları arasında daha rahat aşkar edə bilirlər. Onlar yad insanlara deyə bilmədikləri ürək sözlərini qohum və yaxınlarına deyə .bilirlər

Kişi və qadın arasında bu məsələlərlə bağlı hakim təyin edilib-edilməməsinin vacib və .ya müstəhəb olması barədə alimlər arasında fikir ayrılığı mövcuddur

Tədqiqatçılar bu məsələnin vacib və hökumətin üzərinə düşən bir vəzifə olmasına

Məsalik” əsərində bu vəzifənin bildirildiyi kimi, hakimlərin məsuliyyətlərinə daxil“
.olduğu və eyni zamanda, vacib və zəruriliyi barədə açıq-aşkar fətva vermişdir

Əlmənar” təfsirinin müəllifi olan Seyid Məhəmməd Rəşid Rza hakim təyin edilməsinin“ vacib olması barədə rəy və fikrini bildirdikdən sonra, İslam alimlərinin onun müstəhəb, yoxsa, vacib olması barəsindəki ixtilaflarına cavab verərək deyir: “Müsəlmanlar arasında əməldə həyata keçirilməyən həmin məsələnin özü və onun sonsuz üstünlüklərindən istifadə edilməməsidir. Bunun nəticəsində talaq və boşanmalar günbəgün artır, ailələrdə ixtilaf və münaqişələr başa verir. Amma müsəlmanlar Quranın açıq-aşkar olan nəssinə əməl etmirlər. Bütün alimlər də sadəcə bu məsələnin müstəhəb və ya vacib olması barədə ixtilaf və mübahisə etməkdədirlər. Bir nəfər meydana çıxıb demir ki, istər vacib olsun, istərsə də müstəhəb, nə üçün kimsə onun həyata keçirilməsi üçün hansısa bir addımı atmır? Niyə bütün qüvvələrinizi təkcə mübahisə və münaqişəyə sərf edirsiniz? Əgər insanlar bu məsələlərdən istifadə etməyəcəklərsə, onda həmin məsələnin müstəhəb və ya vacib olmasının nə mənası
”?vardır

Şəhid Sani hakimlərin kişi ilə qadın arasında sülh və saziş yaratmaqla bağlı kişinin
:öhdəsinə qoya biləcəkləri şərtlərdən bəhs edərək belə deyir

Onlar kişini məcbur edirlər ki, qadını filan şəhərdə məskunlaşdırsın. Məsələn, almaq“ istədiyi ikinci qadını və ya öz anasını birinci qadını məskunlaşdırdığı evdə, hətta, ayrıca otaqlarda belə olsa, yerləşdirməməli olmasını bildirirlər. Yaxud da qadının mehriyyəsini və ya ondan müəyyən məbləğdə borc pul almışsa, onu dərhal ödəməyə
”.kişini vadar edirlər

Bu məsələləri bildirməkdə məqsədimiz talaqın təxirə salınmasına səbəb olan hər hansı bir məsələnin İslamın nəzərində bəyənilən olmasıdır. Bizim iyirmi ikinci məqalədə bəyan etdiyimiz bu sualın “kişinin boşanmaqla bağlı verdiyi qərara məhkəmə heyəti
.müdaxilə edərək təxirə sala bilmək haqqına sahibdirmi?” cavabı aydınlaşacaq

Bizim cavabımız həmin haqqa məhkəmə heyətinin sahib ola bilməsini deməkdir. Çünki boşanmaq üçün qəbul edilən hər hansı bir qərar ailə təməl və münasibətlərinin dağılmasına gətirib çıxarmır. Başqa bir ifadə ilə desək, talaqla bağlı verilən bütün qərarlar ailədə kişinin qadına qarşı məhəbbətinin azalması və qadının ailədəki təbii mövqeyinin süqutuna və kişinin qadını saxlaya bilməməsinə səbəb olmur. Verilən qərarların əsəbilik və səhvlik ucbatından ola bilməsi də mümkündür. Bu baxımdan, cəmiyyətin əsəbilik və səhvliklər səbəbi ilə verilən boşanma və talaqlara qarşı çıxması və mübarizə aparması bəyənilən və İslamın nəzərində də qəbul ediləndir. Məhkəmələr qadınla kişinin boşanması ilə bağlı qərar qəbul etmədiyi zamana qədər onların ayrılmasını təxirə salmaq və bu məsələyə mane olmaq mümkündür. Əgər onlar (kişi ilə qadın) arasında sülh və sazişin yaradılmasının mümkün olmaması müəyyən edilərsə, .talaq və boşanmanın həyata keçirilməsi gerçəkləşir

**(Qadının ailədəki xidmətlərinin keçmişi (sabiqəsi**

Bildirmək istədiyimiz digər bir mətləb kişilərin qadınlara namərdliklə verilən . ٢ boşanma məsələlərinin, şəxsən, qadının özünə də müəyyən zərərlər vurduğunu və bunu unudaraq görməzdən gəlməməli olduğumuzdur. Qadın illərlə səmimi şəkildə öz ərinin evində yaşayaraq onun evini öz evi kimi bilir və ayrı-seçkilik etmir və bu sahədə əlindən gələni əsirgəməyərək ailəsinə xidmət etməyə çalışır. Qadınlar (əlbəttə, şəhərdə yaşayan qadınların müəyyən bir təbəqəsi istisna olmaqla) ailədə ekonomik baxımdan o qədər yığımcıllıq və qənaətçilik edirlər ki, kişilərin özlərini də narazı salırlar. Bu cür qadınlar ev işlərində xidmətçi və qulluqçulardan istifadə etməkdən vaz keçərək qənaətçilik edir və özünü ailə və ev işlərinə və həqiqətdə isə, ərinə fəda edirlər. Belə olan halda, kişinin yeni bir qadınla evlənmək fikrinə düşərək illərlə birlikdə yaşadığı, ömrünü və salamatçılığını ərinə sərf etdiyi qadını boşamaq istəməsi və birinci qadının zəhmətləri hesabına əldə etdiklərini əyyaşlığa və kefə sərf etməsi nə dərəcədə qəbul

?ediləndir? Həmçinin, bu işin cəzası nədir

Bu yerdə təkcə kişi və qadın arasındakı ailə münasibətlərinin dağılmasından söhbət getmir və biz kişinin namərdcəsinə hərəkətlərinə qadının təbii olaraq dözməsini söyləyə bilmərik. Ortada başqa bir məsələnin olduğu da aydındır. Yəni, qadının illərlə çəkdiyi zəhmətlərin hədər getməsi, onun öz yeri və evini rəqibə verməli olması və s. .kimi məsələlərdən söhbət gedir

Ailənin dağılması, ərin başqası ilə evlənməyə çalışmaq istəməsi bir tərəfə dursun, insanın öz əlləri ilə tikib düzəltdiyi evini itirməsi ağır bir dərddir. Əgər hansısa bir toyuğu da öz yuvasından çıxarmaq istəsəniz, o da özünü müdafiə etməyə çalışar. Belə olduğu təqdirdə, qadın öz ailə və evini müdafiə etməli deyilmi? Görəsən, kişi tərəfindən bu cür rəftar qadına açıq-aşkar zülm etmək deyildirmi? İslam bu cəhətdən hansı məsələləri nəzərdə tutmuşdur? Bizim nəzərimizcə, həmin məsələ diqqət edilməli .olan bir məsələdir

Adətən, meydana çıxan problem və çətinliklərə səbəb kişilərin namərdcəsinə verdikləri talaqlardır. Talaq və boşanma sadəcə ailə münasibətlərinin parçalanma və dağılması deyil, qadının müflis və məhv olması deməkdir. Ailə və ev məsələsi talaq və boşanma ilə fərqlilik təşkil edən iki məsələdir. Biz onlar arasında müəyyən fərq və .ayrılıqların olmasını nəzərdə tutmalıyıq

İslamın nəzərində bu məsələ və problem öz həllini tapmışdır. Barəsində danışdığımız problem kişilərin sui-istifadə etməsi və qadınların yaxşı niyyətlərindən qaynaqlanmışdır. Eyni zamanda, həmin məsələlərin yaranmasına səbəb olan digər hallar kişinin qadını özünə bir qul kimi hesab etməsi və onun əməyinin nəticəsinin özünə şamil olduğunu düşünməsi və qadının da təbii olaraq, kişinin bütün göstəriş və əmrlərinə tabe olmasını güman etməsidir. Halbuki, biz əvvəlki bəhslərimizdə dəfələrlə qadının əmək fəaliyyətinin, şəxsən, onun özünə aid olduğu və bu sahədə tamamilə sərbəst və azad olamsını və kişinin bu barədə heç bir haqq sahib olmadığını oxucuların diqqətinə çatdırmışdıq. İslam dini qadına kamil şəkildə iqtisadi

azadlıq vermiş, üstəlik onun və övladlarının xərclərini də kişinin öhdəsinə qoymuşdur. Buna səbəb qadının kişidən asılı olmadan özü və həyatı üçün maddi sərvət toplaya bilməsi və əgər ayrılıq və talaq kimi məsələlər meydana çıxarsa, onun bu sahədə .narahatçılığına ehtiyac duyulmamasıdır

Əlbəttə, qadın öz əlləri ilə evi üçün yığıb düzəltdikləri şeylərin ona şamil olduğunu düşünməkdə haqlıdır və kişinin onları qadının əlindən almağa ixtiyarı yoxdur. Belə narahatçılıqları qadını əri və evi üçün işləməyə məcbur edən və onun əmək fəaliyyətinin bütün nəticələrini özünə deyil, onun ərinə şamil olduğunu qəbul edən rejimlərdə müşahidə etmək mümkündür. Bizim camaatımız arasında da yaranan .narahatçılıqlar islami qanunlardan xəbərsiz, cahil və qafil olmağın səbəbiilədir

Bütün bunların digər bir səbəbi də kişinin qadının vəfadarlığından sui-istifadə etməsi məsələsidir. Bəzi qadınlar islami qanunları bilməmələri üzündən deyil, ərlərinə etimad edərək işin içində hesab-kitabın, “sənin və mənim malım” söhbətinin olmaması üçün öz evi və ailəsinə xidmət edir. Bu baxımdan, onlar özləri barədə düşünmür və İslamın onlara verdiyi fürsətlərdən istifadə etmirlər. Onlar (qadınlar) bir də onda gözlərini açıb ayılırlar ki, ömürlərini sadəcə vəfasız olan bir ünsür üçün sərf etmişlər və İslamın onlar üçün nəzərdə tutduğu kifayət qədər olan fürsətlərin də hamısı əllərindən çıxmışdır. Belə qadınlar sadəlövh olmamalı və əvvəlcədən çox diqqətli olmalıdırlar. Əgər qadın şəri haqlarından özünün mal və sərvət toplaması üçün istifadə etməkdən vaz keçərək öz işçi qüvvəsini (əmək fəaliyyətini) ərinə hədiyyə etsə, kişi də əvəzində, Quranında buyurulan

{وَإِذَا حُيِّيتُمْ بِتَحِيةٍ فَحَيوا بِأَحْسَنَ مِنْهَا أَوْ رُدُّوهَا إِنَّ اللَّهَ كَانَ عَلَى كُلِّ شَيءٍ حَسِيبًا}

Sizə salam verildikdə, siz ondan daha gözəl və yaxud onun kimi bir salam(la cavab)“ (verin!”(١)

ayəsini uyğun əməl etməlidir. Şübhəsiz, Allah hər şeyin hesabını aparandır) hökmünə əsasən, həmin miqdarda və ya

.ondan bir qədər artıq qadına nəyi isə hədiyyə və əta etməlidir

Vəfalı və qadınlarına məhəbbət bəsləyən kişilər arasında həmişə onların (qadınların) etdikləri fədakarlıq və verdikləri hədiyyələr müqabilində onlara nə isə könül oxşayan .bir hədiyyə, ev və s. almaq qayda halını almışdır

Hər halda, bizim demək istədiyimiz məsələ talaq məsələsinin qadının evsiz-eşiksiz qalmasına səbəb olmamasıdır. Talaq və boşanma qanunlarında dəyişikliklərin edilməsi həmin çətinlik və problemlərin həll edilməsində təsirli rola malik olmayacaq. Bu məsələ qadının iqtisadi cəhətdən azad və müstəqil olub-olmaması məsələsi ilə əlaqədardır və İslam da həmin məsələni həll etmişdir. Belə problemlər bəzi qadınlar arasında islami təlim və qanunlardan xəbərsizliyin olması və digər qrupdan olan qadınlar arasında isə sadəlövhlük və qəflətdən qaynaqlanır. Əgər qadınlar İslamın onlar üçün nəzərdə tutmuş olduğu fürsətlərdən istifadə etsə və öz ərlərinə fədakarlıq kimi xüsusiyyətləri .nişan verməsələr, bu məsələ və çətinliklər öz-özlüyündə həll olub aradan qalxacaqdır

**(Talaq haqqı (۵**

Əgər hörmətli oxucu xatırlayırsa, əvvəlki bəhslərimizdə talaqdan yaranan problemlərin iki məsələdən qaynaqlandığını söyləmişdik: Onlardan biri kişilərin vəfasızlıq etməsi və namərdcəsinə talaq və boşanmaya can atması, digəri isə belə kişilərin aralarında heç bir anlaşma və sazişin yarana bilməyəcəyini bilsələr də, qadına .daha çox əziyyət vermək üçün onlara talaq verməmələri məsələsidir

İki fəsildən əvvəl olan bəhsdə birinci məsələyə toxunmuşduq. Demişdik ki, İslam talaqın baş verməsinə mane sayılan hər bir səbəbi xoş qarşılayır və özü də onun həyata keçməməsi üçün müəyyən xüsusi tədbirləri nəzərdə tutmuşdur. İslam sadəcə güc və zor tətbiq etməklə ailə təməllərinin qorunması ilə müxalifət edir. Deyilənlərdən İslamın nəzərində ailənin canlı bir təşkilat olması və həyatına davam etməsinin əhəmiyyət kəsb etdiyi və İslamın bu zəminədə səy və təlaş

göstərdiyi məlum olur. Amma həmin varlıq öldüyü zaman, yəni ailə dağıldıqda, onu süni şəkildə və qanunlarla mumyalayaraq qorumağa çalışmır və buna görə .təəssüflənərək onun dəfn edilməsinə göstəriş verir

Talaq və boşanma haqqının kişiyə verilməsi səbəbi aydın oldu. Yəni, evlilik münasibətləri təbii əlaqələrə əsaslanır və onun xüsusi mexanizmi mövcuddur. Bu münasibətlərin möhkəmləndirilməsi, eyni zamanda, onun dağıdılması ilə bağlı bütün kilidlər xilqətdə kişinin ixtiyarı və əlində qoyulmuşdur. Xilqət və yaradılış hökmlərinə əsasən, hər hansı bir kişi və qadın bir-birinə nisbətdə müəyyən edilmiş xüsusi mövqe və funksiyalara malikdirlər və onları heç cür əvəz etmək və ya bir-birinə bənzətmək mümkün deyil. Həmin mövqe və xüsusiyyətlərin bir növ talaq haqqına da məxsus olduğunu söyləmək olar. Başqa bir ifadə ilə desək, o digər məsələ deyil, hər bir kişi və .qadının eşq və məhəbbət məsələsi və evliliyi ilə bağlı olan bir xüsusiyyətdir

**...Kişinin talaq vermək haqqı onun məhəbbət məsələsi ilə əlaqədar**

Kişinin talaq vermək haqqı onun məhəbbət məsələsi ilə əlaqədar olan xüsusi funksiyasından qaynaqlanır, nəinki, onun mülkiyyət vəzifəsindən

Bu yerdə siz İslamın ziddinə olaraq təbliğat aparan ünsürlərin dəyərini anlaya bilərsiniz. Həmin ünsürlər bəzən belə deyirlər: "İslamın kişiyə talaq və boşanma haqqını verməsinə səbəb onun qadının iradə, meyil və arzu sahibi olmasını qəbul etməyərək şəxsiyyət sırasında deyil, əşya sırasında qəbul etməsidir. Eyni zamanda, yəni, insanlar الناس مسلطون على اموالهم ,İslam kişini qadının maliki hesab edir və təbii olaraq öz malları üzərində ixtiyar sahibidirlər) hökmünə əsasən, ona istədiyi zaman öz malını .(mülkiyyətini) tərk etmək haqqını verir

Aydın məsələdir ki, İslamın məntiqi kişinin malik və qadının mülkiyyət olmasına əsaslanmır. İslamın məntiq və düşüncəsi belə fikirdə olan yazıçıların düşüncəsindən üstün və

dəqiqdir. İslam vəhyin şüasında ailə münasibətlərinin təməl və əsasları ilə əlaqədar olan rəmz və sirlərə agah olmuşdur. Hazırda on dörd əsr keçdikdən sonra elm həmin .məsələ və sirlərə yol taparaq özünü yaxınlaşdırır

**...İzdivac və evliliyin təbii mahiyyəti sahiblənmək olduğu üçün**

Həmin düşüncəyə sahib olan insanlar bəzən də belə deyirlər: "Nə üçün talaqın ayrılıq kimi bir forması vardır? Talaq gərək məhkəmə ilə həll edilsin." Onlara bu şəkildə cavab vermək lazımdır: "Evlilik sahiblənmə olduğu üçün talaq da ayrılıqdır. Əgər siz talaq qanunları ilə əlaqədar olaraq kişi və qadın arasında mütləq şəkildə əvəzetmə və dəyişiklik yarada bilsəniz, evlilik və izdivacı öz təbii halətindən çıxara, təbii qanunları dəyişə, erkək və dişi cinsin daşıdıqları funksiyanı (istər insanlarda olsun, istərsə də heyvanlarda) bir-birinə nisbətdə oxşar şəkilə sala bilsəniz, talaqı da ayrılıqdan xaric edə bilərsiniz." İxtiyar məsələsini qadınların əllərindən almayın. Yəni, həmin məsələni əvəzsiz vəkalət şəklinə salın. Bunu bir şərt olaraq nəzərə aldıqda, həmin şərtə əsasən, qadın mütləq şəkildə və ya əvvəlcədən nəzərdə tutulan xüsusi halda özünü boşanmış .hesab edə bilər

Qədim zamanlardan etibarən qadınlar gələcək ərləri barədə nigarançılıq hisləri keçirsələr, əqddə hansısa bir şərti nəzərdə tutmaqla talaq haqqını öz əllərində saxlaya .bilir və zəruri hallarda həmin haqlardan istifadə edirdilər

İslami fiqhdə qadının təbii surətdə talaq vermək haqqı yoxdur, amma əqddə şərt .etmək və razılaşmaq yolu ilə bu haqqa sahib ola bilər

:İctimai qanunun min yüz on doqquzuncu maddəsində belə yazılır

Evlənmək istəyən tərəflər əqdin tələbləri ilə müxalif olmayacaq şəkildə istənilən" şərtləri nəzərdə tuta bilərlər. Məsələn, kişi başqa bir qadınla evlənmək istədikdə, qadının nəfəqəsini vermədikdə, qadının həyatına sui-qəsd təşkil etdikdə, müəyyən müddət ortalıqda görsənmədikdə və ya kişi tərəfindən

ona qarşı pis rəftar edildikdə, belə ki, həmin rəftarlar onların artıq bir yerdə yaşaya bilməsinə mane olduğu zamanlarda qadın vəkil və ya vəkalət verdiyi şəxsin vasitəsi ilə məhkəmədə həmin şərtlərin gerçəkləşdiyini sübut etdikdən sonra özünü boşanmış ”.kimi elan edə bilər

Diqqət edildiyi kimi, İslami və fiqhi baxından İranda talaq haqqının qadınlara aid olmayıb kişilərə verilməsini və bu haqqın bir tərəfli olmasını söyləməyin doğru olmadığı məlum olur. İslami fiqhdə və İran ictimai qanunlarında bu haqqın təbii olaraq mövcud olmadığı aydın və şübhə edilməyən bir məsələdir, amma qadınlar razılaşma və şərtə .əsasən həmin hüquqa (haqqa) sahib ola bilərlər

Hazırda növbə bizim əvvəldə bəyan etdiyimiz bəhsin ikinci qisminə, yəni kişilərin namərdlik edərək qadına daha çox əziyyət etmək məqsədi ilə onlara talaq verməməsi – həqiqətən də, bu çox böyük bir problemdir – məsələsinə yetişir. İndi diqqət edək görək, İslam bu zəminədə hansı çıxış yollarını nəzərdə tutmuşdur. Gələn bəhsimizdə bu barədə “Məhkəmə vasitəsi ilə verilən talaq” başlığı altında söhbət açacağıq. Birinci .məsələ barədə söhbətimiz uzandığı üçün sizdən üzr istəyirik

### Məhkəmə vasitəsi ilə verilən talaq

Məhkəmə talaqı dedikdə, ər tərəfindən verilən talaq deyil, hakim tərəfindən verilən talaq nəzərdə tutulur. Dünyanın əksər ölkələrində talaq vermək haqqı məhkəmə və hakimin ixtiyarında qoyulmuşdur və sadəcə onlar evlilik məsələsinə xitam verə bilərlər. Bu qanunların nəzərində, həyata keçirilən bütün talaqlar məhkəmə vasitəsi ilə verilən talaqlardır. Biz əvvəlki bəhslərimizdə bu nəzəriyyənin batilliyinə və ailə münasibətləri və onun təşkili ilə bağlı nəzərdə tutulan hədəf və məqsədlərə, eyni zamanda, onun ailə ruhu ilə düz gəlmədiyinə işarə edərək bu məsələlərdə əgər talaq özünün təbii mərhələlərini keçərsə, onun qazının rəyindən asılı olmadığını sübuta yetirmişdik. Biz hazırda İslamın qazı və hakim üçün (onların işinin çətinliyini nəzərə aldıqda belə) talaq verməklə

bağlı hansısa bir vəzifə və məsuliyyəti onların ixtiyarında qoymadığı və ya istisna və .nadir hallar olmaqla, belə bir hüququ onlara verməsi barədə bəhs etmək istəyirik

Talaq kişiyə verilən təbii bir haqdır, bu şərtlə ki, onun qadınla münasibətləri öz təbii axarı ilə davam etmiş olsun. Həmin məsələnin kişi və qadın arasındakı təbii axarı onların bir yerdə yaşamağa davam etmək istədikləri müddətdə kişinin qadının haqqını əda etməsi, onu mühafizə edərək qoruması və s. kimi məsələlərdir. Eyni zamanda, əgər qadınla həyat sürməyə davam etmək istəməzsə, onun haqlarını tapdalamadan xoşluqla qadına talaq verməsidir. Yəni, qadına talaq verməkdən imtina etməməsi, hüquqlarına təcavüz etməməsi və Quranın dediyi kimi

{وَمَتِّعُوهُنَّ عَلَى الْمُوسِعِ قَدَرُهُ وَعَلَى الْمُقْتِرِ قَدَرُهُ}

Onlara öz malınızdan bir pay verməli və onları öz malınızdan bəyənilən şəkildə) bəhrələndirməlisiniz, dövlətli öz imkanı qədər və kasıb öz imkanı qədər. Bu haqq, yaxşı əməl sahibləri üçün sabit və vacibdir) evlilik münasibətlərini yaxşılıqla sona (yetirməlidir. (١)

Əgər talaq məsələsi özünün təbii axarı ilə davam etməsə necə? Yəni, nə İslamın qəbul etdiyi kimi yaxşı rəftar və səadətli ailə təşkil etmək fikrində olan, nə də qadına öz işləri ilə məşğul olmağa imkan verən bir kişi meydana çıxsa, başqa bir ifadə ilə desək, nə qadının razılığını cəlb etməyə və ər kimi öz vəzifəsini yerinə yetirməyə meyil göstərir, ?nə də qadına talaq verməyə razıdır, belə olan hallarda nə etmək lazımdır

Təbii şəkildə baş verən talaq təbii olan doğum məsələsinə bənzəyir və o, öz mərhələsini təbii olaraq ötür. Amma kişi tərəfindən öz vəzifələrinə əməl etmədən və talaq vermək istəmədiyi halda gerçəkləşən talaq qeyri-təbii şəkildə baş verən doğuşa .bənzəyir ki, həkim və cərrahların yardım və köməyi ilə övladı güclə dünyaya gətirirlər



---

.Bəqərə“ surəsi, ayə ٢٣۶“ .[١]-١

## GöRəSəN, BəZI EVLILIK Və IZDIVACLAR XəRçəNG XəSTəLIYI KIMIDIR Və QADıNLAR ?YANıB-YAXıLARAQ (SıXıNTıDA OLARAQ) ONA UYğUNLAşMALıDıRLARMı

Hazırkı bəhsimizdə İslamın bu formada olan talaqlar və belə düşünən kişilər haqqında nə düşündüyünü araşdıracağıq. Görəsən, belə olan halda da İslam məsələni kişinin nəzərinin öhdəsinə buraxır və talaq və boşanmanı yüz faiz kişiyə bağlı olduğunu deyərək kişi talaq verməyə razı olmadıqda, qadının bu cür zülümkarcasına bir şərait və vəziyyətə qatlaşmasını və İslamın da həmin hadisələri uzaqdan sakitcə seyr etməli ?olduğunumu bildirir

Əksər insanların həmin məsələ barədəki etiqadı belədir. Onlar deyirlər: "İslamın nəzərində həmin məsələnin heç bir çarəsi yoxdur. Adətən, bu, bir növ xərçəng xəstəliyi kimi bir məsələdir ki, insanlar bəzən həmin xəstəliyə tutulurlar və onunla bağlı çarəsizdirlər. Qadın belə şəraitdə ona alışmalı və həyatının bir şam kimi əriyərək ".bitməsini gözləməlidir

Mənim nəzərim və etiqadıma əsasən, bu cür düşüncə İslamın açıq-aşkar qayda və qanunları ilə tamamilə ziddiyyət təşkil edir. Ədalətdən dəm vuran və ədalətin bərpa edilməsinə göstəriş verərək bütün peyğəmbərlərin hədəf və əsas məqsədinin bu cür

{لَقَدْ أَرْسَلْنَا رُسُلَنَا بِالْبَيِّنَاتِ وَأَنْزَلْنَا مَعَهُمُ الْكِتَابَ وَالْمِيزَانَ لِيَقُومَ النَّاسُ بِالْقِسْطِ}

Şübhəsiz, biz öz peyğəmbərlərimizi aydın dəlillərlə (məntiq və möcüzə ilə) göndərdik) və onlarla birlikdə insanlar (dünya həyatında) ədalət və insafa əməl etsinlər deyə, ((səmavi) kitab və ölçü vasitəsi nazil etdik) (١)

olduğunu bildirdiyi halda, İslam dininin aydın və aşkar olan belə bir zülm barəsində !?hansısa bir çarəni düşünmədiyini necə söyləmək mümkündür

Bəyəm, İslam öz qanunlarını hansısa xərçəng xəstəliyinə tutulmuş bir şəxsin əzab-əziyyət çəkdiyi və çarəsiz qaldığı və sonda ölümlə bitəcəyi kimi bir halla nəticələnəcəyi !?üçün müəyyən etmişdirmi

ədalət dini” olduğunu etiraf edən bəzi şəxslər bu cür nəzərlər irəli sürürlər. Əgər“ zalimanə bir qanunu “xərçəng xəstəliyi” adı altında İslam dininə yapışdırmaq istəsək, onda, “sel”, “əsəb sisteminin iflici” adlı digər qanunları da zalimanə qanunlar kimi qəbul .etməyimiz üçün heç bir maneə olmayacaqdır

Əgər məsələnin bu cür olduğunu qəbul etsək, onda, İslam dinin əsas rükn və təməli olan ədalət harada qaldı? Peyğəmbərlərin hədəf və məqsədi olan ədalətin bərpası ?hara getdi

Deyirlər ki, bu xərçəng xəstəliyidir. Lap yaxşı, əgər belə bir xəstəliyə düçar olan şəxsi sadə bir cərrahi əməliyyat etməklə xilas etmək mümkündürsə, onda, biz bu addımı ?atmamalı və xəstənin həyatını qurtarmamalıyıqmı

Hansısa bir kişi ilə evlənən qadın onunla birgə yaşadıqdan sonra onların əhval-ruhiyyə və vəziyyətləri dəyişir, eyni zamanda, kişi öz ixtiyarından sui-istifadə edərək qadına talaq vermək istəmir. Kişinin belə bir addım atmaqda məqsədi qadının ona layiq bir kişi ilə evlənməsinə mane olmaq və Quranın ifadə etdiyi kimi desək, onu özündən asılı vəziyyətdə saxlamaq üçün talaq verməməsidir. Həqiqətən də, bu məsələ qadın üçün xərçəng xəstəliyinə tutulmuş adamın düşdüyü vəziyyətə bənzəyir. Amma xərçəng xəstəliyinin bu növünün asanlıqla müalicə oluna biləcək bir xəstəlik olduğunu da diqqətə çatdırmaq lazımdır. Sadə və yüngül bir cərrahi əməliyyatla xəstəliyə tutulan şəxs yenidən öz əvvəlki sağlamlığını tamamilə geri qaytara bilər. Bu cür əməliyyatlar səlahiyyətlərə malik olan şəri hakim və məhkəmə heyəti tərəfindən həyata keçirilə .bilər

Əvvəlki məqalələrdə bizim cəmiyyətimizdə mövcud olan iki böyük problem və çətinliyin bəzi zülümkar kişilərin talaqdan imtina etməsi və din adı bəhanəsi ilə zülmə mürtəkib olması səbəbi ilə yaranmasını sizə bildirmişdik. Belə zülümlər və İslam və din adına səhv və yanlış olaraq söylənən və “qadın həmin əziyyət və çətinliklərə əlacsız xərçəng xəstəliyinə tutlmuş insan kimi səbr və təhəmmül etməlidir” qəlibindəki cümlələrlə də ona (dinə) daha çox zərbə vurulmasına səbəb olur. Biz bu məsələ ətrafında bəhs etmək istəyir və İslam barəsində bədgüman

olmuş şəxslərə İslam dininin belə düşüncələrdən daha yüksək səviyyədə dayandığını .bildirmək və qaranlıq qalmış məsələlərin aydınlaşdırılmasını istəyirik

**(Çıxışı olmayan yollar (labirintlər**

Bu cür məsələlərin evlilik və talaqla bağlı olmadığını bilməyimiz gərəklidir. Əksinə, həmin məsələlərin iqtisadiyyatla əlaqəli məsələlərdə də qarşıya çıxması mümkündür. Əvvəlcə, İslamın talaq və evliliklə deyil, digər hallarla bağlı olan bu şəkildəki məsələlərdə necə rəftar etdiyini bilmək lazımdır. Görəsən, İslam dini belə çarəsiz ?məsələləri ortadan qaldıra bilmiş, yoxsa, onları olduğu kimi qəbul etmişdirmi

İki nəfərin ya irs, ya da hansısa digər bir yolla bölüşdürülməsi mümkün olmayan zinət əşyası, üzük, rəssamlıq əsəri, maşın və s. kimi bir mala sahib olduğunu və onların həmin malı müştərək olaraq, yəni bir gün birinin, bir gün də digərinin ixtiyarında olmaq şərti ilə istifadə etmək istəmədiklərini fərz edin. Eyni zamanda, onlardan hansısa birinin öz səhmini digərinə satması və yaxud da həmin mallardan istifadə edilməsi ilə əlaqədar razılığa gəlməsi mümkün deyil. Digər tərəfdən də, iki şəxsə aid olan maldan istifadə etmək üçün onların razılığı və icazəsinin olmasının zəruriliyi məlum məsələdir. ?Belə olan hallarda nə etmək lazımdır

Görəsən, həmin malı istifadəsiz şəkildə qoyaraq onun həll edilməsi mümkün olmayan bir xəstəlik kimi qəbul etmək lazımdırmı, yoxsa, İslam bu barədə müəyyən çarə ?yollarını nəzərdə tutmuşdurmu

Həqiqət həmin məsələnin islami fiqhdə həll edilməz məsələ kimi qəbul edilməməsidir. Mal və mülkün istifadəsiz olaraq qalmasını İslam xoşluqla qəbul etmir. Bu baxımdan, sərvətin istifadəsiz qalmasının qarşısını almaq üçün şəri hakimə ictimai bir məsələ ünvanında və ya qazıya da əxlaqi məsələnin həll edilməsinə görə öz hüquqlarından imtina edən sahiblərin düzgün istiqamətləndirilməsinə icazə verir. Məsələn, nəzərdə tutulan malı icarə vermək və ya onu satışa çıxarmaqla əldə

.edilən gəlirini tərəflər arasında bölüşdürürlər

Hər halda, şəri hakim və qazının vəzifəsi imtina edilən mal barədə ixtiyara malik olaraq düzgün dəyərləndirmə apara bilməkdir. Bu məsələlərdə mal sahibinin icazə verib-.verməməsi o qədər də əhəmiyyət kəsb etmir

Görəsən, nə üçün belə hallarda həqiqi mülkiyyət sahibinin qanuni haqqına riayət ?edilmir

:Çünki işin içində digər bir məsələ var və həmin məsələ bundan ibarətdir

Mal və sərvətin istifadəsiz qalmasının qarşısı alınmalı və onun tələf olmasına mane“ olunmalıdır. Həqiqi mal və sərvət sahiblərinin haqq və mülkiyyət hüquqlarına riayət ”.etmək həmin sərvətin tələf və istifadəsiz olmadığı zamanlarda zəruridir

Məsələn, üzərində ixtilaf və münaqişə edilən malın qılınc, qiymətli bir daş və s. kimi bir şey olduğunu və tərəflərdən heç birinin onu digərinə satmağa razılıq vermədiyini, amma hər iki tərəfin onları ortadan bölərək özlərinə götürmələrinə hazır olduğunu düşünün. Yəni, tərəflərin həmin malı dəyər və qiymətdən salmaqla bağlı razılığa gəldiklərini təsəvvür edin. Görəsən, İslam buna icazə verirmi? Xeyr! Nə üçün? Çünki .belə bir addımın atılması mal və sərvətin zay və tələf edilməsidir

İslam fəqihləri arasında böyük şəxsiyyət kimi tanınan Əllamə Hilli belə buyurur: “Əgər tərəflər belə bir addım atmağa səy göstərsələr, şəri hakim onlara mane olmalı və qarşısını almalıdır. Mal sahiblərinin razılıqları və fikir birliyi belə bir işin həyata ”.keçirilməsi üçün icazə verilməsinə kifayət etmir

### Talaqla bağlı çıxılmaz vəziyyət

İndi həmin məsələni talaq və boşanma ilə bağlı düşünmək lazımdır. Kişinin narazı olduğu və İslamın onun üçün nəzərdə tutduğu vəzifələri - onların bəzisi maddi (nəfəqə ödəmək), bəzisi əxlaqi (yaxşı və bəyənilən şəkildə rəftar etmək) və bəziləri də cinsi məsələlərlə (cinsi yaxınlıq və münasibətlə) bağlıdır - yerinə yetirmədikdə və yaxud da onlardan birini

yerinə yetirib digərlərini həyata keçirmədikdə və bütün bunlarla yanaşı, qadına talaq ?vermək istəmədikdə, görəsən, dinimiz hansı tədbir və çarələri düşünmüşdür

İqtisadi və maddi baxımdan mallarla bağlı şəri hakim və qazıya dəxalət etmək ixtiyarı verdiyi kimi, görəsən, bu məsələdə də onlara müdaxilə etmək üçün hüquq ?vermişdirmi, yoxsa, ümumiyyətlə, belə bir haqq nəzərdə tutulmamışdır

## Əllamə Hillinin nəzəri

Mən bu yerdə sözü əsrinin tanınmış fəqihlərindən sayılan və Nəcəfdə yaşamış olan alimlərdən biri - Əllamə Hilliyə verirəm. O, özünün "Zövcələrin hüququ" adlı risaləsində bu mətləb barəsində fikir söyləmişdir. Xülasə, onun nəzəri qadının hüququ və kişinin həmin hüquqlardan imtina etməsi ilə bağlıdır və o, belə deyir: "İzdivac və evlilik müqəddəs olan əhd və peymandır. Eyni zamanda, evlilik iki tərəf arasında müəyyən müştərək məsələ və öhdəliklərin meydana çıxmasına səbəb olur. Təkcə həmin öhdəlik və vəzifələrin yerinə yetirilməsi ilə tərəflərin səadət və xoşbəxtçiliyi təmin edilir. Həmçinin, ictimai məsələlərin də həlli onların bir-birinə nisbətdə vəzifələrini yerinə .yetirməsinə bağlıdır

Qadının ən əsas hüququ ona nəfəqə ödənilməsi, cinsi ehtiyaclarının təmini və əxlaqi baxımdan onunla yaxşı rəftar etmək və davranışdan ibarətdir. Əgər kişi öz öhdəsinə düşən vəzifələrini qadına nisbətdə yerinə yetirmək və eyni zamanda, qadına talaq da vermək istəməsə, bu zaman qadın onunla necə qarşı-qarşıya gəlməlidir? Belə olan :təqdirdə, iki yol mövcuddur

Birincisi, şəri hakim məsələyə dəxalət edərək qadına talaq verməli və bu iş birdəfəlik həll olunmalıdır. İkincisi, qadın da öz növbəsində əri müqabilində onun kimi öz vəzifələrini yerinə yetirməkdən imtina etməlidir. Amma birinci nəzər-nöqtəsinə əsasən, şəri hakimin dəxalət etməsi ilə bağlı hansı dərəcədə belə bir hüququn olması :nəzərdə tutulmuşdur? Quranın "Bəqərə" surəsində belə buyurulur

{الطَّلَاقُ مَرَّتَانِ فَإِمْسَاكٌ بِمَعْرُوفٍ أَوْ تَسْرِيحٌ بِإِحْسَانٍ}

Kişinin arvadı yenidən özünə qaytarmaq haqqına malik olduğu ric’i) talaq iki dəfədir.)“ Beləliklə, (hər dəfə iddə müddətində qayıdaraq onu) yaxşılıqla saxlamaq və ya ((qayıtmayıb onu) xoşluqla buraxmaq (kişinin öhdəsinədir).”(١)

Yəni, talaq haqqı və qayıtmaq iki dəfədən artıq deyil, bundan sonra ya barışmaq, ya da .xoşluqla ayrılmaq lazımdır

:Bir daha “Bəqərə” surəsində buyurulur

{وَإِذَا طَلَّقْتُمُ النِّسَاءَ فَبَلَغْنَ أَجَلَهُنَّ فَأَمْسِكُوهُنَّ بِمَعْرُوفٍ أَوْ سَرِّحُوهُنَّ بِمَعْرُوفٍ وَلَا تُمْسِكُوهُنَّ ضِرَارًا لِتَعْتَدُوا وَمَنْ يفْعَلْ ذَلِكَ فَقَدْ ظَلَمَ نَفْسَهُ}

Qadınlara talaq verdiyiniz və onlar iddələrinin sonuna yaxınlaşan zaman, (ya yenidən“ qayıdın və) onları yaxşılıq və xoşluqla saxlayın, ya da (qayıtmayaraq) onları yaxşılıq və xoşluqla buraxın. Onları əsla incitmək və ziyan vurmaq üçün saxlamayın ki, zülm etmiş (olarsınız. Belə edən kəs, şübhəsiz, özünə zülm etmişdir.”(٢)

Ayədə demək istənilən mətləb qadınların iddə müddəti başa çatdıqda ya onlarla barışmaq, ya da yaxşı şəkildə onlardan ayrılmağın lazım gəldiyidir. Onlara əziyyət vermək və zülm etmək üçün ayrılmamaq bəyənilən bir iş deyil. Belə bir işə addım atan .kəslər başqalarına deyil, özlərinə zülm etdiklərinin fərqinə varmırlar

Bu ayədən ümumi bir qayda əldə edilir və o da bundan ibarətdir ki, kişi ailə həyatında iki yoldan birini seçməlidir: Ya öhdəsinə düşən hüquq və vəzifələri layiqli şəkildə yerinə yetirməlidir (qadınla layiq olduğu kimi rəftar etməlidir), ya da evlilik əlaqə və münasibətlərinə son qoyaraq qadını azad buraxmalıdır (ondan xoşluqla ayrılmalıdır). Qadınla yaxşı rəftar etməmək və ondan ayrılmamaq kimi üçüncü bir yol İslamın .nəzərində mövcud deyildir

{وَلَا تُمْسِكُوهُنَّ ضِرَارًا لِتَعْتَدُوا}

(onları əsla incitmək və ziyan vurmaq üçün saxlamayın ki, zülm etmiş olasınız)

Bu cümlə həmin üçüncü yolun olması düşüncəsini aradan qaldıraraq onu inkar edir. – Yuxarıdakı ayədə ümumi bir məfhum nəzərdə tutulmamış deyil. Yəni, həm kişinin

biləkdən zülm etməsi və həm də kişinin təqsir və günahı olmadığı halda, onun qadınla həyat sürməsinə davam etməsinin qadın üçün zərərdən başqa, bir şeylə .nəticələnməməsini nəzərdə tutur

Ayədə iddə, kişinin öz fikrindən dönərək qadına talaq verməkdən vaz keçməsi və ya bu haqqın olmaması, başqa bir ifadə ilə desək, onun təklif və vəzifələri ilə əlaqədar bəhs edilməsinə baxmayaraq, əgər kişi qadınla yaşamağa davam edərsə, onunla daha layiqli şəkildə rəftar etməsi nəzərdə tutulmuşdur, nəinki, qadına yenidən əzab vermək üçün onunla barışması. Əslində, ayə ümumi halları diqqətə çatdırır, yəni bütün hallar və zamanlarda evlilik münasibətləri bəyan edilir. Deməli, kişi üçün əvvəldə qeyd .etdiyimiz kimi, iki yoldan birini seçməkdən başqa, bir yol yoxdur

Fəqihlərdən bəziləri bu məsələ ilə əlaqədar səhvə düçar olaraq onun sadəcə iddə müddətində qadınları ilə barışıq etmək istəyən kişilərə şamil olduğunu düşünmüşlər. Amma ayə istənilən zaman və dövrdə bütün kişilərin qadına qarşı vəzifə və məsuliyyətlərini aydınlaşdırır. Bizim dəlilimiz həmin ayələrin Əhli-beyt (ə) tərəfindən təkcə iddə ilə bağlı olan hallarda deyil, digər zamanlarda da dəlil və sübut gətirilməsidir. İmam Baqir (ə) belə buyurmuşdur: “Öz qadını ilə yaxınlıq etməmək və cinsi münasibətdə olmamaqla bağlı and içən kişi, dörd aydan sonra, məcburi şəkildə ya öz andını pozmalı və andını pozduğu üçün kəffarə verməlidir, ya da qadınını boşamalı və ondan ayrılmalıdır. Çünki Allah ya qadınlarla birlikdə yaşamaq, ya da ”.onlardan xoşluqla ayrılmağa göstəriş vermişdir

Bir kişi özü üçün vəkil tutaraq onun yerinə əqd etməsini və onun əvəzindən mehriyyəni müəyyən etməsini digər bir şəxsə tapşırmış və vəkil həmin işləri yerinə yetirdikdən sonra, vəkil tutan şəxs ona vəkalət verdiyini inkar etdikdə, imam Sadiq (ə) bu barədə belə buyurmuşdur: “Həmin qadının özü üçün başqa bir ər seçməsində (ərə getməsində) heç bir maneə yoxdur. Əgər müvəkkil (vəkil tutan şəxs) həqiqətən də, vəkalət verərək qadına kəbin kəsdirmişdirsə, Allahla öz arasında həmin qadına talaq verməsi vacibdir. Qadına talaq vermədən onu başlı-başına

:buraxmaq olmaz. Allah Quranda belə buyurmuşdur

{فَإِمْسَاكٌ بِمَعْرُوفٍ أَوْ تَسْرِيحٌ بِإِحْسَانٍ}

İmamın bu sözlərindən həmin ayənin xüsusi hallar üçün deyil, ümumi olaraq nəzərdə tutulduğu məlum olur. Şəri hakim kişi öz vəzifələrinə əməl etmədiyi və qadına talaq vermədiyi zamanlarda onu öz hüzuruna çağırmalıdır. Ona əvvəlcə, talaq verməsini təklif etməlidir və əgər kişi talaq verməyə razı olmazsa, şəri hakim özü qadına talaq verməlidir. “Əbu Bəsir imam Sadiqdən (ə) nəql etdiyi hədisdə belə deyir: “Əgər hansısa bir kişi qadını olduğu halda, onu geyim və nəfəqə ilə təmin etməzsə, müsəlmanların ””.şəri hakimi onlar arasında talaq verməklə fasilə salmalıdır

Hazırkı əsrdə dövrünün tanınmış fəqihlərindən olan bir alimin nəzəriyyələrini sizin diqqətinizə çatdırdıq. Bu məsələ barəsində daha ətraflı şəkildə məlumat almaq istəyən .kəslər Əllamə Hillinin “Zövcələrin hüququ” adlı risaləsinə müraciət edə bilərlər

cümləsinin ümumi bir qayda və düstur {فَإِمْسَاكٌ بِمَعْرُوفٍ أَوْ تَسْرِيحٌ بِإِحْسَانٍ} ,Diqqət edildiyi kimi olduğu və Quranın da həmin düstura əsasən, zövcələrin hüquq məsələlərini ,tənzimlədiyi məlum olur. İslam dini bu göstərişlərə, xüsusən də

onları əsla incitmək və ziyan vurmaq üçün saxlamayın ki, zülm) {وَلَا تُمْسِكُوهُنَّ ضِرَارًا لِتَعْتَدُوا} etmiş olarsınız) cümləsi ilə təkid etməklə, kişiyə onunla birgə yaşamaq xatirinə deyil, qadının başqası ilə evlənməsinə mane olmaq və ya onu incitmək məqsədilə öz .nikahında saxlamağa heç vaxt icazə vermir

### Digər şahid və dəlillər

Zövcələrin hüquqları“ risaləsində qeyd edilən dəlil və şahidlərdən əlavə, digər çoxlu“ sübutlar da mövcuddur ki, İslamın nəzərində

cümləsinin ümumi bir qayda və düstur olduğunu və – {ـفَإِمْسَـاكٌ بِمَعْرُوفٍ أَوْ تَسْـرِيحٌ بِإِحْسَـانٍـ} hüquqların buna əsasən riayət olunmasının zəruriliyini bildirir. İnsan bu məsələlərin barəsində daha çox

mütaliə etdikcə, İslam dininin nəzərdə tutduğu və müəyyən etdiyi qayda və qanunların .aydın və aşkar olmasını, eyni zamanda, dəqiq və ciddiliyini anlayaraq başa düşür

Üsuli-kafi“ əsərinin beşinci cildi, səhifə beş yüz ikidə imam Sadiqdən (ə) belə bir“ :rəvayət nəql edilmişdir

إذا اراد الرجل ان يتزوج المرأه فليقل:أقررت بال ميثاق الّذى اخذ الله:إمساک بمعروف أو تسريح بلحسان

Yəni, hansısa bir kişi qadınla evlənmək istədiyi zaman, Allahla arasında bağladığı əhdə əsasən, qadınla layiqli və yaxşı rəftar edəcəyinə və lazım gələrsə, ona xoşluqla talaq .verəcəyinə etiraf edir

:Nisa” surəsinin iyirmi birinci ayəsində Allah buyurur“

وَكَيْفَ تَأْخُذُونَهُ وَقَدْ أَفْضَى بَعْضُكُمْ إِلَى بَعْضٍ وَأَخَذْنَ مِنكُم مِّيثَاقًا غَلِيظًا

Onu necə geri alırsınız, halbuki, siz (cismi və ruhi cəhətdən əlaqədə olaraq) bir-birinizə“ “ !yetişmisiniz və onlar sizdən (nikah vasitəsi ilə) möhkəm bir əhd-peyman alıblar

Bütün şiə və sünni təfsirçiləri “möhkəm əhd-peyman” cümləsindəki məqsədin Allahın

{فَإِمْسَاكٌ بِمَعْرُوفٍ أَوْ تَسْرِيحٌ بِإِحْسَانٍ}

cümlə ilə kişilərdən almış olduğu əhd-peyman olmasına və imam Sadiqin (ə) də “Kişilər evləndikləri zaman qadınla layiqli şəkildə davranacaqları və ya onları xoşluqla .boşayacaqları barədə söz verirlər” - dediyi məsələyə işarə edildiyinə etiraf etmişlər

İslam peyğəmbərinin (s) həccətül-vidada (vida həccində) bu barədə söylədiyi sözlər mövcuddur. Həmin sözlər əhli-sünnə və şiə tərəfindən nəql edilmişdir. O həzrət :buyurur

إتّقوا اللّه فى النساءِ،فإنَّكم اخذتموهنَّ بأمانهِ اللهِ واستحللتم فروجهنَّ بكلمهِ اللهِ...

Ey insanlar! Qadınlarla bağlı Allahı nəzərdə tutaraq ondan qorxun. Siz onları Allah“ yanında bir əmanət olaraq qəbul etmiş və onların ismətlərini özünüzə Allah kəlməsi ilə ”.halal etmisiniz

:İbn Əsir “Nəhayə” kitabında aşağıdakı kimi qeyd edir

Peyğəmbərin (s) buyurmuş olduğu cümlələrdə “Allah kəlməsi” kimi qeyd edilən və“ qadınların ismətinin kişilərə halal olmasına səbəb olan sözlərdəki məqsəd Quranda

".cümləsidir - {فَإِمْسَاكٌ بِمَعْرُوفٍ أَوْ تَسْرِيحٌ بِإِحْسَانٍ} bildirilən

**Şeyxut–taifə"nin (Şeyx Tusi) nəzəri"**

Şeyx Tusi "Xilaf" kitabının ikinci cild, səhifə yüz səksən beşdə "cinsi qabiliyyətin olmaması" barədə nəzərini bildirdikdən sonra, kişinin ənin (cinsi qabiliyyətə malik .olmadığı) olmasını qadın bildiyi zaman, ondan boşanma haqqının olmasına işarə edir

Şeyx Tusi bütün fəqihlərin bu məsələ barəsində fikir birliyinə sahib olduğunu bildirir. istinad edirlər, yəni {فَإِمْسَاكٌ بِمَعْرُوفٍ أَوْ تَسْرِيحٌ بِإِحْسَانٍ} Həmçinin, fəqihlər Quranın bu ayəsinə cinsi qabiliyyətə malik olmayan kişi qadının tələbatlarını ödəyə bilmədiyi zaman, onu .(xoşluqla tərk etməlidir (boşamalıdır

Bütün bu deyilənlərdən İslamın kişiyə zorakılıq edərək talaq haqqından sui-istifadə etməsi və qadını bir məhbus kimi saxlamasına icazə vermədiyini çox aydın şəkildə başa düşmək olar. Eyni zamanda, həmin məsələlərdən adını qazı və məhkəmə qoymuş hər hansı bir şəxsin belə vəziyyətlərdə müdaxilə edə bilmək haqqının olması nəticəsinə gəlmək olmaz. Əlbəttə, qazı və hakimin də özünəməxsus çətinlik və vəzifələrinin olmasını biz inkar etmirik, amma hazırda bu mövzu ətrafında bəhs etmək .zamanı deyil

Diqqət etməli olduğumuz digər bir məsələ İslamın məhəkəmə yolu ilə boşanmalarla bağlı nəzərdə tutduğu və ailə məsələlərinə bu qədər əhəmiyyət verdiyi halda, həmin məsələlərin (talaqın) nadir, tək-tük və istisna hallarda baş verməsidir. İslam talaqın Amerika və Avropada olduğu və hər gün bu barədə qəzetlərdən oxuduğumuz kimi, bir formaya düşməsinə əsla razı deyil. Məsələn, həmin ölkələrdə qadın özü əri onun sevdiyi filmi sevmədiyi, onun itini öpmədiyi üçün və s. bu qəbildən olan və məsxərəyə, insanlıq və bəşəriyyətin süqutuna səbəb olan məsələlərlə ərindən məhkəməyə .şikayət edərək ondan boşanmaq tələb edir

Möhtərəm oxucunun deyilən bu məsələlərdən iyirmi birinci

məqalədə söylədiyimiz mətləblər barədə müəyyən mənada anlayış və məlumat əldə etməsinə ümid edirik. Biz həmin məqalədə aşağıdakı tərtiblə talaqla əlaqədar olan beş :nəzəriyyəyə işarə etmişdik

Talaqa əhəmiyyət verilməməsi və onun qarşısını alan bütün əxlaqi və ictimai .۱ .qeydlərin aradan qaldırılması

Katolik kilsəsinin irəli sürdüyü nəzəriyyəyə əsasən, evliliyin əbədi və daimi olması .۲ .barədə ümumi düşüncənin formalaşması

Evlilik və izdivacın qadın tərəfindən deyil, kişi tərəfindən dağıdılmasının mümkün .۳ .olması

Hüquq bərabərliyi iddiaçılarının irəli sürdükləri kişi və qadının hər ikisinin ayrılıq və .۴ boşanma kimi haqlara malik olması və onların bu baxımdan oxşar hüquqlara sahibliyi .ilə bağlı nəzəriyyələr

Talaq qapısı kişinin üzünə açıq olduğu kimi, qadın üçün də bağlı deyil. Amma kişinin .۵ .xaric olmaq üçün nəzərdə tutulan qapısı qadından fərqli şəkildə olaraq iki ədəddir

Həmin məqalədə İslamın beşinci nəzəriyyəni qəbul etdiyini söyləmişdik. Əqdin (kəbin oxunması və nikahın) və məhkəmə vasitəsi ilə həyata keçirilən talaqın şərtləri ilə əlaqədar dediklərimiz məsələlərdən İslamın qadın üçün talaq haqqını təbii şəkildə nəzərdə tutmamasına baxmayaraq, bu məsələni tamamilə onun üzünə bağlamadığı, eyni zamanda, məxsus və xüsusi çıxış qapılarını qadın üçün müəyyən etdiyi aydın və .məlum oldu

Məhkəmə vasitəsi ilə həyata keçirilən talaq və boşanmalar barəsində, xüsusən də, imamlar və digər islami məzhəblərin sahib olduğu etiqad və əqidələri nəzərə aldığımız və islami özlkələrdə ona uyğun şəkildə əməli olaraq yerinə yetirilənləri göz önündə tutduğumuz zaman, bundan daha artıq bəhs etmək mümkündür. Amma biz bu .miqdarda verdiyimiz məlumatın oxucu üçün kifayət etdiyini hesab edirik

## ON BİRİNCİ HİSSƏ

### Qadınların (zövcələrin) sayı

Bir qadına sahib olmaq evlilik və izdivacın ən təbii forma və qaydasını təşkil edir. Bir qadına malik olmaqla insan ruhu xüsusi bir şəkildə, yəni xüsusi və fərdi mülkiyyət sahibi bir malik kimi – əlbəttə, xüsusi mülkiyyətdə sərvət də fərqlərə malikdir – hökmranlıq edir. Belə məsələlərdə kişi və qadının hər biri hiss, duyğu və digər cinsi münasibətlərdən əldə edilən mənafeləri sadəcə və sadəcə özünə aid və şəxsən, .özlərinin malı hesab edir

Bir qadına malik olmağın müqabilində bir neçə qadına sahib olmaq və ya qadınların müştərək şəkildə bir kişiyə sahibliyi dayanır. Biz bu məsələni müxtəlif formada .təsəvvür edə bilərik

### Cinsi kommunizm

Həmin formalardan biri məxsusluq və aidliyin tərəflərdən heç birinə şamil olmamasıdır, yəni nə qadın müəyyən bir kişiyə məxsusdur, nə də kişi hansısa bir qadına qarşı müəyyən aidiliyə malikdir. Bu təsəvvür və forma cinsi kommunizm adlandırılır. Cinsi kommunizm ailə həyatının inkar və ziddinə bərabər olan bir .məsələdir

Tarix və hətta, eradan əvvələ aid olan fərziyyələr də bəşər cəmiyyətinin ailə həyatına malik olmadan həyat sürdüyü və cinsi kommunizmin ona hakim olduğu bir dövrün olmasını nişan verərək göstərmişdir. Bəzi kəslər belə halların fəqət vəhşi və

yarımailəvi həyat tərzi sürən qəbilələr arasında mövcud olduğunu da iddia etmişlər. Yəni, onun yarımailəvi həyat tərzi və cinsi kommunizm arasında ortaq bir mövqe .tutduğunu demişlər

Qədimdə bir neçə qardaşın müştərək olaraq bir neçə bacı ilə və ya bir tayfadan olan müəyyən saydakı kişilərin digər tayfadan olan müəyyən qadınlarla şərikli (müştərək) .şəkildə evləndikləri də söylənilmişdir

Vil Dorant məşhur əsəri olan "Sivilizasiya tarixi" adlı əsərinin altmışıncı səhifəsində belə :yazır

Bəzi məntəqələrdə evlilik toplu və cəm halında həyata keçirilirdi. Yəni, hansısa bir" tayfadan olan kişilər müştərək şəkildə digər tayfadan olan qadınlarla evlənirdilər. Tibet ərazisində belə bir adət var idi ki, bir neçə qardaş, digər tayfadan olan bir neçə bacı ilə evlənirdi və bacılardan hansının hansı qardaşla evləndiyi məlum deyildi və bu, bir növ, cinsi kommunizm idi, eyni zamanda, qardaşlardan hər hansı biri istədiyi bacı ilə cinsi münasibətə girə bilirdi. Yuli Sezar da qədimdə İngiltərədə mövcud olan belə oxşar bir adətə işarə etmişdir. Həmin hadisələrin - qardaş öldükdən sonra onun qadını ilə evlənməyin - qalıqlarını yəhudi və digər qədim qəbilələr arasında yayıldığını diqqətə ".çatdırmaq lazımdır

## Platon nəzəriyyəsi

Platonun "Cumhuiyyət" adlı əsərindən başa düşüldüyü və əksər tarixçilərin də təsdiqlədiyi kimi, Platon özünün "Hakim filosoflar və filosof hakimlər" nəzəriyyəsinə əsasən, bu təbəqədən olanlara ailə müştərəkliyi təklifini irəli sürür. On doqquzuncu əsrdə bəzi kommunizm rəhbərlərinin də həmin təklifi qəbul edərək irəli sürdükləri məlumdur. Amma "Freyd və məhrəmlərlə (ana, bacı və s. kimi) evliliyin qadağan olunması" əsərinin kommunist ölkələrdə ticarəti və geniş şəkildə yayılması sayəsində ١٩٣٨-ci ildə bir sıra güclü kommunist ölkələr "bir qadınla evlənmək"lə bağlı qanunu .rəsmi olaraq tanıdılar

Evliliyin digər bir forması bir neçə ərə sahib olmaqdır. Yəni, qadın eyni zamanda birdən artıq ərə malikdir. Vil Dorant belə deyir: “Belə məsələlər Tibetdə məskunlaşan bəzi “ .qəbilələr arasında müşahidə edilmişdir

Səhih-Buxari” kitabında Ayişədən belə nəql edilir: “Cahiliyyət dövründə ərəblər“ arasında dörd növ evlilik forması mövcud olmuşdur. Onlardan biri bizim dövrümüzdə məşhur olan qızın atasına elçi gedərək qızı istəmək və mehriyyə təyin edildikdən sonra kişinin onunla evlənməsi idi və belə hallarda uşaq dünyaya gələrdisə, onun atası bilinir və müəyyən edilirdi. Digər növdən olan evlilik bir kişinin özünə yaxşı övlad əldə etmək üçün öz arvadını müəyyən müddət cinsi yaxınlıq etməsinə görə, başqa bir kişinin ixtiyarında qoyması şəklində idi. Həmin şəxs öz qadınından müəyyən müddət uzaq gəzir və qadını digər bir şəxsdən hamilə qalana qədər ona yaxın getmirdi. Öz qadınının hamilə olduğunu bildikdən sonra, onunla cinsi münasibətə girirdi. Bu məsələ kişilərin nəsil artımı baxımından, digər şəxslərin onlardan üstün olduğunu düşündükləri zamanlar həyata keçirilirdi. Həqiqətdə, belə işlər nəsilin sağlamlaşdırılması və irqin .təmizlənməsi üçün yerinə yetirilirdi

Bu evliliyi onlar “istibza nikahı” adlandırırdılar. Həmin zamanlarda mövcud olan evliliyin başqa bir növü belə idi: “Sayı on nəfərdən az olmayan bir qrup hansısa bir qadınla müştərək şəkildə evlənir və onunla yaxınlıq edirdilər. Qadın uşağa qaldıqdan və övladını dünyaya gətirdikdən sonra, həmin dövrün adətinə uyğun olaraq qadın o on nəfəri hüzuruna çağırır və onlar da gəlirdilər. Sonra qadın öz istək və meylinə əsasən, kişilərdən birini öz övladının atası ünvanında digərlərinə tanıtdırır və həmin şəxs uşağın atası kimi tanınırdı. Onu da qeyd edək ki, həmin kişi uşağın məsuliyyətini boynuna götürməkdən imtina edə bilməzdi. Bu minvalla, qadın tərəfindən müəyyən ”.edilən kişi uşağın rəsmi və qanuni atası hesab edilirdi

Dördüncü növdən olan evlilikdə qadın “ bayraqdar” idi və heç bir istisna olamdan o, istənilən kişi ilə cinsi rabitə və

münasibətə girə bilərdi. Bir qayda olaraq, belə qadınlar evlərinin damına bayraq sancır və bu yolla digər qadınlardan seçilirdilər. Həmin qadın cinsi rabitədə olduğu kişiləri uşağı dünyaya gəldiyi zaman bir araya toplayır və kahin, həmçinin, bizim zamanımıza uyğun bir ifadə və terminlə desək, antropoloq (insanın fizionomiyasına əsasən, onun kimliyini müəyyən edə bilən mütəxəssis) çağıraraq uşağın kimə mənsub olduğunun müəyyən edilməsinə çalışırdı. O şəxs də uşağın görünüş və qiyafəsindən hansısa kişiyə məxsus olduğunu bildirsəydi, həmin şəxs məcburən bununla razılaşaraq uşağın .rəsmi və qanuni şəkildə valideyni olduğunu təsdiqləyirdi

Cahiliyyət dövründə sadalanan bütün bu evlilik növləri var idi və Allah-taala Məhəmmədi (s) peyğəmbərliyə seçərək həmin evlilikdən yalnız zəmanəmizdə yayılmış ".olanını (bir qadına sahib olmaq) saxlamış və digər evlilik növlərini aradan qaldırmışdı

Dediklərimizdən cahiliyyət dövründə bir neçə kişiyə sahib olan qadınların (evliliyin) var .olduğu məlum oldu

Montesko "Qanunların ruhu" adlı əsərində yazır: "Ərəb səyyahı olan Əbu Züheyr Əl-Həsən doqquzuncu əsrdə Hindistan və Çinə səyahət edərək bu adətin (bir neçə ərə sahib olmaq) olduğunu orada da müşahidə etmişdir. Əbu Züheyr həmin məsələni fahişəliyə dəlil gətirmişdir." Montesko bunun ardınca belə yazır: "Malabar sahillərində Nair adlı bir qəbilə yaşayır. Bu qəbilənin kişiləri qadınları özlərinə bir neçə kişi seçə bildikləri halda, birdən artıq qadınla evlənə bilməzlər. Mənim nəzərimcə, belə bir qanunun həmin qəbilə arasında mövcud olmasına səbəb, bu qəbilənin döyüşkən olmasıdır və evlilik və qadına bağlılıq onların müharibə və döyüşçülük ruhunu aradan aparmasın deyə, belə bir qanun yaradılmışdır. Eyni zamanda, Avropada da biz əsgərlərin döyüş ruhunun məhv olmaması və döyüşə meyillərini azalmaması üçün evlənməsinə mane olduğumuz kimi, Nair qəbiləsi də həmin məsələ səbəbi ilə kişilərin ailəyə bağlılığına imkan daxilində mane olmağa çalışmışlar. Ab-havanın təsiri ilə onlar evliliyin qarşısını tamamilə ala bilmədiklərindən, bir neçə kişinin bir qadına sahib ".olmasına icazə vermişlər ki, bu yolla onlarda döyüş ruhiyyəsi ölməsin

## Bir neçə kişiyə sahib olmağa tutulan iradlar

Bu cür evliliyin əmələ gətirdiyi iradlar onun yayılması və əməldə müvəffəqiyyət qazanmasına mane olmuşdur. Həmin irad nəsil-nəcabətlə bağlı olan səhv və iraddır. Cinsi kommunizmdə olduğu kimi, bu şəkildə olan evliliklərdə ata və övladlar arasında mövcud münasibətlər müəyyən edilmiş deyil. Cinsi kommunizm cəmiyyətdə özünə yer tutuduğu kimi, bir neçə ərə sahib olmaq da cəmiyyətdə gerçəkləşə bilmiş və müəyyən .bir insanlar tərəfindən qəbul edilmişdir

Əvvəlki məqalələrdə gələcək nəslin ailə həyatının qurulması və keşmiş və gələcək nəsil arasında qırılmaz münasibət və irtibatların yaradılması ilə əlaqədar səy və təlaş etməyin insan təbiətinin instinktiv istəyinə əsaslandığını nəzərinizə çatdırmışdıq. Bəzən və istisna hallarda insan qəbilələri və bəzi tayfalar arasında bir neçə ərə sahib olmaq məsələsinin meydana çıxması kişilərin bir qadınla yaşamaq və ailə qurmağa təbii baxımdan razı olmamasına dəlil ola bilməz. Bir dəstə kişi və ya qadınlar tərəfindən ailə qurulmasına meyil və istəyin olmaması inhiraf və azğınlığa səbəb olduğu üçün biz .onu insanların təbii baxımdan evliliyi istəməməsinə dəlil gətirə bilmərik

Bir neçə ərə sahib olmaq kişilərin inhisarçılıq tələbi və övlad sevgisi ilə müxalif olması .ilə yanaşı, qadınların da təbiət və fitrəti ilə ziddiyyət təşkil edir

Psixoloji tədqiqat və araşdırmaların nəticəsində qadınların kişilərdən daha çox bir ərə .sahib olmaq istəmələri müəyyən edilmişdir

## Qadınların (zövcələrin) sayı

Bir neçə ərə sahib olmağın digər növ və şəkili bir neçə qadın olması və ya qadınların sayca çoxluq təşkil etməsidir. Bir neçə qadına sahib olmaq və çoxarvadlılıq bir neçə ərə (kişiyə) sahib olmaqdan daha artıq yayılmış və müvəffəqiyyət əldə etmişdir. Həmin məsələ təkcə vəhşi qəbilələr arasında deyil, bəzi mədəni millətlər arasında da müşahidə edilmişdir. Cahiliyyət ərəblərindən başqa, yəhudi qövmü və Sasanilər

zamanı İran xalqı, həmçinin, bəzi digər millətlər arasında da bu qanun və adətlər .mövcud olmuşdur

Montesko yazır ki, Malaziya qanunlarında üç qadınla evlənməyə icazə verilirdi. Eyni zamanda, o, sözlərinə belə davam edir: "Roma imperatoru Valentin xüsusi səbəb və dəlillərə əsasən, kişilərə bir neçə qadınla evlənməyə icazə vermişdi. Amma bu qanun Avropanın şərait və ab-havası ilə uyğun və münasib gəlmədiyindən, Teodor, ".Akardiyus və Monoriyus kimi digər Roma imperatorları tərəfindən ləğv edilmişdir

**İslam və qadınların (zövcələrin) sayı**

İslam bir neçə ərə sahib olmanın ziddinə olaraq bir neçə qadına sahib olmağı tamamilə ləğv və onu qadağan etməmiş, əksinə onu qeydli və şərtli, həmçinin, məhdud etmişdir. Yəni, bir tərəfdən məhdudiyyəti aradan qaldıraraq onun üçün ən çoxu (maksimum) dörd qadını nəzərdə tutdu və bir tərəfdən də onu şərt və qeydli edərək hər bir kəsə bu .sayda qadınla evlənməsinə icazə vermədi

Gələcək bəhslərimizdə həmin şərt və qeydlər, eyni zamanda, İslamın bir neçə qadınla .evlənməyi nə üçün tamaimilə ləğv etmədiyi barədə söhbət edəcəyik

İnsanda təəccüb doğuracaq məsələ orta əsrlərdə İslamın əleyhinə təbliğat aparılaraq ilk dəfə İslam peyğəmbərinin (s) dünyada qadınların say çoxluğu ilə bağlı ixtira etdiyini söyləmələri olmuşdur. Bundan əlavə, onlar İslamın belə sürətlə yayılmasına səbəb kimi müsəlmanların müxtəlif millətlər və çoxlu sayda qadınlarla evlənməsi məsələsini iddia etmişlər. Həmçinin, Şərqdə dəyişikliklərin baş verməsini qadınların say çoxluğu .ilə əlaqələndirmişlər

Vil Dorant "Sivilizasiya tarixi" əsərinin altmış birinci səhifəsində yazır: "Orta əsrlərdə din alimləri qadınların (zövcələrin) say çoxluğunun İslam peyğəmbərinin (s) gətirdiyi bir yenilik olduğunu təsəvvür edirdilər. Həqiqətdə isə belə deyil və ibtidai icma quruluşu zamanında daha çox qadınların bir neçə ərə sahib olması bizə məlum oldu. İbtidai icma quruluşunda (ibtidai cəmiyyətdə) zövcələrin sayının çoxluğuna səbəb olan amillər .həddən artıqdır

Kişilərin döyüş, müharibə və ovçuluqla məşğul olmaları onların həyatının daha çox təhlükədə olmasına gətirib çıxarırdı və qadınlara nisbətdə daha tez tələf olurdular. Bu cür amillər qadınların sayca çoxluğuna səbəb olurdu və kişilər ya daha çox qadınla evlənməli idilər, ya da qadınların əksəriyyəti ərsiz həyat sürmək məcburiyyətində qalmalı idi. Ölüm hadisələrinin çox baş verdiyi millətlərdə bir dəstə qadının ərsiz qalaraq nəsil artırılması məsələlərindən uzaq düşməsi bəyənilmirdi. Şübhəsiz ki, ibtidai icma quruluşunda kişilərin çoxlu sayda qadına sahib olması həmin zamanla uyğun və .münasib idi, çünki qadınlar kişilərdən sayca üstünlük təşkil edirdilər

Nəsilin sağlamlaşdırılması baxımından da, çoxlu ərə sahib olmaq bir ərə sahib olmaqdan üstün tutulurdu. Aydın məsələdir ki, yeni eradakı bəzi qüdrətli kişilər gec evlənir və qadını ilə uşağa sahib olmaq məsələsi baxımından gec razılığa gəlirdilər. Amma keçmiş zamanda belə kişilər ən yaxşı qadınlara malik olur və onlardan çoxlu övladlar dünyaya gəlirdi. Həmin səbəbə əsaslanaraq bir sıra millətlər arasında çoxarvadlılığın son zamanlara qədər davam edərək gəlib çıxmasını deyə bilərik. Sadəcə bizim əsrimizdə bu məsələlər get-gedə azalmağa və haradasa, ortadan qalxmağa başlamışdır. Bu adət və ənənənin aradan qalxmasına bir neçə amil səbəb :olmuşdur. Həmin amillər bunlardır

Əkinçiliyin inkişaf etməsi ilə insanların, xüsusən də, kişilərin itki və tələfatların az baş verməsi və onların qadınlarla sayca bərabər səviyyəyə gəlməsi, eyni zamanda, bir neçə zövcəyə sahib olmaq, hətta, ibtidai icma quruluşunda olsa belə, imkanlılara məxsus bir imtiyaz hesab olunmağa başlaması və həmin cəhətdən kişilərin ”.əksəriyyətinin bir qadınla kifayətlənməsi və onun əvəzinə zinaya əl atmaları

Qustav Levbon “Sivilizasiya (mədəniyyət) tarixi” əsərinin beş yüz yeddinci səhifəsində :yazır

Avropada Şərqdəki adətlərdən heç biri çoxarvadlılıq qədər pis tanıtdırılmamış və bu“ adətlə bağlı olduğu kimi, Avropa bu qədər xətaya yol verməmişdir. Avropa yazıçıları çoxarvadlılığın İslam dininin təməllərindən birini təşkil etdiyini hesab etmiş və

İslam dininin yayılması, şərqlilərin tənəzzül və dəyişikliyə uğraması baxımından onu “səbəblərin səbəbi” adlandırmışlar. Bundan əlavə, onlar etiraz etməklə yanaşı, şərqli qadınların halına acıyaraq onların vəziyyətinə üzülür və sarayların dörd divarı arasında xacələrin nəzarəti altında qaldıqlarını deyirdilər. Həmçinin, əgər onların razılıqlarının əleyhinə hansısa bir addım atılardısa, onlara əziyyət verərək qəddarcasına edam da edə bilərdilər. Şərq qadınları barəsindəki bu cür təsəvvürə malik olmağın heç bir .sənədli və dəlilə istinad edən əsası mövcud deyil

Əgər avropalılar yersiz olan təəssübkeşliklərini özlərindən kənarlaşdıraraq məsələyə bir qədər diqqətli yanaşsalar, onda, çoxlu sayda zövcəyə sahib olmanın Şərqdə ümdə və başlıca bir adət-ənənə olduğunu, Şərqdə qadına daha çox ehtiram və hörmət edilməsi, eyni zamanda, əxlaqi baxımdan da şərqlilərin tərəqqi etməsini, ailə daxilindəki münasibətlərin möhkəmlənməsinə səbəb olmasını, bir sözlə, Avropaya .nisbətdə Şərqdəki qadınlara daha artıq hörmətlə yanaşılmasını təsdiq edəcəklər

Biz bəhsimizə başlamazdan öncə, çoxarvadlılıq məsələsinin İslamla heç bir bağlılığının olmadığını möhtərəm oxucuların diqqətinə çatdırmağı zəruri hesab edirik. Çünki bu adət və ənənələr İslamdan qabaq da ərəb, Şərqdə yaşayan yəhudi qövmləri, iranlı və .s. xalqlar arasında geniş yayılmış idi

Şərqdə yaşayan qövm və tayfalar İslamı qəbul etdiyi zaman, bu adətlərdən onlar üçün hansısa bir fayda və mənfəət hasil olmadı, həmçinin, indiyə qədər dünyada hansısa qüdrətli bir din belə adətləri, yəni çoxarvadlılığı nə irəli sürməyə, nə də onun aradan qalxmasına göstəriş verə bilmişdir. Barəsində söhbət etdiyimiz adətlər din tərəfindən deyil, Şərq mühit və irqi xüsusiyyətləri, digər səbəb və məsələlər nəticəsində və Şərq həyat tərzi ilə əlaqədar yaranaraq meydana gəlmişdir. Deyilən xüsusiyyətlərin Qərb mühit və təbiəti ilə uyğun gəlməməsinə baxmayaraq, bir zövcəyə sahib olmaq orada adət formasını almışdır. Halbuki, biz həmin məsələlərin sadəcə qanun kitablarında dərc olunduğunun şahidi oluruq və onların rəftar və həyat tərzi deyilənlərin əksini göstərir. Mən həqiqətdə, Şərqdə

şəri şəkildə mövcud olan çoxarvadlılığın Qərbdəki bir zövcəyə sahib olmaqdan hansı əskikliyi və naqisliyinin olması barədə təəccüb edirəm. Əksinə, mən bütün cəhətdən çoxarvadlılığı dəstəkləyirəm. Şərqlilər bizim böyük şəhərlərimizə səyahət etdikləri “ ...zaman, bizim həyat tərzimizi gördükləri üçün, etirazlarımıza çox təəccüblənirlər

Bəli, çoxarvadlılıq məsələsini İslam ixtira etməmişdir, əksinə onu bir tərəfdən məhdudlaşdırmış, digər tərəfdən də onu ən son həddə (dörd ədədə) çatdırmışdır. Eyni zamanda, həmin məsələ ilə əlaqədar ağır şərt və qeydləri nəzərədə tutmuşdur. Adətən, İslamı qəbul edən millət və qövmlər öncədən həmin ənənələrə sahib idilər və İslamı qəbul etməklə də onun irəli sürdüyü şərt və qeydləri qəbul etmək .məcburiyyətində qaldılar

### İranda çoxarvadlılıq

Kristin Sin “İran Sasanilər zamanında” əsərinin üç yüz qırx altıncı səhifəsində belə yazır: “İranda Sasanilər zamanında çoxarvadlılıq ailə təşkilinin əsası hesab edilirdi. Qadınların sayının az və ya çox olması kişilərin qüdrətinin (maddi və fiziki) olub-olmamasına bağlı idi. Bir qayda olaraq, cinsi baxımdan zəiflikləri olan kişilər birdən artıq qadına sahib olmurdular. Ailə başçısı hökumət tərəfindən təmin edilirdi. Qadınlardan biri kamilən hüquq sahibi olurdu və onu “seçilmiş qadın” adlandırırdılar. Səviyyə baxımından ondan aşağı olan qadın “xidmətçi qadın” adlandırırdılar. Bu iki qadının (zövcənin) qanuni hüquqları da müxtəlif və bir-birindən fərqli şəkildə idi. Adətən, qızıl alveri ilə məşğul və əsir olan qadınlar “xidmətçi qadın” təbəqəsindən sayılırdı. Seçilmiş qadınların bir kişiyə aid olub-olmadığı bizə məlum deyil. Amma hüquqi məsələlərdə bir kişinin iki seçilmiş qadına sahib olduğu barədə söhbətlər edilmişdir. Həmin qadınlardan “evinin xanımı” adı ilə danışılırdı və guya, onların ayrıca .evləri vardı. Kişi öz seçilmiş qadınını təmin və onu müdafiə etməklə vəzifəli idi

Bütün kişilər həddi-büluğ və yetkinlik çağı, qadınlar da evlilik yaşına qədər bu hüquqlara malik idilər. Amma xidmətçi

qadınlar adlanan zövcələr oğlan uşağı dünyaya gətirdikləri zaman, fəqət həmin uşaq ”.ata tərəfindən qəbul edilirdi

Mərhum Səid Nəfisinin yazmış olduğu “Sasanilərin süqutundan tutmuş Əməvilərin süqutuna qədər İran cəmiyyətinin tarixi” adlı əsərində bu cümləleri qeyd edir: “Kişinin ala (evlənə) bildiyi qadınların sayında heç bir məhdudiyyət yox idi və bəzi Yunan ”.sənədlərində bir kişinin evində yüzlərlə qadının olduğu qələmə alınmışdır

Montesko “Qanunların ruhu” əsərində Roma tarixçisi Akatyasdan belə nəql edir: “Yustinyan zamanında məsihilər tərəfindən təhqirlərə məruz qalmış Roma filosoflarından bir neçə nəfər məsihi dinini qəbul etmək istəmədiklərindən Romanı tərk edərək İran padşahı Xosrov Pərvizə pənah gətirmişlər. Xosrof Pərvizin sarayında təkcə çoxarvadlılığı müşahidə etmək deyil, kişilərin digər qadınlarla da cinsi ”.münasibətə girmələri onların təəccüb və heyrətinə səbəb olmuşdur

Nəzərinizə çatdırırq ki, Roma filosofları Xosrov Pərvizin sarayına deyil, Ənuşirəvanın qəsrinə pənah gətirmişlər. Montesko hökmdarların adları ilə bağlı məsələdə səhv və .xətaya yol vermişdir

Ərəblər arasında zövcələrin sayı heç bir hədd və hüdud tanımırdı. İslam dini zövcələrin sayını məhdudlaşdırmaqla onu dördə endirdi və İslamın nəzərində dörddən artıq qadına sahib olmaq düzgün hesab edilmirdi. Kişilər arasında ona yaxın qadına sahib olanları da var idi və onlar İslam dinin göstərişinə əsasən, altı qadını boşamaq .məcburiyyətində qaldılar

Beləliklə, çoxarvadlılıq məsələsini İslamın kəşf və ixtira etmədiyi, əksinə onu tamamilə aradan qaldırmayaraq məhdud çərçivəyə saldığı və müəyyən qeyd və şərtləri təyin etdiyi məlum oldu. Gələn bəhslərdə çoxarvadlılıq məsələsinin meydana çıxmasına .səbəb olan amilləri araşdıracağıq

Görəsən, kişilərin qolu zorlu olması, yoxsa, müəyyən zəruri halların yaranması həmin məsələlərin meydana çıxmasına səbəb olmuşdurmu? Həmin zəruri məsələlər nələrdən ibarətdir? Görəsən, fiziki-coğrafi və geoloji amillər, yoxsa, digər xüsusiyyətlər onun yaranmasına səbəb olmuşdur? Uzun sözün

qısası, nə üçün İslam o adət və ənənəni ləğv etməmişdir? İslamın həmin məsələ barəsində nəzərdə tutduğu qeyd və şərtlər nələrdir? Eyni zamanda, günümüzdə istər kişi olsun, istərsə də qadın, bəşərin çoxarvadlılıqna qarşı çıxmasına səbəb nədir? Görəsən, işin içində əxlaqi və insani, yaxud digər xüsusiyyətlərmi mövcuddur? Bütün .bunlar gələcək bəhslərdə bəyan edəcəyimiz mətləblərdir

**(Çoxarvadlılığın tarixi səbəbləri (١**

Çoxarvadlılıqnun tarixi və ictimai səbəbləri nələrdir? Nə üçün dünya millətlərinin əksəriyyəti, xüsusən də, Şərq xalqları bu sünnə və adət-ənənəni qəbul etmiş və Qərb xalqları kimi bəzi millətlər isə həmin ənənələri heç vaxt qəbul etməmişlər? Nəyə görə bir necə ərə sahib olmanın üçlük təşkil edən forma və şəkilləri arasından çox ərə sahib olmaq və bəzən əməli olaraq həyata keçirilməyən və ya çox nadir və tək-tük halda gerçəkləşərək istisna bir hal kimi qiymətləndirilən cinsi müştərəkliyə müxalif və zidd ?olan sadəcə bir neçə zövcəyə sahib olmaq məsələsi qəbul edilmişdir

Bu səbəblər barəsində araşdırma və tədqiqat aparmasaq, nə İslamın nəzərindən çoxarvadlılıq məsələsini bəhs edə, nə də həmin məsələni bəşərin bugünkü ehtiyacının .olması baxımından diqqət mərkəzində sxlaya bilmərik

Əgər mövcud olan əksər psixoloji və ictimai amilləri nəzər və diqqətimizdən kənarlaşdırsaq və bir sıra yazıçılar kimi səthi təfəkkür edib düşünsək, bizim üçün çoxarvadlılığın tarixi və ictimai səbəblərini izah və bəyan etməyimiz üçün, bu zəminədəki məsələlərlə bağlı barəsində daimi olaraq danışılan və məşhur olan məsələləri təkrar etməyimizə və "çoxarvadlılığın səbəbləri çox aydın məsələdir, onun səbəbi kişilərin qoluzorluluğu, qadınlar üzərindəki hakimiyyəti və onların qul və kəniz, .yəni - ata şahlığın (Patriarxat) - olmasıdır." - deməyimizə kifayət edər

Kişi qadın üzərində hakimiyyət və təsirə malik olduğu üçün, adət və qanunları öz xeyrinə dövr elətdirmiş və beləliklə, çoxlu

sayda zövcəyə sahib olmağı qadının əleyhi və öz mənfəətinə əsasən, əsrlərlə qayda halına salmışdır. Eyni zamanda, qadın kişidən asılı və qüdrətə malik olmadığına görə, .bir neçə ərə sahib olmaq kimi həmin məsələdən yaxa qurtara bilməmişdir

Əsrimiz kişinin qoluzorlu olmasının sona yetdiyi bir əsr olduğu üçün, bir neçə zövcəyə sahiblik kimi imtiyaz və xüsusiyyətlər, digər yanlış və səhv imtiyazlar timsalındakı kimi, öz yerini kişi və qadının eyni və bərabər hüquqlarına vermişdir. Əgər biz bu şəkildə .düşünsək, çox naşı və səthi olaraq təfəkkür etmişik

Çoxlu sayda zövcəyə malik olmağın geniş şəkildə yayılması səbəbi nə kişinin qoluzorluluğu, nə qadının bir neçə ərə sahib olmasının zəifləyərək aradan qalxması və onların məhkumiyyəti, nə də günümüzdə zövcələrin sayının kişilərin qüdrətinin sona yetməsi məsələsidir. Eyni zamanda, bizim dövrümüzdəki kişilər zövcələrinin sayını azaltmaqla, həmin imtiyazlarını həqiqətdə, əllərindən vermirlər, əksinə onlar .qadınların əleyhinə və öz xeyirlərinə əsaslanan bir imtiyaz əldə edirlər

Mən güc və qüdrətin bəşər tarixinin dəyişdirilməsində təsirli olan amillərdən biri olmadığını deyərək onu inkar etmirəm. Həmçinin, kişilərin də öz qüdrətlərindən tarixlər boyu qadınların əleyhinə sui-istifadə etmədiyini demirəm. Amma mən amillərin güc və qüdrətlə (qoluzorluluqla) əlaqələndirilməsinin - xüsusən də, kişi və qadının ailə münasibətlərinin izah və bəyan edilməsi məsələsində - dar düşüncəlik olmasına etiqad .bəsləyirəm

Əgər yuxarıdakı nəzəriyyənin düzgün olduğunu desək, onda, məcburi şəkildə ərəblərin cahiliyyət dövründə və ya Monteskonun sözlərinə istinadən, Malabar sahillərində yaşayan Nair qəbiləsi arasında qadınların çoxlu sayda ərə malik olmasının adət halını aldığı zamanlardakı kimi, nadir və istisna olaraq qadınların çoxlu ərə sahib olduğu vaxtların qadının imkan və fürsət tapa və kişilərin əleyhinə qüdrət əldə edərək ərin say çoxluğunu onlara (kişilərə) qəbul etdirə bildiyini və bu dövrlərin qadınlar üçün “qızıl əsr” olduğunu qəbul etməliyik. Halbuki, biz ərəb cahiliyyət dövrünün qadın həyatı .üçün tarixin ən qaranlıq və siyah dövrlərindən biri olduğunu bilirik

Əvvəlki məqaləmizdə Monteskoya istinad edərək Nair qəbiləsi arasında yayılmış olan çoxarvadlılıq məsələsinin qüdrət və qadına ehtiramla əlaqədar olmadığını nəql etmişdik. Bu məsələnin geniş yayılmasına səbəb döyüşçü və əsgərləri ailə münasibətlərindən kənar saxlamaq və onlardakı döyüş ruhunun qorunub mühafizə .edilməsi üçün cəmiyyətin belə bir qərara gəlməsi məsələsidir

Bundan əlavə, əgər çoxarvadlılıq məsələsinin səbəbi "Patriarxat" (ata şahlıq) və atanın aparıcı rola malik olmasından qaynaqlanırsa, onda, nə üçün Qərb millətləri arasında yayılmamışdır? Görəsən, "Patriarxat" (ata şahlıq) təkcə Şərqə məxsusdurmu? Qərblilər yəni bu qədər İsa (ə) və Məryəm (ə) tərəfdarı (məsihilikdə düz) olmuş və elə ibtidai zamanlardan qadın üçün kişiyə nisbətdə bərabər və müsavi hüquqları nəzərdə tutmuşlarmı? Yəni, təkcə şərqlilər arasında qüdrət amili kişilərin xeyrinə fəaliyyət ?göstərmiş və qərblilərdə bu amil ədalət məsələlərinə sərf olunmuşdurmu

Qərbli qadınlar yarım əsr əvvələ qədər dünyanın ən bədbəxt qadını idi. Hətta, onlar öz malları ilə bağlı ərlərinin qəyyumluğuna möhtac olmuşlar. Qərblilərin öz etirafına əsasən, şərqli qadınlar orta əsrlərdə qərbli qadınlara nisbətdə daha yaxşı vəziyyət və .şəraitə malik olmuşlar

Qustav Lobon belə yazır: "İslam mədəniyyəti zamanında Əynan ərazisində qadınlar üçün nəzərdə tutulan imtiyaz, məqam və dərəcələr Avropada uzun illər sonra qadınlara verilmişdir. Yəni, Əndəlisdə ərəblərin qəhrəmancasına rəftarları Avropanı həmin məsələdə ötüb keçdi. Avropa əhalisi arasında qəhrəmanlıq əxlaqi keyfiyyətləri - onun bir qismi qadınlarla rəftar etməklə bağlı idi - müsəlmanlara təqlid etmək yolu ilə yayılmışdı. Eyni zamanda, əhli-sünnənin düşündüyü kimi, qadınlara alçaqlıq və rəzillikdən nicat verərək onları əziz və izzətli edən bir din məsihilik dini deyil, fəqət İslam dini olmuşdur. Beləliklə, orta əsrlərdə bizim başçı və sərkərdələrimiz məsihi olmalarına baxmayaraq, qadınların ehtiram və hörmətini lazımı miqdarda .gözləmirdilər

Tarixin tədqiq və araşdırmasına əsasən də, müsəlmanların

qadına ehtiram və hörmət qoyulmasına riayət etməyi bizim sələflərimizə öyrətdikləri zaman, onların (sələflərimizin) həmin yolu vəhşiliklə seyri-süluk edərək keçdiklərini ”...bilirik və bu mətləb barədə heç bir şübhəyə yer qalmır

Başqaları da Qərbdə orta əsrlərdə mövcud olan vəziyyət və şəraiti bu şəkildə vəsf və təsfir etmişlər. Orta əsrlərdə Avropada “Patriarxat” (ata şahlıq), qüdrət və kişilərin ən yüksək həddə qadınlar üzərində hökmranlığının - bütün bu xüsusiyyət və halların ?mövcud olmasına baxmayaraq, nə üçün çoxarvadlılıq məsələsi orada yayılmamışdır

Həqiqət budur ki, bir neçə ərə sahib olmaq nə qadınların qüdrət və fürsətə malik olması, nə həmin məsələnin ortadan qalxması qadınların zəifliyi və qüdrətlərinin əllərindən alınması səbəbi ilə, nə Şərqdə çoxarvadlılıq kişilərin qoluzorlu, qüdrətli və qadınlar üzərindəki hakimiyyəti, nə də Qərbdə bu məsələnin (çoxarvadlılığın) həyata keçirilməməsi qüdrət və kişi ilə qadınların bərabər hüquqlara malik olması ilə .gerçəkləşməmişdir

## Qadınların bir neçə ərə sahib olmasının müvəffəqiyyətsizliyi

Bir neçə ərə sahib olmaq məsələsinin ortadan qalxması və müvəffəqiyyətsizliyinin səbəbi həmin məsələnin nə kişi, nə də qadın təbiəti ilə uyğun gəlməməsi idi. Bu məsələ ilkin olaraq kişilərin inhisarçılıq tələb etməsi və atalıq məsələsinin müəyyən edilməsi ilə ziddiyyət təşkil edirdi. Övlada məhəbbət göstərilməsi bəşərin fitri (instinktiv) və təbii olan xüsusiyyətlərindəndir. Bəşər təbii olaraq, nəsil artırmaq və övladın dünyaya gəlməsini və keçmiş və gələcək nəsillər arasındakı münasibətlərin (rabitələrin) müşəxxəs və müəyyən, əmin və etibarlı olmasını istəyir. Yəni, insanlar hansı atanın övladı və hansı övladın atası olduğunu bilmək istəyir. Bir neçə ərə sahib olmaq məsələsi insanın fitri və təbii olan xüsusiyyətləri ilə ziddiyyət və fərqlilik təşkil edir. Kişinin bir neçə qadına sahib olmasından fərli olaraq, bu məsələ həmin cəhətdən .sadəcə kişiyə zərbə vurur, nəinki, qadına

Bir dəstə qadının (təqribən, qırx nəfərə yaxın) bir yerə toplaşaraq Əli ibn Əbu Talibin :(ə) yanına gəldiyini və belə dediklərini nəql edirlər

Nə üçün İslam dini kişilərə bir neçə qadınla evlənməyə icazə vermiş, amma qadınların“ bir neçə ərə sahib olmasını qadağan etmişdir? Görəsən, bu məsələ ayrı-seçkiliyə səbəb deyilmi?” Həzrət Əli (ə) onların hər biri üçün bir qabda su gətizdirərək qabı onlara verir. Sonra onlara məclisin ortasında qoyulmuş böyük və içi boş bir qaba əllərində olan qabdakı suyu boşaltmalarını söyləyir. O həzrətin göstərişinə əməl edilir. Sonra onlara əmr edir ki, sizin hər biriniz suyu tökdüyünüz qabdan iki dəfə öz qabını su .ilə doldurmalıdır, amma hamı gərək qaba boşaltdığı suyunun eynilə özünü götürsün

Qadınlar suların bir-biri ilə qarışdığı üçün onları bir-birindən ayırmağın mümkün olmadığını dedilər. Həzrət Əli (ə) buyurdu: “Əgər hansısa bir qadın bir neçə ərə sahib olsa, istər-istəməz onlarla cinsi münasibətə girəcək və daha sonra hamilə qalacaq. Belə olan təqdirdə, dünyaya gələcək uşağın hansı kişinin nəslindən olduğunu necə .müəyyən etmək olar?” Bu, məsələnin kişilərə aid olan tərəfi idi

Qadınlar baxımından da bir neçə ərə sahib olmaq həm onların təbiəti, həm də mənafeləri ilə ziddiyyət təşkil edir. Qadın təkcə kişidən onun cinsi ehtiyacını ödəyəcək bir amil kimi istifadə etmir ki, biz “nə qədər çox ər olsa, bir o qədər qadın üçün yaxşıdır” - deyək. Qadın kişi ilə bağlı elə bir varlığa ehtiyac duyur ki, onun qəlbini ələ almağı bacara, (kişi) qadının hami və qoruyucusu ola, onun üçün fədakarlıq edə, zəhmət .çəkərək pul qazana, iş və əməyinin nəticəsini ona sərf edə və onun həmdəmi ola bilsin

Qadının öz əmək fəaliyyəti sayəsində ələ gətirmiş və ələ gətirdiyi pul - kişinin ehtiyaclarının bir neçə bərabəri olan puldur - nə onun geniş olan tələbatlarını ödəməyə kifayət etmir, nə də kişinin qadına nəfəqə ünvanında verdiyi və onun məhəbbəti, .sevgisi yolunda ödədiyi pula çatır

Qadının həddən artıq olan maddi ehtiyaclarını daimi olaraq

kişi bir fədakar ünvanında həmişə təmin etmişdir. Kişi üçün ən yaxşı və ən şiddətli şövq .və istək onun öz ailəsi və uşaqları üçün fəaliyyət göstərməsidir

Bir neçə ərə sahib olmaqla qadın heç vaxt özünə nisbətdə bir kişinin həqiqi sevgisini və onun üçün fədakarlıq etməsini cəlb edərək qazana bilməz. Bu baxımdan, qadının bir .neçə ərə sahib olması məsələsi onda nifrət hissini oyadır

Deməli, həmin məsələ nə kişinin, nə də qadının istək və meylləri ilə müvafiq .olmamışdır

## Cinsi münasibətdəki üştərəkliyin müvəffəqiyyətsizliyə düçar olması

Cinsi münasibətlərdəki müştərəkliyin müvəffəqiyyətsizlik səbəblərinin də yuxarıda .sadaladığımız kimi olduğunu deyə bilərik

Platon tərəfindən cinsi münasibətdəki müştərəklik və iki tərəfdən də məxsusluğun – yəni, nə kişinin bir qadına aid olması, nə də qadının bir kişiyə aid olması – aradan qaldırılması məsələsi irəli sürülmüş və bu xüsusiyyətlər bizim əvvəldə də işarə etdiyimiz kimi, filosof hakimlər və hakim filosoflar, yəni hakim olan təbəqə arasında .nəzərdə tutulmuşdur

Həmin etiqad və təklif digər şəxslər tərəfindən qəbul edilməmiş, hətta, Platonun özü .də öz əqidəsindən daşınmışdır

Son bir əsrdə “kommunizmin ikinci atası” sayılan Fridrix Engels də həmin nəzəriyyənin həyata keçirilməsini təklif edərək onu müdafiə etmiş, amma kommunist ölkələr tərəfindən bu nəzəriyyə qəbul edilməmişdir. Sovetlər İttifaqının ١٩٣٨-ci ildə Engelsin irəli sürdüyü teorinin icrasından əldə edilən acı və təəssüflü təcrübələr səbəbi ilə ailələrin xeyrinə qanun qəbul etməsini və bir qadına sahib olmanı rəsmi evlilik kimi elan .etdiyini qeyd edirlər

Bir neçə qadına sahib olmaq kişi üçün hansısa bir imtiyaz hesab edilə bilər, amma bir neçə ərə malik olmaq qadın üçün əsla qəbul edilməmiş və edilməyəcəkdir. Buna səbəb kişinin, şəxsən, qadının özünü tələb etməsi və qadının da kişinin qəlbini ələ gətirmək və ona fədakarlıq etməsini istəməsidir. Kişi

qadının özünü ələ gətirdiyi zaman onun qəlbini əldən verməyə heç bir əhəmiyyət vermir. Bu cəhətdən, bir neçə qadına malik olan kişi üçün onların qəlblərini əldən vermək heç bir məna kəsb etmir. Amma qadın üçün belə deyil və kişinin qəlbi onun üçün əhəmiyyətə malikdir. Əgər kişinin qəlbini əldən verərsə, deməli, hər bir şeyi əldən vermişdir. Başqa bir ifadə ilə desək, evlilik məsələlərinə günümüzdə iki amil və ünsür :dəxalət edir

Biri maddi və digəri də mənəvi. Evliliyin maddi amili həmin cinsi münasibətdir və o, cavanlıq vaxtında daha da zirvə və pik nöqtəsinə qalxır və tədricən azalmağa doğru .irəliləyir

Mənəvi amil tərəflər arasındakı həssas və davamlı münasibətlərə dayanır və onlar arasında belə məsələlər hakimdir və zaman keçdikcə, daha da şiddətlənməyə başlayır. Kişi ilə qadın arasında mövcud olan fərqlərdən biri birinci ünsür və amilin yox, .ikinci amilin əhəmiyyət kəsb etməsidir. Amma kişi üçün məsələ belə deyil

Evlilik adətən, kişi üçün maddi və qadın üçün mənəvi cəhətlərə malikdir. Yaxud da kişi .üçün maddi və mənəvi xüsusiyyətlərin bərabər və müsavi olduğunu deyə bilərik

Bütün bunları bir kənara qoyaq. İyirmi dördüncü məqalədə avropalı psixoloq bir qadının nəzərlərini şahid gətirmiş və demişdik ki, qadın hamilə olduğu zamanlarda onun psixoloji haləti dəyişir və xüsusən, kişinin ona qarşı daha çox diqqət, məhəbbət və nəvaziş göstərməsinə ehtiyac duyur. Bu ehtiyac qadın bir ərə sahib olduğu hallarda .keçərli və özünü doğruldandır

Bir neçə ərə sahib olmaqla çoxlu sayda zövcəyə sahib olmanın bir-biri ilə müqayisə edilməsi, həmin məsələlər arasında heç bir fərqin olmamasının təsəvvür edilməsi və çoxlu sayda qadına sahib olmağa kişinin qoluzorlu və qüdrətli olmasını dəlil gətirmək və qadının bir neçə ərə malik olması imtiyazının isə onun zəif və gücsüz olduğu üçün .qoruya bilməməsi ilə əlaqələndirmək açıq-aşkar bir səhv və yanlışlıqdır

Xanım Manuçehriyan “İran konstitusiyası və ictimai qanunlarına irad” adlı kitabının :otuz dördüncü səhifəsində yazır

qadınının icazəsi olmadan onun (arvadının) bacısı və ya qardaşı qızını ala bilməz... Əgər qadın icazə verərsə, ər xanımının qardaşı və ya bacısı qızı ilə evlənə bilər. Amma onun icazə vermədiyi hallarda nə etməli olduğumuzu araşdıraq. Cavabında deyirik ki, heç nə, əvəz etmək olan yerdə gileylənməyə yer yoxdur, onda, kişi başqa bir qadınla evlənə bilər." İndi məsələni əksinə düşündüyümüzdə nə baş verəcək? Məsələn, "Qadın (evli olduğu halda) ərinin icazəsi olmadan öz ərinin qardaşı və ya bacısı oğlu ilə evlənə bilməz" - desək, damarda təəssübkeşlik qanı cuşa gələr və fəryad edərək bunun insanlıq qayda-qanunlarına sığmadığını və eyni zamanda, qadın təbiətinin də onunla .müxalif olduğunu deyərlər

Cavabında deməliyik ki, bu məsələ təkcə qadının qul olması məsələsi ilə müxalifdir. Yəni, bir malın birdən artıq maliki olmadığı və ya bir malikə qayıtdığını nəzərə alsaq, bizim qanunlara əsasən də qadın qul və mal hesab olunduğundan, onun birdən çox "...sahibi olmamalıdır

:O, həmin kitabın yetmiş üçüncü səhifəsində isə belə yazır

Kişi dördə yaxın qadına sahib ola bildiyi kimi, biz "qadın da bəşər olduğu üçün kişinin" malik olduğu hüquqlara eyni və bərabər şəkildə sahib olmalıdır" - deyə bilərik. Məntiqi olan bu dəlillərin nəticəsi kişiləri həddən artıq vəhşət və qorxuya salır. Bu yerdə onların qanları damarlarında cuşa gəlir, üzləri qızarır və onlar fəryad edərək "qadınlar birdən artıq ərə necə sahib ola bilər? "- deyirlər. Biz də soyuqqanlı və aram şəkildə cavab ?veririk ki, bəs, kişi birdən artıq qadına necə sahib ola bilir

Biz burada əxlaqi pozğunluqların yayılmasını, qadınların iffət və namusunun heçə sayılmasını istəmirik, amma kişilərə onların qadınlar barəsindəki düşüncə və təfəkkürlərinin o qədər də möhkəm və sarsılmaz olmadığını anlatmağa çalışırıq. Kişi və qadın birdir. Onların hər ikisi bir-biri ilə müsavi və bərabərdirlər. Əgər kişilərə dördə qədər qadınla evlənmək haqqı verilirsə, bu haqq qadınlara da verilməlidir. Eyni zamanda, qadınların əqli baxımdan kişilərdən daha qabiliyyətli olmadığı təsəvvür olunsa da, qadınlar ruhi və nəfsani keyfiyyətlər cəhətindən heç də

”.kişilərdən zəif deyillər və onlardan geridə də qalmırlar

Diqqət edildiyi kimi, yuxarıda bəyan edilən məsələlərdə bir neçə ərə sahib olmaqla bir neçə zövcəyə malik olmaq arasında heç bir fərq qoyulmamışdır. Azadlığa malik olmayan qadınların qul və kəniz olmalarına müxalif və zidd olan bir neçə ərə sahib olmaqla bağlı məsələni müdafiə etməklə yanaşı, sadəcə kişinin qoluzorlu və qüdrətli .olduğu üçün öz xeyrinə bir neçə qadına sahib olmağı adət halına saldığı göstərilmişdir

Yuxarıda qeyd edilən yazılarda bir neçə qadına sahib olmağın yayılması ilə bir neçə ərə sahib olmağın ortadan qalxması səbəbi kimi, kişinin mülkiyyət sahibi və qadının mülk hesab edilməsi məsələsi ilə əlaqədar olduğu göstərilmişdir. Kişi qadının maliki olduğu üçün bir neçə qadına, yəni çoxlu miqdarda mala sahiblənə bilirdi. Amma qadın mülk hesab edildiyi və onun birdən artıq sahibi olmadığı üçün, bir neçə ərə sahib olmaqdan .məhrum olmuşdur

Həqiqətdə, yazıçı xanım Manuçehriyanın nəzərlərinin əksinə olaraq bir neçə ərə sahib olmanın qəbul edilməməsi məsələsinin özü kişinin qadına bir mal (mülk) gözü ilə baxmadığına bir dəlildir. Çünki mala şərik olmaq və bir neçə nəfərin bir malın maliki olması və ondan istifadə edilməsi bəşərin mülkiyyət üzərində icra etdiyi cari qanunlardan hesab edilir. Əgər kişi qadına bir mal gözü ilə baxsaydı, onun üzərində müştərək istifadəni qəbul edərdi, çünki o, mal üzərindəki şərikli maliklik və ondan .istifadəni caiz (qəbul olunası) hesab edirdi

Dünyanın hansı bir yerində hansısa bir malın birdən artıq sahib və malikinin olmadığı qanun şəklini almışdır ki, biz həmin qanuna istinad edərək bir ərə sahib olmanı onunla ?əlaqələndirək və ondan qaynaqlandığını deyək

Kişi və qadının bir olduğunu söyləyərək onların eyni və bərabər hüquqlara malik olmasının zərurət təşkil etdiyini deyirlər. Nə üçün kişi öz hüquqlarından istifadə edərək bir neçə qadına malik ola bilir, amma qadın həmin hüquqlarından faydalanaraq bir neçə ərə sahib olmaq haqqından istifadə edə bilmir? Cavab olaraq deyirik ki, sizin ,səhviniz elə bu yerdədir

çünki bir neçə qadına sahib olmağı siz kişinin haqqı və bir neçə ərə malik olmağı da qadının haqqı olduğunu hesab edirsiniz, halbuki, sayca çox qadına maliklik qadınların hüquqlarına daxildir. Amma çoxlu sayda ərə malik olmaq nə kişinin, nə də qadının .mənafe və məsləhəti ilə uyğun gəlmir

Biz gələn bəhslərimizdə İslamın çoxarvadlılıq məsələsini nəzərdə tutmaqla kişilərin deyil, qadınların hüquqlarını bərpa etməyə çalışdığını və əgər kişilərin hüquqlarına xidmət etmiş olsaydı, həmin məsələni "Qərb dünyasında olduğu kimi, həyata keçirmiş olardı" - deyərək sübuta yetirəcəyik. Yəni, Qərbdə kişilərə çoxlu sayda qadınlardan özünün birinci qadını kimi, öz xeyri və mənfəətinə istifadə etmək haqqı verilmiş, amma onların qadın və uşaqlarını təmin etməsi və qanuni arvad və qanuni övlad məsələsi ilə bağlı olaraq heç bir məsuliyyət, vəzifə və qanun nəzərdə tutulmamışdır. Qərbdə bir .neçə ərə malik olmaq qadının haqqı deyildi ki, onun əlindən alınmış hesab olunsun

Kişilərin qadınlarla bağlı düşüncə və etiqadlarının onların özünün təsəvvür etdiyi kimi o .qədər də möhkəm və sarsılmaz olmadığını kişilərə anlatmağa çalışdıqlarını söyləyirlər

Təsadüfən, bizim istədiyimiz də elə budur (məsələnin anlaşılması).Biz gələcək bəhslərimizdə islami nəzərlərin çoxarvadlılıq məsələsi ilə bağlı əsaslanıb istinad etdiyi mənbələr barədə söhbət açacağıq. Biz bu və digər nəzər sahiblərindən tələb edirik ki, İslamın bu məsələ ilə əlaqədar irəli sürdüyü nəzər və düşüncələrin sarsılmaz olub-olmaması ilə bağlı öz fikir və düşüncələrini bildirsinlər. Mən İslamın irəli sürdüyü nəzərlərin mənbəyində bu məsələlər barədə hansısa bir çatışmamazlıq və boşluq tapa biləcəkləri təqdirdə, qadın hüquqları ilə bağlı bütün dediklərimdən daşınacağıma şərəf .sözü verirəm

**(Çoxarvadlılığın tarixi səbəbləri (۲**

Kişinin qadın üzərində hakimiyyət və heç bir maneə olmadan ona sahiblənməsi təklikdə çoxarvadlılıq ilə bağlı adət və ənənələrin meydana çıxmasında kifayət qədər rola malik olmamışdır. Hökmən, digər səbəb və amillər də bu məsələlərdə

dəxalətli olmuşdur. Yəni, qüdrətli kişilər üçün bir neçə qadına sahib olmaqdan ən asan və baş ağrısı olmayan məsələ onların dəyişiklik istəmələrinə olan tələbatlarını qadınbazlığın azad, məşuqə və rəfiqə formasından istifadə etmək və onları (qadınları) öz arvadları ünvanında qəbul etmədən və gələcək ehtimali övladları barəsində də heç .bir öhdəlik və vəzifə daşımadan ödəmələridir

Bu cəhətdən, bir neçə zövcəyə sahib olmanın adət halını aldığı cəmiyyətlərdə ictimai və əxlaqi maneələr ya kişinin üzünə azad şəkildə olan məşuqə, qadınbazlığı bağlamış və qüdrətli və həvəsbaz kişilər öz tələbatlarını ödəmək üçün istifadə etdiyi qadınları öz arvadı kimi qəbul etməyə və uşaqların məsuliyyətini də qanuni şəkildə öz öhdəsinə götürməyə məcbur olmuşdur, ya da kişinin dəyişikliyə olan meyli və həvəsbazlığından .başqa, digər amillər (coğrafi, ictimai və iqtisadi) də bu məsələdə təsirli olmuşdur

**Coğrafi amillər**

Montesko və Qustav Lobon həmin məsələdə çoğrafi amillərin dəxalət və təsir etdiyinə daha çox israr və təkid edirlər. Bu mütəfəkkirlərin etiqadına görə, Şərqdəki təbii şərait və mühitin tələbinə əsasən, zövcələrin sayının çox olması məsələsi adət halını almışdır. Həmin şəraitdə qadın həm daha tez inkişaf edib həddi-büluğ və yetkinlik yaşına çatır və həm də daha tez qocalırdı deyə, kişi ikinci və üçüncü qadına ehtiyac duyurdu. Bundan əlavə, şərqli kişilər təbii mühitə əsasən, cinsi baxımdan da o qədər inkişaf .etmişlər ki, bir qadın onların tələbatını ödəməyə yetmirdi

Qustav Lobon "İslam və ərəb mədəniyyət (sivilizasiya) tarixi" əsərinin beş yüz doqquzuncu səhifəsində yazır: "Adı çəkilən adət və ənənələr (çoxarvadlılıq) dinin gətirməsi ilə deyil, fəqət Şərqin ab-hava və təbii mühiti, həmçinin, Şərq həyat tərzi ilə əlaqədar olan irqi xüsusiyyət və digər səbəb və məsələlərin nəticəsi olaraq meydana gəlmişdir. Eyni zamanda, təbii mühit və qövm, tayfa xüsusiyyətlərinin də həddən artıq

təsirə malik olan amillərdən hesab edildiyini bilirik və biz bu barədə uzun-uzadı .danışmağa və uzunçuluğa yol verməyə ehtiyac duymuruq

Bunlardan əlavə, təbiətin özü və qadınların strukturu və xəstəlik, övladların xərcləri və digər məsələ və səbəblər əksər hallarda qadınların kişilərdən kənar gəzməsinə səbəb olurdu və Şərqin ab-hava və mühiti, eyni zamanda, qövmi xüsusiyyətlər elə bir şəkildə idi ki, belə müvəqqəti uzaqlıqlar kişilər üçün dözülməz sayılırdı. Bu səbəblərdən də, ".çoxarvadlılığın meydana gəlməsi zərurəti yarandı

Montesko "Qanunların ruhu" adlı əsərinin dörd yüz otuzuncu səhifəsində belə yazır: "İsti iqlimə malik olan ölkələrdə bir qayda olaraq qadınlar səkkiz, doqquz və on yaşlarından yetkin və həddi-büluğa çatmış olurlar. Onlar evləndikdən sonra da tezliklə hamilə qalırlar. Beləliklə, biz isti ölkələrdə evlənən qadınların bir-birinin ardınca və dalbadal olaraq hamilə qaldıqlarını söyləyə bilərik. Preydo İslam peyğəmbərinin (s) şərhi-halı ilə bağlı o həzrətin Xədicəni (ə) beş yaşında olarkən öz nikahına keçirdiyini və səkkiz yaşına gəldiyində onunla yaxınlıq etdiyini qeyd edir. Beləliklə, isti ölkələrdə yaşayan qadınlar iyirmi yaşında qoca hesab edilirlər, halbuki, onların bu yaşda əqlləri ...kamala doğru inkişaf edir

Amma mülayim iqlimə malik olan ölkələrdə qadınlar nisbətən gec həddi-büluğ və yetkinlik yaşına çatır və gec evlənirlər. Onlar evləndikləri zaman müəyyən qədər təcrübə toplamış olurlar və övlad dünyaya gətirmələrinə baxmayaraq, öz ərləri ilə eyni yaşda görsənir və haradasa, ərləri ilə birlikdə qocalır və yaşlaşırlar. Belə olan təqdirdə kişi və qadınlar arasında müsavat və bərabərlik bərqərar edilir və kişilər birdən artıq ...qadınla evlənmirlər

Deməli, qanunların Avropada qadınların (zövcələrin) sayca çoxluğunu qadağan etməsi və Asiyada isə həmin məsələ ilə əlaqədar adətlərin yaranması təbii mühit və ab-hava ".ilə bağlıdır

Bu formadakı izah, əslində, doğru və düzgün deyil. Çünki birincisi, çoxarvadlılıq ilə bağlı adətlər təkcə Şərqin isti iqlimə

malik məntəqələrinə məxsus deyil. Məsələn. İranın özündə əlverişli təbii şərait və mülayim iqlim olmasına baxmayaraq, İslamdan da öncə, burada çoxlu sayda qadınla evlənmək adət halına çevrilmişdi. Eyni zamanda, Monteskonun dediyi “qadın Şərqdə iyirmi yaşında qocalır” – kimi sözlər boş və əsassız sözlərdən başqa, bir şey deyildir. Bundan daha da betər olanı Preydodan nəql edərək onun “Peyğəmbərin (s) Xədicəni (ə) beş yaşında öz əqdinə keçirməsi və səkkiz yaşında onunla yaxınlıq etməsi”ni deməsidir. Halbuki, hamımız Peyğəmbər (s) Xədicə ilə evləndiyində o həzrətin iyirmi .beş yaşında olduğunu və Xədicənin isə ömründən qırx il keçdiyini yaxşı bilirik

İkincisi, qadının tez qocalıb yaşlanması və kişinin cinsi qüvvəsinin tüğyan edərək coşması kimi məsələlər əgər bu məsələnin yaranmasının əsil səbəbidirsə, onda, nə üçün Şərqdə yaşayan insanlar Qərbin orta və yeni əsrlərdə keçdiyi yolu izləyərək öz təbiətlərinin istəyinə əsasən çoxlu sayda qadınla evlənmək yerinə, qadınbazlıq və ?fahişəliklə kifayətlənməmişlər

Beləliklə, Qustav Lobonun sözlərinə istinad edərək zövcələrin vahidliyi məsələsinin təkcə qanun kitablarında qeyd edilən rəsmi bir məsələ olduğunu və qərblilərin rəftarlarında onun heç bir əsər və əlamətinin görünmədiyini deyə bilərik. Həmçinin, onun sözlərinə əsasən, Qərbdə kişilərin qadınları öz məşuqə və rəfiqələri kimi istifadə etmələri və dünyaya gələn övladlarına qarşı heç bir məsuliyyət və vəzifəyə malik olmalarından fərqli olaraq, şərqlilərin sayca çox olan zövcələri rəsmi şəkildə qəbul etdiyini, yəni kişilərin qadınlara nisbətdə öz kişilik funksiyasını və övladlara nisbətdə də .atalıq vəzifələrini yerinə yetirdiklərini diqqətinizə çatdıra bilərik

### Qərbdə çoxarvadlılığın vəziyyəti

Mən bu yerdə orta əsrlərdə Qərbdə mövcud olan çoxarvadlılığın vəziyyəti barədə Qərbdə tədqiqat aparmış tarixçilərdən birinin dili ilə şərh verməyi zəruri hesab edirəm və istəyirəm möhtərəm oxucular və Şərqi “zövcələrin sayının çox olması” və “hərəmxanaların təşkilatçısı” adı ilə irad tutmağın

mərkəzində yerləşdirən və bu məsələni Qərbin önündə Şərqin başıaşağı olmasına yol açan bir məsələ kimi dəyərləndirən kəslər bilsinlər ki, Şərq onda mövcud olan bu məsələ, onun naqisliyi və eyibli cəhətləri ilə Qərbdə saysız şəkildə qadınlara sahib .olmaqla bağlı baş verən hadisələrə nisbətdə, min dəfə üstündür və fəzilətə malikdir

Vil Dorant "Sivilizasiya tarixi" əsərinin on yeddinci cildində "Əxlaqın süstlüyü" adı altında bir fəsil açmışdır. O, bu fəsildə İtaliyada renesans (intibah) dövründə yaşayan insanların ümumi əxlaqı barədə şərh vermişdir. Bütövlükdə on bir hissədən ibarət olan bu şərh oxunulasıdır. Mən bu şərhdə "cinsi münasibətlərdə əxlaq" başlığı adı altında .verilən fəsilin qısa xülasəsini sizin diqqətinizə çatdırıram

Vil Dorant bu şərhlə qısa bir müqəddiməni xatırladır və sanki həmin müqəddimə vasitəsi ilə əvvəlcədən üzrxahlıq etməyə çalışır. O, müqədimə olaraq bunları deyir: "Ruhani olmayan camaatın əxlaqı və cinsi məsələlər barədə söhbət açmazdan öncə, nəzərinizə çatdırmaq istəyirəm ki, kişi zatı baxımdan bir neçə zövcəyə sahib olmaq təbiətinə malikdir və təkcə əxlaqi qeyd və məsələlər, fəqirliyin münasib mizanı, çətin iş və zövcənin daimi nəzarəti bu məsələdə kişini bir qadınla kifayətlənməyə məcbur edə " .bilər

Daha sonra sözlərinə davam edərək belə yazır: "Möhsinə zinanın - yəni, evli kişi və qadının bir-biri ilə etdiyi zina - renesans dövrünə nisbətdə orta əsrlərdə çox olması məsələsi məlum deyil. Orta əsrlərdə zina qəhrəmanlıq şəklində təltif edildiyi kimi, bu üsul renesans dövründə də təhsil almış təbəqə arasında zərif və incə ruhlu qadınların .bununla tərbiyə edilməsi ilə uzlaşır və uyğunlaşırdı

Əsil və kübar ailədən olan qadınlar müəyyən bir həddə öz ailələri ilə uyğun gəlməyən kişilərlə nadir hallarda evlənirdilər. İffətlə bağlı məziyyət və xüsusiyyətlər onlara evlilikdən daha əhəmiyyətli şəkildə təlim edilirdi. Nəql edilənlərə əsasən, bu məsələ o qədər əhəmiyyət kəsb edirdi ki, namusuna təcavüz edilən qadın suda qərq olmaqla ,özünü həlak edirdi. Şübhəsiz ki

həmin qadın bir nəfərə məxsus idi və onun ölümündən sonra, onun üçün büstlər .düzəldilirdi

Evlilikdən əvvəlki macəralar izah edilə biləcək şəkildə olmalı idi, yoxsa, İtaliyada renesans dövründə hər bir şəhərdə əmələ gələn sonsuz saydakı qeyri-qanuni və qeyri-şəri uşaqlar bu məsələdə dəlil kimi istifadə edilə bilərdi. Haramzadə övlada sahib olmamaq üstün bir imtiyaz kimi qiymətləndirilməsinə baxmayaraq, ona sahib olmaq da fahişəlik əlaməti olaraq bilinmirdi. Kişi adətən, hansısa bir qadınla evlənən zaman, onu haramzadə uşağını evinə gətirmək və kişinin digər uşaqları ilə birlikdə .böyüdülməsi ilə bağlı rəğbətləndirirdi

Haramzadə olmaq kiminsə qədir-qiymətinin azalmasına səbəb olmurdu. Cəmiyyətin onlara vurduğu damğa o qədər də əhəmiyyət kəsb etmirdi. Bəzən qanuni və şəri olmanı kilsə üzvlərinə rüşvət verməklə də ələ gətirmək mümkün olurdu. Şəri və qanuni övlad və varislərin və ya səlahiyyətli şəxslərin olmaması səbəbi ilə haramzadələr taxt-tac və digər mülkiyyətə sahib ola bilirdilər. Həmin qayda ilə birinci Frenti birinci Alfonsonun - Neapol padşahının - və Leonelodse isə Frara hakimi üçüncü Nikolyenin canişini olmuşdu. İkinci Pyus min dörd yüz əlli doqquzuncu ildə Fraraya gəldiyi zaman, yeddi şahzadə tərəfindən qarşılanmışdı və onların hamısı qeyri-qanuni övladlar idilər. Halalzadələrlə haramzadələr arasındakı rəqabətin mənşəyi renesansın keçməkeşli dövrlərindən qaynaqlanırdı... Amma həmcinslərə meyillilik məsələsi ilə bağlı onun qədim Yunan adətlərinin icbari olaraq dirçəldilməsi ilə əlaqədar meydana çıxmasını ...deməliyik

San Bernardino bu məsələnin çox geniş şəkildə yayılaraq şəhəri bir xəstəlik kimi təhdid etdiyini müşahidə etmişdi. Artino bu inhiraf və azğınlığın eynilə Romada da olduğunu bildirmişdir. Fahişəlik barəsində də belə sözlər söyləyə bilərik. İnfesuranın nəqlinə əsasən, öz düşüncələrini papanın qərargahı olan Romada geniş yayıldığını bildirmək üçün, Romada min dörd yüz doxsanıncı ildə doxsan minlik əhali arasında altı min səkkiz yüz fahişənin olduğunu qeyd etmişdir. Əlbəttə, bu

statistik rəqəm və göstəricilər gizli və qeyri-rəsmi şəkildə fəaliyyət göstərənlərə şamil .deyildir

Venesiyada da min beş yüz doqquzuncu ilin statistik məlumatlarına əsasən, üç yüz minlik əhali arasında on bir min altı yüz əlli dörd fahişənin olduğu qeydə alınmışdır. XV əsrdə on beş yaşı olmasına baxmayaraq, hələ ərə getməyərək evdə qalmış qız uşağı ailənin üz qarası hesab edilirdi. XVI yüzillikdə evliliklə əlaqədar bu yaş qızlar üçün on yeddiyə qaldırıldı ki, onların ali təhsil ala bilmələri mümkün olsun. Fahişəliyin bütün məziyyət və xüsusiyyətlərindən asanlıqla faydalana bilən kişilər üçün evlilik sadəcə bir halda mümkün ola bilərdi və o da evlilik kişi üçün hansısa bir vəsilə olduğunda baş .tuturdu

Orta əsrlərdəki evlilik ayinlərinə əsasən, evlilik məsələlərinin müxtəlif dövrlərində izdivacın kişi və qadın arasındakı eşq və məhəbbətə, onların qəm və kədərdə, xoşbəxtlik və bədbəxtlikdə, bir-birinə şərik olması kimi məsələlərə söykəndiyini demək olar və zahirdə belə məsələlər gözlənilirdi. Bütün bunlarla yanaşı, möhsinə zinası onlar arasında geniş yayılmışdı, çünki evliliklər adətən, ali təbəqələr arasında diplomatik əlaqələr, siyasi və iqtisadi mənafelərə xatir həyata keçirilmək xarakteri daşıyır və baş tuturdu. Eyni zamanda, qadınlar ərlərinin bir qayda olaraq, məşuqəyə sahib olmaq hüququnun olmasını düşünürdü və qadınlar bu cəhətdən qəmgin olmalarına baxmayaraq, ya həmin məsələləri görməzdən gəlir, ya da bu barədə bir kəlmə də .olsun danışmırdılar

Orta təbəqəyə mənsub olan kişilər zinanın qanuni və şəri bir iş olduğunu düşünürdülər. Makyavelli və onun dostları, adətən, öz vəfasızlıqları barədə danışdıqları macəra və dastanlardan heç də narahat olmurdular. Əgər qadın da kişidən intiqam almaq üçün öz ərini bu məsələdə təqlid etmiş olsaydı, əri ona bu məsələdə göz yumur və özünü ".daha da qeyrətli kimi göstərirdi

Bəli, şərqlilərə zövcələrin sayının çox olması barədə daimi olaraq irad tutan və onların insana yaraşmayan şəkildə rəftar etməkdə - sanki onlar bağışlanılmaz bir günaha mürtəkib olmuşlar - ittiham edən və bunu Şərqin təbii şərait və ab-havası

ilə əlaqələndirən qərbli camaatın keçirdiyi həyat tərzi qeyd etdiyimiz kimi idi. Onlar məsələni bu şəkildə dəyərləndirirdilər. Sanki qərblilərin malik olduğu təbii şərait və mühit onlara qadınlarına vəfasızlıq etməyə və bir zövcəyə sahib olmaqdan kənara çıxmağa heç vaxt icazə verməmişdir. Nəzərinizə çatdırmaq istəyirəm ki, qərblilər arasında çoxarvadlılı];n qanuni şəkildə olmamsı məsələsinin məsihiliklə heç bir əlaqəsi yoxdur. Həqiqi (təhrif edilməmiş) məsihilik dinində çoxarvadlılıq məsələsi ilə əlaqədar heç bir qadağa qoyulmamışdır, əksinə İsa Məsih (ə) Tövratın qanunlarını təsdiqlədiyinə və zövcələrin sayının çox olmasını rəsmi olaraq tanıdığına görə, onun əsil məsihilik dinində cayiz olduğunu və icazə verildiyini deyə bilərik. Həmçinin, qədimdə məsihilərin bir neçə zövcəyə sahib olduqları da söylənilmişdir. Deməli, Qərbin zövcələrin sayının çox olması məsələsindən qanuni və şəri şəkildə çəkinməsinin .hansısa səbəbləri və digər amilləri olmuşdur

**Menustrasiya (aybaşı) dövrü**

Bəzi şəxlər çoxarvadlılıq məsələsinin qadının menustrasiya dövrü və onların xəstələndikləri zamanlarda kişilərlə cinsi münasibətə hazır olmaması, həmçinin, qadının uşaq dünyaya gətirməkdən yorularaq bu məsələlərdən uzaq olmaq meyli və uşaqları yemək-içmək və böyütməkdən boyun qaçırması kimi məsələlərdən .qaynaqlandığını söyləmişlər

Vil Dorant deyir: "İbtidai cəmiyyətdə (və ya ibtidai icma quruluşunda) qadınlar tez qocalır və bu səbəbdən onların özləri əksər hallarda ərlərini yeni evliliyə təşviq edirdilər ki, bu yolla uzun müddət övladlarını ərzaqla təmin edə və hamiləlik dövrləri arasındakı fasilələri - ərlərinin cinsi istək və meyillərinə, eyni zamanda, nəsil artımına .heç bir xələl gətirmədən - uzada bilsinlər

Əksər hallarda birinci zövcənin öz ərini digər qadınla evlənməyə təşviq etdiyi müşahidə olunmuşdur və buna səbəb digər qadının ailəyə daxil olmaqla övlad ".dünyaya gətirməsi və bu minvalla, sərvətin artmasına vasitə olması məsələsi idi

Qadının menustarsiya və aybaşı dövrlərindəki xəstələnməsi

və həmçinin, onun uşaq dünyaya gətirməkdən yorulması kimi məsələlər, şübhəsiz, kişi ilə qadının cinsi münasibətlərlə bağlı bərabər olmayan vəziyyətlərdə olmasına və onun digər qadına üz gətirməsinə səbəb olur. Amma yuxarıda qeyd edilən iki səbəbdən heç biri təklikdə zövcələrin sayının çox olmasına bais olmaqda kifayət etmir. Təkcə əxlaqi və ya ictimai bir maneə onun (kişinin) öz cinsi tələbatını məşuqə və azad şəkildəki qadınbazlıq vasitəsi ilə ödəməsinə mane ola bilər. Deməli, qeyd etdiyimiz iki amilin hər biri kişinin həvəsbazlıq etməyə kamil şəkildə azadlığa malik olmadığı zamanlarda .dəxalət edə bilmişdir

### Qadının uşaq dünyaya gətirməsi dövrlərinin məhdud olması

Bəzilərinin etiqadına əsasən, kişilərdən fərqli olaraq qadınların uşaq dünyaya gətirməklə bağlı yaşlarının az olması və qadınların yaisəlik(١) yaşına çatması məsələsi də çoxarvadlılı];n meydana çıxmasına səbəb olan amillərdir. Adətən, qadınlar bu yaşa çatdıqda, ya onların kifayət qədər uşaq dünyaya gətirmək qabiliyyəti olmur, ya da .əvvəlki uşaqları tələf olur

Kişinin övlad sahibi olmaq istəyi və birinci qadınından ayrılmağa meylinin olmaması onun ikinci və üçüncü qadının arxasınca getməsinə səbəb olmuşdur. Eyni zamanda, qadının cinsi fəsaliyyətinin olmamasını da digər amillərə əlavə etmək olar ki, kişinin .ikinci dəfə evlənməsinə yol açmışdır

### İqtisadi amillər

Çoxarvadlılığa səbəb kimi iqtisadi məsələri də vurğulamış və bizim dövrümüzdən fərqli olaraq qədimdə qadın və uşaqların çoxluq təşkil eməsinin kişilərin mənafeyinə xidmət .etdiyini demişlər

Kişi öz qadın və uşaqlarından qul və işçi qüvvəsi kimi istifadə edir və bəzən öz övladlarını satırdı. Əksər insanların qul



---

١- [١] . Yaisəlik – adətən, qadınlar müəyyən bir yaşa çatdıqları zaman, onlar cinsi fəaliyyətdən düşür və aybaşı olmaqdan kəsilirlər, həmçinin, həmin məsələlər övladın

olmasının mənşəyi sadəcə döyüş və müharibələr deyildi, əksinə övladların valideynləri onların bazara çıxararaq qul kimi satırdı. Bu cəhət çoxarvadlılığın yaranması amili kimi gerçəkləşə bilər. Kişi sadəcə qadını rəsmi şəkildə arvad olaraq qəbul etdikdə, övladlarının çox olması imtiyazından istifadə edə bilər. Azad şəkildə olan qadınbazlıq .və məşuqə kişinin həmin imtiyazlarını təmin etmək qabiliyyətinə malik deyil

Bildiyimiz kimi, həmin səbəbi çoxarvadlılıq olan bütün şəraitlər üçün nəzərdə tutmaq olmaz. İbtidai dövrlərdə yaşayan millətlərin bu məqsədlə (mənfəət xatirinə) çoxlu sayda qadına sahib olmasını söyləmək mümkün olsa da, bunu bütün millətlərlə bağlı söyləyə bilmərik. Adətən, qədimdə çoxlu sayda zövcələrə sahib olmaq yüksək təbəqədən olanlar – padşahlar, hakimlər, tacirlər, əmirlər, ruhanilər və s – arasında adət halını almışdı və bildiyimiz kimi onlar çoxlu sayda olan qadın və övladlarından heç .bir iqtisadi bəhrə və mənfəət əldə etmirdilər

**Tayfa və ədəd (say) amili**

Zövcələrin sayının çox olması məsələsinin meydana çıxmasında övladların çoxluğuna olan meyil və ailə üzvlərinin sayının artması amili də öz növbəsində təsirli olan digər amillərdən hesab edilir. Kişi ilə qadın arasında mövcud olan fərqlərdən biri – istər ər bir nəfər olsun, istərsə də bir neçə nəfər – qadının dünyaya gətirdiyi övladlarının sayca az və həddən artıq məhdud olmasıdır. Amma kişinin bu məsələdə yerinə yetirə biləcəyi funksiya onun ixtiyarında olan qadınları və zövcələrinin sayından asılıdır. Hansısa bir .kişinin yüzlərlə qadından minə yaxın övladının olması mümkün olan bir işdir

İndiki əsrdən fərqli olaraq, qədim zamanlarda qəbilə və tayfanın sayca çox olması mühüm ictimai bir amil kimi qiymətləndirilirdi. Qəbilə və tayfalar öz saylarını artırmaq üçün bütün vasitə və üsullardan istifadə edərək onun sayının azalmasının qarşısını almağa çalışırdılar. Həmin dövrdə yaşayan insanlar öz qəbilə üzvlərinin say çoxluğu ilə fəxr edirdilər. çoxarvadlılığın bu məsələdə yeganə vasitə olduğu aydın və məlum .məsələdir

### Qadınların kişilərdən sayca çox olması

Çoxarvadlılıqda təsirli və mühüm olan sonuncu amil qadınların say və miqdarının kişilərin sayından artıq olması idi. Qız uşaqlarının doğum sayı oğlan uşaqlarının doğum sayından çox olmur və deyildi. Bəzi ölkələrdə qız uşaqları oğlan uşaqlarına nisbətdə çox doğulurdu və əksinə, bəzi ölkələrdə oğlan uşaqları qız uşaqlarından daha artıq dünyaya gəlirdi. Evlənmək istəyən qadınların say baxımından evlənmək istəyən kişilərdən çox olmasına səbəb həmişə kişilərin tələf olmasının qadınlara nisbətdə çoxluq təşkil etməsi idi. Kişilərin həddən artıq tələfat və itkisi daimi olaraq bir ərə sahib olmanı nəzərə aldıqda, müəyyən bir qrupu təşkil edən qadının qanuni şəkildə ər, ev-eşik və şəri olan övladdan məhrum qalmasına gətirib çıxardığını anlamaq olar. İbtidai .icma quruluşunda məsələnin bu formada olması barəsində biz heç bir söz demirik

Əvvəldə Vil Dorantdan belə nəql etmişdik: “İbtidai və ilkin yaranmış cəmiyyətlərdə kişilər döyüş, müharibə və ovçuluq kimi işlərlə məşğul olduğuna görə, onların həyatı daha artıq təhlükə ilə üzləşir və kişilər qadınlardan daha çox tələf olurdular. Belə hallarda qadınların sayca çoxluq təşkil etməsi ya onların ərsiz qalmasına, ya da ”.zövcələrin sayca artmasına gətirib çıxarırdı

### Səbəb və amillərin araşdırılması

Əvvəldə deyilmiş olan səbəbləri tarixi cəhətdən çoxlu sayda zövcələrin yaranması mənşə və mənbəyi hesab etmək mümkündür. Amma məlum olduğu kimi, həmin səbəblərdən bəziləri, həqiqətdə, səbəb hesab edilmir və əbəs yerə çoxarvadlılıq məsələsinin yaranması ilə bağlı göstərilən səbəblər sırasında qeyd olunmuşdur. Misal .üçün, ab-hava və təbii mühiti göstərə bilərik

:Bu məsələləri geridə qoyduğumuz zaman, üç növ səbəblə üzləşirik

Birinci növ: Kişilərin digər qadınlara üz gətirməsində təsirli olmayan və kişiyə bu məsələdə icazə verilməyən və təkcə qüdrət, zülm və sitəm yönlərinə malik səbəblər. Öncəki bəhslərdə diqqətinizə çatdırdığımız iqtisadi səbəblər bu qəbildən olan

səbəblərdəndir. Aydın məsələdir ki, uşaqların satılması kimi mövzular bəşər vəhşiliyi və zülmünün bir nümunəsidir və bu məqsədlə zövcələrin sayının artırılması həmin işin .özü kimi, qeyri-qanuni və şəri olmayan bir işdir

İkinci növ: Bu növdən olan səbəblərdə qanuni və hüquqi cəhətləri müşahidə etmək və kişi və ya cəmiyyətə bu baxımdan icazə verildiyini söyləmək olar. Əgər qadın cinsi qabiliyyətə malik olmayan və yaisədirsə, yaxud kişi övlada ehtiyac duyur və hansısa bir qəbilə və ya tayfa da əhali sayını artırmaq istəyirsə, onda, çoxarvadlılığa icazə verilir. Ümumi halda, kişi və qadını cinsi məsələlər və ya övlad dünyaya gətirməklə bağlı fərqli mövqelərdə olmasına şərait yaradan təbii səbəblərin qanuni şəkildə .zövcələrin sayını artırmaq üçün icazə funksiyasını daşıdığını deyə bilərik

Amma əvvəlki səbəblərin arasında qədim və indiki zamanda olmasını fərz edə biləcəyimiz üçüncü növdən olan səbəblər də vardır. Həmin səbəblərin zövcələrin sayının artırılması ilə əlaqədar kişi və ya cəmiyyət üçün bir icazə və ya qadın üçün bir haqq və kişi, yaxud da cəmiyyətin öhdəsi və üzərinə düşə bilən bir təklif və məsuliyyət .olduğunu təsəvvür edin. Bu səbəb qadınların kişilərdən sayca çoxluq təşkil etməsidir

Siz evliliyə hazır olan qadınların sayca evlənmək qabiliyyətinə malik olan kişilərdən çox olmasını və yalnız qanuni və rəsmi formada bir qadına sahib olmanın mümkünlüyünü düşünsəniz, görəcəksiniz ki, belə olan təqdirdə, bir dəstə qadın evlənmək və ailəyə sahib olmaq imtiyazlarından məhrum olacaq. Bu zaman bir neçə zövcəyə malik olmaq məhrum qadınların "haqqı" və onlarla evlənmək isə kişilər üzərində "vəzifə" və ."məsuliyyət"ə çevriləcək

Evlənmək hüququ bəşərin ən təbii olan hüquqlardandır. İnsanlardan heç birini bu haqdan hansısa bir adla məhrum etmək olmaz. Evlənmək və izdivac haqqı hər bir fərd üçün cəmiyyətdə meydana gələrək yaranır. Cəmiyyət müəyyən bir dəstənin evlilikdən məhrum olması ilə nəticələnən bir işi həyata keçirə bilməz. İnsanların cəmiyyətdə yemək, məskən, təlim və tərbiyə

və azadlıq adlı haqları onların əsas və ilkin hüquqlarından hesab edildiyi və heç bir halda onların əllərindən alına bilmədiyi kimi, evlilik haqqı da təbii haqlardan sayılır və evlənmə qabiliyyətli qadınların sayca evlənmək istəyən kişilərdən çox olması məsələsi evliliyi bir zövcə ilə məhdudlaşdıran qanunlarla ziddiyyət təşkil edir və bəşərin təbii hüquqları ilə müxalifdir. Deməli, bu qanunlar bəşərin təbii haqqlarına ziddir. Bunlar .keçmişlə əlaqədar olan məsələlərdəndir

Hazırkı zamanla bağlı nə deyə bilərik? Bizim dövrümüzdə zövcələrin sayının çox olmasına icazə verən və onu qadının haqqı olaraq rəsmi şəkildə tanıyan səbəblər mövcudur, ya yox? Bu səbəblərin mövcud olduğunu fərz etdiyimiz zaman, əvvəlki ?(birinci) zövcənin haqqı barəsində nə deyə bilərik

### Çoxarvadlı olduqda əvvəlki (birinci) zövcənin haqqı

Bir neçə ərə sahib olmağın müvəffəqiyyətsizliyə düçar olması və çoxarvadlılığın nə üçün yaranması səbəbini nəzərinizə çatdırdıq. Belə məsələlərin meydana gəlməsində müxtəlif və cürbəcür səbəblərin təsirli olduğunu aydınlaşdırdıq. Həmin səbəblərdən bəzisi kişi cinsinin hökmranlıq etməsi və zülmündən qaynaqlanmış, bəzisi də kişi və qadın arasındakı nəsil artırılması, həmçinin, çoxlu sayda övlad dünyaya gətirməklə bağlı olan qabiliyyətlər və s. məsələlərin təbii xüsusiyyətlərindəki fərqlərə əsaslanaraq kişi üçün çoxlu sayda zövcəyə sahib olmaq məsələsinə icazə verilməsi kimi .dəyərləndirilə bilər

Qeyd edək ki, işin içində həmişə tarix boyu xüsusi digər amillər də təsirli olaraq çoxarvadlılığı qadın üçün bir “haqq” və kişi üçün “vəzifə” və “məsuliyyət” olmasına gətirib çıxarmışdır. Həmin məsələyə evlilik qabiliyyəti olan qadınların evlənməyə hazır .kişilərdən sayca nisbi çoxluğu bais olmuşdur

Biz ixtisarı gözləmək məqsədi ilə kişilərin sayca çox zövcəyə sahib olmasında təsirli ola və onlara haqq verə biləcək digər səbəblər barədə bəhs etməkdən daşınırıq. Çoxarvadlılığın təbəqələr arasında bərabər şəkildə nəzərdə tutulan bir haqq kimi yaranıb-yarana bilməməsi barədə söhbət açmaq istəyirik. İddiamızı sübuta

yetirmək üçün iki müqəddimənin aydın olması zəruridir: Birincisi, dəqiq statistik məlumat və rəqəmlərə əsaslanaraq evlənməyə hazır olan qadınların evlənmək .istəyən kişilərdən sayca çoxluq təşkil etməsi məsələsi ilə bağlı olan müqəddimə

İkincisi, belə bir məsələ qarşıya çıxarsa, onun məhrum (ərə malik olmayan) qadınlar üçün bir "haqq" və evli kişi və qadınlar üzərində bir "vəzifə" olması ilə əlaqədar olan .müqəddimə

Birinci baxımdan, xoşbəxtlikdən dünya ölkələrində bir neçə ildən bir əhalinin siyahıya alınması həyata keçirilir deyə, həmin zəmində bugünkü dünyada nisbətən düzgün və .dəqiq statistik məlumat və rəqəmlər mövcuddur

İnkişaf etmiş ölkələrdə dəqiq şəkildə həyata keçirilən əhalinin siyahıya alınması zamanı təkcə kişi və qadın cinsinin say nisbəti deyil, həmçinin, onların müxtəlif yaşlardakı sayı da əldə edilir. Məsələn, iyirmi yaşdan tutmuş, iyirmi dörd yaşa qədər oğlanlar və qızların nə qədər olduğu müəyyən edilə bilir. Eyni zamanda, digər yaşlarda olanların da statistik məlumatları öyrənilir. Birləşmiş Millətlər Təşkilatı nəzərdə tutduğu cəmiyyətin siyahıya alınması ilə bağlı proqram əsasında bu statistik məlumatları nəşr edir və indiyə qədər haradasa, on altı dəfə həmin statistik məlumatlar nəşr edilmişdir. Sonuncu dəfə Birləşmiş Millətlər Təşkilatının nəşr etdirdiyi .məlumatlar ۱۹۶۴-cü illərin məlumatıdır və ۱۹۶۵-ci ildə nəşr edilmişdir

Əlbəttə, əvvəlcədən qeyd etmək lazımdır ki, təkcə bir ölkədəki kişi və qadın cinsi barədə əldə edilən statistik məlumatlar bizim iddiamızı sübuta yetirməyə kifayət etməz. Bu sahədə faydalı və bilinməsi lazım olan məsələ evlənməyə hazır olan kişi və qadınların bir-birinə nisbətdəki say fərqidir. Bir qayda olaraq, evlənməyə hazır və yetişkin olan kişi və qadın cinsinin ölkədəki qadın və kişi cinsinin ümumi sayına olan :nisbəti arasında müəyyən fərqlər mövcuddur. Bunun iki səbəbi var

Birincisi, qızların həddi-büluğ və yetkinlik yaşına çatması dövrü kişilərin yetkinliyə çatma dövründən tez baş verir. Həmin səbəbdən, dünyadakı hüquq sistemində ,qadınların qanuni evlilik yaşı kişilərin qanuni evlilik yaşından aşağıdır və adətən

dünyanın hər bir yerində kişi və qadın arasında həyata keçirilən evliliklərin .əksəriyyətində kişilər qadınlardan orta həddə beş yaş böyük olurlar

İkinci səbəb əsas və mühüm olan səbəblərdəndir. Dünyanın əksər ölkələrində qız uşaqları oğlan uşaqlarından az doğulur və bəzən də oğlan uşaqlarının qız uşaqlarından çox dünyaya gəlməsi müşahidə edilməsinə baxmayaraq, kişi cinsinin qadınlardan daha çox tələf olaraq aradan getməsi nəticəsində baş verən evliliklər zamanı kişi və .qadın arasındakı say mizanı pozulur

Bəzi vaxtlarda bu, özünü açıq-aşkar şəkildə göstərir və evliliyə hazır və yetkin olan qadınların sayı böyük miqyasda evliliyə hazır olan kişilərin sayından artıqlıq təşkil edir. Bəzən də, hansısa bir ölkədəki kişilərin sayının qadınların sayı ilə bərabər və yaxud da onlardan çox olması mümkün olan məsələdir. Amma əksər hallarda evliliyə hazır olan təbəqələr - yəni qanuni evlilik yaşına çatmış qadın cinsi ilə kişi cinsi - arasında say baxımından bunun fərq təşkil etdiyi müşahidə olunmuşdur. Bu mətləb Birləşmiş Millətlər Təşkilatının ۱۹۶۴-cü ilə aid siyahıya alma ilə bağlı nəşr etdirdiyi statistik .məlumatlarda tamamilə aydın və aşkar şəkildə görülməkdədir

Məsələn, bu statistik məlumatlara əsasən, Koreya Respublikasındakı ümumi əhalinin sayı iyirmi altı milyon iki yüz yetmiş yeddi min altı yüz otuz beş nəfərdən ibarətdir. Həmin əhalidən on üç milyon yüz qırx beş min iki yüz səksən doqquzu kişi və on üç milyon yüz otuz iki min üç yüz qırx altısı isə qadındır. Kişilər on iki min doqquz yüz qırx üç nəfər olmaqla qadınlardan çoxdurlar. Bu fərqlilik bir yaşından az və bir yaşdan dörd yaş, beş yaşdan doqquz yaş, on iki yaşdan on dörd yaş və on beş yaşdan on doqquz .yaşa qədər olan uşaqlar arasında özünü büruzə verməkdədir

Statistik rəqəm və göstəricilər bütün bu yaşlardakı kişi cinsinin qadın cinsindən çox olmasını nişan verir. Amma iyirmi yaşdan iyirmi dörd yaşa qədər bu göstəricilər dəyişməyə başlayır. Bu yaşdakı bütün kişilərin sayı bir milyon səksən üç min üç yüz altmış dörd nəfər və qadınların sayı bir milyon yüz

on min əlli bir nəfərdir. Bu yaşdan yuxarı olan və kişi ilə qadın üçün qanuni evlilik yaşı .sayılan həddə qadınların say nisbəti dəyişərək kişilərdən üstünlük təşkil edir

Bununla belə, Koreya Respublikasında ümumi əhali arasında istisna olan bir hal var və o, kişilərin sayının qadınlardan daha çox olmasıdır. Amma əksər ölkələrdə təkcə evlilik yaşına çatmış qadınların sayca kişilərdən çoxluq təşkil etməsi deyil, ümumi əhali arasında da qadınların kişilərdən çox olduğu nəzərə çarpır. Məsələn, keçmiş Sovet Sosialist Respublikalar İttifaqında (SSRİ) ümumi əhali sayı iki yüz on altı milyon yüz bir min idi və onun doxsan yeddi milyon səkkiz yüz qırx minini kişi və yüz on səkkiz milyon iki yüz altmış bir minini isə qadınlar təşkil edirdi. Eyni zamanda, bu fərqlilik özünü həm qanuni evlilik yaşlarında, həm də ondan qabaq, yəni iyirmi-iyirmi dörd, iyirmi beş-.iyirmi doqquz, otuz-otuz dörd, səksən-səksən dörd yaşlarda göstərirdi

Fransa, İngiltərə, Qərbi Almaniya, Şərqi Almaniya, Çexslovakiya, Ruminya, Macarıstan, Amerika, Yaponiya və s kimi ölkələrdə də əhali arasındakı fərqlər bu qaydadadır. Qərbi və Şərqi Berlin kimi bəzi məntəqələrdə kişi və qadın arasındakı say fərqi aşkarcasına bilinməkdədir. Hindistanda, hətta, qanuni evlilik yaşında belə, kişilərin sayı qadınlardan çoxluq təşkil edir və bu fərq sadəcə əlli və ondan yuxarı olan yaşda əksinə dəyişir. Bunun səbəbi Hindistanda mövcud olan qədim bir adətlə bağlıdır .və onlar əri ölən qadını aradan aparırmışlar

Əvvəlki illərdə İranda əhalinin siyahıya alınması ilə İranın istisnalıq təşkil edən ölkələr sırasına daxil olduğu və ümumi əhali arasında kişilərin sayının qadınların sayından çox olduğu təsbit edilmişdir. İrandakı əhalinin sayı həmin statistik məlumatlara əsasən, iyirmi beş milyon yeddi yüz səksən bir min doxsan nəfərdir və onun on üç milyon üç yüz otuz yeddi min üç yüz otuz dörd nəfərini kişilər və on iki milyon dörd yüz qırx üç min beş yüz yetmiş altı nəfərini isə qadınlar təşkil edir. Kişilər qadınlardan səkkiz yüz .doxsan üç min beş yüz yetmiş səkkiz nəfər çoxdurlar

Mən həmin vaxtlarda zövcələrin sayının çox olması barədə

bəhs edən bəzi yazıçıların “çoxarvadlılığa tərəfdarlıq edən şəxslərin əksinə olaraq ölkəmizdə kişilərin sayı çoxdur, deməli, biz bu qanunu ləğv etməliyik” – deyə .yazdıqlarının şahidiyəm və onların belə düşünməsindən çox təəccüb edirdim

Birincisi, çoxarvadlılıq məsələsi təkcə İrana aid deyil, ikincisi, bu məsələdə bizim üçün faydalı olan bəhs evlilik yaşına çatmış kişilərin sayca izdivac yaşına çatmış və yetkin qadınlarla bərabər, yoxsa, onlardan çox olması ilə bağlı statistik məlumatların ələ gətirilməsidir. Əhalinin say məsələsində kişi cinsinin qadınların sayından çox olması bizim nəzərdə tutulan mövzu üçün kifayət etmir. Çünki Koreya Respublikası və digər ölkələrdəki əhali arasında kişi cinsinin qadın cinsindən çox olmasını bildirmişdik, amma məsələ burasındadır ki, evliliyə hazır və yetkin olan fərdlər arasında qadınlar çoxluq təşkil edir. İran və başqa ölkələrdəki bu statistik göstəricilərə etimad edilməsi məsələsini bir kənara qoyaq. Məsələn, İrandakı qadınların oğlan uşağı dünyaya gətirməsi ilə bağlı göstərdikləri jesti nəzərə alaq. Onlar əhalini siyahıya alan məmurlara yalandan qız uşaqlarını dünyaya gətirmədiklərini deməyə hazır olmasalar və əksinə, oğlan yerinə qız doğulduğunu desələr, bu, bizim həmin göstəricilər olan etimadımızı aradan qaldırmağa kifayət edər. Ölkədəki bəzi məsələrdən İrandakı evlilik yaşına çatmış qadın cinsinin kişilərdən çox olmasını qətiyyətlə deməyə əsas verir və şəhər, kənd və əyalətlərdə sayca zövcələrin çoxluq təşkil etməsi səbəbi ilə heç kim bu ölkədə qadın çatışmamazlığını hiss etməmiş və qadın qara bazara çıxmamışdır (məcazi mənada). Əksinə, həmişə bu sahədə tələbat və ehtiyaclar ödənilmişdir. Qızlar, dul qadın və ya ərindən ayrılmağa məcbur olanlar həmişə subay kişilərdən sayca kifayət qədər artıq olmuşlar. Evlənmək istəyən hər hansı bir kişi, hətta, görkəm baxımından eybəcər və fəqir olsalar da belə, zövcəsiz qalmamışdır. Amma ərlərini itirmək məcburiyyətində qalan qadınlar sayca çoxluq təşkil etmişdir. Bu hadisə və .cərəyanlar statistik göstəricilərdən də tutarlı və qəti olan sübutlardır

Eşli Montaqo “Qadın – ən üstün cins (varlıq)” adlı kitabında

səh:۳۱۱

qadının gözəllik və özünə diqqət etməyə olan meylinin ictimai amillərdən qaynaqlandığını demək üçün boş və əbəs yerə təlaş etdikdən sonra, bu həqiqətə etiraf edir və deyir: “Dünyanın bütün yerində evlənməyə hazır və yetkin olan qadınlar ”.kişilərdən sayca üstünlük təşkil edirlər

ci illərə aid statistik göstəricilər Amerikadakı evliliyə hazır olan qadınların bir-۱۹۵۰ milyon yüz otuz min nəfər olmaqla kişilərdən çoxluq təşkil etdiyini nişan vermişdir .((“Günün qadını” jurnalının altmış doqquzuncu sayı, səhifə yetmiş bir

Bertrand Rassel “Evlilik və əxlaq” adlı kitabının yetmiş beşinci səhifəsində əhalinin sayı ilə bağlı olan fəsildə belə yazır: “İndiki İngiltərədə iki milyondan artıq qadın kişilərdən sayca üstünlük təşkil edir və onlar ürfi adət və ənənələrə əsasən gərək subay ”.qalsınlar. Bu, onlar üçün böyük məhrumiyyətdir

Bir neçə il bundan öncə, İrandakı qəzetlərin birində Almaniyadak subay qadınların ikinci dünya müharibəsindəki kişilərin tələfat və itkisi səbəbi ilə ailə həyatı qurmadıqları və ev-eşik sahibi olmadıqlarından, Alman hökumətinə müraciət edərək bir zövcəyə sahib olmaqla bağlı qanunun ləğv edilməsini və çoxlu sayda zövcəyə sahib olmağa icazə verilməsini rəsmi şəkildə tələb etdiklərini oxumuşduq. Almaniya hökuməti Əl-Əhzər islami universitetə müraciət edərək bu məsələnin formul və qaydasını onlardan öyrənmək istəmişdi. Əlbəttə, sonradan kilsənin bu məsələyə qarşı ciddi müxalifət göstərdiyi də məlum oldu. Çoxarvadlılıq məsələsinin Şərq və İslama aid bir xüsusiyyət olduğu üçün, kilsələr açıq-aşkar şəkildə fahişəliyin yayılması və qadınların qanuni .surətdə ailə sahibi olmaqdan məhrum qalmasına üstünlük verirdi

**...Evliliyə hazır olan qadınların sayca evliliyə hazır**

Evliliyə hazır olan qadınların sayca evliliyə hazır kişilərdən çox olmasının səbəbləri

Görəsən, bu məsələyə səbəb nədir? Qız uşaqlarının dünyaya gəlməsi oğlan uşaqlarının doğulmasından az olmasına baxmayaraq, nə üçün evliliyə hazır və yetkin ?qadınlar sayca kişilərdən çoxdurlar

Bu məsələnin səbəbləri aydındır. Kişi cinsinin tələfat və aradan getməsi qadınlara nisbətdə daha artıqdır. Eyni zamanda, bu cür itkilər kişilərin ailə başçısı olmalı olduqları vaxtlarda baş vermişdir. Əgər müharibə, zəlzələ, boğulmalar, uçqunlar altında qalmalar, qəzalar və s kimi müəyyən hadisələr səbəbi ilə qarşıya çıxan ölüm hallarına azacıq da olsa diqqət etsək, həmin hadisələrdə daha çox kişi cinsinin tələf olduğunu müşahidə edərik. Onlar arasında qadın cinsinin olması daha az nəzərə çarpır. İstər insanın insanla, istərsə də insanın təbiətlə bağlı apardığı mübarizələrdə, adətən, .tələfat kişi cinsinə dəymiş olur

Bis təkcə tarixlər boyu bir gün də olsun belə, dünyanın əksər məntəqəsinin müharibələrsiz ötüşmədiyinə nəzər salsaq, bu, kişilərin nə üçün itkilərə məruz qaldığını və kişi ilə qadın arasında evlilik yaşındakı tarazlıq və mizanın pozulduğunu anlamağımıza kifayət edər. Sənaye hərəkatı əsrindəki müharibələrdə baş verən kişilərin tələfat və itkisi ovçuluq və əkinçilik zamanında baş verənlərin yüz qatı və bərabəridir. Son iki dünya müharibəsi illərində kişilərə dəyən tələfat - yetmiş milyon nəfərə yaxın kişi öldürülmüşdü - neçə-neçə əsr ərzində bəşəriyyətə üz verən tələfatlara bərabərdir. Əgər siz son bir neçə il ərzində yaxın və uzaq Şərqdə baş verən və Afrikada isə hələ də davam etməkdə olan mətnəqə müharibələrinə diqqət etsəniz, .bizim iddia etdiklərimizi təsdiq edəcəksiniz

Vil Dorant yazır: "Çoxarvadlılıq ilə bağlı adətlərin aradan qalxmasında bir neçə amil təsirli olmuş və dəxalət etmişdir. Sabit şəkildə olan əkinçilik məşğuliyyəti kişilərin həyatındakı çətinlikləri azaltmış və xətərlər nisbətən aradan qaldırılmışdı. Bu ".səbəbdən də, kişi və qadınların sayı, təqribən, bir-biri ilə bərabərləşmişdi

Vil Dorantın bu cür sözləri qeyd etməsi insanda təəccüb doğurur. Əgər kişilərin tələfat və itkisini sadəcə təbiətlə mübarizə ilə əlaqələndirsək, əlbəttə, ovçuluq zamanındakı tələfatla əkinçilik zamannındakı tələfatlar arasında müəyyən fərqlər meydana gələcək. Halbuki, kişilərin itkisinə daha çox müharibələr səbəb olmuşdur ki, bu da əkinçilik dövrlərində heç də ovçuluqdan az olmamışdır. Eyni zamanda, kişilər həmişə

qadınları öz himayəsinə götürmüş, çətin və ölüm təhlükəsi olan işlərlə özü məşğul olmuşdur. Ovçuluq zamanında kişi və qadın arasında mövcud olmayan bu cür tarazlıq, eynilə əkinçilik zamanında da var idi. Vil Dorant kişi və qadın arasındakı say tarazlığının açıq-aşkar pozulduğu müşahidə edilən maşınlı sənaye və texniki inkişafla bağlı bir .kəlmə də olsun danışmır

## Xəstəliklər müqabilində qadının daha çox müqavimətli olması

Kişi cinsinin qadın cinsinə nisbətdə daha çox tələf olmasına səbəb olan digər bir amil son zamanlarda elm sayəsində kəşf edilən "qadının xəstəliklər müqabilində müqavimətinin kişidən daha çox olması" amilidir ki, bunun nəticəsində, kişilər .xəstəliklər vasitəsi ilə daha çox tələf olurlar

Məlumat" qəzitində hicri-qəməri min üç yüz otuz beşinci ildə belə yazılmışdı: "Fransa" statistik məlumatlar bürosu orada dünyaya gələn oğlan uşaqlarının qız uşaqlarının sayından çox olmasına və hər yüz qız uşağına nisbətdə yüz beş oğlan uşağının doğulmasına baxmayaraq, ölkədəki qadınların sayının kişilərdən bir milyon yeddi yüz altmış beş min nəfər çox olduğunu bildirmiş və bunun səbəbi kimi, qadın cinsinin kişilərdən fərqli olaraq xəstəliklər müqabilində daha çox müqavimət göstərə bilməsini ".vurğulamışlar

Min üç yüz otuz altıncı ildə (hicri-qəməri) nəşr eilmiş "Söz" jurnalının on birinci sayında "Siyasət və cəmiyyətdə qadın" başlığı altında Yuneskonun aylıq nəşr edilən jurnallarından doktor Zəhra Xanlerinin vasitəsi ilə bir məqalə tərcümə edilərək dərc olunmuşdu. Həmin məqalədə Eşli Montaqodan belə nəql edilmişdi: "Elmi cəhətdən kişinin təbiəti qadın təbiətindən fərqlərə malikdir. Qadına məxsus olan X xromosomları kişiyə mənsub Y xromosomlarından daha qüvvətlidir. Bu səbəbdən, qadının ömrü kişi ömründən daha uzun, qadın ömrünün orta həddi kişininkindən daha çoxdur və ümumi halda, qadın kişidən daha sağlam, əksər xəstəliklər müqabilində də kişiyə nisbətdə daha müqavimətlidir. Əksər halda qadınlar çox tez müalicə

olunurlar. Bir alkolik qadın müqabilində beş alkolik kişi dayanır. Bir kürən qadına nisbətdə on altı kürən kişinin olduğu deyilə bilər. İstiqanlılıq (stress) kişilərə məxsusdur və qadınlar hadisələr müqabilində soyuqqanlı və müqavimətlidirlər. Son zamanlarda baş verən müharibələrdə qadınların kişilərdən daha çox mühasirə və zindan həyatına dözə və tab gətirə bildiyi müəyyən edilmişdir. Bütün ölkələrdə intiharın kişilər ” .arasındakı sayı, təqribən, qadınlar arasındakının üç bərabəridir

Eşli Montaqonun qadınların xəstəliklər müqabilində daha çox müqavimət göstərə bilməsi ilə əlaqədar nəzəriyyələri sonralar “Qadın – ən üstün cins (varlıq)” adlı kitabında toplanmış və Hisamuddin İmami tərəfindən tərcümə edilərək “Günün qadını” jurnalının .yetmişinci sayında dərc edilmişdir

Qadınların xəstəliklər müqabilindəki daha çox müqavimət göstərə bilmək qabiliyyəti (fərziyyəsini) bir gün kişilərin qüdrət toplayaraq onlardan intiqam almaq istəməsi, qadınları çətin və ölüm təhlükəsi olan işlərə, xüsusən də, onları döyüş meydanlarına apara və zərif vücudunu top-tüfəng və bomba partlayışlarının mərkəzində yerləşdirərək onları bu hissi duymağa vadar etməsinə səbəb olmasını söyləmək və bir daha qadınların xəstəlik qarşısında müqavimətini bildirməklə kişi və qadının sayı .arasındakı tarazlıq qorunub saxlanıla bilməyəcək

Bunların evliliyə hazır olan qadınların kişilər üzərindəki nisbi say çoxluğunu demək üçün ilkin müqəddimə olduğunu qeyd edirik. Deməli, belə bir həqiqətin varlığı və onun yaranma səbəbləri və həmin səbəblərin tarixlər boyu və indiyə qədər də mövcud .olduğu məlum oldu

### Bir neçə ərə malik olduqda qadının haqqı

İndi isə ikinci müqəddimə barəsində danışaq. Yəni, evliliyə hazır qadınların evliliyə hazır kişilərdən sayca çox olmasının qadın təbəqəsi üçün “haqq” və evli kişi və qadınlar üçün isə “vəzifə” və “məsuliyyət” yaradıb-yaratmaması məsələsinə diqqət edək. Evliliyin bəşərin ən əsas və təbii haqlarından olması barədə bizim heç bir sübhəmiz ,yoxdur. İstər kişi olsun, istərsə də qadın

hər bir şəxsin məskən, yaşamaq, yemək, təhsil, iş, azadlıq və əmniyyət və s. hüquqları olduğu kimi, onların evlənmək, ailə qurmaq, ər və övladlardan bəhrələnmək haqqı .vardır

Cəmiyyət bu hüquqların əldə olunmasına mane olmamalı, əksinə onun həyata keçirilməsi üçün bütün vasitələri təmin etməlidir. Bizim fikrimizcə, bəşər hüququ ilə əlaqədar irəli sürülən tezislərdə mövcud olan ən böyük naqislik və çatışmamazlıq evlənmək məsələsinə diqqət edilməməsindədir. Orada azadlıq və əmniyyət, beynəlxalq məhkəməyə müraciət, tabeçilik və tabe olmamaq, hər hansı bir irq, millət və dindən olmasına baxmayaraq, evlənməkdə azadlq, mülkiyyət hüququ, təşkilat yaratmaq, istirahət və s. kimi hüquqlar yad olunur, amma qanuni olaraq evlilik haqqının, yəni ailəyə sahib olma haqının olmasından söhbət açılmır. Bu haqqın .olmasına daha çox qadın ehtiyaclıdır və o kişidən daha artıq ev və ailəyə möhtacdır

İyirmi yeddinci məqaləmizdə evliliyin kişi üçün maddi, qadın üçün isə mənəvi və atifə xarakter daşıdığını bildirmişdik. Əgər kişi ailəsini əldən verərsə, haradasa, qadınbazlıq və fahişəliklə öz ehtiyaclarını təmin edə bilər. Amma qadın üçün ailə bundan artıq əhəmiyyət kəsb edir. Əgər qadın ailə mühitini əldən verərsə, fahişəlik və rəfiqbazlıqla öz maddi və mənəvi ehtiyaclarını heç vaxt – hətta, azacıq da olsa belə – təmin edib ödəyə bilməz. Kişi üçün evlilik haqqı onun qərizə və ehtiyaclarının təmin edilməsi, şərik, həmdəm və zövcəyə və qanuni övlada sahib olmaq hüququ deməkdir. Amma qadın üçün bu haqq dediklərimiz bütün haqlardan əlavə, onun özünə hami və dəstək olacaq, .eyni zamanda, hisslərini bölüşəcəyi bir adamın olması mənasındadır

:İndi yuxarıdakı iki müqəddiməni sübuta yetirdikdən sonra belə deyə bilərik

.Nisbi olaraq qadınlar sayca kişilərdən çoxluq təşkil edir .۱

.Evlənmək haqqı bəşərin ən təbii haqlarındandır .۲

Nəticədə, əgər bir zövcəyə malik olmaq evliliyin yeganə qanuni forması olarsa, çoxlu sayda qadınların bu təbii haqdan (evlənmək haqqı) məhrum olacağını bilməliyik. Bu təbii olan

haqlar təkcə çoxarvadlılıq ilə bağlı olan qanunlarla – əlbəttə, sahib olduğu xüsusi şəraitlə birgə – həyata keçirilə bilər. Müsəlmanlar arasındakı mütəfəkkir qadınlar yenidən öz şəxsiyyətlərini əldə edərək qadın hüquqlarını himayə, əxlaqı qorumaq, insan nəslinin mühafizəsi və bəşərin ən təbii hüquqları adı ilə Birləşmiş Millətlər Təşkilatının hüquqi komissiyasında təklif irəli sürməli və İslamın dediyi məntiqə əsasən, zövcələrin sayca çoxluğu məsələsinin rəsmi olaraq tanınmasına .çalışmalıdırlar. Bu yolla onlar qadın cinsi və əxlaqa ən böyük xidmət göstərmiş olarlar

Sadəcə Şərqə mənsub olması və Qərbin də onu izləməsi məsələsində heç bir günah və .(qəbahət mövcud deyil (yəni, Qərb də bunu izləyə bilər

**Rassel nəzəriyyəsi**

Bertrand Rassel – əvvəldə də işarə etdiyimiz kimi – bir zövcəyə malik olmanın qanuni şəkildə qəbul edilməsi məsələsinin çoxlu sayda qadınların evlilikdən məhrum olması ilə nəticələnəcəyi etiqadına sahibdir. Beləliklə, o, məsələnin həlli yolunu təklif edir. Amma necə bir həll yolu?! Çox sadə. O, qadınların övlada sahib olmaqdan məhrum olmaması, qadınbaz kişilərin tələsinə düşməməsi və qadının hamilə olduğu müddətdə kişinin kömək və qadının ehtiyaclarının ödənməsi üçün ona nəfəqə verməsinə möhtac olduğuna görə, dövlətin bu vəzifəni icra etməkdə atanın canişininin olmasını və belə .qadınlara iqtisadi və maddi baxımdan yardım göstərsini təklif edir

Rassel “Hazırda İngiltərədə bir milyondan artıq qadının sayca kişilərdən üstünlük təşkil etdiyini və camaat arasındakı adət və ürfə (bir zövcəyə malik olmaqla bağlı) əsasən, onların subay qalacaqlarını və bu qadınlar üçün ən böyük məhrumiyyətdir” dedikdən :sonra, belə yazır

Bir qadına sahib olmaqla bağlı olan evlilik kişi və qadınların sayca təqribi bərabərliyi“ fərziyyəsinə əsaslanır. Bərabərliyin mövcud olmadığı yerlərdə kişilərin subay qalması məcburiyyəti insanlarda mənfi təsirlər yaradır. Əgər əhalinin sayca artırılmasına

meyilli olsaq, bu məsələ ümumi düşüncələri kənara qoysaq belə, xüsusi nəzərlərə ".əsasən də qəbul edilməyəcək

İyirminci əsrdə yaşayan filosofun ictimai bir məsələnin həlli ilə bağlı irəli sürdüyü təklifin bu şəkildə olması ilə İslamın irəli sürdüyü təklif arasındakı fərqə diqqət edin. İslam bu məsələni həll edərkən bir kişinin iqtisadi və cismi imkanlara malik olduğu zaman, birdən artıq qadınla evlənə bildiyini, ikinci qadının da onun qanuni və rəsmi zövcəsi hesab edildiyini, birinci qadınından dünyaya gələn övladları ilə ikinci qadından doğulmuş övladları arasında heç bir ayrı-seçkilik qoymamalı olduğunu, eyni zamanda, birinci qadının ikinci qadına nisbətdə ictimai bir vəzifə olaraq sanki öz bacısı imiş kimi, ona qarşı fədakarlıq etməli və bu cür müştərəklik və bərabərlik sosializmin .əsaslarından hesab edildiyi kimi, onu qəbul etməli olduğunu bildirir

Amma XX əsrin bu filosofu isə belə deyir: "Ərdən məhrum olan qadınlar qeyri-qanuni uşaq dünyaya gətirdikləri zaman, dövlət onların qayğısına qalmalıdır. Həmin filosofun nəzərində qadının evliliyə olan ehtiyacı üç cəhətdəndir: Birincisi, kişi vasitəsi ilə onun cinsi tələbatları daha yaxşı şəkildə təmin edilir. İkincisi, onun dolayı yolla (qeyri-qanuni və qeyri-şəri) övlad əldə etməsinə yol açır. Üçüncüsü, onun iqtisadi ehtiyaclarının ödənməsi məsələsidir ki, bu da dövlət vasitəsi ilə həyata keçirilməlidir. Rasselin düşüncələrinə əsasən, qadının ehtiyac duymadığı və əhəmiyyət kəsb etməyən məsələlərdən biri qadının ərinin davamlı məhəbbətinə ehtiyac duymamasıdır. Yəni, qadın kişinin onu öz himayəsinə götürməsini və onun qadınla təmas və ünsiyyətinin .təkcə cinsi tələbatlarını ödəməklə bağlı olmamasını istəyir

Filosofun nəzərində, əhəmiyyət kəsb etməyən digər məsələ bu vasitə ilə (qeyri-qanuni) dünyaya gələn uşağın pərişan və narahatedici halıdır. Hər bir uşaq və hər bir insan ata və anasının bilinməsinə, eyni zamanda, valideynlərinin ona qarşı davamlı .məhəbbət göstərməsinə ehtiyaclıdır

Təcrübələr qadının atası məlum olmayan uşaq dünyaya

gətirdiyi zaman, ata tərəfindən özünə qarşı qayğı və məhəbbət görmədiyi üçün öz uşağına kifayət qədər məhəbbət göstərə bilmədiyini nişan vermişdir. Belə olduğu təqdirdə, məhəbbətlə bağlı yaranan çatışmamazlığı haradan təmin etmək olar? Görəsən, dövlət bunu təmin edə bilərmi? Cənab Rassel onun irəli sürdüyü təklifin qanun şəklində qəbul olunmayacağı təqdirdə, çoxlu sayda qadınların subay qalacaqlarına təəssüf etdiyini bildirir. Amma Rasselin özü də yaxşı bilir ki, İngiltərədəki qadınlar belə bir qanunun həyata keçirilməsində cəsarətə malik deyillər. Onlar əməldə .özləri tərəfindən subaylıq və atasız uşaqlar məsələsini həll etməyə çalışmışıar

**...Hər on ingiltərəlidən biri**

ci il (hixri-qəməri) tarixli məlumatlarda "Hər on ingiltərəldən biri-٢٥/٠٩/١٣٣٨ :haramzadədir" başlığı altında belə yazılmışdı

On altı dekabr, London, Fransa "Roter" informasiya agentliyi, London şəhər tibb işçisi" doktor J.A.Skatın dediklərin əsasən, İngiltərənin London şəhərində keçən il dünyaya gələn hər on uşaqdan birinin qeyri-qanuni olduğunu bildirir. Doktor Skat qeyri-qanuni və qeyri-şəri uşaqların doğum sayının getdikcə artmaqda olduğunu və ١٩٥٧-ci ildə otuz üç min səkkiz yüz əlli səkkiz nəfər təşkil edirdisə, bu rəqəmin sonrakı ildə əlli üç min ".dörd yüz otuz üç nəfərə çatdığını qeyd etmişdir

İngiltərə xalqı Rasselin irəli sürdüyü təklifin qanuni formada həyata keçirilməsinin intizarında olmazdan öncə, bu məsələ və problemi yuxarıda qeyd edildiyi kimi, öz .aralarında həll etdi

**?Çoxarvadlılığa mane olmaq və həmcinsbazlığın yayılması rəvadırmı**

İngiltərə dövləti tamamilə Rassel nəzəriyyəsinin əksinə əməl etdi. Subay qadınların vəzifə və məsuliyyətini aydınlaşdırmaq və onlar üçün hansısa hüquqları kişilərin vücudunda müəyyən etmək yerinə, İngiltərə hökuməti qadınların kişilərdən tamamilə məhrum olması ilə nəticələnən bir iş gördü. Əvvəlki həftədə "həmcinsbazlıq" qanunun .qəbul edilməsi ilə bağlı məsələni sona çatdırdı

cı il (hicri-qəməri) tarixində “Məlumat” qəzeti belə bir informasiya verdi:-۱۴/۰۴/۱۳۴۶ “İngiltərənin Lordlar palatası “həmcinsbazlıq” qanununu iki cələsədə qəbul etdi. İlkin olaraq İngiltərə avamlar məclisinə göndərilən bu qanun tez bir zamanda Britaniya ”.kraliçəsi (şahzadəsi) ikinci Yelizaveta tərəfindən dəstəkləndi

Hal-hazırda İngiltərədə çoxarvadlılıq qadağan olunmuş və həmcinsbazlıq isə geniş yayılmışdır. Bu camaatın nəzərində, əgər kişi qadının üstünə günü (ikinci bir arvad) gətirərsə, qəbul olunası deyil, sanki o, insanlığa sığışmayan bir iş görmüşdür, amma kişi cinsindən olan bir günü gətirsə, bu zaman, insani, şərafətli və XX əsrin tələblərinə uyğun olan bir iş görmüşdür. Başqa bir ifadə ilə desək, İngiltərənin nikah qanunları və məsələni həll edənlərinə görə, əgər gününün bığ və saqqalı olsa, çoxarvadlılığın heç bir .maneəsi yoxdur

Qərb ailə problem və çətinlikləri, həmçinin, cinsi məsələləri həll etmişdir, biz də gərək“ onların “məsələnin həlli üslubu”ndan istifadə edək” - deyilən zaman, yuxarıda .söylədiyimiz həll yolu nəzərdə tutulmalıdır

Bu cür məsələlər mənim üçün o qədər də təəccüb doğurmur. Ailə və cinsi problemlərin həlli ilə bağlı tutduğu bu mövqe ilə Qərbin nəticəsi bundan başqa, bir nəticəyə çatmayacaqdı. Əgər bundan başqa bir nəticəyə çatsaydılar, onda təəccüblənməyə .ehtiyac vardı

Həqiqətdə, məni heyrətə salan məsələ budur ki, nə üçün bizim camaatımız öz məntiqlərini əldən verir?! Nə üçün bizim bugünkü ali təhsilli gənc və cavanlarımız hadisələri düzgün təhlil və dərketmə qabiliyyətinə çox az malikdirlər?! Görəsən, niyə öz şəxsiyyətlərini əldən verirlər?! Nə üçün əllərində ləl-cəvahir olduğu zaman əgər dünyanın o tayındakı camaat “sizin əlinizdəki qozdur” - deyərsə, ona inanır və əllərindəkini bir kənara tullayırlar?! Amma əcnəbilərin əlində bir qozu gördükləri və onlara “sizin əlinizdəki ləl-cəvahiratdır” - dedikləri zaman, görəsən, onlar buna inanır !?və söz onların ağıllarına batırmı

## ?Görəsən, kişinin təbiət və fitrəti neçə zövcəyə meyillidir

Bəlkə də, Qərb cəmiyyətinin filosof və psixoloqlarının "kişi təbiət baxımından bir neçə zövcəyə meyilli yaradıldığını və biz zövcəyə malik olmanın onun təbiətinə zidd və müxalif olması" barəsindəki bir əqidəyə sahib olduğunu eşitdiyiniz zaman, çox təəccüb .edəcəksiniz

Vil Dorant "Fəlsəfənin ləzzətləri" adlı əsərinin doxsan birinci səhifəsində bugünkü cəmiyyətdə cinsi məsələlər baxımından əxlaqi pozğunluqların olması mövzusunu şərh etdikdən sonra belə yazır: "Şübhəsiz, bu əxlaqi pozğunluqların çoxu kişinin təbiəti ilə əlaqədar olan bir qadınla kifayətlənməmək kimi "islah olunmaz əlaqələr"in nəticəsində yaranmışdır. Kişi zatən bir neçə zövcənin olmasına meyillidir və fəqət ən güclü əxlaqi normalar, münasib mizanlı çətin iş və fəqirlik, həmçinin, zövcənin daimi nəzarəti kimi ".məsələlər kişini bir zövcə ilə kifayətlənməyə məcbur edə bilər

Günün qadını" jurnalının yüz on ikinci sayında "Görəsən, kişi xəyanətkardırmı?" adı" :altında belə yazılmışdı

Almaniyalı professor Eşmid demişdir: "...Tarixlər boyu kişi xəyanətkar olmuş və qadın " da onun xəyanətini izləmişdir. Orta əsrlərdə də dəlil və sübutlara əsaslanaraq doxsan faiz cavanların dəfələrlə öz rəfiqələrini əvəz edərək dəyişdiyini və əlli faiz evli kişilərin də öz qadınlarına xəyanət etdiyini söyləyə bilərik. "Məşhur Amerika tədqiqatçısı Robert Kenzi öz qeydlərində - həmin qeydlər "Kenzinin raportları" adı ilə tanınır - yazır: "Amerikalı kişi və qadınlar bir-birinə xəyanət etməkdə dünyanın digər xalqlarını geridə qoyaraq ötüb keçmişlər...Kenzi qeydlərinin digər qismində də qadınların kişilərdən fərqli olaraq ləzzət və eşqbazlıq ardınca olmağa nifrət etdiyini yazmışdır. Bu səbəbdən, o, bəzən kişilərin rəftarlarından baş aça bilmir. Amma kişilər ləzzət axtarışını bir macəra kimi dəyərləndirərək bu yolu aya çıxmaqdan da asan şəkildə gedir. Onun nəzərində, mühüm olan ruhi və mənəvi ləzzətlər deyil, cismi ləzzətlərdir. Kişinin özünü ruhi və atifi msələlərə meyilli kimi göstərməsi onun cismi ləzzətlərin dərki üçün fürsət əldə etmədiyi zamana

qədərdir. Günlərin birində tanınmış həkimlərdən biri mənə dedi ki, kişinin poliqam (dəyişiklik sevmək və sayca çoxluğa meylin olması) və qadının monoqam (inhisarçı və birinə meylliliyi) olması təbii məsələlərdən hesab edilir, çünki kişilərin toxumluğunda milyonlarla sprermatozoidlər əmələ gəlir, halbuki, qadın cinsi baxımdan hazır ".olduğunda, ondan bir dənə də olsun hücüeyrə belə, yaranmır

Kenzinin nəzəriyyəsini bir kənara qoyaraq özümüzdən soruşa bilərik ki, kişinin vəfalı ?və sadiq ola bilməsi çətin bir məsələdirmi

Fransalı Henri De Monterlan bu sualın cavabında yazmışdır: "Kişinin vəfalı və sadiq olması çətin bir məsələ deyil, əksinə qeyri-mümkündür. Bir qadın bir kişi üçün, amma bir kişi yaşamaq və bütün qadınlar üçün xəlq edilmişdir. Əgər kişi öz qadınına xəyanət edirsə, bu, onun öz təqsiri üzündən deyil. Təbiət və xilqətin təqsiridir, çünki bütün ".xəyanət amillərinin kişinin vücudunda yerləşdirmişdir

Günün qadını" jurnalının yüz iyirminci sayında "Fransasayağı eşq və evlilik" adı ilə nəşr" edilən məqalədə yazılır: "Fransalı ər və arvad vəfasızlıq məsələsini öz aralarında həll edərək onun üçün müəyyən hədd və hüdudlar nəzərdə tutmuşlar. Əgər kişi bu qanun və qaydalar sərhədini aşmasa, onun əməllərinin heç bir əhəmiyyəti yoxdur. Görəsən, iki illik evlilik müddətindən sonra kişi vəfadar qala bilərmi? Qəti şəkildə "xeyr" - deyə cavab verə bilərik, çünki bu, onun təbiətinə ziddir. Amma qadınlar barəsində xoşbəxtlikdən, onların bu sahədə kişilərdn fərqləndiyini və özlərinin də həmin .məsələdən agah olduğunu deyə bilərik

Fransada hansısa bir kişi qadınına xəyanət edərsə, qadın bu məsələdən əsəbləşməz və narazılığını bildirməz, çünki qadın özünə belə təsəlli verir: "O, öz cismini başqa ".qadının yanına aparmışdır, onun ruh və qəlbi isə mənə aiddir

Bir neçə il əvvəl həmin zəminədə ekologiya sahəsində professor olan Rassel Li adlı bir şəxsin "Keyhan" qəzetində nəzəriyyələri çap edilmiş və bir müddət iranlı yazıçı və ,ziyalıların müzakirə mərkəzində olmuşdur. Rassel Linin etiqadına görə

kişilərin bir qadınla kifayətlənməsi gələcək nəsillər üçün kəmiyyət cəhətdən deyil, keyfiyyət cəhətdən xəyanət hesab edilir. Çünki bir qadınla kifayətlənmək kişinin nəslini .zəiflədir. Bir neçə qadına malik olduqda insanın nəsli güclü və qüdrətli olur

Bizim etiqadımıza əsasən, məsələnin kişi təbiəti ilə əlaqələndirilməsi heç də düzgün deyil. Bu cür mütəfəkkirlərə belə bir əqidədə olmaq üçün ilham verən şey həqiqətdə, .kişinin təbiəti deyil, ictimai mühitin xüsusi vəziyyəti olmuşdur

Əlbəttə, biz kişi və qadının ekoloji və psixoloji cəhətdən eyni xüsusiyyətlərə malik olduğunu iddia etmirik. Əksinə, biz kişi və qadın arasında ekoloji və psixoloji baxımdan fərqlərin olduğunu və xilqətin bu fərqlilikdə müəyyən bir hədəfi nəzərdə tutduğu etiqadına malikik. Bu səbəbdən kişi və qadının insanlıq hüquqlarını onların hüquq bərabərliyi və bənzərliyinə bəhanə etmək olmaz. Bir zövcəyə malik olmaq .məsələsində də qəti olaraq kişi və qadın fərqli ruhiyyəyə sahibdir

Qadın təbiətən ərinin bir nəfər olmasına meyillidir. Çoxlu ərə sahib olmaq onun ruhiyyəsi ilə ziddir. Qadının ərinə olan tələbatının ödənilməsi bir neçə ərə sahib olmaq .məsələsi ilə düz və uyğun gəlmir

Amma kişi təbiətən bir zövcəyə meyilli deyil, bu mənada ki, bir neçə qadına sahib olmaq onun ruhiyyəsi ilə ziddiyyət təşkil etmir. Kişinin qadın vücudu ilə bağlı güddüyü təmmәna bir neçə zövcənin olması ilə uyğun gəlir və bu məsələdə heç bir maneə .yoxdur

Biz kişi təbiətinin bir zövcə ilə uyğun gəlməməsi ilə bağlı əqidəyə müxalifik. Biz kişinin dəyişiklik və qadına meylinin islah olunmaz olması fikrini inkar edirik. Eyni zamanda, biz kişinin vəfadar və sadiq olmasının qeyri-mümkünlüyünü və bir qadının bir kişi, bir .kişinin isə bütün qadınlar üçün yaradıldığını deyənlərlə razılaşmırıq

Bizim etiqadımıza əsasən, kişilərdəki xəyanət amillərini təbiət və xilqət deyil, ictimai mühit meydana gətirir. Kişinin etdiyi xəyanətin məsuliyyətlisi xilqət yox, ictimai mühitdir. Xəyanət amillərini bir tərəfdən, qadının yad kişiləri yoldan

çıxarmaq üçün təşviq edən və min bir hiylə ilə onu azdırmağa çalışmaqda əlindən gələni əsirgəməməsinə səbəb olan və digər tərəfdən də, evlənməyə ehtiyac duyan və hazır olan yüzlərlə, bəlkə də, minlərlə qadını “evliliyin yeganə qanuni və rəsmi formasını bir zövcənin olması təşkil edir” bəhanəsi ilə bu haqdan məhrum edən və .qadınları kişilərin yoldan çıxarılması üçün cəmiyyətə təqdim edən mühit yaradır

İslami ölkələrdə Qərb adət və ənənələri yayılmazdan öncə, kişilərin doxsan faizi həqiqətən də, bir zövcəyə malik idilər. Onlar nə birdən artıq zövcəyə malik olmuş, nə də başlarını məşuqə və digər qadınlarla qatmışlar. Bu mənada olan evlilik islami .ölkələrdə ailələrə hakim olan bir məsələ olmuşdur

**Çoxarvadlılıq bir qadına malik olmaqdan nicat tapmaq amilidir**

İslami Şərqdə çoxarvadlılığın bir zövcəyə sahib olmaqdan nicat tapmaqda ən mühüm amili olduğunu söyləsəm, bundan təəccüblənəcəksiniz. Bəli, çoxarvadlılığa icazə verilməsi bir qadına sahib olmaqdan yaxa qurtarmaq üçün ən böyük amil hesab edilmişdir. Bu mənada ki, əgər çoxlu sayda qadınlarla evlənməyə zəruri şərait yaransa və evlənmək istəyən qadınlar sayca kişilərdən çox olduğu zamanlarda həmin qadınların evlənmək haqqı rəsmi şəkildə tanınmasa və kişilər əxlaqi, maddi və cismi baxımdan, qüdrətə malik olsalar, çoxarvadlılığa icazənin verilməməsi nəticəsində .məşuqə və rəfiqəbazlıq bir qadına sahib olmağın kökünü kəsəcək

İslami Şərqdə çoxarvadlılığa baxmayaraq, bütün bunlar azğınlıq və inhiraf üçün hazırlıq və mühərrikə çevrilməmişdir. Eyni zamanda, bir zövcəyə sahib olmaq bütün ailələrə hakim olmuş və kişilərin məşuqəbazlığı hələ qərblilərin onun üçün yavaş-yafaş fəlsəfə yaratması və “kişi təbii cəhətdən çoxlu sayda zövcəyə sahib olmağa meyillidir və bir qadına malik olmaq isə dünyadakı qadağalardan hesab olunur” - deməsinə .gətirib çıxaracaq bir həddə yetişməmişdi

Sizin “bu alimlərin əqidəsinə - kişinin təbii qanunlara

baxımından, çoxarvadlılığa meyilli və ictimai qanunlar cəhətindən isə çox arvadlılığın qadağan olunması – əsasən, kişinin bu iki qanunla bağlı vəzifəsi nədir?” kimi bir sual .verməyiniz mümkündür

Kişinin vəzifəsi bu cür düşünənlərin məktəbində aydındır, yəni kişi qanunda bir zövcəyə, əməldə isə bir neçə qadına malik olmalıdır. Birdən artıq qanuni və rəsmi zövcəyə malik ola bilməz, amma ürəyi isdədiyi qədər məşuqəsi olsa, eyib etməz. Onların əqidəsinə görə, rəfiqəbazlıq və məşuqəni olması kişinin şəri və qanuni olan təbii haqqıdır və həmçinin, kişinin ömrünün sonuna qədər bir qadınla kifayətlənməsi .bir növ, namərdlikdir

**Bəhsimizin həqiqi siması**

Möhtərəm oxucunun bəşərin çoxlu zövcəyə malik olması məsələsi barəsində bəhs edilmiş və edilməkdə olan mövzunun nə olduğunu dərk etməsi üçün artıq vaxtın yetişdiyini güman edirəm. Məsələ bir zövcəyə, yoxsa, çoxlu sayda zövcəyə sahib olmanın yaxşı olub-olmamasında deyil. Bir zövcəyə sahib olmağın daha yaxşı olmasında heç bir şübhəmiz yoxdur. Bir arvadlıq, yəni ailəyə məxsusluq və zövcələrdən hər birinin ruh və cismi baxımdan bir-birinə aid olması. Evlilik həyatının ruhunu tək zövcəyə malik olmağın təşkil etdiyi və zövcələrin bir-birinə nisbətdə .məxsusluğunun daha kamil şəkildə hiss edildiyi aydın və məlum məsələdir

İki yol ayrıcında qalmış bəşərin məqsədi bir zövcəni, yoxsa, bir neçə zövcəni seçmək deyil. Bu cahətdən, bəşər üçün bəyan edilən məsələ ictimai zərurətlər, xüsusən, evliliyə ehtiyaclı və hazır qadınların nisbi sayının kişilərdən çox olması nəticəsində bir zövcəyə sahib olmağın əməldə xətər və təhlükə ilə üz-üzə gəlməsidir. Mütləq şəkildə bir zövcəyə sahib olmaq məsələsinin bütün ailələrə şamil olması məsələsi əfsanədən :başqa, bir şey deyil. Qarşıda iki yoldan birini seçmək lazımdır

Ya zövcələrin sayca çoxluğunun rəsmi olaraq tanınması, ya da məşuqəbazlığın yayılması məsələsi. Başqa bir ifadə ilə desək, evli kişilərdən bir qisminin bi neçə zövcəyə malik olması

vasitəsi ilə – bu, hökmən, kişilərin on faizdən artığını təşkil etməyəcək – ərsiz qadınların ər və ev-eşik sahibi olmasına və ya məşuqəbazlığa geri dönməyə səbəb olacaq. Çünki ikinci halda, hər bir məşuqə bir neçə kişi ilə irtibat və münasibətdə ola biləcəyi səbəbi .ilə evli kişilər haradasa, çoxarvadlı olacaqdır

Bəli, bu, bir neçə zövcəyə sahib olmaq məsələsinin həqiqi simasının bəyan edilməsidir. Amma Qərb üslubunun təbliğatçıları onun həqiqi siması barədə danışmağa hazır deyillər və məsələnin həqiqətini də demək istəmirlər. Onlar açıq-qşkar məşuqəbazlığı müdafiə edərək qanuni zövcəyə sahib olmağı kişinin əl-qolunun bağlanması və ona bir maneə hesab edirlər. Onlar bir zövcənin belə çox olduğunu düşünürlər, qaldı ki, bir neçə zövcəyə sahib olmağı dəstəkləyələr. Belə şəxslər ləzzəti izdivac şərtləri ilə məhdudlaşmayan azad münasibətlərdə axtarır, amma öz danışıq və söhbətlərində özlərini sadəlövh insanlara bir zövcəyə malik olmağı dəstəkləyən kimi göstərirlər. Məsumcasına kişinin vəfasız olmasının deyil, onun bir zövcəyə sahib olaraq qadına .sadiq və vəfalı qalmasının tərəfdarı olduğunu vurğulayırlar

### İyirminci əsrdəki kişilərin hiylələri

İyirminci əsrin kişiləri ailə hüquqlarına aid olan əksər məsələləri aradan qaldıra və azadlıq və bərabərlik kimi qəşəng adalarla qadınları qəflət yuxusunda yatızdıra, onlara vermiş olduğu vədələri yerinə yetirməkdən yayına və öz istəklərinin ardınca gedərək onu daha da artıra bilmişdir. Amma bu arada çoxarvadlılıq məsələsi kimi hansısa bir .məsələ bu qədər gündəmdə olmamış və müvəffəqiyyət əldə etməmişdir

Mən həqiqətən də, bəzi İran yazıçılarının əsərlərini gördüyüm zaman, onların sadəlövh, yoxsa, qafil olduğunu başa düşə bilməkdə şəkk edirəm. Həmin yazıçılardan biri çoxarvadlılıq barədə öz nəzərlərini bu şəkildə ifadə edir: “Hal-hazırda inkişaf etmiş ölkələrdə ər və arvadın münasibətləri qarşılıqlı hüquq və vəzifələrə söykənir və qadınlar tərəfindən coxarvadlılığı onun istənilən forma və şəkli ilə (daimi və müvəqqəti) qəbul etmək və hansısa bir qadın rəqibi ilə ərini paylaşmaq çox çətin bir ”.məsələdir

Mən bu məsələ ilə bağlı həmin şəxslərin həqiqətdə, belə təsəvvürə malik olduğunu, yoxsa, özlərini qəflətə vurduqlarını başa düşə bilmirəm. Görəsən, onlar doğrudan da, çoxarvadlılıq ilə əlaqədar olan məsələnin cəmiyyətdən qaynaqlan bir problem və çətinlik olduğunu və onun bütün evli kişi və qadınlar üzərində məsuliyyət və vəzifə əmələ gətirdiyini, eyni zamanda, həmin problemin həlli üçün çoxarvadlılıqdan daha ?yaxşı bir həll yolu olmadığını anlayaraq başa düşmürlərmi

Onlar bir-birinin üzünə gözlərini döyərək və "yaşasın təkarvadlılıq və çoxaravadlılığa ölüm" şüarlarını verməklə bu problemi həll etməyin mümkün olmadığını anlamırlarmı? Həmçinin, çoxarvadlılığın kişilərin deyil, qadınların hüquqları olduğunu və bu məsələnin ?kişi və qadının qarşılıqlı hüquqları ilə heç bir rabitəsinin olmadığını bilmirlərmi

Məsxərə ediləsi məsələ belə şəxslərin "Qadınlar üçün çoxarvadlılığı qəbul etmək sanki hansısa bir qadın rəqiblə ərlərini paylaşmaq kimi çətindir" - kimi sözlər deməsidir. Bunun yanlış bir müqayisə olduğunu bir kənara qoyaq. Ola bilsin ki, onlar bugünkü dünyanın - həmin kəslər bu zəminədə meydana çıxan hər bir yeniliyi cəzb edir və onların düz və yalnışlığı barədə heç bir tərəddüdə yol vermirlər - daimi olaraq kişidən öz qadınına qarşı məhəbbət və ehtiram göstərməsini və onların həyatında rəqiblərin olmasına da qadınların səbr və dözüm nişan verməsini tələb etdiyini unudurlar. Hazırkı dünya bu çəkilməz yükləri "həsəd", "təəssüb" və "fanatizm" və s. kimi adlar ilə məhkum edir. Kaş ki, bizim cavanlarımız azacıq belə olsa, Qərbdə baş verən cərəyan və !hadisələrin həqiqətindən agah ola biləydilər

Çoxarvadlılığın kişinin təbiətindən deyil, ictimai problemlərdən qaynaqlandığı məlum .və aydın oldu

Cəmiyyətdə evliliyə hazır və qabiliyyətli qadınların nisbi sayının kişilərdən üstünlük təşkil etməsi məsələsinin mövcud olmadığı təqdirdə, çoxarvadlılığın aradan qalxacağı və ya həddən artıq az olacağı məlum bir məsələdir. Əgər belə bir şəraitdə (onun mövcud olduğunu fərz edərək) qadınların ərsiz qalmamasını istəsək, zövcələrin sayca .çoxluğu məsələsi nə kifayətdir, nə də səhih

Bu baxımdan, digər bir neçə şey də gərəkli və zəruridir: Birincisi, evlənməyə ehtiyaclı olan kişilərin ailə qura bilməsi üçün münasib bir iş və kifayət qədər gəlirin, eyni zamanda, ictimai ədalətin olması. İkincisi, qadının öz atası, qardaşı və ya digər şəxslər tərəfindən evli olan hansısa bir pullu kişi ilə evləndirilməsi və onun nikahına keçirilməsinə məcbur edilməməsi və qadının ixtiyar və iradəyə malik olması. Aydın məsələlədir ki, qadın ixtiyar sahibi və kifayət qədər azadlığa malik olarsa, onun subay bir kişi ilə evlənməsi mümkün olduğu təqdirdə, heç vaxt evli və pullu bir kişi ilə .evlənərək günü getməsinə razı olmaz

Qadınların qəyyumları, ata və qardaşları pul və tamah səbəbi ilə qız və bacılarını varlı və evli kişilərlə evlənməyə məcbur edir və onları pula satırlar. Üçüncüsü, ailələrin dağılmasına səbəb olan təhrik edici və azğınlıq yaradan amillər o qədər də çox olmamalıdır. Azğınlıq və inhiraf yaradan amillər evli qadınları öz ərlərinin evindən kənarlaşdıraraq onların yad kişilərin evinə daxil olmasına səbəb olduğu halda, qaldı ki, .dul qadınları yoldan azdırmasın

Əgər cəmiyyət islahatlar aparmaq və həqiqətən də, təkarvadlılıqdan nicat tapmaq istəyirsə, sadaladığımız üç amili nəzərə almalı və bu sahədə təlaş etməlidir. Yoxsa, çoxarvadlılıq qanununun qadağan edilməsinin fahişəliyin yayılmasından başqa, heç bir .təsiri olmayacaqdır

## Ərsiz qadınların məhrumiyyətlərindən qaynaqlanan böhran

Əgər ehtiyaclı qadınların sayı ehtiyaclı olan kişilərin sayından çox olarsa, çoxarvadlılıq qanununun qadağan edilməsi bəşəriyyətə xəyanət hesab edilməlidir, çünki təkcə qadınların hüquqlarının tapdalanması məsələsindən söhbət getmir. Əgər məsələ sadəcə qadınların haqlarının aradan getməsi məsələsi ilə bitsəydi, buna səbir etmək olardı. Bu baxımdan, cəmiyyətdə yaranmış böhran hər bir cəhətdən xətərli və .təhlükəlidir. Həmçinin, ailə də digər bütün məsələlərdən müqəddəs hesab edilir

Öz təbii haqlarından məhrum olan və məhrumiyyətə düçar olmuşlar kimi psixoloji və əqidəvi çatışmamazlıqlar zamanı

reaksiya verərərək əksül-əməl göstərən kəs, bir insan və canlı bir varlıq - bütün hiyləgərliklər və insanı aldatmaqda mahir olan şəxs Həvvanın qızıdır. O, buğda və arpanın istifadə olunmayaraq artıq qalmış hissəsi deyil ki, bir kənara atılsın və ya anbarlara yığılaraq ehtiyyat üçün saxlanılsın, həmçinin, ev və otaq da deyil ki, istifadə edilmədikdə qapısına bir qıfıl vurulsun. Bəli, o, canlı bir varlıq, insan və qadındır. Eyni zamanda, o, cəmiyyətdə sakit oturmayaraq öz qüdrətini göstərməyə çalışacaq və onun (cəmiyyətin) nəbzini tutmaq istəyəcəkdir. Qadın belə deyəcəkdir: “Mən haqqımın tapdalanmasına göz yuma bilmərəm.” Həmin söz ailələrin dağılmasına, qəlblərdə kin və həsədin meydana çıxmasına səbəb olan məsələdir. Bəşər düşüncə və etiqadını !qərizələrin öhdəsinə qoyaraq bir-biri ilə əl-ələ verdiyi zaman, vay onun halına

Ailədən məhrum olmuş qadınlar kişiləri azdırmaq və yoldan çıxarmaq üçün bütün səyi - kişilərin ayağı bu sahədə büdrədiyi kimi, heç bir yerdə büdrəmir - və təlaşını göstərəcək və altında qalmaq üçün yükün ağırlığı kifayət etdiyi kimi, ailə körpülərinin .dağılmasına da bu, kifayət edəcəkdir

Görəsən, məsələ bununla sona çatırmı? Xeyr, növbə evli qadınlara yetişir. Öz ərlərinin onlara xəyanət etdiyini görən qadınlar da, kişilərdən intiqam almaq və onlara xəyanət etmək fikrinə düşürlər. Həmçinin, xəyanət məsələsində qadınlar kişilərin tutduğu yolu ?izləyirlər. Bunun son nəticəsi necə olacaq

Həmin məsələnin nəticəsi “Kenzinin raportları” adı altında məşhurlaşmış qeydlərdə bir cümlə ilə xülasələşdirilmişdir. Həmin cümlə belədir: “Amerikalı kişi və qadınlar bir-birinə xəyanət etmək və vəfasızlıqda digər dünya millətlərini ötərək geridə qoymuşlar.” Məsələnin sadəcə kişilərin yoldan azması və inhirafı ilə nəticələnməklə .qalmayaraq, onun atəşində evli qadınların da ətəyinin yanacağına diqqət edin

**...Qadının say çoxluğu meydana gəldiyi zamanlarda müxtəlif şəkildə**

Qadının say çoxluğu meydana gəldiyi zamanlarda müxtəlif şəkildə özünü büruzə verən reaksiyalar

Qadının nisbi çoxluğu məsələsi həmişə bəşər həyatında

mövcud olmuş məsələlərdəndir. Diqqəti çəkən mövzu həmin məsələlərlə bağlı – cəmiyyət üçün müəyyən bir problem və çətinlik yaratmışdır – göstərilən reaksiya və .əksül-əmmələrin qeyri-bərabər və müxtəlif olmasıdır

Ruhiyyəsi təqva və iffətlə çoxl bağlı olan millətlər öz səmavi dinlərinin rəhbərliyi ilə bu problem və çətinlikləri və çoxarvadlılıq məsələsi ilə həll etmiş və iffət və təqva ilə ruhiyyəsi o qədər də uzlaşmayan millətlər isə qarşıya çıxan məsələdən fahişəlik .vasitəsi kimi istifadə etməyə çalışmışlar

Çoxarvadlılığın Şərqdə geniş yayılması nə İslam dinindən, nə də Qərbdə həmin məsələnin tərk edilməsi məsihilikdən qaynaqlanmamışdır. Hələ İslamdan qabaq, Şərqdə çoxarvadlılıq ilə bağlı adət və ənənələr mövcud olmuş və din vasitəsi ilə də ona icazə verilmişdi. Eyni zamanda, əsil və təhrif edilməmiş məsihilik dinində də çoxarvadlılığın qadağan olunması ilə bağlı hansısa bir nəss olmamışdır. Mövcud olanlar .da sadəcə Qərb millətlərinin özlərinə aiddir, nəinki, məsihilik dininə

Fahişəlik yolunu tutmuş millətlər Şərqdə çoxarvadlılıq yayılmamışdan öncə, təkarvadlılığa zərbə vurmuşdular. “Məhəmmədin (s) həyatı” adlı kitabın müəllifi Məhəmməd Hüseyn zövcələrin sayının çox olması ilə bağlı Quran ayələrini :xatırlatdıqdan sonra, belə yazır

Bu ayələrdə bir qadınla kifayətlənmək daha yaxşı qiymətləndirilir və orada belə“ buyurulur: “Əgər ədalətə riayət edə bilməyəcəyinizdən qorxursunuzsa, onda, bir qadınla evlənin.” Yəni, ayələrdə ədalətə mütləq şəkildə riayət edilə bilinmədiyi məsələsi üzərində daha çox təkid olunur. Eyni zamanda, cəmiyyətdə çoxarvadlılığı tələb edən hadisələrin meydana gəlməsi mümkün olduğu üçün, qadınlarla ədalətli davranmaq şərti ilə ona icazə verilmişdir. Həzrət Məhəmməd (s) baş verən döyüşlərdə müsəlmanlardan bir qrupunun qırılması nəticəsində onların qadınları dul qalmışdır deyə, həmin məsələlərdən istifadə etmişdir. Həqiqətən də, döyüşlər, hərəkat və üsyanlar nəticəsində milyonlarla kişi tələf olduğunda qadınlar ailə başçısız qalarsa, bir zövcə ilə kifayətlənməyin çoxlu qadına sahib olmaqdan yaxşı

olduğunu demək ədalətdən sayılır və bu məsələ doğrudurmu? Görəsən, qərblilər dünya müharibələrindən sonra sadəcə kağızlarda mövcud olan bir qadınla ”?kifayətlənmək qanununun əməldə icra olunduğunu iddia edə bilərlərmi

## Çoxarvadlılığın nöqsan və eyibləri

Evliliyin xoşbəxtlik və səfası, səmimilik, fədakarlıq, vəhdət və birliyin girovundadır və bunların hamısı zövcələrin sayı çox olduqda xətər və təhlükəyə düşür. Qadınların və iki anaya (biri ögey olmaqla) sahib olan uşaqların çətin və çıxılmaz vəziyyətini bir kənara qoymaqla, kişi üçün çoxarvadlılıq məsələsinin həddən artıq məsuliyyət yaratdığını və bunu həyata keçirməyin sanki kişinin öz asayiş və aramlığından üz çevirməsi demək .olduğunu söyləyə bilərik

Adətən, zövcələrin sayının çox olmasından əməldə onun şəri, əxlaqi və qanuni məsuliyyətindən çiyinlərini kənara çəkmiş olan kişilər razıdırlar. Yəni, onlar qadınlardan birinə diqqət edərək digərini nəzərdən qaçırırlar. Quranın təbiri ilə desək, onu (digər qadını) özündən asılı saxlayırlar. Bu formada olan və bəzilərinin də onun adını çoxlu zövcəyə sahiblik qoyduğu evlilik, həqiqətdə, bir zövcəyə malik olmaqdır və bu, zülm, ədalətsizlik və cinayətə bərabər bir məsələdir. Camaat arasında ümumi şəkildə belə bir fikir yayılmışdır: “Allah birdir, qadın da bir.” Həqiqətdə, məsələyə fərdi və şəxsi, eyni zamanda, asayiş və aramlıq prizmasından yanaşsaq, bu cür düşüncə və etiqad düzgündür. Bütün kişilər barəsində doğru olmasa da, əksər kişilər barəsində .gerçəkdir

Əgər bütün kişilər onun bütün əxlaqi və şəri məsuliyyətini qəbul etməklə çoxlu zövcəyə sahib olmağın onların lehinə olduğunu düşünürsə, yanılmaqdadırlar. Təkarvadlılıq asayiş və xoşbəxtlik baxımından bir neçə zövcəyə sahib olmaqdan daha ...yaxşıdır, amma

## Düzgün araşdırma

Çoxarvadlılıq kimi – ictimai və ya şəxsi ehtiyaclardan yaranan – məsələlərin düzgün və ya yanlış olması barədə

araşdırma apardığımızda və onu təkarvadlılıqla müqayisə etdiyimiz zaman, yanlış olduğunu deyə bilərik. Bu cür məsələlərin düzgün tədqiqi onun yaranma səbəbi və meydana çıxmasını zəruri edən şeyləri nəzərə almaq və ona edilən diqqətsizliyə nələrin səbəb olduğunu analiz etməyə əsaslanır. Digər tərəfdən də, bu məsələlərin özündən qaynaqlanan fəsad və naqisliklərə diqqət etmək lazımdır. Belə etdiyimiz təqdirdə, məsələnin hər iki cəhəti və onların ümumi təsir və nəticələri barədə müəyyən mənada məlumat əldə etmək olar. Təkcə bu şəkildə biz məsələnin həqiqi .siması və həqiqəti barədə hansısa bir nəticəyə gələ və onu araşdıra bilərik

Daha artıq izah etmək üçün bir misalı nəzərinizə çatdıraq. İcbari hərbi xidmət barədə nəzər verməli olduğunuzu fərz edin. Əgər təkcə ailələrin manafe və meyilləri prizmasından fikir yürütmək istəsək, şübhəsiz ki, hərbi xidmət yaxşı və bəyənilən bir vəzifə, həmçinin, qanun deyil. Yaşı olardı ki, belə bir vəzifə qanunu mövcud olmasın və ailənin gözünün işığı olan kəslər onların yanından uzaqlaşaraq döyüş meydanına getməsin və ölüm-itim məsələləri ilə üzləşməsinlər. Məsələnin bu şəkildə araşdırılması düzgün deyil. Düzgün formada olan tədqiqat ailəsindən uzaqlaşdırılaraq cəbhə bölgəsinə göndərilən və müdafiəsiz qalan əsgərin düşdüyü çətin vəziyyət ölkənin .mənafeyi üçün nəzərdə tutulduqda mümkündür

Belə olduğu halda, vətənin müdafiəsi üçün əsgər adlı vətən oğullarının cəbhəyə getməsi daha məntiqli və ağılabatan olacaq və ailələr bu zəminədə meydana çıxan .çətinliklərə qarşı səbir və dözümlülük göstərə biləcəklər

Biz əvvəlki bəhslərimizdə zövcələrin sayca çoxluğunun yaranması məsələsində şəxsi və ictimai amillərin rol oynadığını sizin diqqətinizə çatdırmışdıq. İndi isə çoxarvadlılıqdan yaranan bir sıra eyib və naqislikləri araşdırmaq vasitəsi ilə bu zəminədə ümumi bir nəticənin əldə edilməsini istəyir və çoxarvadlılıqla bağlı tutulan iradlardan bəzisini qəbul etməməyimizə (həmin iradları tezliklə aydınlaşdıracağıq) baxmayaraq, irad və çatışmamazlıqların olmasını etiraf etdiyimizi bildiririk. Zövcələrin sayının çoxluğu

barədə edilən iradlar həddən artıqdır və biz bəhsə müxtəlif prizmalardan daxil :olacağıq. Həmin iradlara nəzər salın

**Psixoloji baxımdan**

Evlilik məsələləri təkcə maddi və cismani məsələlərə, yəni bədənin təması və iqtisadi himayələrə məxsus deyil və onlarla xülasələnmir. Əgər sadəcə həmin məsələlərlə xülasələnsəydi, çoxarvadlılıq izah olunmağa qabil olardı, çünki maddi və cismani məsələləri müxtəlif insanlar arasında bölüşdürmək və onların hər birinə bu sahədə .müəyyən səhmlər vermək olardı

Evlilik məsələlərində mühüm və ümdə olan şeylər ruhi, mənəvi, məhəbbət və hissiyyatla bağlı olan məsələlərdir. İki tərəfi bir-biri ilə birləşdirən nöqtə qəlbdir. Eşq və məhəbbət digər psixoloji məsələlər kimi, insanlar arasında bölüşdürülmək xüsusiyyətinə malik deyil. Onu insanlar arasında paylaşdırmaq olmaz. Bəyəm, qəlbi iki ?yerə bölmək və ya onu iki yerdə girov qoymaq olarmı

Onu (qəlbi) iki nəfərə təslim etmək mümkündürmü? Eşq və məhəbbət məsələsi bir tərəflidir və o, şərik və rəqib qəbul etmir. Buğda və arpa deyil ki, onu çəkiyə vuraraq istəyənlərə verə biləsən. Bundan əlavə, hissiyyatlar konturol ediləsi deyil. İnsanlar qəlblərinin ixtiyarındadırlar, nəinki, qəlblər insanların ixtiyarında. Deməli, insanların münasibətlərini heyvanların münasibətlərindən - onların münasibəti sırf şəhvani və instinktiv xüsusiyyətlərə malikdir - fərqləndirən hisslər bölüşdürülməyə, kontrol və tənzim edilməyə qabil deyil. Belə olduğu təqdirdə, çoxarvadlılıq məsələsi məhkum .(edilir (tənqid olunur

Bizim etiqadımıza əsasən, yuxarıda bəyan edilən məsələlərdə səhv və yanlış olan xüsusiyyətlər mövcud olmamış deyil. Evlilik ruhunu hissiyyat və atifələrin təşkil etməsi, qəlbi hislərin insanın ixtiyarından asılı olmadığı doğrudur. Amma hissiyyatların kontrol və tənzim edilməyə qabil olmadığını demək şairanə təxəyyül və səhvlikdən başqa, bir şey deyil. Çünki söhbət hissiyyatların cisim kimi bölüşdürülməsindən getmir ki, onun insanlar arasında paylaşdırmağın mümkün olmadığı deyilsin. Söhbət insanların ruhi zərfiyyət və tutumundan gedir. Bəşərin ruhi zərfiyyət və tutumu iki

münasibətə özündə yer verə bilməyəcək qədər də məhdud deyil. Bir ata on dənə övlada sahib ola və onların hər birinə öz sevgisini verə və onlar üçün fədakarlıq edə .bilir

Bəli, ortada aydın olan bir məsələ var və o da çoxarvadlılıqda hissiyyat və məhəbbət məsələsinin təkarvadlılıqdakı kimi özünün zirvə və pik nöqtəsinə qalxmadığıdır. Sevgi və məhəbbətin zirvə və pik nöqtəsinə çatması çoxarvadlılıqla uyğun gəlmir, həmçinin, .bu məsələ əqli və məntiqi baxımdan da düz gəlmir

:Bertrand Rassel "Evlilik və əxlaq" adlı kitabında yazır

Bugünkü insanların əksəriyyəti eşq və məhəbbət məsələsini hissiyyatların münsifanə" mübadiləsi kimi başa düşür. Təkcə bu dəlilin özünü digər məsələləri nəzərə almadan ".sübut gətirmək çoxarvadlılıq məsələsini tənqid və onu məhkum etməyə kifayət edir

Mən hissiyyatların münsifanə mübadiləsində inhisarın nə üçün mövcud olduğunu anlaya bilmirəm. Görəsən, çoxlu övlada sahib olan ata öz uşaqlarına məhəbbət göstərdiyi və uşaqlarının da atasına qarşı eyni məhəbbətə sahib olduqları zaman, bu məsələdə hissiyyatlar münsifanə şəkildə deyilmi? Həqiqətdə, övladların sayca çox .olması atanın övladlarına qarşı olan məhəbbətinin həddən artıq olmasına səbəb olur

Məsələnin təəccüblü tərəfi kişilərə öz qadınlarının yad şəxslərə qarşı göstərdiyi sevgisinə ehtiram göstərməsini və onların aşiqanə münasibətlərinə mane olmamalarını tövsiyə edən şəxslərin bu sözləri danışmasıdır. Eyni zamanda, həmin şəxslər bu məsələni qadınlara da tövsiyə edirlər. Görəsən, yenə də Rasselin etiqadına ?əsasən, kişi və qadın arasındakı hissiyyatlar münsifanədirmi

### Tərbiyə baxımından

Günü (ikinci qadın) məsələsi uyğunsuzluq üçün bir zərbül-məsələ çevrilmişdir. Qadın üçün günü məsələsi kimi düşmən hesab edilən bir şey mövcud deyil. Çoxlu zövcənin olması məsələsi qadınları bir-birinin, xüsusən də, ərlərinin əleyhinə tədbir tökməsinə məcbur edir və səfa və aramlıq mühiti olmalı olan ailə

mühitinin münaqişə və mübahisə, həmçinin, intiqam və kin meydanına çevrilməsinə səbəb olur. Qadınlar arasında baş verən münaqişə, rəqabət, düşmənçilik və mübahisələr onların övladlarına da mənfi təsir göstərərək sirayət edir və onlar arasında qruplaşmaların yaranmasına səbəb olur. Bu minvalla, ilkin həyat məktəbi və uşaqların psixoloji baxımdan inkişafında və onların yaxşılıq və xeyirli işlərə yönəldilməsində təsirli olan mühit namərdlik və nifaq dərslərinin öyrədilməsi mühitinə .çevrilir

Çoxarvadlılıq məsələsinin tərbiyəvi cəhətdən bütün bu xoşagəlməz təsirlərin yaranma zəminəsi olduğunda şəkk və şübhə yoxdur. Əlbəttə, biz gərək bir məsələni unutmayaq və həmin məsələ tərbiyə cəhətindən təbii məsələlərin nə qədər və çoxarvadlılıqda kişi və ikinci qadının oynadığı rolun nə qədər və hansı dərəcədə təsirli olmasıdır. Bizim nəzərimizcə, həmin narahatlıq və problemlər çoxarvadlılığın təbiəti ilə əlaqədar deyil, .əksinə onun düzgün tərzdə həyata keçirilməməsindədir

Kişi və qadın birlikdə həyat sürür və onların həyatındakı cərəyanlar öz axarı ilə davam edir. Kişi qadının gözləmədiyi halda, birdən-birə digər qadınla evlənmək fikrinə düşür və öz aralarındakı müəyyən razılaşmalardan sonra ikinci qadını birinci zövcəsinin evinə gətirir. Beləliklə, ikinci qadın əvvəlki zövcənin evi və ərinə sahib olan kimi nəzərə çarpır və həqiqətdə, onun həyatında qanıqaraçılıq əmələ gətirir. Birinci qadının belə şəraitdə göstərə biləcəyi əksül-əməl və düşdüyü fikir onun intiqam alması ilə bağlıdır. Qadın .üçün ərinin onu təhqir etməsindən daha alçaldıcı bir şey düşünülə bilməz

Qadın üçün ən böyük məğlubiyyət öz ərinin qəlbini əldə saxlaya bilməyərək onu əlindən verməsi və digər bir qadının ona sahib olduğunu müşahidə etməkdir. Kişi çox arvadlılıq fikrinə düşdüyü və ikinci qadının da qanıqaraçılıq etdiyi zamanlarda birinci .zövcədən bu şəraitə razılaşmaq və səbr etməyi gözləmək yersiz bir intizardır

Amma kişi öz birinci qadınına qarşı məsuliyyət hissi keçirərək ona öz məhəbbətini artırsa, birinci qadın da ərinin ona biganə və etinasız olmadığını və təmin olunmadığı üçün bu məsələdə üzürlü olduğunu görsə, həmçinin, ikinci zövcə də

ərinin birinci qadına qarşı vəzifəyə sahib və qadının da bunda haqqı olduğunu anlasa, başqa bir ifadə ilə desək, tərəflər ictimai bir məsələ ilə bağlı addım atdığını düşünərək .bir-birinə dəstək olsa, daxili problemlər ortadan tədricən qalxacaqdır

Çoxarvadlılıq məsələsi cəmiyyətdən qaynaqlanan mütərəqqi həll yollarına malikdir. Onun icraçıları, hökmən, ali səviyyədə təfəkkür eməli və islami tərbiyədən yararlanmalıdırlar. Təcrübələr kişinin ikinci qadına ehtiyaclı olduğu, amma bu sahədə addım atmadığı zamanlarda qadın məsələni anlamış olarasa, onun özünün cəsarətli olaraq ikinci qadını ərinin evinə gətirdiyini və heç bir narahatçılıq və problemin də .yaranmadığını nişan verib göstərmişdir

Adətən, kişilərin bu məsələni həyata keçirərkən istifadə etdikləri vəhşiliklər bir sıra .problemlərin yaranmasına səbəb olur

**Əxlaqi baxımdan**

Çoxarvadlılıq ilə bağlı icazə verilməsinin şəhvətə icazə vermək olduğunu deyirlər. Yəni, kişinin şəhvətbazlıq etməsinə icazə verilir. Əxlaq insanı şəhvani hislərini mümkün olduğu qədər minimuma azaltmağa yönəldir, çünki insan şəhvətinin qarşısını almazsa, .o, daha da artaraq alovlanacaqdır İnsan təbiəti belədir

Montesko “Qanunların ruhu” (Ruhul-qəvanin) əsərinin dörd yüz qırx üçüncü :səhifəsində çoxarvadlılıq barədə belə yazır

Mərakeş padşahının hərəmxanasında ağ, sarı və qaradərili olmaqla, bütün irqlərdən“ qadınlar var idi. Əgər bu şəxs sahib olduğu qadınların iki bərabəri qədər də qadına sahib olsa, yenə də təzə qadınlar almaq istəyəcək. Şəhvət məsələsi elə bir məsələdir ki, nə qədər artırılsa, bir o qədər şiddətlənəcək. Çoxarvadlılıq eyni zamanda, insanın təbiəti ilə zidd və müxalif olan məsələni (həmcinsbazlığı) də insana təlim verərək onun yayılmasına səbəb olur. Çünki şəhvətlə bağlı məsələlərdə müəyyən olunmuş hədlərdən xaric olmaq əməldə qanun tanımayan halların yaranmasına səbəb olur. Orada hərəkat baş verdiyi zaman hərəmxanalarda, hətta, bir qadına belə sahib olan hökmdar tapma mümkün olmurdu, o hökmdarlar öz eşqbazlıqlarını təbiət və

”.fitrətlərinə zidd olaraq həyata keçirirdilər

Bu iradı iki cəhətdən tədiqiq edərək araşdırmaq lazımdır: Birincisi, düzgün və pak əxlaqın şəhvətlə uyğun gəlmədiyini və cəmiyyətin sağlamlaşdırılması üçün onun mümkün qədər azaldılmasının zəruri olduğunu söyləyirlər. İkincisi, insan təbiəti ilə tərs mütənasib olduğunu və onun tələbinə uyğun olaraq daha çox təmin olunduqda coşub-.daşaraq tüğyan etdiyini, amma az təmin edildiyində isə aramlaşdığını bildirirlər

Birinci nəzərlə bağlı təəssüf edərək onun yanlış və səhv bir təlqin olduğunu, həmçinin, məsihilik əxlaqında riyazətə (özünü bir işə və ya əmələ məcbur etməyə) əsaslanaraq hinduist, buddust və yunan əxlaqından təsirlənərək aşılandığını nəzərinizə çatdırırıq. İslam əxlaqı belə məsələlərə əsaslanmır. İslamın nəzərində “şəhvət nə qədər az olsa, bir o qədər yaxşıdır və əgər sıfıra düşərsə, bu, yüz faiz əxlaqlılıqdır” kimi düşünmək .düzgün hesab edilmir. İslam ifrat dərəcəfə olan şəhvətin əxlaqla uzlaşmadığını bildirir

Belə olduğu halda, çoxarvadlılığın ifrat bir məsələ olub olmadığını bilmək üçün, biz kişinin təbii və fitri cəhətdən bir, yoxsa, bir neçə zövcəyə malik olmağa meyilli olduğunu araşdırmalıyıq. Otuz birinci məqaləmizdə söylədiyimiz mətləblərdən günümüzdə kişinin təbii cəhətdən bir zövcə ilə məhdudlaşdığını və çox zövcəyə sahib olmanın da əməldə ifrat və azğınlıq kimi düşünən bir nəfərin olmadığı məlum oldu. Əksinə, çoxları kişinin təbii baxımdan bir neçə zövcəyə malik olmağa meyilli və təkarvadlılığın isə kişinin təbiətinə zidd olaraq onu bu haqdan məhrum etməyə bərabər olduğunu düşünür. Biz kişinin təbiəti baxımından çoxarvadlılığı nəzəriyyəsi ilə müxalif olmağımıza baxmayaraq, onun fitrətən təkarvadlılığı nəzəriyyəsini də qəbul etmir və çoxarvadlılığın kişinin təbiəti ilə zidd və müxalif olan həmcinsbazlıqla eyni .olduğu ilə də müvafiq deyilik

Montesko və çox zövcəyə sahib olmağı şəhvətbazlıqla əlaqləndirən digər şəxlər hərəmxanaları nəzərlərində tuturlar. Onlar İslamın bu məsələdə icazə verməsinin Abbasi, Osmanlı və onların timsalındakı xəlifələrin hərəmxanalar yaratması üçün bir ,vasitə olduğunu hesab edirlər. İslamın özü hər şeydən öncə

həmin məsələlərlə müxalifdir. Çoxlu sayda zövcələrin olması ilə əlaqədar İslamın nəzərdə tutduğu qeyd və şərtlər həvəsbaz kişilərin azadlığını bütövlükdə onların .əlindən alır

İkinci nəzəriyyəyə gəldikdə isə, “insan şəhvəti nə qədər azaldılsa, bir o qədər cilovlana və nə qədər çox təmin edilsə, həddindən artıq coşaraq tüğyan edəcəkdir” kimi söylənən nəzəriyyənin Freyd əqidəsinin tərəfdarları arasında meydana çıxararaq onun xeyrinə təbliğ edilən etiqadın tamamilə müqabil nöqtəsində dayandığını deyə .bilərik

Freyd tərəfdarları belə deyirlər: “Kişinin təbiəti qənaət və razılıq ilə aramlaşır və tələbatının ödənilməsi ilə artaraq tüğyan edir.” Bu insanlar yüz faizlik azadlıq və xüsusən də, cinsi məsələlərdəki sünnə və adətlərin aradan qaldırılması tərəfdarıdırlar. Kaş ki, Montesko sağ olaydı və Freyd tərəfdarlarının onun fərziyyəsini necə !məsxərəyə qoyduğunu görəydi

İslami əxlaq baxımından, hər iki nəzəriyyə və etiqad batildir. Təbiətin özünəməxsus hədd və hüquqları vardır və onları tanımaq lazımdır. Təbiət iki məsələ səbəbi ilə tüğyan edərək aramlığı aradan qaldırır: Birincisi, məhrumiyyət və ikincisi isə, ona tamamilə .azadlıq verərək bütün qeyd və şərtləri onun qarşısından qaldırmaq nəticəsində

Hər halda, Monteskonun dediyi kimi, nə çoxarvadlılıq əxlaq zidd və ruhi aramlığı aradan qaldıran, həmçinin, nəfsin paklığı ilə zidd deyil, nə də Freyd tərəfdarlarının .təbliğ etdiyi kimi, insanın öz şəri və qanuni zövcə və qadınlarına qənaət etmək

### Hüquqi baxımdan

Evlilik əqdi və nikahına əsaslanaraq tərəflərdən hər biri bir-birinə aid hesab edilir. Onların bir-birinə nisbətdə sahib olduğu cinsi münasibət məsələsi evlilik səbəbi ilə həmin məsələyə tərəflərin malik olmasından qaynaqlanır. Bu baxımdan, zövcələrin sayca çoxluğu məsələsində birinci növbədə haqqa sahib olan əvvəlki qadındır. Kişi ilə ikinci zövcə arasında baş verən müamilə, həqiqətdə, artıq bir müamilədir, çünki müamilə mərkəzində yerləşdirilən mal, yəni kişinin evlilik mənfəəti

öncədən birinci zövcəyə satılmışdır və o, həmin malın sahib və maliki hesab edilir. Deməli, bu zəminədə nəzəri barədə maraqlanılan və icazəsi ələ gətirilməli olan şəxs ilkin növbədə birinci qadındır (zövcədir). Belə olduğu təqdirdə, ərinin ikinci dəfə evlənib-evlənməməsi barədə icazə vermək ixtiyarına malik olan və əri barədə qərara verən birinci qadındır. Həqiqətdə, kişinin ikinci, üçüncü və dördüncü dəfə evlənməsi satılmış malın ikinci, üçüncü və dördüncü dəfə digər şəxslərə satılmasına bənzəyir. Aydın məsələdir ki, həmin malın satılması sahiblərinin icazəsi ilə həyata keçirilməlidir və onu satan şəxs malı icazəsiz olaraq digər şəxslərin ixtiyarında qoyarsa, o, .cəzalandırılmalıdır

Bu irad evlilik və izdivacın hüquqi təbiətini manafe mübadiləsinə əsaslandırdığımız və evli tərəflərdən hər birini də digərinin mənafeyinin malik və sahibi hesab etdiyimiz zaman keçərlidir. Mən hazırda bu mətləb barəsində - əlbəttə, o, irad tutulmağa qabildir - bəhs etmirəm. Evliliyin hüquqi təbiətinin elə bu formada olduğunu fərz edirəm. Adı çəkilən iradın yerli irad olduğunu kişi çoxarvadlılığı dəyişiklik və əyləncə kimi dəyərləndirdiyi zaman söyləmək olar. Əgər evliliyin hüquqi təbiəti tərəflərin mənafeyinin mübadiləsi hesab edilər və qadın da bu cəhətdən kişini təmin edərsə, .kişinin heç vaxt çoxarvadlılıq fikrinə düşməyəcəyi aydın məsələdir

Amma evliliyin kişi üçün dəyişiklik və əyləncə cəhəti olmasa və kişi əvvəlki bəhslərdə işarə etdiyimiz kimi, bu zəminədə (çoxarvadlılıq məsələsində) icazəli və üzürlü olsa, ona irad tutmaq yersizdir. Məsələn, qadın cinsi qabiliyyətə malik olmasa, ya yaisəlik yaşına çatsa və kişi də övlad sahibi olmaq istəsə, yaxud da hansısa bir xəstəlik səbəbi ilə qadınla cinsi münasibət mümkün olmasa, belə olan hallarda qadının haqqı çoxarvadlılıqda maneə sayıla bilməz. Bu məsələlər, şəxsən, kişinin çoxlu sayda zövcəyə sahib olmaq istədiyi və buna icazəli olduğu hallarda mümkündür. Amma həmin məsələ ictimai bir hal alsa, yəni evlənməyə ehtiyaclı olan qadınlar sayca kişilərdən üstünlük təşkil etsələr və ya cəmiyyətdə əhali sayının artırılmasına ehtiyac .duyulsa, tutulan irad başqa bir forma və şəkil alacaqdır

Belə hallarda çoxarvadlılıq məsələsi bir növ, vəzifə və vacibi-kifayi(۱) hesab edilir. Yəni, cəmiyyətin fəsad və azğınlıqdan xilas edilməsi və ya cəmiyyətdəki əhali sayının artırılması üçün həyata keçirilməsi vacib olan məsələlərdəndir. Aydın məsələdir ki, ictimai bir vəzifənin yerinə yetirilməsindən söhbət gedərsə, qadının icazə və razılığına .ehtiyac duyulmaz

Cəmiyyətdə qadınlar həqiqətən də, kişilərdən sayca çox olsalar və ya əhalinin sayının artırılması kimi məsələlər qarşıya çıxsa, bu zaman evli kişi və qadınlar fədakarlıq göstərərək bu məsələdə razılıq göstərməlidirlər. Həmin məsələ eynilə ailələrin öz əziz və yaxınlarından keçərək cəmiyyət üçün onları döyüş meydanına yola salmalı olduqları əsgərlik məsələsinə bənzəyir. Belə şəraitdə müəyyən şəxslərin icazə və razılığı barədə .düşünmək ağılabatan deyil

Çoxarvadlılıq ilə bağlı məsələlərin sadəcə birinci zövcənin icazəsi ilə həyata keçirilməsinin düzgün olduğunu düşünən kəslər bu işin kişinin istək və tələbinə uyğun olduğunu fikirləşərək onun ictimai və fərdi zəruriliyi və cəhətlərini nəzərdən qaçırmışlar. Əgər işin içində ictimai və fərdi ehtiyaclar olmasa, hətta, birinci qadının .icazə və razılığı ilə olsa da, çoxarvadlılıq məsələsi qəbul olunan bir məsələ deyil

**Fəlsəfi baxımdan**

Çoxarvadlılıq kişi və qadın hüquqlarının bərabərliyi fəlsəfəsinin əsli ilə - onların insaniyyətdə müsavi olmalarından qaynaqlanır - ziddiyyət təşkil edir. Çünki kişi və qadının hər ikisi insan və bərabər hüquqludur, ya onların hər ikisi bu hüquqa malik olmalıdır, ya da hər ikisi həmin hüquqdan məhrum edilməlidir. Eyni zamanda, kişinin bir neçə zövcəyə sahib ola bilməkdə icazəli, qadının isə çoxlu sayda ərə malik ola bilməkdə ixtiyarının



---

Vacibi-kifayi, yəni hansısa bir insanın yerinə yetirməsi ilə digərlərinin üzərindən . [۱] -۱ qalxan məsələlər. Misal üçün, meyiti dəfn etmək və bu işlərə görə müqəddimə sayılan işləri həyata keçirmək hamı üçün vacibdir, amma kimsə bu işləri yerinə yetirsə, digər .şəxslərin üzərindən onun məsuliyyəti qalxmış olur

.olmaması bir növ, ayrı-seçkilik və kişilərə nəvaziş göstərməkdir

Kişiyə dördə qədər qadınla evlənməkdə icazə verməyin mənası qadının kişinin dörddəbiri qədər imtiyaz və dəyərə sahib olduğunu deməkdir. Bu, ən son həddə qadının təhqir edilməsi deməkdir və hətta, İslamın nəzərində şahidlik və irslə bağlı - iki qadının şahidliyi bir kişinin şahidliyinə bərabərdir - qeyd edilən məsələ ilə də ziddiyyət təşkil edir. Bu, çoxarvadlılığa tutulan iradlardan ən yerində və yerli olanı idi. Sanki, çoxarvadlılığa irad tutan şəxslər onun şəxsi və ictimai səbəblərinə azacıq da olsa, diqqət etməyərək nəzərdən qaçırtmış və məsələnin təkcə həvəs və istəklə bağlı olduğunu düşünmüşlər. Belə olduğu təqdirdə, nə üçün kişinin istəyinin nəzərə alınıb qadının istəklərinə diqqət edilmədiyini fikirləşmişlər. Əvvəlki bəhslərimizdə çoxarvadlılıq məsələsin yaranması səbəblərinə toxunduğumuz zaman, onun evli kişi və qadınlar üzərində ərsiz qadınlarla bağlı məsuliyyət və vəzifə yaratdığını dediyimiz .üçün bu barədə danışmaqdan daşınırıq

İslamın fəlsəfi mənbələrində irs, şəhadət və zövcələrin çoxluğu məsələlərində əgər qadına qarşı diqqətsizlik və onu təhqir etmək nəzərdə tutulsaydı, həmçinin, insanlıq və insanlıq hüquqlarından qaynaqlanan məsələlər baxımından kişi və qadın arasında fərqlər qoyulsaydı, onda, o, hər yerdə eyni cür fikir yürütməli və eyni hökmləri verməli olardı. Bir yerdə qadının kişinin mirasının yarısı qədər irs apardığını, başqa yerdə isə, onun mirasda kişi ilə bərabər olduğunu və kişinin dörd qadınla evlənə bildiyini .söyləməz və bu barədə müxtəlif hökmlərə malik olmazdı

Bütün bu məsələlərdən İslamın fərqli bir düşüncə və fəlsəfəyə malik olduğu aydın olur. Biz əvvəlki məqalələrimizdə irs barəsində izah edərək kişi ilə qadının insanlıq və insanlıqdan qaynaqlanan hüquqlarda bərabər olması məsələsini bəhs etmiş və bunun İslamın nəzərində hüququn müqəddimə və əlifbası olduğunu demişdik. İslamın nəzərində, kişi və qadın hüquqları ilə əlaqədar müsavi və bərabərlikdən də üstün .mətləblər mövcuddur və onlara daha çox diqqət edilməli və o, icra olunmalıdır

**Çoxarvadlılıq məsələsində İslamın rolu**

,Nə İslam dini çoxarvadlılığı ixtira və kəşf etmiş (çünki o

İslamdan əsrlərlə əvvəl dünyada mövcud idi), nə də onu ləğv etmişdir (çünki İslam cəmiyyətdə müəyyən çətinlik və problemlərin qarçıya çıxacağını düşünmüş və onun həlli yolunun zövcələrin sayca çoxluğuna məxsus ola biləcəyini nəzərə almışdır). Amma İslam çoxarvadlılıq məsələsi ilə bağlı olan adət və ənənələri islah və ona .düzəlişlər etmişdir

**Məhdudiyyət**

İslamın bu zəminədə atdığı ilkin addım onun məhdudlaşdırılması olmuşdur. İslamdan öncə, zövcələrin sayı naməhdud idi. Hansısa bir kişi təklikdə yüz qadına sahib olaraq bir hərəmxana yarada bilərdi. Amma İslam onun sayını "ən çox" (maksimum) həddə qaldırdı və kişiyə dörddən artıq qadınla evlənməyə icazə vermədi. İslamın əvvəllərində yaşamış və İslamı qəbul etdiyi halda, dörddən artıq qadına sahib olan şəxslər barədə hədislərdə məlumat verilmiş və İslamın həmin kişiləri artıq qadınlarını azad etmələrinə məcbur etdiyi bildirilmişdir. Həmin şəxslərə Ğəylan ibn Əsləmə adlı birini misal olaraq göstərmək olar. O, ona yaxın qadına malik idi və Peyğəmbər (s) onun altı qadınını boşamağa məcbur etmişdi. Eyni zamanda, Nofəl ibn Müaviyyə adlı bir nəfər də beş qadına sahib idi və İslamı qəbul edən zaman Peyğəmbər (s) ona bir qadınını boşamağı .göstəriş verdi

Şiə rəvayətlərində iranlı olan bir məcusinin imam Sadiq (ə) zamanında müsəlmanlığı qəbul etdiyi vaxtlarda yeddi qadına malik olduğu bildirilmişdi. İmam Sadiqdən "hazırda müsəlman olmuş bu şəxsin yeddi qadınla bağlı vəzifəsi nədir?" - deyə soruşulduqda, o .həzrət cavabında həmin şəxsin üç qadınını tərk etməli olduğunu bildirmişdir

**Ədalət**

Bu sahədə İslamın əməli olaraq atdığı digər bir addım onun ədaləti şərt kimi nəzərdə tutaraq qadın və ya onların övladları arasında hansısa bir ayrı-seçkiliyin olmamasını :təmin etmək idi. Quran aydın şəkildə belə buyurur

{فَإِنْ خِفْتُمْ أَلَّا تَعْدِلُوا فَوَاحِدَةً}

Əgər birdən ədalətlə rəftar etməyəcəyinizdən qorxsanız, onda, yalnız bir qadınla (ya" (da aldığınız bir kənizlə) kifayətlənin."(١)

İslamdan əvvəlki dünyada ədalətin əsil simasından heç bir əsər və əlamət yox idi və ona nə qadınlar, nə də onların övladları arasında əməl edilmirdi. İyirmi yeddinci məqalədə Kristin Sin və digər şəxslərdən Sasanilər zamanı İranda çoxarvadlılıq ilə bağlı adətlərin yayıldığı, qadınlar və övladlar arasında ayrı-seçkilik qoyulduğunu və qadınların bir qisminin "seçilmiş qadınlar" ünvanı ilə hüquqlardan kamil şəkildə istifadə edə bildiyini nəql etmişdik. Digər qadınları isə "xidmətçi qadınlar" adlandırırdılar və onlar nisbətən az hüquqlara malik idilər. Belə qadınlardan doğulan uşaqlar əgər oğlan uşaqları olsaydı, kişinin oğlu kimi qəbul edilirdi və əgər qız uşağı dünyaya gəlsəydi, onu .rədd edirdilər

İslam dini bütün bu adət və ənənələri ləğv olunmasına göstəriş verərək qadın və ya onların dünyaya gələn övladları ilə əlaqədar ayrı-seçkilik və fərq qoymağı qadağan .etdi və onlarla bağlı az qanuni imtiyazlar nəzərdə tutulmasına icazə vermədi

Vil Dorant "Sivilizasiya tarixi" adlı əsərinin birinci cildində çoxarvadlılıq ilə əlaqədar bəhs edərək deyir: "Tədricən, bir fərdin sərvətinin miqdarı artarsa, o, bu məsələdən narahat olacaq, çünki onun var-dövləti çoxlu hissələrə bölünərsə, övladlarının hər birinə qeyri-bərabər miqdarda sərvət çata bilər. Bu səbəbdən, o, mirasının həqiqi qadınından olan övladlarına çatması üçün düşünməyə başlayaraq digər qadınları ".arasında fərq qoyacaq

Bu cümlə qədim zamanlarda qadın və onların övladları arasında həddən artıq ayrı-seçkilik olduğunu nişan verib göstərir. Təəccüblü burasındadır ki, Vil Dorant öz :sözlərinə bu şəkildə davam edir

Müasir dövrümüzə qədər evlilik məsələsi Asiya qitəsində təqribən, bu formada idi." Getdikcə, zövcələr kişinin əsil qadını olmaq məqamını qazandılar və digər qadınlar gizli ".və məxfi məşuqə səviyyəsinə düşdülər və yaxud da bu məsələ ortadan qalxdı

Vil Dorant Asiya qitəsində qadın və uşaqlar arasında müqəddəs İslam dini sayəsində -on dörd əsrə yaxındır ki, ayrı



---

۱- [۱] . "Nisa" surəsi, ayə ۳.

seçkilik və fərq qoymaq adətinin aradan qalxdığını ya diqqətdən qaçırıb, ya da diqqət etmək istəməyib. Bir əsil qadına və neçə ədəd də gizli məşuqəyə sahib olmaq Asiyanın deyil, Avropanın sahib olduğu adətlərdəndir. Həmin adətlər son zamanlarda .Avropadan Asiyaya sirayət etmişdir

Bir sözlə, İslamın çoxarvadlılıq ilə əməli olaraq atdığı ikinci addım istər qadınlar .arasında olsun, istərsə də onların övladları, ayrı-seçkiliyi ləğv etməsi idi

İslamın nəzərində bu məsələ ilə oyun oynamaq heç bir halda qəbul olunası deyil. İslam alimləri də qadınlar arasında hansısa bir məqsədlə fərq qoyulmasının cayiz olmadığı barəsində fikir birliyinə malikdirlər. Sadəcə islami fiqhdə bəzi məsələlər ilə bağlı onların hüquqlarında ayrı-seçkilik edilməsinə haqq qazandırılmışdır. Mənim nəzərimcə, həmin məsələ Quran ayəsinin məfhumu ilə müxalifdir və bu nəzərin doğru olmadığında tərəddüd etmək olmaz. Peyğəmbərin (s) bu barədə söylədiyi bir cümlə var və həmin :cümlə əhli-sünnə və şiə rəvayətlərində nəql edilmişdir. O həzrət belə buyurur

Əgər bir kişi iki qadına sahib olar və onlar arasında ədalətə riayət edə bilməzsə (yəni,“ onlardan birinə daha çox meyil və məhəbbət göstərərsə), qiyamət günü o şəxsi ”.sürüyə-sürüyə cəhənnəm oduna atarlar

Ədalət insan üçün ən ali fəzilətlərdən biri hesab edilir. Ədalətin şərti dedikdə, ən üstün əxlaqi keyfiyyətlərə malik olmaq başa düşülür. Adətən, insanın hissiyyatlarının qadınlara nisbətdə eyni dərəcədə və bərabər olmadığını nəzərə aldıqda, qadınlar arasında fərq qoymamaq və ədalətlə rəftar etməyin ən çətin və ən problemli .vəzifələrdən olduğu məlum olur

Bildiyimiz kimi, İslam peyğəmbəri (s) ömrünün son on ilində, yəni Mədinədə olduğu dövrdə - islami döyüşlərin baş verdiyi və müsəlmanlar arasında dul qadınların həddən artıq olduğu zamanlarda - çoxlu sayda qadınlarla evlənmişdi. Həmin qadınların əksəriyyəti yaşca böyük idilər və onların öz əvvəlki ərlərindən də övladları vardı. Peyğəmbərin (s) evlənmiş olduğu sonsuz qadın sadəcə Ayişə idi. Bu baxımdan, Ayişə Peyğəmbərin

s) evləndiyi qadınlar arasında, ona Peyğəmbərdən (s) başqa, heç bir kişinin) toxunmadığı ilə həmişə fəxr edirdi. Peyğəmbər (s) o qadınların hamısı arasında ədalətə .riayət edərək onların arasında heç bir fərq və ayrı-seçkilik qoymurdu

Ürvət ibn Zübeyr Ayişənin bacısı oğlu idi. O, Peyğəmbərin (s) öz zövcələri ilə rəftar tərzi barədə xalası Ayişədən sorğu-sual etmiş və Ayişə də belə cavab vermişdi: “Peyğəmbər (s) öz qadınlarından heç birini digərindən üstün tutmur və onlar arasında fərq qoymurdu. Hamı ilə ədalət və kamil bir bərabərliklə rəftar edirdi. O həzrətin gün ərzində qadınlarına baş çəkmədiyi və onlardan hal-əhval tutmadığı hallar çox az-az olurdu. Hansı qadının növbəsi olsaydı onunla da hamı ilə olduğu kimi rəftar edir və .gecəni onun evində keçirirdi

Əgər bəzi vaxtlarda bir qadının növbəsi olduğu zamanlarda digər qadının yanına getmək istəsəydi, həmin qadının yanına gələr və ondan icazə alardı. Əgər qadın ona icazə versə gedər, verməsə idi getməzdi. Şəxsən, mənim xasiyyətim belə idi ki, məndən icazə istədikdə, o həzrətə icazə verməzdim. Peyğəmbər (s), hətta, onun vəfat etməsinə səbəb olan xəstəlik yatağında və hərəkət etməyə taqəti olmadığı zamanlarda da belə, ədalətə kamil şəkildə riayət etməkdən qalmırdı. Ədalət və qadınların növbəsinə riayət etmək səbəbi ilə öz yerini hər gün qadınlardan birinin otağına köçürtdürürdü. Nəhayət, günlərin birində zövcələrinin hamısını bir yerə toplayaraq onlardan artıq bir otaqda qalmasına icazə vermələrini istədi və hamısı ”.onun Ayişənin evində qalmasına razılıq verdi

Həzrət Əli (ə) də iki zövcəyə sahib olduğu zamanlarda, əgər dəstəmaz almaq istəsəydi, növbəsi olmayan qadının evində dəstəmaz almazdı. İslam ədalətin yerinə yetirilməsi ilə bağlı şərtə çox əhəmiyyət verərək, hətta, kişinin ikinci qadınla evlilik zamanı onunla əlbir olaraq birinci qadını ilə qeyri-bərabər şəraitdə yaşamasına razı deyil. Yəni, İslamın nəzərində ədalət kişinin qadınla əvvəlcədən müttəfiqliyi .nəticəsində özünü onu riayət etmək məsuliyyətindən xaric edəcək bir məsələ deyil

Kişi və qadından heç birinin nikah zamanı belə bir məsələ ilə

bağlı olaraq şərtləşə bilmək haqqı yoxdur. İkinci qadının əməldə edə biləcəyi bir iş, onun sadəcə öz hüquqlarından daşınmasıdır və o, əri ilə birinci qadınla eyi və müsavi haqlara malik olmamaq üçün şərtləşə bilməz. Eyni zamanda, birinci qadın da öz haqlarından razılıq və istəyi ilə daşına bilər, amma qanuni formada hüquqlarından .keçmək üçün hansısa bir iş görə bilməz

İmam Baqirdən (ə) belə bir sual soruşulmuşdur: "Görəsən, camaat öz qadınları ilə gündə, həftədə və ya ayda bir dəfə istədikləri vaxt onlara baş çəkərək yanlarına gələ bilmək, yaxud onlara digər qadınlarla müsavi və bərabər olmayacaq şəkildə nəfəqə verməyi şərt etsələr və qadınlar da əvvəlcədən bununla razılaşsalar, həmin məsələ "?düzgündürmü

İmam Baqir (ə) buyurur: "Xeyr, bu cür şərtlər düzgün deyil. Hər hansı bir qadın evlilik səbəbi ilə istər-istəməz bir qadının malik olduğu bütün hüquqlara kamilən sahib olur. Qadının əməli olaraq həyata keçirə biləcəyi iş, ərinin onu tərk etməməsi və ya digər ".səbəblər üzündən öz haqlarının bir qismini və yaxud da hamısını ona bağışlamasıdır

Çoxarvadlılıq məsələsi bu formada olan şiddətli əxlaqi şərt və keyfiyyətləri ilə kişilərin həvəsbazlığına vəsilə olmazdan öncə, vəzifə və məsuliyyətin icra edilməsi şəklini almışdır. Həvəsbazlıq və şəhvətpərəstlik nəfsi istəklərin ardınca getmək və kamil azadlıqdan başqa, bir məsələ ilə uyğun gəlmir. Bu cür məsələlər hansısa bir insanın özünü qəlbinin, qəlbini isə istək və meyillərin ixtiyarında qoyması zamanı özünü əməldə büruzə verə və formalaşa bilir. Qəlb və istəklər heç bir mənqiq və məhdudiyyət tanımır. Qaydalar, ədalət və vəzifələrin yerinə yetirilməsi məsələsi meydana gəldiyi zaman, şəhvətpərəstlik və həvəsbazlıq ortadan qalxmalıdır. Bu səbəblərdən də, islami şəraitdə çoxarvadlılıq məsələsinin şəhvət və həvəsbazlıq üçün bir vəsilə olmasını düşünmək olmaz. Çoxarvadlılıq məsələsini şəhvət üçün bir vəsilə seçən kəslər islami qanunları belə nalayiq əməlləri həyata keçirmək üçün bəhanə etmişlər. Cəmiyyətin həmin şəxsləri cəzalandırmaq və o vəsilələri onlardan geri almaq .haqqı vardır

### Ədalətin olmamasından qorxmaq məsələsi

İnsaflı olaraq çoxarvadlılıq məsələsində ədalətə kamil şəkildə riayət edənlərin az olduğunu deməliyik. İslami fiqhdə belə deyilir: “Əgər sudan istifadə edilməsinin bədəninizə zərəri varsa, su ilə dəstamaz almayın, əgər oruc tutmağın sizə zərəri varsa, oruc tutmayın.” Bu iki göstəriş islami fiqhdə qeyd edilmişdir. Siz əksər insanların “qorxuram suyun mənə zərəri olsun, mən dəstəmaz alım, yoxsa, almayım?” – deyə sual verdiklərini yəqin ki, müşahidə etmisiniz. Əlbəttə, bu suallar doğru suallardır və .belə şəxslər dəstəmaz almamalı və oruc tutmamalıdırlar

Amma Quranın açıq-aşkar “əgər qadınlarla ədalətlə rəftar edə bilməyəcəyinizdən qorxursunuzsa, birdən artıq qadınla evlənməyin” – kimi dediyi nəssə uyğun olaraq, kiminsə ömründə bir dəfə də olsun “mən ikinci dəfə evlənmək istəyirəm, amma ədalətə riayət edə bilməyəcəyimdən qorxuram, görəsən, evlənim, yoxsa, evlənməyim?” – kimi dediyini eşitmisinizmi? Mən eşitməmişəm. Hökmən, siz də eşitməmisiniz. Əlbəttə, camaatın ədalətlə rəftar edə bilməyəcəyini bildiyi halda, İslam adı altında və İslam pərdəsi ilə çoxlu sayda qadınla evlənməsi təəccüblüdür. İslamın adını bədnam edən kəslər, məhz, belə kəslərdir. Əgər təkcə bu xüsusiyyətə (ədalətlə rəftar etməyə) malik olan şəxslər belə bir addımı atmış olsaydı, heç bir bəhanə və .irada yer olmazdı

### Hərəmxanalar

Çoxarvadlılıq ilə bağlı islami qanuna irad və eyib tutmaq üçün səbəb olan digər bir mövzu əvvəlki sultan və xəlifə hakimiyyətinin yaratmış olduqları hərəmxanalar mövzusu idi. Bəzi məsihi yazıçı və mübəlliğləri (təbliğatçıları) İslamda zövcələrin çoxluğu məsələsini digər dinlərdəki kimi, hərəmxanalara bərabər olan bir məsələ və zülmün sonsuz bir numunəsi şəklində tanıtdırmış və İslamda mövcud olan çoxarvadlılığı eynilə, tarixin nişan verdiyi öncəki sultan və xəlifələrin hakimiyyət .dövründəki hərəmxanalara bənzətmişlər

Təəssüflər olsun ki, bizim öz yazıçılarımızdan bəziləri də – onların hər bir kəlməsi Qərb təfəkkür, etiqad və düşüncələrinin

göstəricisidir – çoxarvadlılıq barədə bəhs edilən hər bir məsələni hərəmxanalarla bir sırada tuturlar. Onlar bu iki məsələ arasında azad düşüncə və şəxsiyyətə malik .olmadıqları üçün fərq qoya bilmirlər

### Digər şərait və imkanlar

Ədalət şərtindən başqa, digər şərait və vəzifələrə də kişi diqqət etməlidir. Bizim hamımız bilirik ki, qadının kişi üzərində bir sıra silsilə təşkil edən maddi və cinsi məsələlərdə hüquqları vardır. Hansısa bir kişinin də maddi imkanları icazə verdiyi təqdirdə, çoxlu sayda zövcəyə sahib olmaqdan söz sala bilmək haqqı vardır. Maddi imkanların olması şərti bir zövcənin olduğu zamanlarda da mövcuddur. Hal-hazırda bu .bəhsə daxil olmağımız üçün o qədər də fürsət və imkanımız yoxdur

Cismi və instinktiv olan digər qüvvə və imkanlar da öz növbəsində vacib və şərt edilən məsələlərdəndir. "Üsuli-kafi" və "Vəsailuş-şiə" kitablarında imam Sadiqin (ə) belə :buyurduğu nəql edilmişdir

Hər hansı bir şəxs müəyyən sayda qadınla evlənər və onları cinsi baxımdan təmin edə" bilməzsə və həmin qadınlar da fahişəlik və zinaya düşsələr, həmin günahlar o şəxsin " .boynunadır

Hərəmxanaların tarixçəsinə nəzər saldığımız zaman, cinsi baxımdan təzyiq altında olan cavan qadınların fahişəlik və zinaya mürtəkib olduğunu və həmin günahların ardından da qətl və ölüm kimi cinayət hadisələrinin baş verdiyini müşahidə etmək .mümkündür

Ümid edirik ki, çoxarvadlılıq ilə əlaqədar yazdığımız yeddi məqalənin məcmusundan möhtərəm oxucu çoxarvadlılığın yaranması səbəb və amillərini, eyni zamanda, İslamın çoxarvadlılıq məsələsini nə üçün aradan qaldırmadığını və onun üçün hansı hədlər, qeyd və şərtləri nəzərdə tutduğunu yaxşı anlayıb başa düşə bildi. Həmçinin, əziz oxucuya İslamın çoxarvadlılığa icazə verməklə qadınları təhqir etmək fikrində olmaması, əksinə bu yolla qadın cinsinə ən böyük xidmət göstərməsi məsələsi də aydın oldu. Əgər nisbi şəkildə evlənmək istəyən və buna hazır qadınların

sayca evlənmək istəyən kişilərdən çox olduğu zaman və şəraitlərdə – bu məsələ həmişə dünyada olmuş və mövcuddur – çoxarvadlılğa icazə verilməzsə, qadınlar kişilərin onlardan ən pis halda yararlanma və faydalanmasına səbəb olacaqlar. Kişi onunla bir kənizdən də betər şəkildə rəftar edəcək. Yəni, insan öz kənizinə qarşı, haradasa, ondan dünyaya gələn övladı olarsa, məsuliyyət daşıyır, amma məşuqə və rəfiqəbazlıq məsələlərində isə belə bir məsuliyyət əsla mövcud deyil (yəni, qadınlar .(kişilər üçün bir məşuqə formasına düşəcəklər

## Bugünkü kişilər və çoxarvadlılıq

Bizim günümüzdəki kişilər çoxarvadlılıq məsələsindən üz çevirməkdədirlər. Nə üçün? Görəsən, onlar öz zövcələrinə vəfalı və sadiq qalmaq, eyni zamanda, bir qadınla kifayətlənmək istəyirlər, yoxsa, öz dəyişiklik tələb etmək hisslərini günaha düşməklə – onlar üçün bu yolla həzz almaq imkanları daha çoxdur – təmin etməyə çalışırlar? Bugünkü günlərdə çoxarvadlılıq məsələsi öz yerini vəfa və sadiqliyə deyil, günaha vermişdir. Elə bu səbəblərdən də, kişi üçün məsuliyyət və vəzifə yaradan zövcələrin .sayca çoxluğu məsələsi onlarda nifrət və ikrah yaradır

Keçmişdəki kişilər əgər həvəsbazlıq fikrinə düşsəydi, onlar üçün günah etmək yolu o qədər də açıq deyildi və kişilər məcburi şəkildə öz həvəsləri və şəhvətlərini təmin etmək üçün çoxlu sayda qadınlarla evlənmək vasitəsinə əl atırdılar. Onlar bir sıra silsilə təşkil edən vəzifə və məsuliyyətlərdən boyun qaçırmalarına baxmayaraq, öz qadın və övladlarına qarşı bəzi maddi, eyni zamanda, insanlıq borclarını yerinə yetirirdilər. Amma bugünkü kişilər hədsiz və hüdudsuz olan şəhvətpərəstlik məsələlərində öz vəzifə və öhdəçiliklərini azacıq da olsa, yerinə yetirmək üçün heç bir məcburiyyət və .lüzumu qəbul etmirlər. Onlar çarəsiz olaraq çoxarvadlılıq məsələsinə qarşı çıxırlar

Bizim əsrimizdəki müasir kişilər qadından katibə, mühasibatçı və s. yüzlərlə ad altında istifadə edərək öz kamlarına çatır və həmin qadınların xərcini dövlət büdcəsi və yaxud da işlədiyi müəssisə, təşkilat və şirkətə ödətməyə çalışaraq öz

cibindən bir qəpik belə xərcləmirlər. Bugünkü kişilər hər gün bir məşuqə dəyişməklə məşğuldur və talaq, mehriyyə və nəfəqə ilə bağlı sahədə heç bir məsuliyyətə də girmir. Əsrimizdəki kişilərin çoxarvadlılıq ilə müxalif olmaları aydın məsələdir, çünki onların yanlarında yaraşıqlı, gözəl və cazibədar olan bir katibə var və ildə bir dəfə də olsa, onu dəyişə bilmək imkanına sahibdirlər. Belə olduğu təqdirdə, çoxarvadlılığa nə ?ehtiyac var

Bertrand Rasselin – çoxarvadlılığa ən şiddətli şəkildə müxalif olan şəxsdir – şərhi-:halında (avtobioqrafiyasında) belə oxuyuruq

Onun həyatının ilkin dövrlərində nənəsindən əlavə, iki qadının da çox böyük rolu“ olmuşdur. Həmin qadınlardan biri Rasselin birinci zövcəsi Alis, digəri isə onun rəfiqəsi Otolin Moreldir. Morel öz zəmanəsinin tanınmış qadınlarından sayılırdı və XX əsrin ”.əvvəllərindəki bir çox yazıçılarla dostluq edirdi

Aydındır ki, belə bir şəxs çoxarvadlılıq məsələsinə qarşı xoş üz göstərməyəcəkdir. Guya, onun məşuqəbazlığı öz zövcəsi Alis ilə münasibətlərinin bitməsinə səbəb olmuşdur. Rasselin öz dilindən belə yazmışlar: “Günlərin birində günorta velosipedlə şəhərin yaxınlığındakı küçələrdən keçdiyim zaman, gözlənilmədən artıq Alisi ”.sevmədiyimi anladım

səh:۳۵۰

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər sürəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹